عُدَّةُ الصَّابِرِين

وَذَخِيرَةُ الشَّاكِرِين



# Səbir edənlərin azuqəsi və şükür edənlərin tədarükü

Imam Ibn əl-Qayyim əl-Cəvziyyə

# Kitabın içindəkilər

# DİQQƏT!

**Əziz müsəlmanlar! Bu kitab İbnul-Qayyimin "Uddətus-Sabirin va Zaxiratuş-Şəkirin" adlı kitabının azərbaycan dilinə çevrilmiş şəklidir. Bu tərcüməni www.ehlitevhid.com internet səhifəsində məsul şəxslər elektron kitab halına salıblar və buna görə əziyyət çəkmiş qardaşlarımıza dərin minnətdarlığımızı bildiririk. Əldə etdiyimiz məlumata əsasən kitabı Rəsul Ömərov və Mahmud Qəhrəmanov adlı iki müsəlman qardaşımız tərcümə edib. Allah bu kitabı tərcümə edənlərə və onu elektron kitab halına gətirib müsəlmanların xidmətinə təqdim edənlərə bol-bol əcr yazsın! Kitabın bəzi bölümlərinə nəzər saldıqdan sonra gəldiyim qənaət budur ki, kitab ərəb dilindən birbaşa tərcümə edilməmiş, lakin türk dilindən çevrilmişdir. Kitabın içində tərcümə xətaları və orfoqrafik xətaların olması labüddür. Allah qismət edərsə tərcüməni gələcəkdə kitabın orijinalı ilə tutuşduraraq bir daha dəqiqləşdirəcəyik. Müvəffəqiyyət Allahdandır!**



# MÜƏLLİFİN MÜQƏDDİMƏSİ

**Rəhmli və mərhəmətli Allahın adı ilə!**
**Ondan kömək istəyərək**

Həmd səbri tükənməz, şükür edənlərə öz neməti ilə əvəzini verən, ən uca, ən böyük, hər şeyi haqqı ilə eşidən, hər şeyi kəmalı ilə görən, hər şeyi layiqincə bilən və qüdrəti sonsuz olan Allaha məxsusdur. Məxluqatının bütün işləri Onun istəyinə bağlıdır, Allah-taala qiyamət günündə çağırışını qəbirdə olanlara eşitdirəcək. Bütün məxluqatın müqəddəratını və əcəlini öncədən müəyyənləşdirmiş, özlərindən sonra qoyduqları izləri, əməlləri yazmış, onlar arasında məişətlərini və mallarını bölmüş, onlardan hansının daha gözəl əməl edəcəyini imtahan etmək üçün ölümü və həyatı yaratmışdır. O, güclü və bağışlayandır, mütləq Qalibdir, ən yaxşı araşdıran, şəriksiz üstün olan və Qüdrət sahibidir, hər çətinlik Ona asandır. O dostdur, çox gözəl dost və çox gözəl yardımçıdır. Göylərdə və yerdə nə varsa, hamısı Onu alqışlayır, pak və nöqsansız bilir. Mülk və Sahiblik Onundur. Bütün həmd Ona məxsusdur. O, hər şeyə haqqı ilə Qadirdir. Sizi yaradan Odur, bununla da kiminiz kafir, kiminiz möminsiniz. Allah nə etsəniz Görəndir. Göyləri və yeri haqq ilə yaratmış, sizə surət vermiş, surətlərinizə isə gözəllik bəxş etmişdir. Dönüş ancaq Onadır. Allah gizlətdiyiniz və aşkar etdiyiniz hər bir şeyi bilir. Çünki O, qəlblərdə olanı belə biləndir. Mən şəhadət verirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur. O, təkdir. Onun ortağı və bənzəri yoxdur. O, ortaq və yardımçıya möhtac olmayan qüsur və nöqsansızdır. Məxluqata bənzəməkdən münəzzəh[1] olduğu kimi mülhidlərin[2] dediklərindən də münəzzəhdir. Ona bənzər heç bir şey yoxdur. O, hər şeyi eşidəndir, hər şeyi görəndir! Mən şəhadət verirəm ki, şübhəsiz Məhəmməd[3] Onun qulu və rəsulu, məxluqatın xeyirlisi və seçilmişi, vəhyin etibar olunduğu, Allah ilə qulları arasında elçi, Allahı ən yaxşı tanıyan, Ondan ən çox qorxan, ümmətinə ən yaxşı nəsihət edən, Allahın hökmünə ən çox səbir edən, Onun nemətlərinə ən çox şükür edən və Allaha ən yaxın olandır. Çünki Allah dərgahında ən

---

[1] Qüsur və nöqsanlardan uzaq.
[2] Ateistlər.
[3] Səllallahu aleyhi vəs-səlləm (Ona Allahın salamı və salavatı olsun). İrəlidə yazılmayacaq, nəzərdə tutulacaq.

yüksək və ən böyük məqamı olan, ən böyük şəfaət sahibi odur. Allah-taala onu imana və Cənnətə dəvət etmək üçün göndərmişdir. Allah rizası üçün çalışmış, yaxşılıqları əmr etmiş, pisliklərdən çəkindirmiş, Rəbbinin əmr və qadağalarını təbliğ etmiş, Allahın əmrini açıq-aşkar bildirmiş, Allahın rizası uğrunda heç kimin qatlanmayacağı məşəqqətlərə qatlanmış və Allahın rizasına çatmaq üçün səbir və şükür ilə hazır olmuş, səbir edənlərdən heç kimin çatmayacağı "səbir məqamında" durmuşdur. Bütün şükür edənlərin yetişmədiyi "şükür dərəcəsinə" yüksəlmişdir. Allah-taala, mələklər, peyğəmbərlər və bütün möminlər onu mədh etmişdir. Bundan başqa, "Livaul-həmd" ("Həmd bayrağı") adlı bayraq yalnız onun adına aid edilmişdir. Həzrəti Adəm[4] və digər bütün peyğəmbərlər onun bayrağı altında toplanacaqlar. Allah-taala "həmd"i peyğəmbərimizə endirdiyi Qurani Kərimin əvvəlində qeyd etmişdir. Tövrat və İncildə də bu belədir. Peyğəmbərimizin vəsiləsi ilə hidayət olanların Cənnətdəki son duaları da Allaha həmd etmək olacaqdır.

Allah-taala Peyğəmbərimizin ümmətini yaratmazdan öncə, onlara "həmd edənlər" adını vermişdir. Çünki onlar Allaha ağgündə və ağır günlərində həmd edərlər. Onlar bütün ümmətlərdən öncə Cənnətə girəcəklər. Məxluqatın "Livaul-həmd"-ə ən yaxın olanları, Allahı ən çox həmd və zikr edənləridir. Belə ki, onların məqam etibarı ilə ən yüksəyi, ən çox səbir edən və şükür edənləridir. Allah-taala, Onun mələkləri, peyğəmbərləri və bütün möminlər ona xeyir-dua edirlər. Çünki məbud kimi Allahı təkləşdirən, Onu tanıdan və Ona dəvət edən odur.

Bu girişdən sonra bil ki, Allah-taala səbri büdrəməyən bir at, kütləşməyən bir qılınc, məğlubedilməz bir ordu, yıxılmayan, hətta dəlik belə açılmayan möhkəm bir qala etmişdir. Səbir ilə zəfər iki doğma qardaşdır.

Zəfər çalmaq səbirlə, fərəh və sevinc üzüntü ilə, çətinlik və sıxıntı isə rahatlıqla yanaşıdır. Səbir, sahibinə silahsız və hazırlıqsız bir ordudan daha çox yardımçıdır. Səbrin zəfərdəki yeri, başın bədəndəki yeri kimidir.

Allah-taala kitabında səbir edənlərə əvəzsiz mükafat verəcəyini vəd etmiş və ayələrin birində: **«Səbir edin, çünki Allah səbir edənlərlədir!»** (əl-Ənfal, 46) buyurmuşdur. Yəni ey iman gətirənlər! Səbir edin, çünki Allahın hidayəti, yardımı, aydın zəfəri səbir edənlərlə bərabərdir. Əslində, bu bərabərlik sayəsində səbir edənlər, Allahın gizli və açıq nemətlərini, dünya və axirət xeyrini qazanırlar.

Allah-taala dini iştərdə imam (rəhbər) olmağı, səbrə və

[4] Əleyhis-səlam (Ona salam olsun). İrəlidə yazılmayacaq, nəzərdə tutulacaq.

yəqinliyə bağlamış və buyurmuşdur: «(Çətinliklərə) **səbir etdikləri və ayələrimizə ürəkdən inandıqları üçün Biz onlardan əmrimizlə** (insanlara) **haqq yolu göstərən rəhbərlər təyin etmişdik»** (əs-Səcdə, 24). Allah-taala, səbir edənlər üçün ən xeyirli keyfiyyətin səbir olduğuna andla təkid edərək: **«...Əgər səbir etsəniz, bu, səbir edənlər üçün daha xeyirlidir» -** buyurmuşdur (ən-Nəhl, 126).

Allah-taala səbir və təqva sahibinə düşmən hiyləsinin nə qədər güclü və qüvvətli olursa olsun, zərər verə bilməyəcəyini belə xəbər vermişdir: **«Əgər səbir edib özünüzü qorusanız** (Allahdan qorxsanız), **onların hiyləsi sizə heç bir zərər yetirməz. Şübhəsiz ki, Allah onların nə etdiyini biləndir»** (Ali-İmran, 120). Allah-taala Yusifdən xəbər verərkən belə buyurur: **«Kim Allahdan qorxub pis əməllərdən çəkinsə və səbir etsə,** (bilin ki) **Allah yaxşı işlər görənlərin mükafatını əsla zay etməz!»** (Yusif, 90). Yusif bu ayədə səbir və təqvanın onu yüksək məqama çatdırdığını və qurtuluşun səbir və təqva ilə bağlı olduğunu xəbər verir. Mömünlər də bu ayəni qurtuluşun səbir etməklə və Allahın əmrini tutub yasaqlarından çəkinməklə mümkün olduğunu anlamışlar. Məsələn, Allah-taala: «**Ey iman gətirənlər!** (Dində vacib olan hökmləri yerinə yetirməyin zəhmətinə, düçar olduğunuz bəlalara) **səbir edin, dözün, hazır olun və Allahdan qorxun ki, bəlkə, nicat tapasınız»** (Ali-İmran, 200).

Allah-taala səbir edənləri sevdiyini xəbər verərək demişdir: **«...Allah səbir edənləri sevər»** (Ali-İmran, 146). Bu ayədə Allahın sevgisini arzu edənlər üçün səbir etməyə böyük bir təşviq vardır. Allah-taala səbir edənləri üç ayə ilə müjdələdi ki, bunlardan hər biri dünya əhlinin bir-biri ilə çəkişərək, uğrunda qan tökdükləri dünya və dünya malından daha xeyirlidir: **«Əlbəttə, Biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal, can** (övlad) **və məhsul qıtlığı ilə imtahan edərik.** (Belə imtahanlara) **səbir edən şəxslərə müjdə ver! O kəslər ki, başlarına bir müsibət gəldiyi zaman: "Biz Allahınıq** (Allahın bəndələriyik) **və** (öləndən sonra) **Ona tərəf** (onun dərgahına) **qayıdacağıq!"- deyirlər. Onları Rəbbi tərəfindən bağışlamaq və rəhmət** (Cənnət) **gözləyir. Onlar doğru yolda olanlardır»** (əl-Bəqərə, 155-157).

Allah-taala qullarına din və dünya məsələlərində başlarına bir müsibət gəldiyi zaman səbir və dua ilə yardım diləmələrini tövsiyə edərək buyurur: «(Müsibət vaxtında) **səbir etmək və namaz qılmaqla** (Allahdan) **kömək diləyin! Bu, ağır iş olsa da,** (Allaha) **itaət edənlər üçün ağır deyildir»** (əl-Bəqərə, 45).

Allah-taala Cənnəti qazanan və Cəhənnəmdən qurtulanların ancaq səbir edənlər olacaqlarını bəyan edərək: **«Həqiqətən, Mən**

**səbir etdiklərinə görə onları mükafatlandırdım. Onlar nicat tapanlardır** (uğura yetənlərdir)**!»** (əl-Muminun, 111) - buyurur.

Allah-taala dünyadan və nemətindən üz çevirib, savabı arzulayanların, ancaq səbirli möminlər olduğunu xəbər verərək buyurur: **«Axirət barəsində elm verilmiş kəslər isə belə dedilər: "Vay halınıza!** (Ay yazıqlar!) **İman gətirib yaxşı əməl edən kimsə üçün Allahın mükafatı** (təmənnasında olduğunuz var-dövlətdən, dəbdə-bədən) **daha yaxşıdır. Buna** (bu nemətə) **yalnız səbir edənlər** (Allaha itaət və ibadət etməyi fani dünya malından üstün tutanlar, həyatın çətinliklərinə dözənlər) **qovuşarlar!»** (əl-Qəsəs, 80).

Allah-taala pisliyə yaxşılıqla cavab veriləndə, pislik edənin yaxın bir dost ola biləcəyini xəbər vermişdir: **«Yaxşılıqla pislik eyni ola bilməz!** (Ey mömin kimsə!) **sən pisliyi yaxşılıqla dəf et!** (Qəzəbə səbirlə, cəhalətə elmlə, xəsisliyə comərdliklə, cəzaya bağışlamaqla cavab ver!) **Belə olduqda aranızda düşmənçilik olan şəxsi, sanki yaxın bir dost görərsən!»** (Fussilət, 34). Məhz bu rütbəyə ancaq səbir edənlər qovuşdurulur.

Allah-taala andla təkid edərək buyurur: **«And olsun axşam çağına. İnsan ziyan içindədir. Yalnız iman gətirib yaxşı əməllər edən, bir-birinə haqqı tövsiyə edən və səbri tövsiyə edənlərdən başqa!»** (əl-Əsr, 1-3). İnsanlar sağ və sol tərəf sahibləri olmaq üzrə iki qisimdir. Səbir və mərhəməti tövsiyə edənlər, Allahın ayələrinə iman edənlər, səbir edənlər və şükür edənlər sağ tərəf sahibləridir. Bu vəsflərilə sağ tərəf sahibləri, sol tərəf sahiblərindən ayrılır. Möminlərin vəsflərindən ən böyükləri səbir və şükürdür. Belə ki, Allah-taala Qurani Kərimin dörd yerində: **«Həqiqətən, bunda** (çətinliklərə) **səbir,** (nemətlərə) **şükür edən hər bir kəs üçün ibrətlər vardır!»** (İbrahim, 5; Loğman, 31; Səba, 19; əş-Şura, 33) buyurmuşdur. Allah-taalanın məğfirət və mükafatı yaxşı əməl ilə səbrə bağlanmışdır. Belə ki, Allah-taala: **«Səbir edənlər və yaxşı işlər görənlər müstəsnadır. Məhz onları** (günahlardan) **bağışlanma və böyük bir mükafat gözləyir»** (Hud, 11) - deyə buyurmuşdur.

Allah-taala səbir etmənin və günahları bağışlamanın zərər verməyəcək bir ticarət sahiblərinin səy göstərəcəyi işlərdən olduğunu xəbər verir: **«Əlbəttə, Hər kəs** (pisliyə) **səbir edib** (qisası) **bağışlasa,** (onun bu hərəkəti) **çox bəyənilən əməllərdəndir!»** (əş-Şura, 43).

Allah-taala hökmünə səbir etməsini peyğəmbərinə əmr etmiş, peyğəmbərin səbrinin, ancaq Allahın yardımıyla olacağını və beləcə bütün müsibətlərin asanlaşacağını xəbər verərək belə demişdir: **«Sən**

**öz Rəbbinin hökmünə səbir et! Şübhəsiz ki, sən Bizim gözümüzün qabağındasan,** (himayəmiz altındasan)...» (əl-Tur, 48);

**«Səbir et. Sənin səbir etməyin ancaq Allahın köməyilədir.** (Dəvətini qəbul etmədiklərinə, iman gətirmədiklərinə görə) **onlardan** (müşriklərdən) **ötrü kədərlənmə və qurduqları hiyləyə görə də ürəyini qısma! Həqiqətən, Allah Ondan qorxub pis əməllərdən çəkinənlər və yaxşı işlər görənlərlədir!»** (ən-Nəhl, 127-128).

Səbir möminin bağlanmış olduğu və ondan qopması mümkün olmayan bir ipdir, imanın söykəndiyi təməldir, səbri olmayanın imanı yoxdur, olsa da çox zəifdir. Belə bir iman sahibi Allah-taalaya bir tərəfli ibadət edənlərdəndir. Əgər özünə bir xeyir yetişərsə, ona könlü yatar, əgər bir bəla gəlirsə, geriyə dönər (mürtəd olar), dünyada da axirətdə də zərərə uğrayar və zərərdən başqa bir şey qazanmaz. Xoşbəxt və bəxtiyar insanlar səbirləri sayəsində ən gözəl yaşayışı əldə etmişlər, şükürləri sayəsində ən yüksək məqamlara yüksəlmişlər. Səbir ilə şükrün qanadları arasında Nəim Cənnətlərinə qovuşmuşlar. Bu Allahın lütfüdür, onu dilədiyinə verir. Allah böyük fəzilət sahibidir.

## Kitabın yazılma səbəbi və əhəmiyyəti

İman iki sinifdir, bir sinfi səbir, digər sinfi isə şükürdür. Buna görə nəsihəti qəbul edən, qurtuluşu arzu edən və səadətə çatmaq istəyən hər kəs, səbir və şükrə etinasızlıq etməməli, bu iki yoldan ayrılmamalı, qiyamət günündə Allah-taalanın onu iki firqədən (biri Cənnətlik, digəri Cəhənnəmlik) xeyirli olanı ilə bərabər etməsi üçün bu ikisi ilə Allaha doğru getməlidir.

Bu kitab səbirlə şükrü açıqlamaq üçün yazılmışdır. Çünki dünya və axirətin səadəti bunlara bağlıdır. Odur ki, hər müsəlman bu kitaba möhkəm sarılmalı və təkrar oxumalıdır. Çünki bu kitab oxucunu faydalandırır, üzüntünü təsəlli edir, tənbəlləri hərəkətə, çalışqanları daha da qeyrətləndirir.

Bu kitab əsas mövzusu olan səbir və şükürdən başqa, Qurani Kərimin təfsirindən ən gözəl bəndləri, sənədləri ilə hədisi şərifləri, sələf-salihin əsərlərini, dəlilləriylə açıqlanmış gözəl fiqh məsələlərini, doğru yolda diqqətlə getməyi də əhatə etmişdir. Bunlar ağıl və fikir sahiblərinə gizli deyildir.

Kitabda səbrin qisimləri, şükrün səbəb və növləri qeyd edilmiş, şükür edən varlı ilə səbir edən kasıbın hansının daha fəzilətli və üstün olduğu da göstərilmişdir. Kitabda dünyanın həqiqəti, Allah-taalanın, elçisinin və sələfin misallarla bu dünyanı anlatmaları, bu misalların gerçəyə uyğun olması, Allaha yaxınlaşdıran və uzaqlaşdıran bu dünya səbəbiylə kimin necə bədbəxt, kimin də necə xoşbəxt olduğu qeyd edilmiş və heç bir kitabda olmayan bir çox faydalı məsələlər aydınlaşdırılmışdır. Bu, Allah-taalanın quluna ehsan və bəxşişlərindən biridir.

Bu kitab hökmdar və əmirlərin, varlı və yoxsulların, sufi və şəriət alimlərinin istifadə edəcəyi bir kitabdır.

Bu kitab yolçuya yoldaş olur, çalışanı məqsədinə çatdırır, iflas edənə güc verir. (Müəllif təvazökarlıq göstərərək deyir ki, — tərc.) hər nə qədər özüm xəstə olsam da, bu kitabda insanları xəstəlikdən qorumağa çalışdım, özüm istifadə etməsəm də əlacını göstərdim. Mən səxavətlilərin səxavətlisi, rəhmlilərin rəhmlisi olan Allahdan mömin qullarına nəsihət etmək səbəbi ilə günahlarımı əfv etməsini umuram. Bu kitabdakı doğru olanlar bir olan, yardım istənilən Allahdandır. Xatalar isə məndən və şeytandandır. Bu kitabın faydası oxucusuna, zərəri isə mənədir.

Əziz oxucu, kitabda sənə təmiz düşüncələr təqdim edilir. Əgər

bu düşüncələrin doğruluğunu dərk etsən xoşbəxt olarsan, əgər bunların doğruluğunu dərk etməsən, istifadə edə bilməzsən.

Kitabı iyirmi altı bölmə və son sözlə bitirdim.

# BİRİNCİ BÖLMƏ

## Səbrin lüğəvi mənası, mənşəyi

"Səbir" lüğətdə çəkindirmək və həbs etmək mənasındadır. Səbir insanın özünü fəryad etməkdən, dilini şikayət etməkdən, əllərini üzünə, dizinə vurmaqdan və paltarını cırmaqdan çəkindirməsidir.

"Səbir" kəlməsi "sabəra", "yasbiru", "sabran" kimi çəkilir. Məsələn, "sabəra nəfsəhu" - özünü (nəfsini) qorudu. Allah-taala buyurur: **«Səhər-axşam Rəbbinin rizasını diləyərək Ona ibadət edənlərlə birlikdə özünü səbirli apar** (nəfsini qoru)**»** (əl-Kəhf, 28).

Bir kimsəni həbs edərkən "sabərtu fulənən" (filankəsi həbs etdim) və kimisə səbir etməyə həvəsləndirərkən "sabbərtuhu" (onu səbrə həvəsləndirdim) deyilir. İki nəfər bir şəxsi yaxalamış, biri tutaraq digəri öldürmüşdür. Bu zaman Allahın elçisi: "Qatil öldürülür, tutan həbs edilir" - demişdir[5]. Öldürülməsi üçün birini tutduqda "sabərtu ər-rəculə" (adamı tutdum) və and içməsi üçün həbs etdikdə "asbərtuhu" (onu həbs etdim) deyilir. Hədislərin birində buyurulur: "Kim müsəlmanın malını qopararaq həbs etmək (almaq) üçün (yalan yerə) and içərsə, qiyamət günü Allahla görüşə gəldikdə, Allahın ondan üz çevirdiyini görər"[6]. And içməklə bağlı digər hədisdə də: "Başqalarının and içmələri üçün həbs edildikləri yerdə onu həbs etmə!" - deyə buyurulur.

And içilən şeyə "məsbura" deyilir. Hədislərin birində "məsbura", yəni qoyun, toyuq kimi heyvanların ölmələri üçün bağlanaraq həbs edilmələri qadağan edilmişdir.[7]

"Səbir" kəlməsi keçmiş zamanda "üstün", çox zaman sabərtu, asbiru fəslindən olarsa "zamin" mənasında işlədilir. Zamin olan kəsə "sabir" deyilməklə, sanki özü - özünü borc ödəmək üçün həbs etməsi düşünülür. Ərəblərin "asbirni" (məni zamin göstər) sözü də belədir. "Səbir" kəlməsinin əslində "şiddət" və "qüvvət" mənası da vardır, bundan başqa müalicə üçün istifadə olunan məşhur bir dərmana çox acı olduğu üçün "səbir" adı verilmişdir.

---

[5] **Səhihdir:** Abdurrəzzaq, "əl-Musənnəf', 17896; əd-Daraqutni, 3/140; əl-Beyhəqi, 8/50.

[6] əl-Buxari, 6676; Müslim, 138, 220. Ləfz Müslimindir.

[7] əl-Buxari, 5513; Müslim, 1956. Ənəsin hədisindən bir hissə.

Alim Əsmai kimsə şiddətli bir bəlaya məruz qaldıqda "ləqiyəhə bi asbərahə" (şiddətli bir bəlaya uğradı) demişdir. Azad (sərbəst) qadına şiddətli və qüvvətli olduğu üçün "ummi sabbərə" deyirlər. Ərəblər bir qövm şiddətli sıxıntıya düşdükdə "vaqaa əl - qaumu fi əmrin sabburin", həmçinin qış çox şiddətli olduqda "sabərratu əş-şitə" deyirlər.

Bəziləri " "səbir"- toplamaq, qatmaq, birləşdirmək mənalarını verir"- demişlər. Çünki səbir edən, özünü fəryad və şikayət etməkdən qoruyar. Eləcə də arpa, buğda kimi yeyiləcək qidaların yığımına "subratu ət-təam" və daş yığmağa isə "subəratu əl-hicarə" deyilir.

Nəticə olaraq səbir ən çox üç mənada işlədilir: çəkindirmək, şiddət və toplamaq.

Kimsə səbir etdiyi zaman "sabara", özünü səbrə məcbur etdikdə "təsabbəra", səbri qazandığı zaman "istabəra", özünü və başqasını səbrə təşviq etdiyi zaman "sabbərə nəfsəhu və ğeyrahu" deyilir.

"Səbir etmək" felini icra edənlər (fail) bunlardır: "sabirun", "sabbarun", "saburun", "musabirun" və "mustabirun". "Sabbarun" və "saburun", "darrabun" və "darabun" kimi üçlüyün ("sulasi": bax ərəb dili qramatikasına - tərc.) mübaliğə vəznlərindəndir.

# İKİNCİ BÖLMƏ

## Səbrin mahiyyəti və alimlərin bu mövzuda fikirləri

Səbrin lüğətdəki mənaları yuxarıda bildirildi. Doğru səbir insanın üstün əxlaqlarından biridir. İnsan onunla gözəl və xoş olmayan işləri görməkdən çəkinir. Səbir insanın qüvvətlərindən biridir. İnsanın halı və işləri ancaq onunla düzəlir və yoluna düşür.

Cuneyd bin Məhəmməddən səbir haqqında soruşduqda: "Səbir insanın üzünü turşutmadan acıları udmasıdır"- deyə cavab vermişdir.[8]

Zunnun isə: "Səbir insanın yasaqlardan uzaq qalması, bəlanın acılarını udarkən sükunətini qoruması, kasıb vaxtında da varlı görünməsidir" - demişdir.[9]

Bəziləri də "səbir" - bəla gəldiyi vaxt ədəb və ciddiyyəti qorumaqdan, digərləri isə şikayət etməməkdən ibarətdir"- demişlər.[10]

Əbu Osman: "Səbirli şəxs özünü pisliklərə hücum etməyə alışdıran kəsdir" - demişdir.[11]

Bəziləri də "səbir səhhəti yaxşı və sağlam olarkən necə durursa, bəla zamanı da eləcə durmasıdır"- demişlər. Yəni Allah-taalanın qulu üzərində həm sağlam, həm də bəla zamanında olarkən haqqı vardır. Buna görə də bəndənin sağlam olarkən şükür etməsi, bəlaya düçar olanda isə səbir etməsi lazımdır.

Əmr bin Osman əl-Məkki demişdir: "Səbir Allahla bərabər səbat etmək, bəlaları rahatlıq və sükunətlə qarşılamaqdır"[12]. Yəni bəlanı darlıq, qəzəb və şikayətlə deyil, geniş qəlblə qarşılamaqdır.

Xəvvas: "Səbir Kitabın və Sünnənin hökmləri üzərində səbat etməkdir"- demişdir.[13]

Rüveym: "Səbir şikayəti tərk etməkdir"- demişdir. Bəziləri "səbir Allahdan yardım istəməkdir"- demişdir.[14]

---

[8] "Ər-risalətul-quşəyriyyə", səh. 183.
[9] "Ər-risalətul-quşəyriyyə", səh. 184.
[10] "Ər-risalətul-quşəyriyyə", səh. 184.
[11] "Ər-risalətul-quşəyriyyə", səh. 184.
[12] "Ər-risalətul-quşəyriyyə", səh. 184.
[13] "Ər-risalətul-quşəyriyyə", səh. 184.
[14] "Ər-risalətul-quşəyriyyə", səh. 184; "Şuabul-iman", 10078.

Əbu Əli: "Səbir adı kimidir»- demişdir.[15]

Əli bin Əbu Talib: "Səbir büdrəməyən minikdir"- demişdir.[16]

Əbu Məhəmməd əl-Cəriri: "Səbir bolluq və qıtlıq hallarının hər ikisində xətir və könlün xoş olmasıdır" - demişdir.[17]

Mən deyirəm ki, bu bəndənin edə biləcəyi iş deyil, eləcə də əmr belə əmr olunmayıb. Çünki Allah-taala təbiətləri bu iki hala görə müxtəlif cür yaradıb. Bəndənin edə biləcəyi iş özünü şikayətlənməkdən çəkindirməsidir, əksinə, onun üçün hər iki halın eyni olması deyildir. Sağlamlıq bəndə üçün səbirdən daha genişdir. Belə ki, Allahın elçisi məşhur duasında: "İlahi, əgər mənə qarşı qəzəbli deyilsənsə, mən çəkdiyim məşəqqət və bəlalara heç əhəmiyyət vermirəm. Çünki Sənin sağlamlıq və lütfün bunlardan çox genişdir"- demişdir[18]. Bu aşağıdakı hədisə zidd deyildir:

"Səbirdən daha xeyirli, səbirdən daha böyük nemət heç kimə verilməmişdir"[19]. Çünki bu hədis qulun başına bir bəla gəldikdən sonra onun üçün səbirdən daha xeyirli nemət olmadığını, birinci hədis isə bəla gəlməmişdən əvvəl, sağlamlıqdan daha xeyirli bir nemətin olmadığını göstərir.

Əbu Əli Dəqqaq deyir: "Səbir qədərə etiraz etməməkdir. Şikayət etməklə bəlanı açıqlamaq səbrə zidd deyil. Allah-taala Eyyub peyğəmbərin: **«...Mənə bəla üz verdi...»** (əl-Ənbiya, 83) dediyi halda: **«...Biz onu səbir edən gördük...»** (Sad, 44)- buyurmuşdur"[20].

Əbu Əli Dəqqaqın "şikayət etməklə" sözünə gəldikdə, şikayət iki növdür. Birinci növü Allaha şikayət etməkdir ki, səbrə zidd deyil. Belə ki, Yəqub: **«...Mənə gözəl səbir gərəkdir...»** (Yusif, 18) deməsinə baxmayaraq «**...Mən dərd-sərimi yalnız Allaha ərz edirəm...»** (Yuslf, 86) demişdir. Və Allah-taala Eyyubu səbirli kimi vəsf etdiyi halda, Eyyub: **«...Mənə bəla üz verdi...»**- demişdir.

Həmçinin Allahın elçisi: "İlahi! Qüvvətimin zəiflədiyini, çarəsiz qaldığımı ancaq sənə ərz edirəm" - demişdir[21].

Musa: "İlahi! Həmd ancaq sənə məxsusdur. Bəlalar ancaq sənə ərz olunur, yardım yalnız səndən istənilir, darda qalanlar yalnız sənə dua edərlər, yalnız sənə təvəkkül olunur, güc və qüvvət ancaq

---

[15] "Ər-risalətul-quşəyriyyə", səh. 185.
[16] "Ər-risatətul-quşəyriyyə", səh. 185.
[17] "Ər-risalətul-quşəyriyyə", səh. 185.
[18] **Hədis zəifdir:** ət-Tabərani, "əl-Kəbir", 13/73/181; əl-Heysəmi, "Məcmuə əz-Zəvaid" (6/35) kitabında demişdir: "Hədisi ət-Tabərani rəvayət edib, rəvayətçilərindən İbn İshaq müdəllisdir".
[19] əl-Buxari, 1469; Müslim, 1053. Əbu Səid əl-Xudrinin rəvayət etdiyi hədisin bir hissəsidir.
[20] "Ər-risalətul-quşəyriyyə", səh. 188.
[21] **Hədis zəifdir:** Yuxarıda zəifliyi bəyan olunmuşdur.

sənindir" - demişdir.

İkinci növü bəlaya uğrayan kimsənin sözlə şikayətidir. Bu şikayət səbri pozur, onunla bir araya sığmır. Sözlə insanlara edilən şikayət Allaha edilən şikayətdən fərqlənir. Bu məsələyə inşaallah şikayət ilə səbrin oxşar və fərqli cəhətlərini öyrənəndə qayıdacağıq.

Deyildi ki, səbir nəfsin qəhrəmanlığıdır. Buna əsasən, bir saat səbir etmək qəhramanlıqdır.

Deyildi ki, səbir fəlakət zamanı qəlbin sabit olmasıdır. Səbir ilə sızlamaq bir-birinə zidd olub biri digərinə qarşı çıxır. Belə ki, Allah-taala cəhənnəm əhli haqqında: **«...İndi ağlayıb sızlasaq da, səbir etsək də, fərq etməz. Bizim üçün heç bir sığınacaq yoxdur!»** (İbrahim, 21) buyurmuşdur. Sızlamaq acizliyin yoldaşı və qardaşıdır, səbir isə ağlın yoldaşı və məhsuludur. Sızlamaqdan "atan" kimdir - deyə soruşduqda, "səbirdir" - deye cavab vermişdir.

Nəfs qulun miniyi olub, onunla Cənnət və ya Cəhənnəmə gedər. Səbir isə bu miniyin yüyəni və cilovu kimidir, bunlarsız özbaşına hər tərəfə gedə bilər.

Həccacın moizələrində qeyd edilmişdir: "Nəfslərinizi çəkindirin, çünki nəfslər bütün pislikləri arzu edər. Allah-taala nəfsinə yüyən və cilov taxıb, onu yüyəni ilə Allahın itaətinə çəkən və cilovuyla günahlardan çəkindirən kimsəyə rəhmət eləsin. Çünki Allahın haram etdiklərinə səbir etmək, əzabına səbir etməkdən daha asandır. Mən deyirəm ki, insanda iki qüvvə vardır. Biri can atma, digəri çəkindirmə qüvvəsidir. Doğru səbir can atma qüvvəsini faydalı şeyə sərf etdirər, çəkindirmə qüvvəsi ilə zərərli şeydən uzaqlaşdırar."

Bəzi şəxslərdə özünə faydalı olanlara səbir etməsi zərərli olanlara səbir etməsindən qüvvətlidir. Belələri ibadət və itaətin məşəqqətinə səbir edər, fəqət yasaq olanlara səbir etməz.

Bəzilərinin qadağalara səbir etməsi ibadət və itaətin məşəqqətinə səbir etməsindən daha qüvvətlidir.

Bəzilərində bunların heç biri yoxdur. İnsanların ən üstün və fəzilətlisi həm ibadət və itaətin məşəqqətlərinə, həm də qadağalara səbir edənidir.

Bir çoxları isti və ya soyuq gecələri ibadət etmə, gündüzləri oruc tutma məşəqqətinə səbir edərlər, lakin harama baxmamağa səbir etməzlər. Bəzisi də haramlara baxmağa səbir edər, lakin yaxşılığı etməyə, pisliklərdən çəkinməyə, kafir və münafiqlərlə döyüşə səbir etməzlər. İnsanların çoxu bunların heç birinə səbir etməz. Bunların hamısına səbir edənlər isə lap azdır.

Deyildi ki, səbir istək və şəhvət qüvvəsinin qarşısında ağıl və din qüvvəsini hakim etməkdir. Yəni təbiətən insan sevdiyi şeyləri əldə etməyə çalışır, ağıl və din qüvvəsi isə buna qarşı çıxır, bunlar

arasında savaş davam edir. Bu savaşın meydanı qulun qəlbi, səbri, şücaəti və səbatıdır.

# ÜÇÜNCÜ BÖLMƏ

## Səbrin əlaqələri (izafələri) ilə yanaşı onun adlarının açıqlanması

İxtiyari və məqbul olan səbir pis arzu və istəklərə səbir etməkdir. Bu səbir əlaqəli olduğu yerlərə görə müxtəlif adlar alır. Belə səbir haram olan tənasül orqanının şəhvətinə görədirsə, buna "namusluluq", əksinə isə "zina" deyilir. Bu səbir mədə şəhvətinə, yeməyə təcili başlamamağa, xoş olmayanları yeməməyə qarşıdırsa, buna "toxgözlülük" əksinə isə "acgözlülük" deyilir. Bu səbir açıqlanmayan, söylənməyən sözlərə görədirsə, buna "sirr saxlama", əksinə isə "söz yayma" və "ifşa etmə" deyilir. Bu səbir dunya malından kifayət edəcəyindən artığını qazanmamağa görə olarsa, buna "zahidlik", əksinə isə "ehtiras" deyilir. Bu səbir dünya malının kifayət miqdarı ilə əlaqəlidirsə, buna "halalla kifayətlənmək", əksinə isə "hərislik" deyilir. Bu səbir əsəbləşməyə qalib gəlmək üçündürsə, buna "yumşaqlıq", əksinə isə "tez əsəbləşmək" deyilir. Bu səbir tələsməyə qarşı olarsa, buna "ciddilik" və ya "səbat", əksinə isə "həlimlik" və ya "qeyri ciddilik" deyilir. Bu səbir döyüşdən qaçmamağa görədirsə, buna "qəhrəmanlıq", əksinə isə "qorxaqlıq" deyilir. Bu səbir intiqam almamaq üçündürsə, buna "əfv" və "bağışlamaq", əksinə isə "qisas almaq" və "cəzalandırmaq" deyilir. Bu səbir müəyyən vaxtda yeməməyə və içməməyə görədirsə, buna oruc tutmaq deyilir. Bu səbir acizliyə və tənbəlliyə qarşıdırsa, buna "bacarıq" və "çalışqan" deyilir. Bu səbir insanlara yük olmamaq və onların yükünü çəkmək üçündürsə, buna "insanlıq" və "mərdlik" deyilir.

Səbir tərk edilən və ya yerinə yetirilən işin aidiyyatına görə müxtəlif adlar alır. Lakin bu adların hamısı "səbir" sözündə ümumiləşir. Buna görə dini məqamların hamısı səbirlə əlaqəlidir. Bu səbir iki nəfər arasında eyni hökm verməklə əlaqəli olursa, buna "ədalət", əksinə isə "zülm" və "haqsızlıq" deyilir. Riza və istəklə vacib və müstəhəb olan bir vəzifəni yerinə yetirməklə əlaqəli olarsa, buna "comərdlik" və ya "səxavət" deyilir. Dinin bütün mərtəbələri buna bağlıdır.

# DÖRDÜNCÜ BÖLMƏ

## Səbir etmək – Səbir etdirmək
## Səbri qazanmaq və tövsiyə etmək

Səbrin adları arasındakı fərq insanın öz vəziyyətinə və başqalarına nisbətən vəziyyətinə görədir. Bir kimsə özünü və nəfsini yaxşı və xoş olmayanlardan asanlıqla çəkindirərsə, buna "səbir" deyilir. Əgər özünü çətinliklə və acıları udaraq çəkindirirsə, buna "tasabbur" məcburi səbir deyilir. Çünki belə sözlər bir şeyi çətinliklə əldə edərkən istifadə olunur. Məsələn, "tahallum" məcburi yumşalmaq, "təcəssü" məcburi qəhrəman, "təkərrüm" məcburi comərdlik, "tahammul" məcburi yüklənmə kimi. Kim özünü səbir etməyə məcbur edər və bunda israrlı olarsa, səbir onun üçün bir xüsusiyyət olar. Belə ki, peyğəmbər hədislərin birində: "Hər kim səbir etmək istərsə, Allah ona səbri bəxş edər"- buyurmuşdur[22]. Kim ismətli olmağa çalışarsa, ismət onun üçün bir xüsusiyyət olur. Digər əxlaqlarda da belədir.

"Əxlaq çalışmaqla qazanılır, yoxsa çalışmağa ehtiyac yoxdur"- sualına görə alimlər ixtilaf etmişlər. Bəziləri dedilər ki, əxlaq çalışmaqla əsla qazanılmaz. Necə ki, bir şair demişdir: "Qəlbdən sizi unutmağı istənildi, lakin qəlblər dəyişikliyi qəbul etməz". Digər şair isə demişdir: "Ey öz xüsusiyyətində olmayan şeylə süslənmək istəyən kimsə, qazanılması istənilən əxlaqın önünə yaradılışdakı əxlaq çıxar". Yəni sonradan əxlaq qazanılmaz. Çünki Allah-taala məxluqatı, əxlaqı, əcəl və ruzini əzəldən təqdir etmişdir.

Bəziləri də dedilər ki, ağlın, yumşaqlığın, comərdliyin, şəhvətin və qəhrəmanlığın qazanıldığı kimi əxlaqın da qazanılması mümkündür. Belə ki, bunlar hərəkət və əməllərdə görünür.

Onlar deyir ki, çalışmaq və məşğul olmaq məharətlə nəticələnir. Yəni kimsə bir şeylə məşğul olursa, o işində davam edərək buna adət edərsə, o şey onun üçün məharət, xasiyyət və xüsusiyyət olar. İnsan əvvəlcə çətinliklə səbir etməyə çalışır, amma sonda səbir onun üçün bir xasiyyət olur. Belə ki, hər kəs həlim,

[22] Əbu Səid əl-Xudrinin rəvayət etdiyi hədisin bir hissəsidir. Bax: 14-cü səhifə, 19-cu qeyd.

təmkinli, vüqarlı, intizamlı və mətin olmaq üçün cəhd göstərirsə, nəticədə bunlar onun üçün yaradılışındakı təbii əxlaqi keyfiyyətləri kimi olur.

Onlar deyir ki, Allah-taala insanda qəbul etmə və öyrənmə bacarığı və istedadı yaratmışdır. O halda xasiyyətləri dəyişmək mümkündür. Ola bilər ki, bəzən bu dəyişiklik zəif olduqda kiçik bir təsirlə insan öz təbii halına qayıdır, bəzən də qayıtmır, amma təsir güclü olduqda qayıdır. Bu dəyişiklik bəzən o qədər sağlam olur ki, insan köhnə xasiyyətinə dönmür.

"İstibar" kəlməsi "təsabbur" kəlməsindən daha mübaliğəlidir. "Təsabbur" “istibar”ın başlanğıcıdır. "Təsabbur" səbir etməyə başlayıb davam etməkdir. "İstibar" isə səbrin xasiyyət halına çevrilməsidir. "Musabərə" kəlməsi "müfaalə" növündəndir. Bu növ fellərin əksəriyyəti iki nəfər arasında cərəyan edir. ("Müşatimə" - söyüşmə, "mudarəbə" - döyüşmə kimi). Belə ki, Allah-taala: **«Ey iman gətirənlər!** (Dində vacib olan hökmləri yerinə yetirməyin zəhmətinə, düçar olduğunuz bəlalara) **səbir edin,** (Allahın düşmənlərinə qələbə çalmaq uğrundakı müharibə və döyüşlərdə sizə üz verən müsibət və çətinliklərə) **dözün,** (sərhəd boyu növbədə durub cihada) **hazır olun və Allahdan qorxun ki, bəlkə, nicat tapasınız!»** (Ali-İmran, 200) buyuraraq öncə səbri əmr etmişdir. Çünki bu səbir insanın öz nəfsinə qarşı olan səbirdir. Sonra düşmənlərə qarşı olan səbri- "musabərə"ni, axırda isə "murabata"nı, - yəni səbir və "musabərə"də səbat etməyi, davam etməyi və bunlardan ayrılmamağı əmr etmişdir.

İnsan bəzən öz nəfsinə qarşı səbir edir, lakin düşmənə qarşı səbir etmir. Bəzən də düşmənə qarşı da səbir edir, fəqət bu səbri davam etdirmir. Bəzən də bu səbri düşmənə qarşı davam da etdirir, lakin təqva sahibi ola bilmir. Halbuki, Allah-taala bunların hamısına təqvalı olanın malik və sahib olduğunu, qurtuluşun da təqvaya bağlı olduğunu xəbər verərək ayənin axırında: **«...Allahdan qorxun ki, bəlkə, nicat tapasınız!»** buyurmuşdur.

"Murabata" vətən sərhədlərini görünən düşmənlərin hücumlarından daim qorumaq olduğu kimi, qəlbin sərhədlərini də görünməyən heyvanın və şeytanın girməsindən daim qorumaqdır. Əks təqdirdə şeytan sərhəddən girib qəlbi məmləkətindən çıxarar.

# BEŞİNCİ BÖLMƏ

## Yerlərinə görə səbrin növləri

Səbir iki qisimdir: biri bədənin, digəri nəfsin səbri. Bunlar da hər biri ixtiyari və məcburi olmaqla iki növdür. Buna görə səbrin dörd növü var:

1. Bədənin ixtiyarı səbri. Bu, insanın öz iradə və ixtiyarı ilə bədəninə yükləmiş olduğu ağır işlərə olan səbridir.

2. Bədənin məcburi səbri. Bu, başqasının etdiklərinə olan səbridir. İnsanın döyülmə, xəstəlik, yaralar, soyuq, isti və oxşar şeylərin acılarına, sızıntılarına olan səbridir.

3. Nəfsin ixtiyari səbri. Bu, şəriət və ağılla gözəl olmayanları etməməyə olan səbirdir.

4. Nəfsin məcburi səbri. Bu da sevgilisinə qovuşması mümkün olmadıqda nəfsin ona səbri kimidir.

Səbrin bu dörd növü insana məxsusdur. Fəqət bədənin və nəfsin məcburi səbrində heyvanlar da buna ortaqdır. Üstəlik heyvanların bir qismi bu səbirdə insanlardan daha qüvvətlidir. İnsanlar heyvanlardan ancaq səbrin ixtiyari qisimlərində fərqlənirlər. İnsanlardan bir çoxları heyvanlarla ortaq olan səbrin qisimlərində asanlıqla səbir edər, amma yalnız insanlara məxsus olan səbrin qisimlərinə isə səbir etməzlər.

"Səbirdə cinlər də insanlarla eynidirmi" sualına cavab olaraq demək olar ki, eynidirlər. Çünki səbir, əmr və nəhylərdən (qadağalardan) ibarət dini vəzifələrin yerinə yetirilməsinin vacibatlarındandır. Yəni biz mükəlləf olduğumuz kimi, cinlər də əmrləri yerinə yetirməyə, qadağalardan çəkinməyə mükəlləfdirlər. "Cinlər də bizim kimi mükəlləfdirlər yoxsa başqa cür?"- deyə soruşularsa, demək olar ki, sevmə, iman, təsdiq, dostluq və düşmənçilik kimi nəfsi vacibatlarda onlar da bizimlə eynidirlər. Fəqət cünubluqdan yuyunma, dəstəmazda əzaları yuma, təharət etmə, sünnət olma, heyzdən yuyunma kimi bədənlərin vacibatlarında bizim kimi mükəlləf olmaları lazım deyil. Onlar öz yaradılışlarına və yaşayışlarına uyğun bir tərzdə mükəlləfdirlər.

"Səbrin növlərindən hər hansı birində mələklər də bizə ortaqdırmı?" sualına cavab olaraq demək olar ki, mələklər ağılları və dinlərinə zidd olan həvəs və istəkləri ilə və nəfslə imtahan edilmirlər.

İbadət və itaət onlar üçün bizim nəfəs almağımız kimidir. Həvəs və şəhvət gücü qarşısında din və ağıl gücünü hakim etməkdən ibarət olan gerçək səbir onlara aid deyil. Lakin onlara da layiq bir səbir var ki, o da özlərinə qarşı çıxacaq istək, şəhvət və xüsusiyyətlərinə rəğmən yaradılmış olduqları fitrət üzrə davam və səbat etmələridir.

İnsanın səviyyəsi, onun səbri istək və şəhvət gücünə üstün gəlirsə mələklərin, əksinə istək və şəhvət gücü səbrinə üstün gəlirsə şeytanların, yəmək, içmək və cinsi münasibət kimi xasiyyətlərinin gücü səbrə üstün gəlirsə, heyvanların səviyyəsi ilə eyniləşir.

Qatədə[23] demişdir: "Allah-taala mələkləri şəhvətsiz və ağıllı, heyvanları ağılsız və şəhvətli, insanları isə həm şəhvətli, həm də ağıllı olaraq yaratmışdır. Buna görə kimin ağlı şəhvətinə üstün gəlirsə, o mələklərlə, əksinə şəhvəti ağlına üstün gəlirsə o heyvanlarla bərabərdir."

İnsanda doğulduğu zaman yalnız o an üçün möhtac olduğu yemə və içmə arzusu vardır. Bu haldakı səbri heyvanların səbri kimidir. Yaxşı və pisi fərqləndirə bilmə yaşından əvvəl insan üçün ixtiyari səbir yoxdur. Sonra oyun arzusu yaranır. Bununla zəif də olsa ixtiyari səbir inkişafa başlayır, sonra cinsi arzu hərəkətə gəlir və ixtiyari səbir inkişaf etmiş və güclənmiş olur. Daha sonra ağlın sultanı hərəkətə gəlməklə güclənir və səbir ordusundan yardım istəyir. Fəqət bu ağıl sultanının ordusu, istək sultanının ordusuna qarşı dura bilmir. Sonra yaxşı və pisi ayırd edəcək yaşda hidayət nurunun işıltıları qırpışmağa başlayır, tədricən inkişaf edir və yetkinlik çağında təkmilləşir. Bu eyni ilə dan yerinin sökülərək, aydınlığın tam artması kimidir. Səbir, ağıl və hidayət işıltıları axirətin fayda və zərərlərini anlamağa kifayət etməsə də, dünyanın bəzi fayda və zərərlərini qavramağa kömək edir.

Bundan sonra insan üzərinə peyğəmbərlik və risalət günəşi doğur. Onun aydınlığında dünya və axirətin təfsilatı ilə fayda və zərərlərini və nəticələrini görür, mübarizə üçün zirehini geyinir, növbənöv silahları alır, sonra xasiyyət və istək qüvvələri ilə ağıl və hidayət qüvvələri arasında sürən savaşa qatılır. Allah-taalanın yardım etdiyi tərəf zəfər çalır, yardım etmədiyi tərəf isə məğlub olur. İnsan bu iki tərəfdən birində öz yerini almadıqca silahlar yerə qoyulmur. O, bu dünya ilə axirətdən hansı üçün yaradılmışsa orada yerini alır.

[23] - radıyallahu anhu (Allah ondan razı olsun). İrəlidə yazılmayacaq, nəzərdə tutulacaq.

# ALTINCI BÖLMƏ

## Güclü və zəif olmasına görə səbrin növləri

İstək və dini qüvvələr üç cür münasibətdə ola bilər:

**Birinci halda** dini güc istək ordusuna qalib gəlir. Bu da dini gücün istək ordusunu məğlub edərək təmizləri azad etməsidir. Bunu ancaq səbirlə əldə etmək olar. Bu mərtəbəyə ancaq dünya və axirət zəfərini qazananlar çatırlar. Bunlar: **«Şübhəsiz: "Rəbbimiz Allahdır!" - deyən, sonra da düz olan kəslərə mələklər nazil olub: "Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin! Biz dünyada da, axirətdə də sizin dostlarınızıq"»** (Fussilət, 30-31)- dedikləri kimsələrdir. Bunlar: «Allah səbir edənlərlədir» və «Allah yolunda lazımınca cihad edənlərdir» şərəfinə nail olub tam mənası ilə hidayətə yetişənlərdir.

**İkinci hal** istək gücünün dini gücə qalib gəlməsidir. Bu birinci halın əksinə olaraq istək gücünün qalib gəlməsi və dini gücün tamami ilə savaş meydanından silinməsidir. Bu şəraitdə güclü və qalib gələn istək insanı şeytana və onun ordusuna təslim edir. Onlar da onu istədikləri yerə sürükləyir. O insan bu zaman iki vəziyyətdən birində ola bilər. Birincisi, həmin şəxsin onların ordusundan və onlara uyanlardan olmasıdır ki, bu vəziyyət aciz və zəif kimsənin vəziyyətidir. İkincisi, şeytanın o insanın ordusundan olmasıdır ki, bu vəziyyət güclü, hökmü altına alan, bidətə dəvət edən, özündən razı, haram və günaha dalan fasiq kimsənin vəziyyətidir. Belə ki, bu dəstədən olanlardan biri belə demişdir: "Mən şeytanın ordusunda bir nəfər idim. O qədər yüksəldim ki, şeytan mənim ordumda bir nəfər oldu."

Şeytan və onun ordusu belələrinin köməkçilərindən, onlara tabe olanlardan olurlar. Bunlar şəhvətləri özlərinə üstün gəldiklərindən axirəti verib, dünya həyatını satın alan bədbəxtlərdir. Bunlar bu hala səbirdən iflas etdikləri üçün düşmüşlər. Bu hal insanın nə qatlana və nə də dəf etməyə qüdrəti kifayət etməyən güclü və məşəqqətli bir haldır. Bu hal insanın ölənə qədər ağırlıq və çətinliklər içində qıvranıb qalması halıdır. Bu hal insanın iradəsinə görə Allahın əzəli hökmünün təzahürüdür. Bu, insanda düşmənin sevinciylə ortaya çıxan üzüntü və kədəridir ki, vicdanda meydana gələn üzüntülü əzabların ən şiddətlisidir. Bu hal sahibinin ordusu hiylə,

aldatma, boş arzu və istəklər, şeytan, xeyir işlərə yer verməmək, hirs, tamah və dünyanı axirətdən üstün tutmaqdır. Bu hal sahibi haqqında Allahın elçisi belə buyurmuşdur: "Aciz, nəfsinin arzularına uyaraq Allaha ümidlər bağlayan kəsdir"[24].

Bu hal sahibləri cürbəcürdür. Kimi Allah və rəsulu ilə müharibə edərək peyğəmbərin gətirdiklərini mənasız saydıqları kimi, Allahın yolunu da əyri yol kimi göstərərək insanları ondan aralayırlar.

Kimi Allahın elçisinin gətirdiklərindən üz çevirərək dünyaya yönəlir. Kimi həm kafir, həm də müsəlman kimi görünərək münafiq olur. Kimisi zarafat, əyləncə və oyunla ömrünü başa vurur. Kimisinə də nəsihət verdikdə: "Ah, bircə tövbə edə bilsəydim, amma bu mənim üçün çox çətindir, artıq mənə ümid yoxdur"- deyər. Kimi: "Allah-taalanın mənim namazıma, orucuma ehtiyacı yoxdur, mən əməlimlə qurtula bilmərəm, Allah bağışlayandır, rəhmlidir"- deyər. Kimi: "Günahı tərk etmək, Allahın əfvini və bağışlamasını kiçik tutmaqdır"- deyir. Belələrindən biri demişdir: "Onsuz da Kərim olan Allahın hüzuruna gedəcəyik, nə qədər istəyirsən günah et". Kimi dənizdə boğularkən barmağını qurtarmaq ona fayda vermədiyi kimi: "Mənə də günahlarımın yanında ibadət və itaətim fayda verməz"- deyərək, Allahın rəhmətindən ümidini kəsir. Kimi: "Ölüm mənə yaxınlaşanda tövbə edərəm, tövbəm qəbul olunar"- deyir. Beləliklə, bu kimi ağılları şəhvətlərinin əlində əsiri olan aldanmış dəstə, şəhvani istəklərinə çatmaq üçün ağıllarını hiylə yollarını araşdırmağa sərf edirlər. Belələrinin ağlı, kafirin əlindəki müsəlman əsir kimi şeytanın əsiri olmuşdur. Kafir o müsəlman əsiri donuz otarmada, şərab işlərində və xaç gəzdirmədə istifadə etdiyi kimi, şeytan da onun ağlını pis işlərdə istifadə etdirir. Ağlını məğlub etdirərək düşmənə təslim olan kəsin Allah dərgahında yeri müsəlmanı yaxalayıb düşmənə satan və təslim edənin yeri kimidir.

## Fəsil

Burada incə bir məqam vardır ki, bunun yaxşıca düşünülərək anlaşılması üçün qəlbin saflaşdırılması lazımdır. O da bu aldanmış kimsənin özünün şanını, şərəfini, qədrini yüksəldərək bütün məxluqatdan üstün tutan və Allahın sultan olaraq yaratdığı ağlı ən böyük düşməni olan şeytana təslim edərək, onun qəhəri, idarə və

[24] **Hədis zəifdir:** ət-Tirmizi, 2459; İbn Macə, 4260; Əhməd, 4/124; əl-Hakim, 1/57.

hökmünə əsir etməsidir. Bu səbəbdən Allah-taala da əslində haqqı ümidsizlik olan şeytanı aldanmış kimsəyə hakim etmiş və onun hökmranlığına məhkum etmişdir. Şeytan onu istədiyi yerə aparır, onunla həm özü, həm də ordusu və tərəfdarları rişxənd edirlər. Bu adam özünə min bir işkəncə verən ən böyük düşməninə nəfsini təslim etdirən kimidir. Halbuki, bu kimsənin düşmənini məğlub edərək, əsir alıb ondan intiqam alması lazım olduğu halda ona qarşı savaşı buraxıb təslim olduğundan Allah-taala cəza olaraq şeytanı ona yönəltmişdir. Belə ki, Allah-taala: **«Quran oxumaq istədiyin zaman məlun Şeytandan Allaha sığın! Həqiqətən, iman gətirib yalnız öz Rəbbinə təvəkkül edənlərin üzərində Şeytanın heç bir hökmü yoxdur. Şeytanın hökmü yalnız ona itaət edib Allaha şərik qoşanlar üzərindədir»** (ən-Nəhl, 98-100)- buyurmuşdur. Allah-taala burada şeytanın öz dostları üzərində hakimiyyətinin olduğunu isbat etdiyi halda aşağıdakı ayələrdə bunun əksini bildirir:

**«İş bitdikdə** (cənnətliklər Cənnətə, cəhənnəmliklər də Cəhənnəmə daxil olduqda) **Şeytan** (onu məzəmmət edən kafirlərə) **belə deyəcək: Allah sizə** (pis əməllərinizə görə Cəhənnəmə düşəcəyiniz barədə) **doğru vəd vermişdi. Mən də sizə** (kömək edəcəyim haqda) **vəd vermişdim, amma sonra vədimə xilaf çıxdım. Əslində mənim sizin üzərinizdə heç bir hökmüm** (sizi özümə tabe edəcək heç bir qüdrətim) **yox idi. Lakin mən sizi** (günah işləməyə, Allaha asi olmağa) **çağırdım, siz də mənə uydunuz. İndi məni yox, özünüzü qınayın. Nə mən sizin dadınıza çata bilərəm, nə də siz mənim dadıma...»** (İbrahim, 22);

**«İblisin onlar haqqındakı zənni düz çıxdı.** (İçərilərindən) **bir dəstə mömin istisna olmaqla, hamısı ona uydu. Əslində** (İblisin) **onlar üzərində heç bir hökmü yoxdur. Lakin Biz axirətə inananla ona şəkk edəni ayırd edib bilmək üçün** (İblisə bu imkanı verdik)**»** (Səba, 20-21).

Şeytanın onlar üzərində hakimiyyətinin olması və olmaması iki istiqamətlidir. Birinci istiqamətə görə insanlar şeytana itaət etməklə və onu dost etməklə ona hakimiyyət imkanı və fürsəti vermişlər. O da bunun sayəsində onlara hakim olaraq, onlarla istədiyi kimi oynama və istədiyi yerə sürükləmə imkanı və fürsəti tapmışdır. O halda təsdiqlənən hakimiyyət insanların ona itaət etmələri ilə və onu dost etmələri ilə ona verdikləri imkan və fürsətdir. Olmayan hakimiyyət isə sənəd və dəlil hakimiyyətidir. Yəni İblisin insanlar üzərində hakimiyyət qurması üçün sənədi və dəlili yoxdur. Amma o, onları sənəd və dəlilsiz çağırmasına rəğmən, onlar buna baxmadan bu çağırışı qəbul etmişlər.

İkinci istiqamət Allah-taalanın başlanğıcda şeytana qəti olaraq

hakimiyyət verməməsidir. Lakin insanlar ona itaət etməklə, onun ordusuna və firqəsinə qoşulmaqla onu özlərinə hakim etmişlər. O, öz-özünə öz gücü ilə onlara hakim ola bilmir. Ona görə o hiyləgərdir. Onun hakimiyyəti insanların iradə və ixtiyarı ilədir.

**Üçüncü hal** dini güclə istək gücünün növbələşməsidir. Yəni bu iki güc arasındakı savaş bunlardan hər birinin bəzən lehinə, bəzən də əleyhinə olur. Heç biri digərini tamamilə məğlub edə bilmir. Bu hal yaxşı əməli ilə pis əməli qarışdıran əksər möminlərin halıdır.

Qiyamət günündə də insanların halları bu dünyadakı bu üç hala uyğun olacaqdır. İnsanlardan kimi Cəhənnəmə girmədən Cənnətə girəcəkdir, kimi Cəhənnəmə girib Cənnətə girməyəcəkdir. Kimi də Cəhənnəmə girib sonra Cənnətə girəcəkdir.

İnsanların sağlam və xəstə olmaları da bu üç hal üzrədir. Kiminin qüvvəti xəstəliyinə müqavimət göstərərək onu məğlub edir, üstünlük qüvvətin olur. Kiminin isə xəstəliyi qüvvətini məğlub edər, bu dəfə üstünlük xəstəliyin olar. Kiminin də xəstəliyi və qüvvəti arasındakı savaş növbələşərək sürər. Belə adam bəzən yaxşı, bəzən də xəstə olur.

## Fəsil

İnsanlardan bəzisi çətinliklə səbir edir. Bu hal bir kimsənin güclü bir kəslə güləşib onu çətinliklə yıxmasına bənzəyir. Kimi də asanlıqla səbir edər. Bunun halı zəif bir şəxslə güləşib onu asanlıqla yıxmağa bənzəyir.

ər-Rəhmanın (Allahın- tərc) ordusu ilə şeytanın ordusu arasındakı güləş də belədir. Hər kim şeytanın ordusunu yıxarsa Şeytanı yıxmış olur.

İbn Məsud demişdir: "İnsanlardan biri cinlərdən biriylə qarşılaşarkən güləşmişlər. İnsan cini yıxmışdır. Bu zaman o adam cinə: "Səni zəif görürəm"- demişdir. O da: "Amma mən cinlər arasında qüvvətliyəm"- demişdir".

Səhabələr: "O, Ömər bin Xəttabdırmı?" - deyə soruşduqda, İbn Məsud da: "Ömərdən başqa kim ola bilər"- deyə cavab vermişdir[25].

Səhabələrdən bəziləri belə demişdir: "Səfərə çıxmaqla dəvənizi zəiflətməniz, gücdən salmanız kimi şübhəsiz, mömin də şeytanını zəiflədir".

Saleh sələflərdən İbn Əbi əd-Dünya belə nəql edir: "İki şeytan

[25] **Hədis səhihdir:** İbn Əbi əd-Dünya, "Məkəid əş-Şeytan", 63.

görüşərkən biri digərinə: "Səni çox zəif və gücsüz görürəm"- deyir. O da: "Heç soruşma. Elə bir adama rast gəlmişəm ki, yeməyə başlayarkən "bismilləh" deyir, mən yeyə bilmirəm. Su içərkən "bismilləh" deyir, mən içə bilmirəm. Evinə girərkən "bismilləh" deyir, mən bayırda gecələyirəm".

Sonra birinci şeytan belə deyir: "Mən isə elə bir adamlayam ki, yeməyə başlayarkən "bismilləh" deməz, mən onunla yeyirəm. Su içərkən "bismilləh" deməz, mən onunla içirəm. Evinə girərkən "bismilləh" deməz, mən onunla evə girirəm. Qadını ilə cinsi əlaqədə olarkən "bismilləh" deməz, bir yerdə olarıq"[26].

Səbrə adət edən kimsədən düşməni qorxar. Səbir etmək kimə çətin gələrsə, düşməni onu öz başına qoymayıb məqsədinə çatar.

[26] **Sənədi zəifdir:** Abdurrəzzaq, "əl-Musənnəf", 19560.

# YEDDİNCİ BÖLMƏ

## Əlaqəli olduğu mövzulara görə səbrin növləri

Əlaqəli olduğu mövzulara görə səbrin üç növü var:

1. Əmrləri, ibadət və itaətləri yerinə yetirməyə edilən səbir.
2. Qadağan və şəriətə uyğun olmayanları etməməyə olan səbir.
3. Qəza və qədərə edilən səbir.

Şeyx Abdulqadir «Futuhul-qeyb» adlı əsərində səbrin bu üç növü haqqında belə demişdir: "İnsan üçün yerinə yetirəcəyi bir əmr, çəkinəcəyi bir qadağan və səbir edəcəyi bir qədər mütləq lazımdır". Bu mövzunun açıqlanması Allah-taala və insan kimi iki tərəflə əlaqəlidir.

Allah-taala ilə əlaqəli tərəfinə baxaq.

Allahın qulları üzərində iki hökmü vardır. Biri şəri və dini, digəri isə yaradılışla (kainatla) bağlı və qədəridir. Şəri hökm Allahın əmriylə əlaqəlidir. Yaradılışla bağlı və qədəri hökm isə Allahın yaratmasıyla əlaqəlidir. Çünki yaratmaq və əmr etmək yalnız Allaha məxsusdur.

Allah-taalanın dini hökmü tələb olunan (istənilən) şeyə görə iki növdür. Birincisi tələb edilən şey sevimli olduğundan icrası istəniləndir. Bu ya vacib, ya da müstəhəb olur. Bunların icrası ancaq səbirlə tamamlanır. İkincisi isə tələb edilən şey sevilmədiyi üçün icrası istənilməyəndir. Bu ya haram, ya da məkruh olur. Bunların da icrası səbirə bağlıdır. Beləliklə, bunlar Allahın şəri və dini hökmləridir.

Allah-taalanın kainatla bağlı və qədəri hökmünə gəldikdə isə bu insanın hər hansı bir təsiri olmadan Allahın öz qulu üzərinə qəza və öncədən müəyyənləşdirdiyi müsibətlərdir. Qulun bu müsibətlərə səbir etməsi fərzdir. Bəs bu müsibətlərə razı olmaq vacibdirmi? Bu məsələdə alimlərin iki fikri var. Bu fikirlər imam Əhmədin məzhəbində iki yönlüdür. Ən doğru olan fikrə görə razılıq müstəhəbdir.

Dinin təməli bu üç əsasdan ibarətdir: əmr edilənlərin icrası, qadağaların tərk olunması, təqdir olunmuşlara səbir etmək.

İndi isə insanla əlaqəli tərəfinə baxaq.

Qul mükəlləf olduğu müddətdə yuxarıdakı üç əsasdan ayrıla bilməz və mükəlləf olduğu tapşırıqdan azad olmadıqca bu üç əsas ona

aiddir. Buğdanın sünbülü gövdə üzərində yüksəldiyi kimi, əmrlərdən, nəhylərdən və qədərdən ibarət olan vəzifələr də yalnız səbir təməli üzərində yüksəlir.

İstər Allahın əmriylə olan ibadət və itaətlər, istər Allahın yaratmasıyla olan qəzavü-qədər, istərsə də Allahın etdiyi qadağalar, hamısı səbrə bağlıdır.

İbn Teymiyyə daim bu üç əsas üzərində duraraq belə deyirdi: "Ey oğlum! Əmr edilənləri yerinə yetir, haramlardan və qadağalardan qaç və qədərinə səbir et". Belə ki, həzrəti Loğman da oğluna bu cür nəsihət etmişdir: **«Oğlum! Namaz qıl,** (insanlara) **yaxşı işlər görməyi əmr et, pis işləri qadağan elə.** (Bu yolda) **sənə üz verəcək müsibətlərə döz. Həqiqətən, bu** (dediklərim) **vacib əməllərdəndir!»** (Loğman, 17). Loğmanın oğluna “yaxşı işləri əmr et, pis işləri qadağan elə" ifadəsi oğlunun yaxşılığı həm özünün etməsi, həm də başqalarına əmr etməsini və pisliklərdən həm özünün çəkinməsi, həm də başqalarını çəkindirməsini bildirir. Çünki əmr edən və çəkindirən bir kəsin əmr etdiyini özü etmədikcə, qadağalardan özü çəkinmədikcə bu doğru olmaz. Belə ki, Allah-taala bu üç əsası ayədə aydınlaşdırır: **«Rəbbindən sənə nazil edilənin haqq olduğunu bilən kimsə korla eyni ola bilərmi? Yalnız ağıl sahibləri öyüd-nəsihət qəbul edərlər! O kəslər ki, Allaha verdikləri vədi yerinə yetirər və əhdi pozmurlar. O kəslər ki, Allahın birləşdirilməsini əmr etdiyi şeyləri birləşdirir, Rəbbindən və pis haqq-hesabdən qorxurlar. Və o kəslər ki, Rəbbinin razılığını qazanmaq üçün səbir edir, namazı layiqincə qılır, onlara verdiyimiz ruzidən gizli və aşkar xərcləyir, pisliyin qarşısını yaxşılıq etməklə alırlar...»** (ər-Rəd, 19-22). Ayədə edilən vəsflərdə islam və iman məsələləri toplandığından Allah-taala onları verdikləri əhdi yerinə yetirmələriylə öymüşdür. Çünki bu əhddə həm dinin zahiri, həm batini, həm Allahın haqqı, həm də məxluqatın haqqı əhatə olunmuşdur. Onlar özləriylə tək və şəriki olmayan Rəbbləri arasındakı vəzifələrinə riayət edərək ibadət və itaətlərini lazımınca yerinə yetirməyə çalışırlar. Allaha yönəlib ona təvəkkül edərlər. Onu sevərlər, Ondan qorxarlar, Onun rəhmətini umaraq tövbə edərlər. Ona boyun əyərək müti olarlar. Onun nemətlərini etiraf edərək şükür edərlər, xata və günahlarını qəbul və təsdiq edərək bağışlanma diləyərlər. Bütün bunlar Allah-taala ilə qulları arasındakı bağlarıdır. Allah-taala özü ilə qulları arasındakı bağların davam etməsi üçün yuxarıdakıların yerinə yetirilməsini əmr etmişdir.

Allah-taala bizimlə elçisi arasında daimi bağların olmasını da əmr etmişdir. O da Allahın elçisinə iman edərək onu təsdiq etməyimiz, hər şeydə onu hakim təyin edib hökmünə razı olaraq

təslim olmağımız, ona olan məhəbbəti özümüzə, övladımıza, valideynlərimizə və bütün insanlara olan məhəbbətdən üstün tutmağımızdır. Deməli, Allahın və elçisinin haqqını layiqincə yerinə yetirmək bu əhdə daxildir.

Allah-taala bizə valideynlərimiz və qohum-əqrəbamıza yaxşılıq etməyi və onlarla aramızdakı əlaqələri qorumağımızı əmr etmişdir. Beləliklə, bunlar da Allahın ayədə yerinə yetirəcəyimiz əmrlərindəndir.

Allah bizə qadınlarımızın haqqını gözləyərək, onlarla yaxşı davranmağı əmr etmişdir.

Həmçinin, Allah-taala bizimlə tabeçiliyimizdə olanlar arasında yediyimizdən onları yedirərək, geydiklərimizdən onları da geydirərək, etməyəcəyimiz işləri onlara tapşırmayaraq bağlantı yaratmağı əmr etmişdir.

Həmçinin, Allah-taala bizimlə yaxın və uzaq əqrəbalarımızın arasında özümüzü, ailəmizi, mallarımızı mühafizə etdiyimiz kimi, onları da, ailələrini də, mallarını da mühafizə edib, haqlarına riayət edərək bağlantı yaratmağı əmr etmişdir.

Eyni ilə səfərdə olarkən yoldaşlarımızın haqlarına riayət etməyi, aramızda bağlantı yaratmağı əmr etmişdir.

Allah-taala bizimlə bütün insanlar arasında da onların bizə necə münasibətdə olmalarını arzu ediriksə, bizim də onlarla eyni münasibət də olmağımızla bağlantı yaratmağı əmr etmişdir.

Bizimlə insanların etdiklərini yazan mələklər arasında da, yanında təzim və hörmət edəcək bir kəs olarkən ondan utanıb günah işləməyən kəs kimi, mələklərdən də utanaraq günah işlətməkdən çəkinməklə bağlantı yaratmağı əmr etmişdir. Beləliklə, bunların hamısı Allahın yerinə yetirəcəyimiz əmrlərindəndir.

Allah-taala sadaladıqlarımız bağlantıları yerinə yetirməyə sövq edənin Qiyamət günündəki hesabın şiddətindən Allah qorxusu ilə qorxmaları olduğunu açıqlamışdir. Allahın əmr etdiyi bu bağlantıları ancaq Allahdan qorxanlar edərlər. Bir insanın qəlbindən Allah qorxusu çıxarsa, bu bağlantılar da qırılar.

Allah-taala bağlantıların da, Allah qorxusu ilə qiyamət günündəki hesabın şiddətindən qorxmanın da səbirlə əlaqəli olduğunu açıqlayaraq: **«...Və o kəslər ki, Rəbbinin razılığını qazanmaq üçün səbir edir...»** (ər-Rəd, 22)- buyurmuşdur. Allah-taala səbrin yalnız Öz rizası üçün edildiyini bildirdikdən sonra, insanların səbir etmələrinə ən böyük yardımçının namaz olduğunu qeyd edərək: **«...namazı layiqincə qılır...»** (ər-Rəd, 22)- buyurmuşdur.

Dünya və axirət işlərində ən böyük yardımçının namaz ilə səbir

olduğunu Allah-taala ayələrdə bəyan etmişdir: **«Səbir etmək və namaz qılmaqla** (Allahdan) **kömək diləyin! Bu, ağır iş olsa da** (Allaha) **itaət edənlər üçün ağır deyildir»** (əl-Bəqərə, 45);

«**Ey iman gətirənlər! Səbir və dua ilə** (namazla Allahdan) **kömək diləyin. Çünki Allah səbir edənlərlədir»** (əl-Bəqərə, 153).

Allahın əhdini yerinə yetirənlər belə olurlar:

- onlar özlərinə səbir və namazla yaxşılıq edərlər;

- başqalarına da mallarını verərək yaxşılıq edərlər;

- avamlar onlara pislik etdikdə pisliklə deyil, əksinə yaxşılıqla cavab verərlər.

Çünki uca Allah: **«...pisliyin qarşısını yaxşılıq etməklə alırlar...»** (ər-Rəd, 22)- buyurmuşdur. Ayədəki "yədraunə" kəlməsini "onlar bir günah işlədikdə, o saat ardınca yaxşı əməl edərək günahlarını əfv etdirməyə çalışarlar" kimi təfsir etmişlər. Belə ki, Allah-taala: **«...Həqiqətən, yaxşı əməllər pis işləri yuyub aparır...»** (Hud, 114)- buyurmuşdur. Peyğəmbər hədislərin birində demişdir: "Bir pisliyin ardınca bir yaxşılıq et ki, pisliyi (günahı) yusun "[27].

Nəticə olaraq demək olar ki, ayənin mövzusu iki cürdür. Birinci Allahın əhdini yerinə yetirənlər özlərinə bir pislik edildiyində pisliyi yaxşılıqla əvəz edərlər. İkinci isə bir günah işlətdiklərində onu əfv etdirmək üçün o saat ardınca bir yaxşı əməl edərlər.

Bu ayələr əmr edilənlərin yerinə yetirilməsinə, haram və qadağaların tərk edilməsinə, qəzavü-qədərə səbir edilməsinə şamil olduğu üçün islam və iman məsələlərinin hamısını əhatə edir. Allah-taala bu üç əsası aşağıdakı ayələrdə qeyd etmişdir:

**«Bəli, əgər səbir edib** (Allahdan) **qorxsanız, onlar qəzəblə üstünüzə gəldikləri zaman Rəbbiniz artıq beş min nişan qoyulmuş mələklə sizə yardım edər»** (Ali-İmran, 125);

«... **Kim Allahdan qorxub pis əməllərdən çəkinsə və səbir etsə,** (bilsin ki) **Allah yaxşı işlər görənlərin mükafatını əsla zay etməz!...»** (Yusif, 90);

**«Ey iman gətirənlər!** (Dində vacib olan hökmləri yerinə yetirməyin zəhmətinə, düçar olduğunuz bəlalara) **səbir edin,** (Allahın düşmənlərinə qələbə çalmaq uğrundakı müharibə və döyüşlərdə sizə üz verən müsibət və çətinliklərə) **dözün,** (sərhəd boyu növbədə durub cihada) **hazır olun və Allahdan qorxun ki, bəlkə, nicat tapasınız!»** (Ali-İmran, 200).

Harada "təqva" kəlməsi "səbir" kəlməsi ilə bərabər qeyd edilirsə, bu əmr edilənlərin yerinə yetirilməsinə, haram və

[27] **Hədis səhihdir**: ət-Tirmizi, 1987; Əhməd, 5/228, 236; İbn Əbi Şeybə, "əl-Musənnəf", 8/516-517; ət-Tabərani, "əl-Əvsat", 3779; Əbu Nəim, "əl-Hilyə", 4/376; Vəki'i, "əz-Zühd", 1073.

qadağaların tərk edilməsinə, qəzavü-qədərə səbir edilməsinə də şamil olur. Çünki təqvalı olmağın mahiyyəti əmr edilənlərin yerinə yetirilməsi ilə haram və qadağaların tərk edilməsindən ibarətdir.

# SƏKKİZİNCİ BÖLMƏ

## Bağlı olduğu beş hökmə görə səbrin növləri

Səbrin vacib, məndub (məsləhət görülən), haram, məkruh və mübah kimi beş növü var.

**Vacib** səbir də üç növdür:

1. Haram və qadağalara qarşı edilən səbir;

2. Fərz və vaciblərin yerinə yetirilməsinə edilən səbir;

3. Xəstəlik və kasıblıq kimi insanın iradəsindən asılı olmayan müsibətlərə qarşı edilən səbir.

**Məndub** səbir məkruhlara qarşı edilən və müstəhəblərin yerinə yetirilməsinə edilən səbirdir. Özünə başqası tərəfindən edilən zərərin mislini edib, artığını etməmək belə səbirdir.

**Haram** olan səbrin bir neçə növü vardır. Yeməyib, içməyib ölənə qədər edilən səbirdir.

İmam Tavus və imam Əhməd demişlər ki: "Hər kim aclıqdan çarəsiz qalıb, ölmüş heyvan ətini və qanını yeməyib ölürsə cəhənnəmə girər". Əgər "dilənməkdən başqa çarəsi olmayan kimsənin dilənməyib səbir etməsinin hökmü nədir»- deyə soruşularsa, iki cür cavab vermək olar. Birinci görüşə görə belə səbir haram, ikinciyə görə mübahdır. Məncə, daha doğru olanı dilənməyib, səbir etməsi caizdir.

Əhməd bin Hənbəldən: "Birdən dilənməsə ölərsə qorxuludurmu?" - soruşulduğu təqdirdə o: "Ölməz, ölməz, Allah onun ruzisini verər. Allah-taala onun ehtıyacını və dilənməyi tərk etməsindəki səmimiyyəti görüb ruzisini bəxş edər"- cavabını vermişdir. Əhməd bin Hənbələ görə dilənmək qadağan bir işdir. Ancaq Əhməd bin Hənbəl və imam Şafiinin məzhəbindən olanların bir çoxunun rəyinə görə o kimsənin dilənməsi vacibdir. Dilənməsə ölərsə günahkar olar. Çünki dilənmək onu ölümdən qurtarır.

### Fəsil

Bir insanın üzərinə yırtıcı heyvanın, ilanın və ya yanğının, daşqının və ya bir kafirin onu öldürmək üçün gəldiyini gördüyü halda, qaçmayıb səbir etməsi haramdır. Lakin müsəlmanlar arasında bir fitnə və savaş olarkən təslim olub səbir etməsi mübah, hətta müstəhəbdir.

Allahın elçisindən bu məsələ barədə soruşulduqda demişdir: "Adəmin iki oğlundan xeyirlisi kimi ol"[28].

Başqa rəvayətdə deyilir: "Allahın öldürülmüş qulu kimi ol, öldürən qulu kimi olma!"[29].

Digər bir rəvayətdə deyilir: "Burax onu, öz günahını və sənin günahını da daşısın!"[30].

Başqa bir rəvayətdə isə deyilir: "Qılıncın parıldaması səni qorxudursa, səni öldürənə qədər əlinlə üzünü ört!"[31].

Allah-taala Adəmin oğullarından təslim olanın xeyirli olduğunu açıqlamış və bununla onu mədh etmişdir.

Ancaq kafir müsəlmanı öldürmək istədikdə müsəlmanın özünü müdafiə etməsi vacibdir. Çünki cihaddan məqsəd bir müsəlmanın özünü və digər müsəlmanı müdafiə etməsidir. Amma bir kimsə malını və canını müdafiə etmək üçün oğrularla çəkişməyə girməsi ixtilaflıdır. Fəqət, günahsız olan kimsənin müdafiə edilməsinin vacibliyində alimlər eyni fikirdədirlər.

Bir kimsə başqasına və ya onun qadınına təcavüz etdikdə, o şəxsin buna qarşı səbir etməsi caiz deyildir.

**Məkruh** olan səbrin bir çox növləri var.

Birincisi, bir kimsənin öz bədəninə zərər verəcək şəkildə yeməyi, içməyi, geyinməyi və qadınıyla cinsi münasibəti tərk edərək səbir etməsi məkruhdur. İkincisi, qadının cinsi münasibətə ehtiyacı olduğu halda onunla birləşməyərək səbir etməsi məkruhdur. Üçüncüsü, məkruh olanları etməməyə səbir etmək məkruhdur.

Bir işlə mükəlləf olanın onu etməsi və ya etməməsində sərbəst olduğu bir işi etməyə və ya etməməyə səbir etməsi mübahdır.

Nəticə etibarilə, vacibi etməyə səbir etmək vacibdir, Vacibi etməməyə səbir etmək haramdır. Harama qarşı səbir etmək vacibdir. Haramı etməyə səbir etmək də vacibdir. Müstəhəbi etməyə səbir etmək müstəhəbdir. Müstəhəbi etməməyə səbir etmək məkruhdur.

Məkruhu tərk etməyə səbir etmək müstəhəbdir. Məkruhu

[28] **Hədis səhihdir**: Əbu Davud, 4257; Əhməd, 1/185

[29] **Hədis həsəndir**: Əhməd, 295; əl-Hakim, 3/281.

[30] Əbu Bəkrin rəvayət etdiyi hədisin bir hissəsidir. Müslim, 2887.

[31] **Hədis səhihdir**: Əbu Davud, 4261; İbn Macə, 3958; Əhməd, 5/163; əl-Hakim, 4/423, 424; əl-Beyhəqi, 8/191; əl-Hakim demişdir ki, əl-Buxari və Müslimin şərtlərinə görə səhihdir və əz-Zəhəbi bununla razılaşmışdır.

etməyə səbir etmək məkruhdur. Mübahı etməməyə səbir etmək mübahdır.

Daha yaxşısını Allah bilir.

# DOQQUZUNCU BÖLMƏ

## Səbrin dərəcələrinin fərqləri

Səbir yuxarıda deyildiyi kimi ixtiyari və məcburi olmaqla iki növdür.

İxtiyari səbir məcburi səbirdən üstündür. Çünki məcburi səbrə bütün insanlar ortaq olduqları kimi, ixtiyari səbri olmayan heyvanlar da buna ortaqdır. Buna görə Yusifin Əzizin qadının istədiyini etməməsinə görə həbs olması kimi başına gələn fəlakətlərə səbir etməsi, qardaşlarının onu quyuya atmaları, atasından ayırmaqları və kölə olaraq satmaları kimi başına gələn müsibətlərə səbir etməsindən daha böyükdür. Allah-taalanın yer üzündə Yusifin şanını və şərəfini yüksəldərək ona verdiyi mülk və səltənətə səbir etməsi məcburi səbir növündəndir.

İbrahim Xəlilullahın, Musa Kəlimullahın, Nuh Nəciyullahın, İsa Ruhullahın və peyğəmbərlərin sonuncusu Məhəmmədin səbri də belədir. Bunlar insanları Allaha dəvət edərkən və Allah düşmənləriylə savaşarkən bütün sıxıntılara səbir edənlərdir. Buna görə Allah-taala onların əzm sahibləri olduqlarını bildirmiş və elçisinə də onların səbir etdikləri kimi səbir etməsini əmr edərək: **«Peyğəmbərlərdən əzm sahibləri olanların səbir etdiyi kimi, sən də səbir et,..»** (əl-Əhqaf, 35)- buyurmuşdur.

Uca Allah əzm sahibi olan peyğəmbərlərini aşağıdakı ayələrdə belə xatırlatmışdır:

**«Allah: "Dini doğru tutun, onda ayrılığa düşməyin!" - deyə Nuha tövsiyə etdiyini, sənə də vəhy buyurduğunu, İbrahimə, Musaya və İsaya tövsiyə etdiyini dində sizin üçün də qanuni etdi...»** (əş-Şura, 13);

**«Xatırla ki, Biz bir zaman peyğəmbərlərdən əhd almışdıq: səndən də, Nuhdan da, İbrahimdən də, Musadan da, Məryəm oğlu İsadan da!...»** (əl-Əhzab, 7).

İbn Abbas və digər sələf alimlər əzm sahibi peyğəmbərlərin bu ayələrdə adları çəkilənlər olduğunu söyləyirlər.

Allah-taala elçisini əzm sahibi peyğəmbərlərin səbir etdikləri kimi, səbir etməyən balıq sahibinə (Yunusa) bənzəməkdən çəkindirərək: **«Sən Öz Rəbbinin hökmünə səbir et və balıq sahibi** (Yunus peyğəmbər) **kimi olma. O zaman o,** (balığın qarnında) **qəm-**

**kədər içində boğularaq dua etmişdi»** (Nuh, 48)- demişdir.

Burada (ərəb dili ilə bağlı - tərc.) faydalı sual oluna bilər ki, ayədə istifadə olunan "iznədə" zərfinin amili nədir? "Lətəkun" ola bilməz, çünki bu kəlmə amil olduğu təqdirdə ayənin mənası belə dəyişərdi: **«Yunus kimi dua etmə».** Bu məna nəzərdə tutulmur. Çünki Allah-taala onu bu duasında öyüb, bu duası ilə nicat tapdığını xəbər verərək: **«Zün-Nunu** (balıq sahibi Yunusu) **da xatırla! Bir zaman o** (küfr etməkdə həddi aşmış ümmətinə qarşı) **qəzəblənərək çıxıb getmiş və** (Bizə xoş gəlməyən bu səbirsizliyinə görə) **onu möhnətə düçar etməyəciyimizi güman etmişdi. Amma sonra qaranlıqlar içində** (balığın qarnında; gecənin, yaxud dənizin zülmətində): **"Səndən başqa heç bir Allah yoxdur. Sən pak və müqəddəssən! Mən isə, həqiqətən, zalimlərdən olmuşam", - deyib dua etmişdi. Biz onun duasını qəbul buyurduq və onu qəmdən qurtardıq. Biz möminlərə belə nicat veririk!»** (əl-Ənbiya, 87-88)- buyurmuşdur.

ət-Tirmizinin və digərlərin hədis kitablarında Peyğəmbərdən rəvayət olunan hədisdə deyilir: "Qardaşım balıq sahihi xanı balığın qarnında: "Səndən başqa heç bir ilah yoxdur. Sən nöqsansızsan. Mən həqiqətən, zalimlərdən oldum" — deyə dua etmişdi. Odur ki, kədərli bir kəs bu cür dua edərsə, mütləq Allah-taala onun kədərini yox edər”[32].

Bu duada Yunus peyğəmbərə bənzəməyin nəhyi mümkün deyil. Əvəzində qövmünə qəzəblənərək gedən, balığın qarnında qalmağına görə çox sıxılıb kədərlə dolu olduğu halda Rəbbinə dua edən Yunus peyğəmbərə bənzəmək nəhy olunmuşdur. Belə ki, bu ayə buna dəlalət edir: **«Sən öz Rəbbinin hökmünə səbir et...».** Bundan sonra **«...balıq sahibi** (Yunus peyğəmbər) **kimi olma...» -** deyə nəhy edilmişdir. Buradan görünür ki, əmr edilən və nəhy edilən hallar başqadır. Bu ayəyə "müqəddərata səbir etməklə, əmr edilən yerdə səbir edilir, müqəddarata davam gətirməkdə səbir etməyib, kədərlə dolu olduğu halda bundan özünü qurtarması üçün Allaha dua edən Yunus peyğəmbərə bənzəməməli" mənasını verməkdən səni çəkindirən nədir? - soruşularsa, cavab verirəm ki, belə məna verməkdən məni çəkindirən, Allah-taalanın Yunusu və digər peyğəmbərləri başlarına gələn müsibətlərin yox edilməsini istəyərək etdikləri dualara görə tərifləməsidir. Belə ki, ayədə bildirildiyi kimi Allah-taala Yunusu etdiyi duaya görə tərifləmişdir. Odur ki, tərifləndiyi bir yerdə ona bənzəməkdən nəhy olunmaz.

Allah-taala Əyyübu **«...Mənə bəla üz verdi. Sən rəhmlilərin**

---

[32] **Hədis səhihdir:** ət-Tirmizi, 3572; əl-Hakim, 1/505. əl-Hakim hədisə səhihdir demiş və əz-Zəhəbi bununla razılaşmışdır.

**ən rəhmlisisən!»** (əl-Ənbiya, 83)- deməsinə görə, Yaqubu **«...Mən dərd-sərimi yalnız Allaha ərz edirəm...»-** (Yusif, 86) deməsinə görə, Musanı da: **«Ey Rəbbim! Mən Sənin mənə nazil edəcəyin xeyrə möhtacam!»** (əl-Qəsəs, 24)- deməsinə görə tərifləmişdir.

Həzrəti Peyğəmbər: "İlahi! Qüvvətimin zəiflədiyini, çarəsiz qaldığımı ancaq Sənə ərz edirəm" - deyərək şikayət etmişdir. Buna görə, Allaha edilən şikayət həqiqi səbrə zidd deyildir. Çünki bu şikayət qulun öz dərdini yalnız Allaha ərz etməsindən ibarətdir. Şikayətin yalnız Allaha ərz olunması isə səbrin özüdür.

Allah-taala şikayətini, yalvarmasını və duasını dinləmək üçün quluna dərd və bəla verir. Belə ki, Allah-taala müsibət və bəla zamanında Ona boyun əyərək yalvarmayanları məzəmmət edərək: **«Biz, həqiqətən, onları əzabla yaxaladıq, lakin onlar yenə öz Rəbbinə itaət etmədilər,** (Ona) **yalvarıb-yaxarmadılar»** (əl-Muminun, 76) - buyurmuşdur.

Qul Allaha qarşı igidlik göstərmək üçün çox zəifdir. Allah-taala qulunun Ona qarşı özünü igid kimi göstərməsini deyil, əksinə, boyun əyərək yalvarıb-yaxarmasını istəyir. Uca Allah qulunun öz dərdinə görə insanlara şikayət etməsinə qəzəblənərək, Özünə şikayət etməsini istəyir.

Salehlərin birindən: "Özünə heç bir şeyin gizli qalmadığı Allah-taalaya nədən şikayət edirsən?»- deyə soruşulduqda o: "Rəbbim, qulun Ona baş əyməsindən xoşlanır" - deyə cavab vermişdir.

Nəticə olaraq, Allah-taala peyğəmbərimiz Məhəmmədə əzm sahibi peyğəmbərlərin Onun hökmünə ixtiyari səbirlə səbir etdikləri kimi səbir etməsini əmr etmişdir. Çünki bu səbir, səbirlərin ən mükəmməlidir. Bundan başqa, Qiyamət günündə əzm sahibi peyğəmbərlərə şəfaət etmələri üçün müraciət etdikləri zaman insanları özlərinin ən fəzilətlisi, ən xeyirlisi və Allahın hökmünə ən səbirlisi olan Məhəmmədə göndərəcəklər.

**Dedilər:** Mükəlləfiyyətlər şəriətlə yerinə yetirilməsi əmr olunan və qadağan olunan əməllərdir.

"Mükəlləfiyyətlərəmi yoxsa müqəddəratamı səbir etmək daha kamildir?"- deyə soruşularsa, demək olar ki, əmr edilənlərə və qadağalara səbir etmək müqəddərata səbir etməkdən daha üstündür. Çünki müqəddərata yaxşı adam da, pis adam da, mömin də, kafir də səbir edər. Düzdür, səbri ixtiyari və məcburi olan hər bir insanın müqəddərata səbir etməsi gərəkdir. Amma əmr edilənləri yerinə yetirərkən çəkilən sıxıntılara, yasaqlardan çəkinmələrə edilən səbir isə ancaq peyğəmbərlərə tabe olanların səbridir. Hər bir səbir yerinə görə fəzilətlidir.

**Dedilər:** Yasaqlara qarşı səbir, yoxsa əmr edilənlərə səbir

Allaha daha sevimlidir? Bu barədə ixtilaf vardır. Bir qisim alimlər: "Qadağalara qarşı səbir etmək daha fəzilətlidir. Çünki bu səbir daha çətin, daha güclüdür. Ona görə ki, yaxşı əməlləri həm yaxşı, həm də pis adamlar edə bilər. Yasaqları etməməyə səbir etmək isə ancaq siddiqlərin işidir"- deyə dəlilləri sadaladılar.

Haramlara qarşı səbir etmək, nəfsin arzusuna qarşı səbir etməkdir. Bu səbir çətin və daha fəzilətlidir. Çünki bu, nəfslərin öz sevimlisini Allah üçün tərk edən kimsənin Allahı öz nəfsindən və nəfsinin arzularından daha çox sevdiyinin dəlilidir. Lakin sevimlisinin sevdiyini etmək Allahı sevmənin dəlili ola bilməz. İnsanlıq (mürüvvət) və mərdlik (futuvvət) bunların hamısı səbrə bağlıdır.

Əhməd bin Hənbəl dedi ki: "Mərdlik arzu edilən bir şeyin Allahdan qorxduğu üçün tərk edilməsidir. Qulun mürüvvət və futuvvəti səbrinə görədir"[33].

Əmr edilənləri yerinə yetirməyə səbir etmək təəccüblü deyil. Çünki onların hamısı ədalət, ehsan, yaxşılıq kimi fəzilətli və təmiz nəfslərin xislətidir. Əksinə, təəccüblü birinin nəfsləri aldadıcı olan yasaqlara qarşı səbir edəndir. Ona görə ki, bu kimsə dünyada sevdiklərini axirətdəkilərə görə tərk edir. Çünki nəfs nağd olanı sevər. Nəfsin nağd olanlara qarşı səbir etməsi onun xüsusiyyətinə ziddir.

İnsanı yasaqlara sürükləyən dörd faktor var: insanın nəfsi, şeytanı, puç istək və arzular, dünyası. İnsan bu dörd düşmənlə mübarizə aparmadıqca yasaqları tərk edə bilməz. Odur ki, bu dörd düşmənlə mübarizə aparmaq nəfs üçün çox ağır və çox acıdır. Çünki yasaqlar nəfslərin puç arzu və ləzzətlərdən çəkindirilməsindən ibarətdir. O halda bu dörd qüvvətli düşmən insanı puç arzu və ləzzətlərə çağırdığı halda onlara qarşı çıxmaq, çətin və ən ağır olanlardandır. Buna görə yasaqlara yaxınlaşma qapılarının hamısı bağlanmalıdır.

Əmr edilənlərdə isə insan gücü çatan qədər mükəlləfdir. Belə ki, hədislərin birində Peyğəmbər buyurmuşdur: "Sizə bir şeyi əmr etdiyim zaman gücünüz çatan gədər onu yerinə yetirin. Sizə nəyi qadağan etsəm, ondan çəkinin"[34].

Bu hədis əmr edilmişlərin qapısından yasaq olunmuşların qapısının daha dar olduğuna, acizlik və üzürə görə əmr edilənlərin bəzisinin tərk edilməsinə rüsxət və izin verildiyinə, yasaqlardan heç birinin icrasına rüsxət və izin verilmədiyinə dəlalət edir. Buna görə şəriətin müəyyən etdiyi cəza tədbirləri və digər cəzalar yasaqlar işləndikdə tətbiq edilir. Lakin əmr edilənlər tərk edildikdə onlara

33 "Ər-risalətul-quşeyriyyə", səh. 227.
34 əl-Buxari. 7288; Müslim, 1337. Əbu Hureyrənin rəvayətinin bir hissəsidir.

görə müəyyən cəza yoxdur. Hətta, əmr edilənlərin ən böyüyü namaz olmasına baxmayaraq, onu tərk edən üçün cəzanın olmasına görə yekdil rəy yoxdur. Bu məsələdə alimlər ixtilaf etmişlər. Beləliklə, bunlar yasaqlara qarşı səbir etmənin daha fəzilətli olduğunu irəli sürən alimlərin dəlillərindəndir.

Digər bir qisim alimlər isə: "Əmr edilənləri icra etməyə səbir etmək, yasaqları etməməyə səbir etməkdən daha fəzilətlidir"- deyirlər.

Allah dərgahında əmr edilənləri yerinə yetirmək, yasaqları etməməkdən daha sevimlidir. İki şeydən sevilənə səbir etmək bir çox baxımdan daha üstündür. Bunu bir neçə cəhətdən izah etmək olar:

**1.** Allahı tanıyıb Onun təkliyini qəbul edərək, yalnız Onun qulu olmaq, Ona yönəlmək, Ona təvəkkül etmək, ibadət və itaətləri ixlasla Onun üçün etmək, Onu sevmək, Onun hökmlərinə razı olmaq, Ona xidmət etmək və s. şeylər əsl məqsədlər olduğu kimi əmr edilənlər də əsl məqsədlərdir. Allah-taala bunları əmr etmiş, insanları bu məqsədlər üçün yaratmışdır. O halda bunların yerinə yetirilmələri istənilir. Yasaqlar isə əmr edilənlərin icrasına mane olduqları, yasaqlarla məşğul olarkən əmr edilənlərə etinasızlıq göstərildiyi və yaxud əmr edilənlərin həyata keçirilməsinə mane olduqları üçün qadağan edilmişlərdir. Buna görə yasaqlar başqalarından dolayı qadağan edilmişdir. Əmr edilənlərin isə özlərinin yerinə yetirilməsi istənilir. Əgər içki, qumar, Allahı zikr etməkdən, namaz qılmaqdan, Allahın qulları arasında olan məhəbbətdən ayırmasaydı və qul ilə Allahın tanınmasına, Allaha ibadət edilməsinə, həmd edilməsinə, təzim edilməsinə, namaz qılınmasına, səcdə edilməsinə səbəb olan ağıl arasında pərdə olmasaydı haram edilməzdi. Digər haramlar da Allahın sevdiklərindən və razı olduqlarından ayırdığı üçün və qul ilə onun həyata keçməsi arasında pərdə olduqları üçün haram edilmişdir.

**2.** Əmr edilənlər Allahı bilməklə, Onun təkliyini qəbul edərək ibadət etməklə, zikr etməklə, şükür etməklə, sevməklə, təvəkkül etməklə və yönəlməklə əlaqəlidir. Bunlar Allahın Zatı, ad və sifətləri ilə əlaqəlidir. Yasaqlar isə yasaq edilənlərin özləri ilə əlaqəlidir. Odur ki, ikisi arasındakı fərq düşünülməyəcək dərəcədə böyükdür.

**3.** İnsanın əmr edilənləri etməyə zərurət və ehtiyacı yasaqları tərk etməyə olan zərurətindən daha böyükdür. Çünki insanın Allahı tanımağa, Onun təkliyini qəbul edərək ixlasla əməl etməyə, yalnız Onu sevib Onun itaətində olmağa möhtac olduğu qədər heç bir şeyə möhtac deyildir. İnsanın bunlara ehtiyacı öz nəfsinə olan ehtiyacından daha böyükdür. Çünki qulun əmr edilənlərə olan ehtiyacı, bədəni üçün zəruri olan qidaya ehtiyacından daha

böyükdür. Qida bədənin ehtiyacıdır, əmr edilənlər isə qəlbin və ruhun qidasıdır. Qul bədəni və qəlbi ilə insan deyil, ancaq qəlbi və ruhu ilə insandır. Belə ki, deyiblər: "Ey bədəninə qulluq edən kimsə ona xidmət etməklə bədbəxtliyində nə vaxta qədər davam edəcəksən? Sən bədəninlə deyil, ancaq qəlbinlə insansan".

Yasaqların tərk edilməsi əmr edilənlərin icrası üçündür.

**4.** Yasaqları tərk etmək pəhriz növündəndir. Əmr edilənləri yerinə yetirmək isə güc və qidanı mühafizə etmək növündəndir. Onlar olmadan bədənin fəaliyyət göstərməsi mümkün deyil. Ona görə ki, həyat ancaq onlarla davam edir.

İnsan pəhrizi tərk etdikdə xəstəliyi artsa da yaşaya bilər. Lakin bədəni ayaqda saxlayan güc və qida olmazsa yaşaya bilməz. Məhz bunlar əmr edilənlərlə yasaq edilənlərin misallarıdır.

**5.** Günahların hamısı iki əsasa dayanır: əmr edilənləri tərk edib yasaqları etmək. Bir kimsə ömrünün əvvəlindən sonuna qədər bütün qadağaları etsə, sonunda əmr edilmiş olan imanın zərrəsi onda olsa, bu qədər imanla Cəhənnəmdə əbədi qalmaqdan qurtulur. Lakin yasaqlardan heç bir şey etmədiyi halda əmr edilənlərdən olan imanı yerinə yetirməzsə, yəni iman gətirməzsə, əbədi Cəhənnəmdə qalar.

Nəticə olaraq, dağlar qədər günahı olan kimsənin zərrə qədər imanı olsa, Cəhənnəmdə əbədi qalmayacaqdır. Lakin heç bir günahı olmadığı halda zərrə qədər imanı olmazsa, Cəhənnəmdə əbədi qalacaqdır. Elə isə əmr edilənlər hara, yasaqlar hara!

**6.** Bir kimsə ömrünün əvvəlindən sonuna qədər bütün yasaqları etsə, sonunda əmr edilmiş olan tövbəni etsə bütün günahları əfv edilir. Allaha şərik qoşmaqdan və ya kafir olaraq ölməkdən başqa heç bir günah, əmr edilənləri (ibadət və itaətləri) yox etməz. Hər günahın tövbə ilə əfv ediləcəyinə görə alimlər arasında ixtilaf yoxdur. Lakin alimlər "günah etməklə ibadət və itaət yox olurmu və ya olmazmı?" məsələsində mübahisə etmişlər. Bu məsələyə görə mübahisə və təfsilat vardır, lakin bura yeri deyil.

**7.** Adəmin günahı yasaq olanı etməsi oldu. Sonu isə Rəbbinin onu seçməsi, onun tövbəsini qəbul etməsi və onu doğru yola yönəltməsi oldu. Şeytanın günahı əmr edilmiş olanı tərk etməsi oldu. Sonu isə Allah-taalanın bəyan etdiyi kimi kafir oldu. Uca Allah şeytanı qiyamətə qədər Adəmin zürriyəti üçün ibrət etdi.

**8.** Şübhəsiz ki, əmr edilənlər Allah dərgahında sevilənlər, yasaqlar isə sevilməyənlərdir. Allahın yasaqları öncədən müəyyən etməsi və hökm etməsinin hikməti onların Allahın sevdiyi şeylərin qulları tərəfindən və Özü tərəfindən meydana gəlməsinə səbəb olmasıdır.

Qullarının tövbə etmələri, bağışlanma diləmələri, ibadət və

itaətdə olmaları, boyun əyməkləri Uca Allahın sevdiyi şeylərdir.

Allah-taalanın Özünün yerinə yetirdiklərindən sevdiyi şeylər bunlardır: tövbə edənlərin tövbəsini qəbul etmək, bağışlanma diləyənlərin günahlarını bağışlamaq, əfv diləyənləri əfv etmək.

Uca Allahın sevmədiyi şeyləri, sevdiyi şeylərə vəsilə olsun deyə öncədən müəyyən etməsi göz qabağında olsa da əsas məqsədin sevilən şeylər olması aşkardır. O halda Allah-taala sevdiyi şeylərin yerinə yetirilməməsinə, sevmədiyi şeylərin yerinə yetirilməsindən daha çox qəzəblənər. Belə ki, yasaqlar və məkruhlar əmr edilənlərin haqqıdır. Çünki əsas məqsəd və qayə sevilən şeylər olduğundan Allah insanları və cinləri sevilən və əmr edilənlər üçün yaratmışdır. Sevilən və əmr edilənlər isə Allahın varlığını və təkliyini qəbul edərək yalnız Ona ibadət etməkdir. Belə ki, Allah-taala buyurmuşdur: **«Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!»** (əz-Zariyat, 56).

Uca Allah yasaqları yaratdığı insanlar və cinlərin əmr edilənləri tamamlamaları üçün öncədən müəyyən etmişdir. Yasaqlar öncədən müəyyən edilməsəydi, əmr edilənlərdən bir çoxları yerinə yetirilməzdi.

Cihad – Allaha görə sevmək, Allaha görə qəzəblənmək Allah dərgahında ən sevilən əməllərdəndir. Allah bunları sevməsəydi, bunların yerinə yetirilməsinə səbəb olanları öncədən müəyyən etməzdi.

**9.** Şübhə yoxdur ki, yasaqların tərk edilməsi əmr edilənlərin yerinə yetirilməsinə yaxın olmasca, itaət və Allaha yaxınlıq ola bilməz. Əgər bir kimsə bütün yasaqları tərk etsə, əmr edilmiş iman bu tərk edilməyə yaxın olmadıqca, yəni yasaqları tərk edərkən iman olmazsa, Allah ona yasaqları tərk etməsinə görə savab verməz.

Bir mömin yasaqları tərk edərkən Allaha görə tərk etdiyini niyyət etməzsə savab qazanmaz. Buna görə yasaqların tərk edilməsi itaət və Allaha yaxınlıq olub, savabla nəticələnən əmr edilənlərin icrasına bağlıdır. Lakin əmr edilənlərin icrasının Allaha yaxınlıq və itaət olması yasaqların tərk edilməsinə bağlı deyildir. "Əgər əmr edilənlərin Allaha yaxınlıq və itaət olması yasaqların tərk edilməsinə bağlı olsaydı, Allah günah edənin itaətini qəbul etməzdi"- demək batil bir sözdür.

**10.** Yasaqların edilməməsi, əmr edilənlərin isə icrası istənilir. İkisi də edilsə və ya ikisi də edilməsə, edilmələri edilməmələrindən daha xeyirlidir. O halda əmr edilənlər icra olunmazsa, yasaqların tərk edilməsi fayda verməz. Lakin əmr edilənlərin icrası ilə yasaqların aradan qaldırılmasına və ya günahların aradan qaldırılmasına yardım istənilir. Gücün və xəstəliyin olması, həyatın və xəstəliyin

olmamasından daha xeyirlidir.

**11.** Əmr edilənlərdən bir yaxşılıq icra ediləndə, bir yaxşılığa on və ya yeddi yüz və daha artıq savab verilir. Yasaqlardan bir pislik işlənildiyində yalnız bir günah yazılır. Pisliklər və günahlar tövbə ilə, istiğfarla, yaxşı əməllərlə, kəffarə olan müsibətlərlə, mələklərin möminlərə istiğfarı ilə, möminlərin bir-birinə istiğfarı ilə əfv olunur. Məhz bunlar əmr edilənlərin icrasının, yasaqların tərk edilməsindən Allah dərgahında daha sevimli olmasına dəlalət edir.

**12.** Allah-taala edilən qadağaların günahlarını qulun özünün və başqalarının Onun naminə etdikləri bir çox yaxşılıqları ilə əfv edər. İnsan həyatda ikən altı şeylə pislikləri və günahları əfv olunur: bir daha pozmamaq şərti ilə edilən tövbə, bağışlanma diləmə, yaxşı əməllər, kəffarə olan müsibətlər, mələklərin bağışlanma diləmələri və möminlərin duası ilə.

İnsan dünyadan ayrılarkən günahları bunlarla əfv olunur: ölümün ona göndərilməsi ilə, ölümün şiddəti və ölümün sıxıntısı ilə.

Qəbirdə günahlar bunlarla əfv olunur: qəbrə girmə qorxusu ilə, mələklərin verəcəyi sualların qorxusu ilə, qəbrin darısqallığı ilə.

Qiyamət günündə günahlar bunlarla əfv olunur: qiyamət gününün şiddəti ilə, orada durmaqdan yorulmaqla (intizar əzabı-tərc), orada çətinlik çəkməklə, orada şəfaətçilərin şəfaəti ilə, rəhmlilərin ən rəhmlisi olan Allahın rəhməti ilə.

Əgər bunlar qulun günahlarının əfv olunmasına kifayət etməzsə, Cəhənnəmə girər, günahlarından, pisliklərindən və çirkinliklərindən təmizlənincəyə qədər orada qalar. Buna görə qulda nəcasət, pislik və çirk olduqca körük vəzifəsini oynayan Cəhənnəmdə bunlardan təmizlənincəyə qədər qalacaqdır.

Edilən yasaqların günahları bir çox səbəblərlə əfv edilir. Əmr edilənləri isə Allaha şərik qoşmaqdan başqa heç bir şey ləğv edə bilmir.

**13.** Əmr edilənlərin mükafatı bəxşiş, fəzilət və rəhmət növündən olan savabdır. Yasaqların qarşılığı isə qəzəb və ədalət növündən olan cəza və əzabdır. Allahın rəhməti qəzəbından üstündür. Allah dərgahında rəhmət və fəzilət ilə əlaqəli olanın yerinə yetirilməsi, qəzəb və ədalətlə əlaqəli olanın yerinə yetirilməsindən daha sevimlidir. Allah dərgahında rəhmətlə əlaqəli olanın yerinə yetirilməməsi, qəzəblə əlaqəli olanın yerinə yetirilməsindən daha pisdir.

**14.** Əmr edilənlərdən birinin yerinə yetirilməsi ilə edilmiş qadağaların minlərlə günahını yox edir. Lakin minlərlə günah isə əmr edilənlərin bir dənəsinin savabını yox edə bilməz.

**15.** Əmr edilənlərin əlaqəli olduğu yer feldir (etməkdir). Etmək

isə kamillik sifətidir. İnsanın kamilliyi etdiyi işə bağlıdır. İnsan iş gördükcə təkmilləşir. Yasaqların əlaqəli olduğu yer isə tərk etməkdir. Tərk etmək isə yoxluqdur. Yalnız yoxluq isə heç zaman kamil ola bilməz. Ancaq yoxluq kamilliyin səbəbi olan bir işin icrasını zəruri etdiyi təqdirdə kamil olur. Məsələn, bir kimsə bütə səcdə etməyi tərk etsə, Allaha səcdə etmədikcə bütə səcdəni tərk etmək kamillik deyildir. Allaha səcdə etdiyi təqdirdə bütə səcdəni tərk etməsi kamillik olur. Allaha da, bütə də səcdəni tərk etsə yenə kamillik deyildir. Məsələn, bir nəfər Peyğəmbəri təsdiq edib, onu sevib, onu dost edib, ona itaət etməzsə, onu təkzib etməyi və ona düşmən olmağı tərk etsə, bununla mömin olmaz. Bu izahlardan başa düşülür ki, kamilliyin hamısı əmr edilənlərlədir. Yasaqların tərk edilməsinə əmr edilənlərin icrası əlavə olunmadıqca bu kamillik olmadığı kimi, heç bir şey də ifadə etməz.

Biri Peyğəmbərə: "Mən səni təkzib etmirəm, amma təsdiq də etmirəm, sənə dost deyiləm, amma səninlə müharibə də etmərəm və səninlə müharibə edənlərə də qoşulmaram"- desə, kafir olur. Yuxarıda bildirildiyi kimi o kimsə Peyğəmbəri təsdiq etmək və onun itaətində olmaq kimi əmr edilənləri icra etmədikcə, onu təkzib etməyi, ona düşmən olmağı və onunla müharibə etməyi tərk etməklə mömin olmaz.

**16.** İnsan ona əmr olunanları yerinə yetirdikdə qadağaları tərk etməsi labüddür. Çünki əsas məqsəd əmr edilənlərin icrasıdır. Ona görə ki, əmr edilənlər icra olunduqda yasaqların işlənilməsindən çəkinilir. Həqiqətən, yasaqların icrası əmr edilənlərin zayına səbəb olur. Çünki insan ədalətli və iffətli olmaq kimi əmr edilənlərə əməl edib, zülmdən və pis işlərdən çəkinəndə ədalətli olmaqla zülmü, iffətli olmaqla pis işləri tərk edir. Buna görə yasaqların tərk edilməsi əmr edilənlərin icrasına qeyri-aşkar şəkildə daxildir. Amma yasaqların tərk edilməsi əmr edilənlərin icrasını əhatə etmir. Bu açıqlamalardan aydın olur ki, əsas məqsəd əmr edilənləri layiqincə yerinə yetirməkdir. Bu halda yasaqların işlənməsi mümkün deyil. Amma yasaqların tərk edilməsi əmr edilənlərin yerinə yetirilməsini vacib etməz.

**17.** Allah-taala qullarına bəzi əməlləri yasaqlamış, bəzilərini əmr etmişdir. Bir kimsə bunların hər ikisini edərsə, Allahı həm sevindirər, həm də qəzəbləndirər. Fəqət Allah dərgahında sevilənin icrası qəzəbə səbəb olacağın tərk edilməsindən daha üstün olduğuna görə, sevilən əməlin icrası zamanı, qəzəbə səbəb əməlin şəri dəf edilir. Uca Allah qulunun etdiyi cinayəti, onun itaəti səbəbi ilə bağışladığı kimi bir çox günahlarını da izzətli fəziləti ilə əfv edər. Məsələn, kimsə bir hökmdarın öldürülməsini istəyən düşməni

öldürərsə, eyni zamanda hökmdarın qadağan etdiyi içkini də içərsə, hökmdar seviləni etdiyi (düşməni öldürməsi) və buna nisbətən içki içilməsinin kiçik olduğuna görə, o kimsənin bu günahını və digər günahlarını da bağışlar. Amma o kimsə hökmdarın həm sevdiyini, həm də qəzəbləndiyini tərk etsə, qəzəbə səbəb olanı tərk etməsi heç vaxt sevdiyinin yerinə yetirilməsinin yerini verməz. Hökmdar düşməninin öldürülməsini köləsinə əmr etdiyi halda içkini də yasaqlasa, kölə gücü çatdığı halda o düşməni öldürmədiyi kimi, içkini tərk etsə, içkini tərk etməsinə əvəz olaraq əmri tərk etmə günahını bağışlamaz. Allah-taala qulların bu fitrət üzrə yaratmışdır. Ağalar köləəriylə, atalar uşaqlarıyla, hökmdarlar ordularıyla, ərlər qadınlarıylə bu cürdür. Yəni bunlardan əmr edilənləri və yasaq olanları tərk edənlər, əmr edilənləri və yasaq olanları icra edənlər kimi deyildir.

**18.** Allahın sevdiklərini edən kimsənin bütün yasaqları etməsi mümkün deyil. Çünki o, sevilənlərdən etdiyi qədər yasaqları etməmişdir. Həm sevilənləri, həm də qəzəbə səbəb olanları edən bir kimsənin də bütün günahları işləməsi mümkün deyil.

Nəticə olaraq həm əmr edilənləri, həm də yasaqları edən bir kimsəni Allah-taala bir cəhətdən sevir, bir cəhətdən sevmir. Əmr edilənləri tamamilə tərk edən kəs Allahın sevdiklərini etməmiş olur.

Yuxarıda deyildiyi kimi yasaqların tərk edilməsi itaət ola bilməz. Ancaq əmr edilənlərə yaxın olmaqla Allaha yaxınlıq və itaət olur. Yəni yasaqlar tərk edilərkən əmr edilmiş olan iman olmazsa, bu yasaqların tərk edilməsi Allaha yaxınlıq və itaət ola bilməz, iman olarsa, olar. Buna görə sırf yasaqları tərk edən kimsəni Allah sevməz, əmr edilənləri etmədiyinə görə hər cəhətdən ona qəzəblənər.

**19.** Allah-taala məhəbbətini heç bir yerdə yasaqların tərk edilməsinə bağlamamışdır, əksinə istər vacib, istərsə də müstəhəb olan əmrlərin yerinə yetirilməsinə bağlamışdır. Şübhə yoxdur ki, Allah tövbə edənləri, təmizlənənləri, yaxşılıq edənləri, şükür edənləri, səbir edənləri, Onun yolunda bir-birinə monolit bir bina kimi səflər bağlayaraq çarpışanları, təqva sahiblərini, zikr edənləri və sədəqə verənləri sevər. Uca Allah sevgisini və məhəbbətini əmrlərin yerinə yetirilməsinə bağlayıb. Çünki insan və cinlərdən də bu istənilir. Bu barədə Allah-taala buyurmuşdur: **«Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!»** (əz-Zariyat, 56). Allah-taala insanları və cinləri əmr edilənləri etsinlər, əmr edilənlərdən yayındıran yasaqlardan vaz keçsinlər deyə yaratmışdir.

**20.** Yasaqlar, əmr edilənləri yerinə yetirməkdən yayındırmasaydı və onların icrasına mane olmasaydı, qadağaların heç bir mənası, qiyməti olmazdı. Yasaqlar, əmr edilənlərin icrasına

mane olduqları üçün yasaq edilmişdir. Yasaqlar əmr edilənləri kamilləşdirmək və tamamlamaq növündəndir. Buna görə yasaqlar suyun maneəsiz axa bilməsi üçün yatağının təmizlənməsi misalındadır. Əmr edilənlər isə insanların və bütün canlıların həyatlarını təmin edən su kimidir. Yasaqlar gücü mühafizə edən və onu xəstəlikdən qoruyan pəhriz kimidir.

Əmr edilənlərin icrasının yasaqları tərk etməkdən daha fəzilətli olduğu halda, əmr edilənləri yerinə yetirərkən çəkilən məşəqqətlərə səbir etmək, səbrin ən üstunüdür. O halda əmr edilənləri yerinə yetirərkən çəkilən məşəqqətlərə səbir edən kimsənin yasaqları tərk etməyə səbir etməsi və müqəddərata səbir etməsi asan olur. Çünki yüksək dərəcədə olan səbir, özündən aşağı dərəcədə olan səbri əhatə edir. Amma əksi belə deyil.

Açıqlamalardan belə aydın olur ki, bu üç növ səbir, yəni əmr edilənlərə, yasaqlara və müqəddərata səbir bir-birindən ayrılmazdır. Bunlardan hər biri digər ikisinə köməkçidir. İnsanlardan bir qisminin müqəddərata səbri qüvvətli, əmr edilənlərə və yasaqlara səbri zəifdir. Bir qisim insanların səbri bunun əksinədir. İnsanlardan bir qisminin səbri əmr edilənlərə səbri qüvvətlidir. Lakin digər növlərə səbri zəifdir. Kiminin də səbri bunun əksinədir.

Hər şeyi ən yaxşı bilən Allahdır.

# ONUNCU BÖLMƏ

## Səbrin tərifəlayiq və məzəmmət olunan qisimləri

Səbir iki qisimdir: bir qismi məzəmmət olunan, digər qismi tərifəlayiqdir. Allahdan Onun iradəsindən, Onun məhəbbətindən və qəlbin Ondan uzaqlaşmasına səbir etmək məzəmmətlənən səbirdir. Bu səbir insanın tamami ilə kamillikdən dayandırılmasını və yaradılmış olduğu qayədən uzaqlaşmasını əhatə edir. Bu səbir səbirlərin ən çirkinidir. Çünki onsuz yaşamayacağı sevgilisindən uzaqlaşmağa səbir edən kimsənin səbrindən daha artıq və daha çirkin bir səbir yoxdur. Allah-taala dostları üçün heç bir gözün görmədiyi, heç bir qulağın eşitmədiyi və heç bir bəşərin qəlbinə girmədiyi nemətlər hazırlamışdır. Bu nemətlərə nail olmaq üçün dünyanı tərk edib, özünü ibadət və itaətə həsr edən zahiddən daha böyük bir zahid yoxdur.

Belə ki, bir kimsə zahidlərdən birinin tərki-dünyalığına heyrət edərək: "Səndən daha zahid heç kimi görmədim"- dedi. Həmin adam da: "Sən məndən daha zahidsən. Mən əbədi olmayan və vəfasız olan dünyadan uzaqlaşdım, sən isə axirətdən uzaqlaşdın. Hansımız daha zahidik?"- dedi.

Yəhya bin Muaz ər-Razi dedi: "Sevənlərin səbri, zahidlərin səbrindən daha çox heyrət ediləcəkdir. Çox təəccüblüdür, necə səbir edirlər?"

Bu xüsusda deyirlər ki, səbir hər yerdə təriflənir. Ancaq sevgilidən uzaqlaşma mövzusundakı səbir təriflənməz.

Bir nəfər Şiblidən soruşdu: "Hansı səbir səbir edənlərə ən ağır olanıdır?" Şibli belə cavab verdi: "Allaha görə sevmədə və Allaha görə qəzəblənmədə səbir".

Həmin adam: "Xeyr" - dedi.

Şibli: "Hər şeydə Allaha görə uyğun səbir etmək" - dedi.

Adam: "Xeyr" - dedi.

Şibli: "Allahla bərabər səbir" - dedi.

Adam yenə razı olmadığını bildirdiyi üçün Şibli soruşdu: "Bəs hansı səbirdir?" O da belə cavab verdi: "Allahdan uzaqlaşmağa səbir". Bunu eşidən Şibli elə fəryad qopardı ki, sanki ruhu çıxacaqdı[35].

[35] "Ər-risalətul-quşəyriyyə", səh. 185.

Biri deyir ki, Allahla bərabər səbir, vəfadır. Allahdan uzaqlaşmaya səbir isə cəfadır. "Sevgilidən uzaqlaşmağa səbir etmək təriflənməz" rəyi hamılıqla qəbul olunub. İnsanın kamilləşməsi və qurtuluşu Allahı sevmək olduğu halda Ondan uzaqlaşmağa necə səbir edilir? Sevilənlər sevənlərin onlardan uzaqlaşmalarına səbir etmələrini ayıb bilirlər. Hər şeydə səbir təriflənir, ancaq seviləndən uzaqlaşmağa səbir məzəmmət olunur.

Başqa biri də sevgilidən uzaqlaşmağa səbir haqqında: "Kişilər hər şeyə qalib gəldiyi halda, sevginin də onlara qalib gəldiyini görərsən. Onun sevgisi mənə elə təsir etdi ki, sol tərəflə sağ tərəf eyni oldu. Ondan uzaqlaşmağa necə səbir edilir?"[36]

Biri sevgilisinə onun sevgisindən çəkdiyi əzaba görə şikayət edəndə sevgilisi demişdir: "Əgər sən sevgində səmimi olsaydın məndən uzaqlaşmağa səbir edə bilməzdin".

Dahilərdən biri demişdir: "Sevgiyə şikayət etdim". O da: "Yalan söyləyirsən. Aşiqin məşuqdan uzaqlaşmağa səbir edə bilmədiyini görmürsən?" -dedi.

## Fəsil

Tərifəlayiq səbir iki növdür: Allah üçün səbir və Allah ilə səbr.

Allah-taala buyurmuşdur:

**«Səbir et. Sənin səbir etməyin yalnız Allahın köməyi ilədir»** (ən-Nəhl, 127);

**«Sən öz Rəbbinin hökmünə səbir et! Şübhəsiz ki, sən Bizim gözümüzün qabağındasan** (himayəmiz altındasan)**»** (ət-Tur, 48).

Alimlər arasında bu iki səbirdən hansının daha mükəmməl olması barədə fikir ayrılığı vardır.

Bir qisim alimlər: "Allah üçün olan səbir daha mükəmməldir. Çünki Allah üçün olan şey Allah ilə olan şeydən daha mükəmməldir. Ona görə ki, Allah üçün olan şey qayədir. Allah ilə olan şey isə vəsilədir. Qayələr vəsilələrdən şərəflidir. Buna görə Allaha yaxınlaşmaq üçün edilən nəzirlərin icrası vacibdir. Bu nəzir Allah üçün edilmişdir. Nəzir and yerində olursa, onun icrası vacib deyildir. Çünki bu nəzir Allaha anddır. Allah üçün olan şey üluhiyyətlə əlaqəlidir. Allah ilə olan şey isə rübubiyyətlə əlaqəlidir. Üluhiyyətlə əlaqəli olan isə rübubiyyətlə əlaqəli olandan daha şərəflidir.

---

[36] "Ər-risalətul-quşəyriyyə", səh. 186.

Buna görə üluhiyyətinin təkliyini qəbul edən kəs Allaha şərik qoşmaqdan qurtulur. Lakin rübubiyyətinin təkliyini qəbul edən kəs Allaha şərik qoşmaqdan qurtulmur. Çünki bütlərə tapınanlar hər şeyi yalnız Allahın yaratdığını, hər şeyin Rəbbi olduğunu, hər şeyə malik olduğunu təsdiq və qəbul edirdilər. Amma Allahın təkliyini qəbul etmirdilər. Onun təkliyini qəbul etmək, yalnız Ona ibadət etmək və Onun şəriki olmadığını təsdiq etməkdir. Bunu etmədikləri üçün rübubiyyətinin təkliyini qəbul etmələri onlara fayda vermədi" - demişlər.

Digər bir qisim alimlər belə demişlər: "Allah ilə olan səbir daha mükəmməldir. Hətta Allah üçün olan səbir, ancaq Allah ilə olan səbirlə mümkündür. Belə ki, Allah-taala "səbir et" buyurmuşdur, yəni Allah Öz elçisinə səbir etməsini əmr etmişdir. Burada əmr edilmiş olan səbir Allah üçün olan səbirdir. Sonra Allah-taala: **«...Sənin səbir etməyin yalnız Allahın köməyi ilədir»** (ən-Nəhl, 127)-buyurmuşdur. Bu son ayə xəbər cümləsidir. Əvvəlki ayə isə əmr cümləsidir. Uca Allah xəbər cümləsində səbrin ancaq Allah ilə mümkün olduğunu bildirmişdir. Bu xəbər cümləsi iki mənanı ifadə edir. Biri Allahdan yardım istəməkdir. Digəri isə "vasbir və mə sabrukə illə billəhi..." (ən-Nəhl, 127) ayəsindəki "bi" ön qoşması birgəlik üçün olub, xüsusi bərabərliyə dəlalət edir. Belə ki, hədislərin birində: "Mənimlə eşidir, mənimlə görür, mənimlə alıb-verir, mənimlə yeriyir " - buyurulmuşdur[37].

Ayədəki "bə" ön qoşması ilə istianə (yardım istəmək) qəsd edilməmişdir. Çünki yardım istəmək itaət etməklə üsyan etmək arasında müştərək işdir. Allah ilə olmayan heç bir şey mövcud ola bilməz. Ona görə ki, hər şeyi yaradan Odur. Ayədəki "bə" ön qoşması aşağıdakı ayədə göstərildiyi kimi birgəlik üçündür: **«...Həqiqətən Allah səbir edənlərlədir»** (əl-Ənfal, 46). Bu birgəlik qulun nafilə ibadətləri ilə Allaha yaxın olmasından meydana gəlmişdir. Hətta o qul Allahın dostu olub Onunla eşidir, Onunla görür, Onunla səbir edir, hərəkətdə olarkən, oturarkən və düşünüb anlarkən Allah onunla bərabərdir. Kim belə olarsa, ona Allah üçün səbir asan olur və Allah üçün bütün ağır yüklərə qatlanır.

Bir hədisdə: "Hər şeyə qatlananlar, mənim üçün qatlanırlar"-buyurulmuşdur[38].

**«...Sənin səbir etməyin yalnız Allahın köməyi ilədir»** (ən-Nəhl, 127) ayəsi Allah-taalanın bir kimsə ilə bərabər olmazsa, onun səbir etməsinin mümkün olmayacağına dəlalət edir. Onda Allahın yardımı bir kəslə bərabər olmazsa, o kimsə əmr edilənləri yerinə

[37] əl-Buxari, 6502. Əbu Hureyrənin rəvayət etdiyi hədisin bir hissəsidir.
[38] "Ər-risalətul-quşəyriyyə", səh. 186.

yetirməyə və təbliğ etməyə səbir edə bilmədiyi kimi müqəddərata da səbir etməz.

Səbri Allah ilə olmayan kəs səbrin sonundakı gözəl dərəcəyə çata bilməz. Eşitməsi, görməsi, alıb-verməsi, yeriməsi Allah ilə olmayan kəs də sevilən və Allaha yaxınlaşdıran dərəcəyə çata bilməz.

"Mən qulumun eşidən qulağı, görən gözü, alıb-verən əli, yeriyən ayağı oluram" sözü ilə Allah-taalanın Öz qulu ilə bərabər olmasi bildirilir. Bununla heç də bəzilərinin dediyi kimi Allah-taalanın həmin qulun əza və qüvvətləri olması qəsd edilməmişdir. Onlar qulun zatı ilə Allahın zatının bir olduğunu iddia edirlər. Allah-taala xristianların qardaşları olan belələrinin iddialarından münəzzihdir, qüsur və nöqsanlardan uzaqdir. Əgər onların zənn etdikləri kimi olsaydı, onda Allaha yaxın olan qul və yaxın olmayan qul arasında fərq olmadığı kimi, nafilə ibadətlərlə Allaha yaxın olanla, üsyanı ilə Allahı qəzəbləndirən arasında fərq olmazdı. Hətta yaxınlaşan ilə yaxınlıq edilən, qul ilə məbud, sevən ilə sevilən də lazım olmazdı.

Yuxarıdakı hədis yaxşı düşünülsə, bunların batil iddialarının bir çox baxımdan yalanlığı görünür.

"Mən qulumun eşidən qulağı, görən gözü, alıb-verən əli, yeriyən ayağı oluram" hədisi, "Mənimlə eşidir, mənimlə görür, mənimlə alıb-verir, mənimlə yeriyir" hədisi ilə təfsir edilmişdir.

Hədisdə Allah-taalaya Onun sevdiyi şeylərlə yaxın olmaq, bərabər olmaqla ifadə edilmişdir. Hətta Allah quluna o qədər yaxınlaşır ki, onun qulağı, gözü, əli və ayağının yerinə olur. Belə ki, hədislərin birində: "Qara daş yer üzündə Allahın sağıdır, kim onu əlinə alıb sıxaraq öpərsə, sanki Allah ilə əllə görüşüb Onun sağını öpmüşdür" - buyurulmuşdur[39]. Burada da yuxarıdakı hədisdə olduğu kimi Allah-taalanın Qara daşa yaxın olması ifadə edilmişdir.

Bir kimsə özünü yaxın yoldaşının yerinə qoyaraq belə ifadə işlətməsi mümkündür. Hətta kimsə sevdiyi birinə "sən mənim canımsan, qulağımsan, gözümsən" deyə bilər. Bu sözün iki mənası var. Biri "sən mənim canım, qəlbim, qulağım və gözüm yerindəsən" mənası, digəri "sənin sevgin və məbəbbətin mənim qəlbimi və ruhumu oxşamaqla, örtməklə sən mənimlə bir olub mənim yoldaşım oldun" mənasıdır.

Belə ki, bir qüdsi hədisdə Allah-taala buyurur: "Mən zikr edənin yoldaşıyam"[40].

---

[39] **Hədis batildir:** İbn əl-Cəuzi, "əl-İləl əl-Mutənəhiyə", 2/575; İbn əl-Arabi, "Feyd əl-Qadir", 3/409;

[40] **Mərfu olaraq əsli yoxdur:** əl-Ğazali, "Bidəyətu əl-hidayə", səh. 115; əl-Beyhəqi, "Şuabul-iman", 680.

Digər qüdsi hədisdə isə belə buyurulur: "Qulum Məni zikr edib, dodaqları Mənimlə hərəkət etdikcə Mən onunla bərabərəm"[41].

Yenə başqa qüdsi hədisdə buyurulur: "Qulumu bir dəfə sevdimmi, artıq onun qulağı, gözü, əli və dəstəkləyəni oluram"[42].

Qulun qəlbini və ruhunu Allah sevgisi örtdükcə, Allah ona o qədər yaxın olur ki, bu yaxınlıq ancaq belə ifadələrlə anladılar.

Bu açıqlamalar Allah ilə olan səbri anlatmaq üçündür. Ona görə ki, qulun səbri Allahın onunla bərabər olmasına görədir. Allah onunla bərabər olduqda başqalarının səbir elməyəcəkləri şeylərə səbir edər.

Əbu Əli Sina demişdir: "Səbir edənlər dünya və axirət səadətini əldə edib, Allah ilə bərabər olma şərəfinə nail olanlardır. Necə ki, Uca Allah: **«...Həqiqətən Allah səbir edənlərlədir»** (əl-Ənfal, 46) buyurmuşdur"[43].

Burada çox incə bir sirr vardır. O da hər kim Allahın sifətlərindən birinə sarılarsa o sifətin onu Allaha yaxınlaşdıracağıdır. Allah-taalanın sifətlərindən biri də "əs-sahur" - çox səbirli olandır. Hətta qullarından gördüyü əziyyətə Onun qədər səbir edən yoxdur.

Deyilənə görə Allah-taala Davuda: **"Mənim əxlaqımla tərbiyələn, çünki çox səbirli olmaq Mənim əxlaqımdandır"** deyə vəhy etmişdir[44]. Allah-taala ad və sifətlərini sevdiyi kimi, bunların əlamətlərinin qullarında görünməsini də sevir. Çünki Allah gözəldir, gözəl olmağı sevir. Allah əfv edəndir, əfv edənləri sevir. Allah səxavətlidir, comərd olanları sevir. Allah hər şeyi haqqıyla biləndir, elm əhlini sevir. Allah təkdir, təkləri sevir. Allah çox qüvvətlidir və Allah dərgahında qüvvətli mömin zəif mömindən sevimlidir. Allah çox səbirlidir, səbir edənləri sevir. Allah "əş-şəkur" - çox şükür edəndir, şükür edənləri sevir.

Uca Allah Öz sifətlərinin əlamətləri ilə vəsf olunanları sevdiyinə görə, qullarının da bu sifətlərlə vəsf olunduqları qədər Allah onlarla bərabərdir. Allah-taala məhz bu xüsusi bərabərliyi: "Mən qulumun qulağı, gözü, əli və onu dəstəkləyəni oluram" - buyuraraq açıqlamışdır.

Bəzi alimlər səbrin növlərinə üçüncü bir növü də əlavə etmişlər ki, bu da Allahla bərabər olan səbirdir. Bu səbri səbirlərin ən yüksəyi sayıb buna "əl-vəfa" adını vermişlər. Əgər Allahla bərabər olan səbrin mahiyyəti soruşularsa, bunun yuxarıda bildirilən üç növ səbirdən,

---

[41] **Səhihdir:** əl-Buxari,13/417; İbn Macə, 3792; Əhməd, 2/540; İbn Hibban, 815; İbn Mübarək, "əz-Zühd", 956; əl-Bəğəvi, "Şərh əs-Sünnət" 1242 və başqaları. Əbu Hureyrənin rəvayəti.

[42] əl-Buxari, 6502. Əbu Hureyrənin rəvayət etdiyi hədisin bir hissəsidir.

[43] "Ər-risalətul-quşəyriyyə", səh. 186.

[44] "Ər-risalətul-quşəyriyyə", səh. 185.

yəni müqəddərata, əmr edilənlərə və yasaqlara edilən səbirdən başqasıyla açıqlanması mümkün deyildir.

Bu alimlər: "Allahla bərabər olan səbrin mənası qulun Allahın hökmlərinə səbat edib heç bir zaman onlardan ayrılmayaraq öz nəfsiylə deyil, daima Allahla bərabər, yəni Onu sevmək və Ondan gələn hər şeyə razı olmaqdır" - dedilər. Bu məna doğrudur və yuxarıda göstərilmiş üç növ səbirə aiddir. Eyni alimlərin: "Allahla bərabər olan səbir, səbrin bütün növlərini birləşdirəndir"- iddiaları da doğrudur. Lakin bu səbri səbrin növlərindən biri etmək doğru deyildir.

Allahla bərabər səbrin mahiyyəti qəlbin doğruluqda Allahla bərabər səbat edib Allaha bağlanmasıdır.

Bəzi alimlər səbrə daha bir növ əlavə edib buna "Allah uğrunda səbir" adını vermişlər. Fəqət bu səbir yuxarıda göstərilənlərdən başqası deyil. Yəni "Allah uğrunda səbrin" mənası, Allah üçün səbrin mənasından başqa bir şey deyil[45]. Bu barədə Allah-taala buyurmuşdur:

**«Bizim uğrumuzda cihad edənləri Öz yollarımıza qovuşduracağıq...»** (əl-Ənkəbut, 69);

**«Allah yolunda layiqincə cihad edin...»** (əl-Həcc, 78).

Cabirin rəvayət etdiyi hədisdə deyilir: "Şübhə yoxdur ki, Allah-taala Cabirin atasını diriltdikdə ona: "Nə istəyirsən dilə" - buyurdu. O da: "Ey Rəbbim, məni dünyaya təkrar göndər. Sənin uğrunda ikinci dəfə ölməmi diləyirəm" - dedi"[46].

Allahın elçisi demişdir: "And olsun ki, Allah uğrunda mənə edilən əziyyətlər heç kimə edilməmişdir"[47].

"Allah uğrunda səbrin" iki mənası var:

Birincisi Allahın rizasında, itaətində və yolunda səbir mənasıdır ki, bu insanın öz ixtiyarı ilə etdiyi işlərdəki səbridir. Hədislərin birində də belə deyilir: "Sənin yolunda elm öyrəndim"[48].

İkincisi Allahdan gələn müsibətlərə səbir mənasındadır ki, qulun özündən asılı olmayaraq başına gələnlərə səbridir. Çox vaxt "Allah uğrunda səbir" ilə ikinci məna nəzərdə tutulur. Belə ki, Allahın elçisinin: "And olsun ki, Allah uğrunda mənə edilən əziyyətlər heç kimə edilməmişdir"- sözü və Abdullah bin Hazamın: "Sənin uğrunda

[45] əl-Buxari, 3045, 4086, 7402; "əl-İsabə", 1/418; "Əsədul-Ğabə", 1/597; "Hilyətul-Övliya'", 1/112.

[46] **Səhihdir:** ət-Tirmizi, 3010; İbn Macə, 190, 2800; Əhməd, 3/321,286;

[47] **Səhihdir:** ət-Tırmizi, 2472; İbn Macə, 151; Əhməd, 120, 286; Əbu Yəla, 3423; İbn Hibban, 6560; İbn Əbi Şeyba, 11/464, 14/300. Müslimin şərtinə görə səhihdir.

[48] Müslim, 1905.

öldürüləydim"- sözü və Uca Allahın: **«Bizim uğrumuzda cihad edənləri ...»** (əl-Ənkəbut, 69) ayəsi ilə "Allah uğrunda səbir" mənası qəsd edilmişdir. Yəni bunların başına gələn əziyyət və müsibətlər Allah tərəfindəndir.

Azərbaycan dilindəki "da", "də" şəkilçilərinin verdiyi mənanı ifadə edən ərəbcə "fi" ön qoşması "Allah uğrunda səbir" ifadəsində zərf mənasında olmadığı kimi sırf səbəb mənasında da deyildir.

"Möminin canının qan bahası yüz dəvədir"[49] - hədisindəki "fi" ön qoşması ilə "bir qadın öz üzündən Cəhənnəmə girdi"[50] - hədisindəki "fi" ön qoşmasında səbəb zərfinin mənasından əlavə bir məna da verir. "Fi" ön qoşması bütün mənalarda yer və zaman zərfliyini ifadə etmək üçün deyildir.

"Bu işi Sənin rizan uğrunda etdim" ifadəsinin mənası "bu işi Sənin rizan üçün etdim" ifadəsinin mənasından daha genişdir. "Allah uğrunda mənə əziyyət edildi" ifadəsinin yerini, "mənə "Allah üçün əziyyət edildi" ifadəsi və "Allaha görə əziyyət edildi" ifadəsi tutmaz.

Nəticə olaraq Allah uğrunda səbir ifadəsi ilə Allah tərəfindən gələn müsibətlərə səbir mənası nəzərdə tutulursa, bu doğrudur. Lakin müqəddərata səbir, əmr edilənlərə səbir və yasaqlara səbirdən başqa bir səbir nəzərdə tutulursa, bu doğru deyildir. Allah uğrunda səbir edən Allah uğrunda cihad edən kimidir. Uğur Allahdandır.

Bəziləri demişlər ki, Allah üçün səbir zənginlikdir, Allah ilə səbir səbatdır, Allah uğrunda səbir "bəla", Allahla bərabər səbir "vəfa", Allahdan uzaqlaşmağa səbir isə "cəfa"dır[51]. Bu alimlərin sözləri qəbul edilməz. Çünki onlar ağıllarına gələnləri və düşündüklərini söyləyənlərdir. Bu ifadələr ancaq məsum olan peyğəmbərimizdən söylənilsə, qəbul edilir. Buna baxmayaraq bunların mənalarını açıqlayaq.

"Allah üçün səbir zənginlikdir" ifadəsinin mənası: nəfsin arzu və istəklərini etməyib, Allah-taalanın istəklərini etməkdir. Bu, nəfsə ən ağır və ən çətin olandır. Çünki Allahla nəfs arasındakı məsafəni qət etmək nəfsə ən çətin gələndir. Cüneydin dediyi kimi: "Dünyadan axirətə getmək mömin üçün asandır. Haqqın yanında olub xalqı buraxmaq çətindir. Nəfsi buraxıb Allaha tərəf getmək çox çətindir. Allahla bərabər səbir isə çox çətindir"[52].

"Allah ilə səbir səbatdır" ifadəsinin mənası: qul Allah ilə olduqda ona hər şey asan gəlir, yükləndiyi yüklərin ağırlığını hiss etmir. Çünki bu qul, insanlar ilə və öz nəfsi ilə olmayıb Allah ilə

49 **Səhihdir:** Malik, 2/849; ən-Nəsai, 8/60.
50 əl-Buxari, 3318; Müslim, 2242; Abdullah bin Ömərin rəvayəti.
51 "Ər-risalətul-quşəyriyyə", səh. 186.
52 "Ər-risalətul-quşəyriyyə", səh. 183.

olduqda qəlbi və ruhu üçün başqa bir vücud meydana gəlir ki, insanlar və öz nəfsi ilə olsaydı, bu hal onda olmazdı. Bu qul belə hal ilə səbrin gücünü və acılığını duymaz. Şəriətlə əmr edilənlərin və yasaq edilənlərin məşəqqətləri, onun üçün nemətə və göz bəbəyinə çevrilir. Zahidlərdən biri demişdir: "Bir il gecə namaza qalxmaq üçün zəhmət çəkdim, sonra iyirmi il sevə-sevə qalxdım. Bir kimsənin gözünün aydınlığı namazda olarsa, namazın ağırlığını duymaz".

"Allahda səbir bəladır" ifadəsinin mənası: bəla, çətinlik və məşəqqətlərin üstündədir. Bəlaya səbir Allah uğrunda cihad yerindədir. Bəlaya səbir Allah üçün olan cihaddan daha ağırdır. Allah uğrunda hər cihad edən, Allah üçün cihad etməkdədir. Allah uğrunda hər səbir edən, Allah üçün səbir etməkdədir. Əksi isə belə deyil. Buna görə bir kəs bəzən cihad edir, bəzən səbir edir. Beləsinə "Allah üçün cihad edir", "Allah üçün səbir edir"- deyilir. Fəqət "Allah uğrunda cihad edir", "Allah uğrunda səbir edir"- deyilməz. Ancaq cihada və səbrə dalıb Cənnətə girənə: "Allah uğrunda cihad edir" və "Allah uğrunda səbir edir"- deyilir.

"Allahla bərabər səbir vəfadır" ifadəsinin mənası: Allahın hökmlərinə qulun səbat etməsi, qəlbinin Ona yönəlməsindən və əzalarının Onun itaətindən sapmamasıdır. Belə olan kəs Allahla bərabər olmanın haqqını tam ifa etmiş olur. Belə ki, Allah-taala buyurmuşdur: **«Və** (əhdə) **çox vəfalı olan** (Allah qarşısındakı borcunu layiqincə ödəyən) **İbrahimin...»** (ən-Nəcm, 37).

"Allahdan uzaqlaşmağa səbir cəfadır" ifadəsinin mənası: bir kimsənin məbudu, ilahı, mövlasi olan (ki, Ondan başqa mövlası yoxdur) həyatı, dünya və axirət səadəti ancaq Onu sevməyə, Ona yaxın olmağa və Onun rizasını hər şeydən üstün tutmağa bağlı olan Uca Allahdan uzaqlaşmağa səbir etməkdən daha böyük cəfa varmı?

Bir şair demişdir:

Səndən sonra səbiri və ağlamağı çağırdım.
Ağlamaq cavab verdi, lakin səbir cavab vermədi.

Deyirlər ki, Yaqubun: "Mənim edəcəyim iş gözəl səbirdir"- deməsindən sonra özündən keçəcək qədər ilahi bir eşq onu Yusifin həsrətinə sövq edərək: "Vay Yusifin başına gələnlər"- deməsi də ağlamanın ona cavab verib, səbrin cavab verməməsinə dəlalət edir. Fəqət Yaqubun Yusifə səbir edə bilməməsi, "mənim edəcəyim iş gözəl səbirdir" deməsinə zidd deyildir. Çünki gözəl səbir özündə şikayət olmayan səbirdir. Allaha edilən şikayət isə gözəl səbrə zidd deyildir. Çünki Yaqub: **«...Mən dərd-sərimi yalnız Allaha ərz edirəm...»** (Yusif, 86) demişdi.

Allah-taala Peyğəmbərə gözəl səbri əmr etmiş, o da: "İlahi!

Qüvvətimin zəiflədiyini, çarəsiz qaldığımı ancaq Sənə ərz edirəm"[53] - demişdir.

Bəzi alimlərin fikrincə insanlar arasında müsibət sahibinin kim olduğu bilinməzsə, belə kəsin səbri gözəl səbirdir[54]. Bu vəsfi itirən adam gözəl səbri itirmiş olur. Fəqət müsibətin izinin, əlamətinin insanda görünməsini dəf etmək mümkün deyildir. Uğur Allahdandır.

Bəziləri səbrin növlərinə bir növ də əlavə edərək buna "səbrə səbir" adını vermişdir. Bu səbrin səbrə güc gəlməsi və səbrin səbirdən aciz olmasıdır. Səbrin bu növü digər növlərdən kənarda deyildir. Ancaq bu səbir səbrə bağlanmaqdan və səbir üzrə səbat etməkdən ibarətdir.

Hər şeyi Allah daha yaxşı bilir.

53 **Hədis zəifdir;** ət-Tabərani, "əl-Kəbir". 13/73/181; əl-Heysəmi, "Məcmuə əz-Zəvaid" (6/35) kitabında demişdir: "Hədisi ət-Tabərani rəvəyət edib, rəvayətçilərindən İbn İshaq müdəllisdir'".
54 "Ər-risalətul-quşəyriyyə", səh. 187.

# ON BİRİNCİ BÖLMƏ

## Şərəfli və pis kimsələrin səbirlərindəki fərq

Hər insanın xoşuna gəlməyən bəzi şeylərə istər-istəməz səbir etməsi lazım gəlir. Fəqət şərəfli kimsə səbrin sonunun gözəl olduğunu bildiyi üçün könül xoşluğu ilə səbir edər. Çünki səbir edən tariflənir sızlayan isə əksinə. Şərəfli kimsə bilir ki, səbir etmədiyi təqdirdə sızlanması itirdiyini geri qaytarmaz, başına gələn müsibət və fəlakəti yox etməz. Qədəri, yazıları dəf etmənin, yazılmayanı əldə etmənin çarəsi yoxdur. Sızlanmanın zərəri faydasından daha çoxdur.

Aqillərdən biri demişdir: "Axmaq bir ay ağlayıb sızlandıqdan sonra səbir edər. Ağıllı isə müsibət başına gəldiyi anda səbir edər". Bir işin sonda varacaği yer başlanğıcdakı yeridir. Buna görə bir işin sonu səbir olduqda, axmağın sonda edəcəyini ağıllının əvvəldə etməsi nə qədər gözəldir.

Aqillərdən biri demişdir: "Şərəfli kəslərin səbri kimi səbir etməyən, heyvan kimi bağırır. Şərəfli kəs müsibətə baxar, əgər sızlama müsibəti apararsa, bu sızlama faydalıdır, əgər müsibəti fayda verməzsə, onu iki qat artırmış olur".

Pis insan güclə səbir edər, sızlayar, ah-uf edər, bunların özünə heç bir fayda vermədiyini görər, sonra döyülmək üçün bağlanan adam kimi səbir edər.

Şərəfli insan Allah itaətinə səbir edər. Pis insan isə şeytan itaətinə səbir edər. Pis insanlar puç arzu və istəklərinin itaətində insanların ən səbirliləridir, lakin Rəbblərinə itaətlərində isə insanların ən səbirsizləridir.

Pis insan şeytana itaətində malını sərf etməyə ən çox səbir göstərər, lakin Allaha itaətində malını sərf etməyə az da olsa səbir etməz.

Nəfsinin arzusu və düşməninin rizası üçün bütün məşəqqətlərə qatlanmağa səbir edər. Fəqət Allah rizası üçün ən kiçik məşəqqətə səbir etməz. O, günah işlərkən özünə edilən əziyyət və cəfalara səbir edər, fəqət Allah uğrunda ona edilən əziyyət və cəfalara səbir etməz. Hetta ona əziyyət və cəfa ediləcəyi qorxusundan yaxşılığı əmr edib, pislikdən çəkindirməkdən qaçar.

Nəfsini və puç arzularını doyurmaq üçün namusunu belə qorumaz. Nəfsinin arzu və istəkləri üçün özünü və məqamını fəda

etməyə səbir edər. Lakin Allah rizası və Allaha itaətində heç bir şeyini sərf etməz. Şeytana itaətdə və nəfsinin arzu və istəkləri üçün hər şeyini sərf etməyə çox səbirlidir. Allah uğrunda malını sərf etməyə ən kiçik bir səbri olmaz. Məhz belələri ən pis kimsələrdir. Beləları Allah dərgahında şərəfsizlərdir. Şərəfli kimsələr Qiyamət günündə şahidlər çağırıldıqda pis kimsələrdən ayrılacaqlar. Çünki Qiyamət günü yaxşı kimsələrin pis kimsələrdən ayrılacağı gündür.

# ON İKİNCİ BÖLMƏ

## Səbrə kömək edən səbəblər

Səbir, əmr edilənlərdən olduğuna görə Allah-taala səbrə kömək edən və ona çatdıran bir çox səbəblər qoymuşdur. Uca Allah hər hansı bir şeyi əmr etdikdə, mütləq ona yardım edən səbəblər qoyar. Uca Allah öncədən təyin etdiyi hər hansı xəstəlik üçün dərmanını da öncədən təyin etmişdir[55]. Xəstə müalicə olunduqda Allahın lütfü ilə şəfa tapır. Səbrin nəfslərə ağır və çətin olmasına baxmayaraq əldə edilməsi mümkündür.

Səbrin özülünün iki maddəsi var: elm və əməl.

Qəlb və bədənləri müalicə edən bütün dərmanlar bu iki maddədən hazırlanır. Ona görə səbrin özülünün maddələri olan elm və əməl bir yerdə olmalıdır. Çünki ən faydalı dərmanlar bunlardan düzəldilir. Səbrin özül maddələrindən olan elm əmr edilənlərdəki xeyri, faydanı, ləzzəti, kamilliyi və yasaqlardakı pisliyi, zərəri və nöqsanları qavramaqdır. Bu iki elm tam mənasıyla anlaşıldıqda bunlara təqva ilə əməl etməyi, yüksək əzm və səyi, mərdlik və insaniyyəti əlavə etmək də lazımdır. Elmlə əməl birləşdirildikdə bütün məşəqqətlərə səbir asanlaşır. Səbrin acılığı və ağrısı ləzzətə çevrilir.

Yuxarıda deyildiyi kimi səbir ağıl ilə din və istəklə nəfs gücünün çarpışmasıdır. Bunlardan hər biri digərini məğlub etmək istəyir. Bu zaman hansının üstün gəlməsi istənilirsə ona kömək edilir. Bu çarpışma insan həm sağlam ikən, həm də xəstə ikən davam edir.

Bir kimsənin haram olan cinsi münasibətə şəhvəti qalxdıqda özündə olmaz. Özündə olsa belə gözünə malik olmaz, gözünə malik olsa qəlbi özünün olmaz. Hətta şeytan içindən durmadan pislikləri təlqin edərək onu dünya və axirətdə özünə fayda verəcək təfəkkür və zikrdən ayırır. Bu xəstəlikdən qurtulmaq istəyən kimsənin əvvəlcə aşağıdakıları etməsi lazımdır:

**1.** Şəhvət gücünün özül maddəsinin qidalar olduğunu bilib bunları azaltmaq surətiylə şəhvətə təhrik edən bu maddəni kəsməlidir. Əgər qidaları azaltmaqla şəhvətə təhrik edən maddə

---

[55] **Səhilıdir:** "Allah endirdiyi hər bir xəstəlik üçün şəfasını da endirir". Əbu Hureyrenin rəvayəti, əl-Buxari, 5678; "Zəd əl-Məad", 4/13, 133.

kəsilməzsə, oruc tutmalıdır[56]. Çünki oruc şəhvət yollarını daraldıb, hiddətini kəsər. Xüsusi ilə iftar vaxtı az yeməlidir.

**2.** Şəhvətə təhrik edən baxışlardan çəkinməlidir. Həddindən artıq dərəcədə gözlərə hakim olmalıdır. Çünki baxmaq şəhvani arzulara dəvət edir. Baxmaq şəhvətin qəlbə girməsinə səbəb olur.

"Müsnəd" əsərində[57] rəvayət olunan hədisdə deyilir: "Baxmaq şeytanın zəhərli oxlarındandır"[58]. Şeytan bu oxu qəlbə yönəldir. Qəlbin önündə qalxan olmazsa, ox ona dəyir. Qəlbin önündəki qalxan gözü qapamaqdır. Çünki şeytan şəhvətə təhrik edən yaylardan bu oxu atır. Sən bu oxun yolunda olmasan, ox sənə dəyməz. Qəlbini hədəf etsən, bu zəhərli oxlardan biri səni öldürər.

**3.** Haram olanların yerinə mübah olanları etməklə nəfsi qorumaqdır. Çünki nəfsin yə təbiətin arzuladığı hər şey Allahın mübah etdiklərində vardır. İnsanların çoxlarına lazım olan faydalı müalicə yolu budur və Allahın elçisi bunları bildirmişdir[59].

Birinci müalicə yolu azğın heyvanın və quduz köpəyin gücünün zəifləməsi üçün yeməyinin azaldılmasına bənzəyir. İkinci müalicə yolu da köpəyə əti, heyvana arpanı göstərməməyə bənzəyir. Çünki bunları gördükdə gücləri hərəkətə başlayır. Üçüncü müalicə yolu heyvan və köpəyin gücü dəyişməz qalıb sahiblərinə alışmaları üçün ehtiyaca görə onlara istədikləri yemi verməyə bənzəyir. Ona görə artıq verildikdə sahiblərinə alışmazlar.

**4.** Pis yoldan ehtiyaclarının əldə edəcəklərindən gözlənilən dünyəvi xəsarəti düşünməkdir. Əgər Cənnət və Cəhənnəm olmasaydı, ağlı başında olan kəs bu pislikləri etməzdi. Fəqət eşqin gözü kordur.

**5.** Səni özünə dəvət edən həm səni, həm də başqasını dəvət etməklə tanınırsa, onun çirkinliyi düşünülməlidir. Köpəklərin və qurdların içdiyi hovuzdan su içməkdən nəfsini və şərəfini qorumalıdır. Yaxşı deyiblər: "Sizinlə görüşməyi izzət və şərəfimə sığışdırmadığımdan istəmirəm. Çünki orada digər alçaq ortaqlar vardır".

Digər biri belə deyib: Yeməyin üzərində milçəklər çoxaldıqda

---

[56] Abdullah bin Məsudun rəvayəti: "Ey cavanlar, kimin imkanı varsa evlənsin. Bu onun gözünü və ayaqları arasında olanını zinadan qoruyar". əl-Buxari, 1905; Müslim, 1400.

[57] "Müsnəd"də bu hədisi belə ləfz ilə görmədim.

[58] **Çox zəifdir:** əl-Hakim, 4/313-314; ət-Tabərani, "əl-Kəbir", 10362. əz-Zəhəbi hədisin ravilərinin zəif və mətruk olduğunu demişdir. Mən deyirəm ki, sənədi də üç səbəbdən çox zəifdir.

[59] **Səhihdİr:** Cabir bin Abdullahın rəvayəti: "Qadın şeytan surətində gələr, həmin surətdə də gedər, əgər sizdən biriniz xoşa gələn qadını görsə, öz qadınının yanına gəlsin (onunla əlaqədə olsun). Bu onun istəyini söndürür". Müslim, 1403; Əbu Davud, 2151; Əhməd, 3/330, 341, 348, 395.

yeməyi çox arzuladığım halda belə istəmədim. Çünki bir sudan köpəklər içdikdə aslanlar ondan uzaqlaşırlar. Bir kimsə tüpürcəyinin xəbis kimsənin xəstəlikli tüpürcəyinə qarışmasını xatırlasın. Çünki fasiqin tüpürcəyi xəstəlikdir.

Ey qəlbim! Varını, yoxunu yaxşı, pis hər kəsə sərf edən və ruhunu səxavətlə fəda edən kimsəni düşünərək təsəlli al. O səxavətli insan suya bənzər. Suya gələn hər heyvan ondan içər. O səxavətli insan budağa bənzər. Hər külək onu tərpədər. Tüpürcək hər nə qədər dadlı isə də ağzı qoxulunun tüpürcəyini xatırla.

Özündə bir az insanlıq və heysiyyat olan kimsə bu vəziyyətdəkilərə zahirən və daxilən uyğun olmağa razı olmaz. Əgər nəfsi bu pis kimsələrdən uzaqlaşmayıb, onlarla oturub-durmağa razı olarsa, ağlı ilə bu saxta gözəlliklərin arxasındakı gerçək çirkinlikləri düşünsün. Özünü istifadə etdirən kəs heyvanların belə düşməyəcəyi ən alçaq vəziyyətə düşmüş olur. Donuzdan başqa heç bir heyvan bu çirkin işdə ondan istifadəyə razı olmaz. Donuzdan başqa bu çirkin işi edən heç bir heyvan yoxdur. Bu çirkin işin özünə tətbiq edilməsinə razı olan donuz kimidir. Bu çirkin iş üzdəki və bədəndəki bütün gözəllikləri örtər. Bil ki, bir şeyi sevməyin səni kor və kar edər.

Xəstəliyinə tutulmuş olduğun qadın olarsa, o, Allaha, Elçisinə, ailəsinə, ərinə və özünə xəyanət etmiş olur. Bu ən çirkin iş özündən sonrakı nəslinə sirayət edib onların günahlarından da ona hər zaman pay ayrılır. Onun etdiyi bu çirkin işin yanında saxta gözəlliyin heç bir qiyməti yoxdur. Bu çirkinliyi öyrənmək istəyirsənsə, belə pis kimsələr yaşlandıqda daxillərindəki çirkinliklərin üzlərində əks etdiyini görərsən. Allah-taala necə də gözəllikləri çirkinliklərə çevirərək, onların üzlərində çirkin göstərir. Belə ki, bir şerdə belə deyilmişdir:

"Aşiq əsiri olduğu gözəlliyin sonunu düşünsəydi, aşiq olmazdı".

Bu çox uzundur, lakin biz təməllərini xatırladaraq kifayətləndik[60].

## Fəsil

Dini gücü möhkəmləndirən bir çox işlər var:

**1.** Allah-taalanın böyüklüyünü, hər şeyi haqqıyla görüb kamalıyla eşitdiyini düşünərək Ona üsyan etməmək.

---

[60] Daha ətraflı məlumatı "əd-Duə vəd-Dəva" (səh.319 və sonra) kitabında vermişdir.

Bir kimsənin qəlbində Allahın əzəməti yerləşirsə, qəlbi onun günah etməsinə itaət etməz.

**2.** Allah-taalanın məhəbbətini qəlbdə daim saxlayıb, Ona olan məhəbbətə görə günahı tərk etmək.

Çünki sevən bir kimsə sevdiyinə itaət edər. Tərk etmənin ən üstünü sevənlərini tərk etməsidir. Belə ki, itaətin ən üstünü sevənlərin itaətidir. Allahı sevdiyindən dolayı günahı tərk edib Ona itaət edən ilə, Allahın əzabından qorxub günahı tərk edib Ona itaət edən arasında çox böyük fərq vardır.

**3.** Allahın nemətini və yaxşılığını düşünmək.

Çünki şərəfli kəs ona edilən yaxşılığa pisliklə cavab verməz. Ancaq pis kimsələr özlərinə edilən yaxşılığa pisliklə cavab verərlər. Buna görə də Uca Allahın yaxşılığını və nemətini düşünərək Ona qarşı günah işlətməkdən həya edilməlidir. Allahın neməti və yaxşılığı sənə gələrkən sənin günahların Ona yüksəlməkdədir. Bir mələk Allahın yaxşılıq və nemətlərini sənə endirərkən digər bir mələk də sənin günahlarını Ona yüksəldir. Yaxşılığa qarşı pislik etmək necə də çirkin bir işdir.

**4.** Allahın qəzəbini və intiqamını düşünməkdir.

Çünki Uca Allah qulun Ona qarşı üsyanı davam etdirdiyini gördükdə, ona qəzəblənər. Bir dəfə qəzəblənsə, nəinki bu zəif qul, heç nə Onun qəzəbinin qabağını ala bilməz.

**5.** Əldən gedənləri düşünmək. Günah işlətməklə dünyanın və axirətin xeyir və səadəti əldən gedir. Belə günah işlədən kimsəyə fasiq, haram və günah edən - "facir" kimi ağılla, şəriətlə və adətlə ən çirkin adlar verilib, ondan saleh, müttəqi kimi ən gözəl adlar alınır.

Günahlara davam etdiyi təqdirdə bir zərrəsi dünya və dünyada olanlardan qat-qat daha xeyirli olan iman - Allah qorusun - əldən gedə bilər. Ağıl başında olan kəs ləzzəti gedib günahı qalan pis istək və arzuları üçün belə bir imanı sata bilərmi?

Bir hədisdə deyilir: "Zina edən, zina edərkən mömin olaraq zina etməz"[61].

Səhabələrdən bəziləri demişdir: "Zina edəndən imanı çıxıb başının üstündə kölgə kimi durar, tövbə edərsə, geriyə, öz yerinə qayıdar"[62].

Tabiunlardan bəziləri də belə demişdir: "Zina edəndən iman köynək bədəndən çıxdığı kimi çıxar, tövbə edərsə, onu təkrar geymiş olar".

Buxarinin əsərində Peyğəmbərdən rəvayət edilən hədisdə belə

[61] Əbu Hureyrənin rəvayəti: əl-Buxari, 2475; Müslim, 57.

[62] əl-Beyhəqi, "Şuabul-İman", 4/352-353/5367; Əbu Davud, 4690; əl-Hakim, 1/22; İbn Həcər, "Fəth əl-Bari", 120/61.

buyurulur:

"Soba kimi altı geniş, üstü dar bir quyuya rast gəldik. Burada çılpaq kişi və qadınlar var idi. Yanımda olan iki mələkdən soruşdum:

- Bunlar kimdir?

Mələklər dedilər:

- Onlar zinakarlardır.

Çünki onlar iman paltarlarını soyunmuşlardır. Onların qəlblərindəki şəhvət sobanı həqiqi sobaya çevirib onları alova bürümüşdü[63]".

**6.** Məhv etməyi və zəfəri düşünmək.

Çünki şəhvətini məhv edib, şeytan üzərində qazanılan zəfərin dadı, sevinci, fərəhi bunları dadan üçün, insanlardan olan düşmən üzərində əldə edilən zəfərdən daha dadlı və sevindiricidir, son olmaq etibarı ilə təriflənməyə daha layiqdir. Çünki bu zəfər vücuddakı xəstəliyi Allahın lütfü ilə yox edib, sağlamlığa qovuşduran dərmanın içilməsinə bənzəyir.

**7.** Allah-taalanın rizası üçün haramları tərk edən, nəfsini pis arzu və istəklərdən qoruyan kimsə üçün vəd etdiyi Cənnəti və Onun Cəmalını düşünmək, bu dünya ilə axirətdən hansı layiqsə ona üstünlük vermək.

**8.** Allah-taala ilə bərabər olduğunu düşünmək.

Bu bərabərlik iki növdür: ümumi və xüsusi. Ümumi bərabərlik Allah-taalanın hər şeyi bilməsi və heç bir şeyin ondan gizli qalmamasıdır. Əvvəldə bu barədə qeyd olunub.

Xüsusi bərabərlik isə Allah-taalanın buyurduğu kimidir: **«...həqiqətən Allah səbir edənlərlədir»** (əl-Ənfal, 46);

**«Həqiqətən, Allah Ondan qorxub pis əməllərdən çəkinənlər və yaxşı işlər görənlərlədir!»** (ən-Nəhl, 128);

**«...Şübhəsiz ki, Allah yaxşı əməllər edənlərlədir!»** (əl-Ənkəbut, 69).

O halda bu xüsusi bərabərliyin dünyada və axirətdə, kiminsə ömrünün əvvəlindən sonuna qədər bütün arzu və istəklərindən qane olmasından nə qədər xeyirli və faydalı olduğunu anlamaq mümkün deyildir. Buna görə yatanın röya gorməsi və ya kölgə kimi yox olan ömründəki üzüntülü və kədərli ləzzət, əbədi və sonsuz ləzzətdən necə üstün sayılır?

**9.** Əcəlin qəflətən gəlməsindən qorxaraq hazır olmaq.

Çünki ölümlə dünyəvi və axirətlə bağlı bütün işlər və əməllər sona çatır. O nə böyük həsrət, nə böyük acı, nə qədər çətindir! Bunu ancaq başına gələnlər bilər.

[63] əl-Buxari, 386.

Deyiblər ki: "Ey nəfsinə göz qırpımı qədər güvənməyən və bir günü belə sevinclə keçməyən kəs, bu fani dünyanı əbədi və sonsuz olan axirətdən üstün tutmaqdan çəkin!"

**10.** Bəlanı və sağlamlığı düşünmək. Gerçək bəla günahlar və nəticələridir. Gerçək sağlamlıq isə ibadət, itaət və onların nəticələridir. Bəla əhlinin bədənləri nə qədər sağlam olsa da, günahkarlardır. Sağlamlar isə bədənləri nə qədər xəstə olsa da, ibadət və itaətdə olanlardır.

Əsərlərin birində elm əhlindən biri deyir: "Bəla sahiblərini gördükdə həmin anda Allahdan sağlamlıq diləyin"[64]. Çünki bəla sahibləri Allaha qarşı işlədikləri günahlarına və Allahdan üz çevirmələrinə görə o bəlalara uğramışlardır.

Ən böyük bəlanın günah olduğuna şübhə yoxdur. Fəqət bəla kəlməsi həm bədənlərdəki, həm də dindəki xəstəlikləri əhatə edir.

**11.** Ağıl və dini güclərin, nəfs və keçici həvəsin gücünü məğlub edib, qələbə əldə edənə qədər özü ilə mübarizə aparmaq.

Çünki nəfs və keçici həvəsin gücü məğlub olduqda, qulun dini, səyi və əzmi güclənmiş olur. Bir şeyin ləzzətini dadan kəs onu əldə etmək üçün var gücü ilə çalışır. Ağır işlərdə çalışmağı vərdiş edən şəxsin gücü çox olur. Buna görə hambalların, dəmirçilərin və digər ağır işlərdə çalışanların gücü günbəgün artır. Lakin toxucu və dərzi kimi digər peşə sahiblərinin gücü belə deyildir. Özü ilə mübarizəni tamamilə tərk edənin gücü zəifləyir, nəfsi və şəhvəti quvvətlənir. Nəfsinə və keçici istəklərinə üstünlük verən onların əsiri olur.

**12.** Pis düşüncələrdən qorunmaq.

İnsanın qəlbinə pis düşüncələr gəldikdə onları yox etməyə, qəlbində sığındırmamağa, yerləşdirməməyə çalışmalıdır. Çünki pis düşüncələr iflas etmişlərin sərmayəsi olan bir qrup təmənnalardır. Bunlar insanın içində yerləşdikdə əvvəl arzular olur, sonra qüvvətlənərək istəklər olur, sonra qüvvətlənərək iradə olur, sonra qüvvətlənərək istənilən əzm və qəsd olur. Bu pis istəkləri ilk anda qovmaq işlərə, hərəkətə çevirildikdən, adət edildikdən sonra qovmaqdan daha asandır.

**13.** İnsanı nəfsə və keçici istəklərə çağıran münasibətlərin, arzu və istəklərin tamamilə kəsilməsini məqsəd etməmək.

Əksinə, insanın arzu və istəklərini Allahın arzu etdiyinin yerinə

---

[64] Bu cür ləfzə rast gəlmədim. Bu mənaya uyğun Əbu Hureyrənin rəvayətində deyilir: "Bəlaya düçar olanı görən: "Bu bəlaya məni salmayıb, məni sağlam edən, məni məxluqatının çoxundan fəzilətli edən Allaha həmd olsun"- deyərsə, bəlaya düçar olmaz". ət-Tirmizi, 3493; ət-Tabərani, əd-Dua, 799; **sənədi zəifdir.** Hədisin zəifliyini təsdiq edən bir çox hədislər Əbu Usamə Səlim bin İid əl-Hilali tərəfindan kitab tədqiq edilərkən verilmişdir. Bax: orijinala səh. 95-96.

gətirilməsi üçün istifadə etməklə özünə faydalı olanlara sərf etməsi məqsəd edilmişdir. Çünki arzu və istəklərin Allah yolunda olması, insanı şər və günaha aparmasını qabaqlayar. İnsan hər şeyi Allah üçün edirsə, Allah onu nəfsinin və şeytanın şərindən qoruyur.

Allah üçün edilməyən hər şey nəfs və keçici istəklər üçün edilmiş olur. Elm Allah üçün olmazsa, nəfs və keçici istəklər üçün olur. Əməl Allah üçün olmazsa, riya və nifaq üçün olur. Mal Allahın itaətində xərclənməzsə, şeytan və keçici istəklərin itaətində xərclənmiş olur. Vəzifə və mövqe Allah üçün tətbiq edilməzsə, nəfsin və keçici istəklərin arzuları üçün istifadə olunmuş olur. Güc Allahın əmrində istifadə olunmazsa, ona üsyan yolunda istifadə olunur. Bir kimsə özünü Allah üçün əməl etməyə alışdırırsa, Allah üçün əməl etmək ona çox asan gəlir.

Bir kimsə özünü nəfsinin puç arzu və istəkləri üçün əməl etməyə alışdırırsa, Allah üçün əməl etmək ona çox çətin gəlir. Bütün işlər belədir. Allah yolunda malını xərcləməyi adət edən kimsənin doğru olmayan yolda malını xərcləməsi mümkün deyildir. Əksi də belədir.

**14.** Allah-taala qullarını ayələri haqqında düşünməyə təşviq etmişdir. Ayələr iki qisimdir. Biri Qurani Kərimdəki, digəri isə kainatdakı ayələrdir. Yəni Allahın varlığının əlaməti və buna şahid olan bu aləmdir.

Qurani-Kərim aramla oxunmalı və mənası incəlikləri ilə düşünülməlidir. Allahın varlığının, təkliyinin və sifətlərinin dəlili olan bu aləmin yaradılışı düşünülməlidir. Bu ayələrin hakim olduğu qəlbdə şeytan və onun vəsvəsinə yer olmaz. Allahın, Kitabının, Elçisinin və səhabələrin söhbətindən ayrılmayan bir kəsin qazancı nə qədər də böyükdür! Onların söhbətlərindən üz çevirib insan, cin və şeytanlarının söhbətinə davam edən kimsənin zərər və ziyanı nə qədər də böyükdür!

Yardım ancaq Allah-taaladan istənilir.

**15.** Dünyanın sürətlə sona doğru getməsi və yox olmasının yaxınlaşmasını düşünmək.

Sonsuz və əbədi olan axirət üçün bu dünyadan qiymətsiz və faydası çox az olan azuqə yığmağa ancaq yaxşı işlər üçün əzmi az olan, insaniyyətdən uzaq və qəlbi ölmüş kəs razı olar. O, Qiyamət günü dünyadan aldığı azuqənin mahiyyətini görüb özünə fayda verməyəcəyini anladıqda əsil üzüntünü duyacaqdır. Özünə fayda verəcək azuqəni buraxıb onun yerinə əzab verəcək azuqəni almışın halı necə olacaq? Hətta özünə faydalı azuqəni alıb ondan daha faydalı olan azuqəni almayan üçün də bu böyük üzüntü və ziyan olacaqdır.

**16.** Qulun qəlbləri iki barmağı arasında, bütün işlər iki əlində

və hər şey daimi olaraq Özündə sona çatan Allah-taalaya halını ərz etməsi.

Çünki etdiyi dua əsən xəfif rəhmət küləklərinə təsadüf edə bilər. Məşhur bir əsərdə deyilmişdir: "Bəzi günlərdə Allah-taalanın əsən rəhmət küləkləri vardır. O küləklər üçün hazırlıqlı olun. Allahdan qüsurlarınızı örtməsini və qorxduqlarınız şeylərə görə əmin-amanlıq diləyin. Qul halını daim Allaha ərz etdirərkən elə bir saata təsadüf edər ki, o zaman Allahdan nə istəsə, mütləq onu verər"[65].

Kimə dua etmə istəyi verilirsə, onun duası qəbul edilir. Çünki Allah-taala onun duasının qəbul edilməsini istəməsəydi, dua etməsi üçün onu ruhlandırmazdı.

Yaxşı deyilmişdir: "Səxavətli əllərindən umduğumu və istədiyimi verməyi murad etməsəydin, istəməyi mənim üçün adət etdirməzdin".

İnsan halının pis olduğuna baxıb ümidsizliyə qapılmasın. Çünki sifətlərində bənzəri olmayan Allah-taala qulu ilə hərəkətlərində də bənzəri olmayanın alış-verişi kimi davranar.

Uca Allah quluna vermək üçün onu məhrum edər, şəfa vermək üçün xəstə edər, varlandırmaq üçün kasıb edər, diriltmək üçün öldürər. Allah-taala Adəm və Həvvanı Cənnətdən qovmadı, ancaq oraya daha mükəmməl olaraq qayıtsınlar deyə çıxardı. Belə deyilmişdir: «Ey Adəm! Mənim sənə cənnətdən çıx deməmə üzülmə. Onu sənin üçün yaratdım, yenə səni ora salacağam»

Haqq olan Allah bəla verməklə quluna nemət verir, məhrum etməklə bağışlayır, xəstə etməklə sağlamlığa qovuşdurur. Qul pis vəziyyətə düşdükdə əsla ümidsiz olmamalıdır. Allahın qəzəbinə gələcək və Allahı özündən uzaqlaşdıracaq bir vəziyyətə düşərsə, iş çox ciddi olduğundan həmin anda iman gətirib, tövbə və bağışlanma diləməlidir.

**17.** İnsan özündə iki zidd və cazibəli qüvvə arasında olduğunu bilməlidir.

Onun çəkdiyi zəhmət bu iki cazibədar qüvvənin arasındadır. Cazibə qüvvələrindən biri qulu ən uca məqam olan Cənnətə və ya Cənnət əhli olan peyğəmbərlər, sadiqlər, şəhidlər, salehlərlə olmağa çəkər. Cazibə qüvvələrinin digəri isə qulu şeytanların və köməkçilərinin yeri olan Cəhənnəmin ən aşağı qatlarına çəkər.

İnsan uca məqama çəkən qüvvəyə boyun əyərsə, onu yüksək

---

[65] **Zəifdir:** ət-Tabərani, "əl-Kəbir", 1/250/720; "əd-Dua", 26; ƏbuNəim, "Hilyətul-Övliya", 3/162; əl-Beyhəqi, "əl-Əsma ves-Sifat", 603; əl-Bağəvi, "Şərh əs-Sünnə", 5/179,1378; əl-Bəğəvi hədis qəribdir demişdir. Mən deyirəm ki, hədisin sənədində zəif və naməlum ravi olduğu üçün zəifdir.

məqamlardan layiq olduğu yerə qaldırar, aşağıya çəkən qüvvəyə tabe olarsa, onu Cəhənnəmin ən aşağı qatlarından layiq olduğu yerə salar.

İnsan özünün yüksəyə çəkən qüvvə ilə, yoxsa aşağı çəkən qüvvə ilə olduğunu bilmək istəyirsə, bu aləmdə ruhunun harada olduğuna baxsın. Çünki ruh bədəndən ayrılanda dünyada olarkən, cazibə qüvvələrindən hansı ilə bərabər idisə, o tərəfə gedər.

İnsan xüsusiyyəti, ağlı, cəzası və mükafatı etibarıyla sevdiyi ilədir. Hər insan hansı şeyə üstünlük verirsə, xasiyyəti onu o tərəfə və həmin tərəfin əhlinə çəkər. Hər insan özünə münasib olana meyl edər. Allah buyurmuşdur: **«De: "Hərə öz qabiliyyətinə** (xislətinə) **görə iş görər..."»** (əl-İsra, 84).

Yaxşı kəslər zatlarıyla, səyləriylə, əməlləriylə yüksək məqamlara qalxırlar. Pis kimsələr isə ən aşağı qatlara düşərlər.

**18.** İnsan rəhmət yağışının enməsi üçün əvvəlcə qəlbinin boşaldılmasının, sonra ora əkilən toxumun cücərib tam yetişməsi üçün yabanı otlardan təmizlənməsinin şərt olduğunu bilməlidir.

Qəlb boşaldılmadığı təqdirdə rəhmət yağışı onu qəbul edəcək bir qəlblə qarşılaşmaz. Qəlb boşaldılırsa oraya rəhmət yağışı enər. Lakin yabanı otlardan təmizlənmədiyi təqdirdə, əkilən toxumdan istənilən məhsul əldə edilməz. Hətta yabanı otlar çox olduqda əsil məhsula üstün gəlir və qəlb onlara aid olur.

Torpağını düzəldib, təmizləyib, əkinə tam mənası ilə hazırladıqdan sonra toxumu əkən adamın yağışın yağmasını gözləməsi onun haqqıdır. Eynilə qəlbini təmizləyib, pis düşüncə və xatirələrdən boşaltdıqdan sonra oraya zikr, təfəkkür, məhəbbət, ixlas toxumlarını əkib, rəhmət küləklərinin əsməsinə təqdim edən, vaxtında rəhmət yağışını gözləyən kimsənin də mənəvi məhsulun yetişməsini ümid etməsi haqqıdır.

Müəyyən mövsümlərdə yağışın yağması ümidi güclü olduğu kimi, şərəfli vaxt və fəzilətli zamanlarda, xüsusi ilə Ərafatda, yağış yağarkən edilən duasında, cümə və bayram günlərində çoxlu camaat toplanıb, qəlblər köməkləşib, səy və əzmlər birləşdikdə Allahın rəhmət küləyinin əsdiyi vaxta təsadüf etmə ümidi qüvvətlənir. Çünki Allah-taala əzm və nəfəslərin birləşməsini, xeyirlərin meydana gəlməsi və rəhmətin enməsi üçün zəruri səbəblərdən etmişdir. Digər səbəblər də nəticəni zəruri edir. Məsələn, yağışın yağmasına buludlar, otların bitməsinə də yağış səbəbdir.

Mənəvi səbəblərin rəhmətin meydana gəlməsindəki təsiri, hissi səbəblərin rəhmətin meydana gəlməsindəki təsirindən daha güclüdür. Lakin təəssüf ki, insan cahilliyi üzündən nağd olan dəyərsiz şeyləri, sonra əlinə keçəcək bir çox qiymətli şeylərdən üstün tutur.

İnsan qəlbini boşaldıb mənəvi xəstəliklərini müalicə edib

rəhmətin enməsinə hazırlaşsaydı, Allahın ilahi sirlərindən meydana çıxan, görünən bir çox təəccüblü şeylər görərdi. Allahın fəzilətini, kərəmini qulun qüsurları qabaqlayır. Qul o qüsurlarını yox etsəydi, hər tərəfdən Allahın fəziləti və kərəmi ona sürətlə tələsərdi.

Baş vurduğu bütün əraziləri sulayan bir çayı düşün. Lakin o çay ilə arasında sədd olan bir ərazi susuz qalmaqdadır. Çay ərazisinin yanından keçdiyi halda, sahibi o səddi yox etməz və ərazisinin susuzluğundan şikayət edər.

**19.** İnsanın bu həqiqətləri bilməsi şərtdir:

Allah-taala qulunu fani olmayan əbədilik, zillət və həqarət olmayan izzət və şərəf, içində qorxu olmayan əmin-amanlıq, yanında acısı olmayan ləzzət, əskikliyi olmayan kamillik, kasıblığı olmayan zənginlik üçün yaratmışdır.

Davamlılığı çox tez keçən, izzət və şərəfi, həqarət və zilləti bir-birinə yaxın olan sonra izzət ilə şərəfi gedib yerlərini zillət ilə həqarətə verən dünya üçün yaratmışdır. Əmin-amanlıqla qorxu bərabər olub, sonra əmin-amanlığı gedib yerini qorxuya verən bu dünyada imtahana tabe edilmişdir. Bu dünyanın zənginliyi, ləzzəti, fərəhi, sevinci yə neməti əksləri ilə qarışıq olurlar. Sonra saxta zənginliyi, ləzzəti, fərəhi, sevinci və neməti gedər, geridə kasıblıq, acı kədər, üzüntü və məhrumiyyət qalar.

İnsanların bir çoxu bu mövzuda yanıldılar. Çünki gerçək neməti, ebədiliyi, izzət və şərəfi, mülk və səltənəti, imkan və vəzifəni həqiqi yerləri olmayan bu dünyada axtardılar. Bunların əsil yerləri olan axirəti unutdular. Bir çoxları eşitdiklərini bu dünyadan da əldə edə bilmədilər. Bəziləri istədiklərini əldə etsələrdə, fəqət çox tez keçici olduğundan lap az istifadə edə bildilər.

Bütün peyğəmbərlər insanları əbədi olan nemət və Cənnətə, daimi olan mülk və səltənətə dəvət etmək üçün gəldilər. Onların dəvətini qəbul edənlər dünyada ən ləzzətli və ən xoş nemətlərə nail olan hökmdarların həyatı kimi həyat sürdülər. Çünki dünyada zahidlik hazır bir mülk və səltənətdir.

Şeytan mömin insanın zahidliyinə dözməyərək, həmin şəxsin ona çatmaması üçün var gücü və qüvvəsi ilə çalışır. Çünki şəhvətinə və qəzəbinə malik və sahib olan mömin ağlı və dini güclərini üstün etdiyindən həqiqi hökmdardır. Bu mülkün sahibi tam müstəqilliyi əldə etmişdir. Şəhvətinin və qəzəbinin əmri altında olan hökmdar isə həqiqətən onların köləsi olmuşdur. O kimsə hökmdar qiyafəsində, amma tam mənası ilə itaətkar bir uşaq olub, sahibi dəvəsini cilovundan tutub istədiyi yerə apardığı kimi, şəhvət ilə qəzəb də onu istədikləri yerə aparar. Zahirən hökmdar daxili aləmi kölə olan kimsənin əlindəki nemətlərə və əvvəli ləzzət sonu üzüntü və zərər

olan, şəhvətlərə göz dikənlər aldanmışların lap özləridir.

Allahın köməyinə nail olan bəsirət sahibi isə hər şeyi əvvəldən sonuna qədər incəliklə düşünür və heç vaxt saxta görünüşlərə aldanmır. Bu Allahın istədiyi kimsəyə olan lütfüdür. Allah böyük fəzilətli kərəm sahibidir.

**20.** İnsanın bütün bunları sadəcə bilməsinin və inanmasının məqsədin əldə edilməsi üçün yetərli olmadığını bilməsi və bildiklərinə bütün güc və qüvvəsini sərf edərək istəniləni əldə etməsi lazımdır.

Şəriətə müxalif olan adət və ənənələrdən uzaqlaşmalıdır. Belə adət və ənənələr kamilliyin və qurtuluşun düşmənləridir. Bunlara davam edənlər əbədi nicat tapmazlar. Belə adət və ənənələrdən qurtulmaq, ancaq fitnə yerlərindən qaçmaqla, belə yerlərdən uzaqlaşmaqla mümkün olur. Allahın elçisi demişdir: "Kim bir yerdə Dəccalın olduğunu eşidərsə, oradan uzaqlaşsın"[66].

O halda pisliklərin səbəblərindən və yerlərindən uzaqlaşmaq qədər onlardan qurtulmağa yardım edən heç bir şey yoxdur. Şeytanın burada çox incə və gizli oyunu vardır ki, bundan ancaq mahir olanlar qurtulur. O da şər yerlərində xeyri göstərib, mömini onu əldə etməyə dəvət etməsidir. Mömin oraya yaxınlaşdıqda onu yaxalayır.

Hər şeyi ən doğru bilən Allahdır.

[66] **Səhihdir:** İmran bin Hüseynin rəvayətinin bir hissəsidir. Əbu Davud, 4319; Əhməd, 4/431; Dedim: sənədi səhih, rəvayətçisi siqadır.

# ON ÜÇÜNCÜ BÖLMƏ

## İnsanın bütün hallarda səbrə ehtiyacı olması haqqında

İnsan, yerinə yetirməsi və həyata keçirməsi vacib olan əmrlər, çəkinməsi və tərk etməsi vacib olan yasaqlar, kəskinliklə həyata keçiriləcək müqəddərat və sahibinə şükür etməsi vacib olan nemətlər arasındadır. Bunlar heç bir zaman insandan ayrı olmadığı kimi səbir də ondan ölənə qədər ayrılmaz.

Bu dünyada insanın qarşılaşdığı şeylər iki növdür. Birincisi, insanın nəfsinin və ehtirasının arzu və istəklərinə uyğun olanlardır. Digəri bunlara zidd olanlardır. Buna görə insan hər iki növdə də səbrə möhtacdır.

**Birinci növ.** İnsanın arzu və istəklərinə uyğun olanlar səhhət, salamatçılıq, vəzifə, mal kimi dadlı və mübah olan şeylərdir. İnsan belə şeylərdə müxtəlif səbəblərdən dolayı daha çox səbrə möhtacdır.

Birincisi, insan imkan, vəzifə və mal kimi şeylərə meyl edib aldanmamalıdır. Əks təqdirdə bunlar onu günah olan qürura, - təkəbbürlüyə, azğınlığa, ərköyünlüyə sövq etdirər ki, Allah belələrini əsla sevməz.

İkincisi, insan hər hansı bir şeyin artıq dərəcədə düşkünü olmamalıdır. Əks təqdirdə tərsinə dəyişər. Biri artıqlamasıyla yeyər, içər və cinsi münasibətdə olarsa, bunlar əksinə dəyişərək yeməkdən, içməkdən və cinsi münasibətdə olmaqdan məhrum olar.

Üçüncüsü, insan istər bədənlə, istərsə də mal ilə əlaqəli olan Allahın haqlarını yerinə yetirirsə səbirli olmalıdır, Allahın haqlarını zay etməməlidir. Əks təqdirdə bütün nemətlər əlindən alınar.

Dördüncüsü, haramdan uzaqlaşmağa səbir etməli, nəfsə hər istədiyini verməməlidir. Çünki nəfs insanı harama sürükləyir. Mübahlardan da nəfsi məhrum etməməli, əks halda insanı pis yollara salar.

Bolluqda pisliklərdən uzaqlaşmağa ancaq sadiq qullar səbir edər. Sələfi salehdən bəziləri belə demişlər: "Bəlalara mömin də, kafir də səbir edər. Fəqət səhhətə, sağlamlığa və bolluğa ancaq sadiq qullar səbir edər".

Əbdürrəhman bin Auf demişdir: "Biz kasıblıq və qıtlıqla imtahan edildik, səbir etdik. Lakin bolluqla imtahan edildik, səbir edə

bilmədik"[67].

Buna görə Allah-taala qullarını malların, zövcələrin və övladların fitnələrindən çəkindirərək: **«Ey iman gətirənlər! Nə mal-dövlətiniz, nə də oğul-uşağınız, sizi Allahın zikrindən yayındırmasın!»** (əl-Munafiqun, 9) - buyurmuşdur.

Digər bir ayədə: **«Ey iman gətirənlər! Şübhəsiz ki, zövcələrinizdən və övladlarınızdan sizə düşmən olanlar vardır. Onlardan özünüzü gözləyin! Amma** (tövbə edəcəkləri təqdirdə) **onları əfv etsəniz,** (təqsirlərindən) **keçsəniz və bağışlasanız** (daha yaxşı olar). **Çünki Allah bağışlayandır, rəhm edəndir!»** (ət-Təğabun, 14)- buyurmuşdur.

Ayədəki "düşmənlik" bir çox təfsirçilərin bildirdiyi kimi məzəmmət, nifrət etmə və müxalif olma düşmənliyi deyildir. Əksinə, bu "düşmənlik" onları sevmə düşmənliyidir. Belə ki, onların sevgisi bəzi möminləri hicrətdən, cihaddan, elm öyrənməkdən, sədəqə verməkdən, digər dini işlərdən və yaxşı əməllərdən ayırmışdır.

Tirmizinin İsraildən, o da Simakdan, o da İkrimədən, o da İbn Abbasdan rəvayət etdiyi hədisə görə biri yuxarıdakı ayənin kimlər haqqında nazil olduğunu İbn Abbasdan soruşmuş, o da belə demişdir: "Məkkə əhlindən bir dəstəsi haqqında nazil olmuşdur ki, bunlar müsəlman olmuş və Mədinəyə Peyğəmbərin yanına getmək istəyənlərdir. Lakin zövcələri və övladları da onları buraxmaq istəməmişdilər. Sonra Peyğəmbərin yanına gələndə özlərindən əvvəl hicrət edənlərin dində çox yüksək biliklərə nail olduqlarını görəndə zövcələrini və övladlarını cəzalandırmaq istədilər. Bu hadisə ilə əlaqədar Allah-taala bu ayəni endirdi"[68]. ət-Tirmizi demişdir ki, hədis həsən səhihdir.

İnsan zövcələri və uşaqlarına görə kamillik və qurtuluş kimi bir çox şeyləri itirə bilər. Bir hədisdə: "Şübhəsiz, uşaqa görə ata xəsis və qorxaq ola bilər"- deyilmişdir[69].

İmam Əhmədin Zeyd bin Habbabdan, o da Zeyd bin Vaqiddən, o da Abdullah bin Bureydədən rəvayət etdiyinə görə Bureydə demişdir: "Mən atamın belə dediyini eşitdim: "Bir gün Allahın elçisi xütbə oxuyarkən Həsən ilə Hüseyn (Allah hər ikisindən razı olsun!) əyinlərində qırmızı köynək, atılıb-düşərək gəlirdilər. Allahın elçisi minbərdən enib, onları qucağına alıb, minbərə çıxardaraq arxalarında durdu. Sonra - Allah-taala: **«Həqiqətən, mal-dövlətiniz və oğul-uşağınız ancaq sınaq vasitəsidir...»** (ət-Təğabun, 15) sözündə nə qədər doğru söyləmişdir - deyərək əlavə etdi ki, mən bu

---

[67] **Həsəndir:** ət-Tirmizi, 2464. Deyirəm: sənədi Tirmizinin dediyi kimi həsəndir.
[68] **Həsəndir:** ət-Tirmizi, 3317.
[69] **Səhihdir:** Yəla əl-Amirinin rəvayəti; İbn Macə, 3666; Əhməd, 4/172.

iki atılıb-düşən balanı görəndə səbir edə bilmədim, sözümü kəsib onları yanıma çıxardım"[70].

Bu Allahın elçisinin uşaqlara qarşı son dərəcə mərhəmətli, zərif və şəfqətli olmasındandır. Allahın elçisi bu davranışıyla ümmətinin də uşaqlara qarşı mərhəmətli, zərif və şəfqətli davranmalarını öyrətmək istəmişdir.

İnsan bolluqda və sağlamlığında səbrə daha artıq möhtacdır. Çünki bolluqda bütün imkanlar mövcuddur. Necə ki, birinin yanında yeməyi olmayan zamandakı səbri, yeməyi olduğu zamandakı səbrindən daha çoxdur. Və ya birinin yanında xanımı və ya əri olmayanda cinsi münasibətə səbri, yanında olduğu zamandakı səbrindən daha çoxdur.

**İkinci növ.** Nəfsin və ehtirasın arzu və istəyinə zidd olanlar ya insanın ixtiyarına bağlı olur (itaətlər və günahlar kimi), ya da əvvəli və sonu insanın ixtiyarına bağlı olmur (müsibətlər kimi) və ya əvvəli insanın ixtiyarına bağlı olur, lakin bir dəfə oraya girdikdən sonra onu yox etməyə ixtiyarı yoxdur. Bu da üç qisimdir.

**Birinci qisim**, insanın ixtiyarına bağlı olanlara səbir etməyə möhtac olmasıdır. İnsanın etdiyi günahların hamısı öz ixtiyarına bağlıdır. Qul itaət və ibadətləri yerinə yetirərkən səbrə möhtacdır. Çünki nəfs təbiəti etibarı ilə ibadətlərin çoxunu məzəmmət edir. Nəfsin yaradılışında tənbəllik, rahatlığı üstün tutmaq vardır. Xüsusi ilə buna qəlbin günahla paslanaraq bərkiməsi, pis istəklərə və qəflətlərə daxilən və zahirən meyl etməsi də əlavə olunsa, namaz qılmağa belə yaxınlaşmaz. Bununla bərabər namazı zorla qılırsa, bədən namazda olur, ağıl və qəlb isə ondan qafil olur, iylənmiş cəsədin yanında oturan kimi ondan tez ayrılmaq istər.

Zəkata gəlincə, nəfsin təbiətində xəsislik vardır, zəkat verməyi istəməz.

Həcc ilə cihada gəlincə nəfsin təbiətində həm tənbəllik, həm də xəsislik olduğundan bunları yerinə yetirmək istəməz.

**Qul bu itaət və ibadətləri yerinə yetirərkən üç halda səbrə möhtac olur.**

Birinci hal, qul bu ibadətlərə başlayarkən niyyətin səhih və ixlaslı olması, şübhədən, göstərişdən və şöhrətdən uzaq olması, bu ibadətlərin layiqincə yerinə yetirilməsinə çalışmasıdır.

İkinci hal, bu ibadətləri yerinə yetirərkən səbir edilməsidir. Bu zaman insan bu ibadətlərdə nöqsana, qüsura tələsdirməyə və etinasızlıq göstərməyə dəvət edənlərdən uzaqlaşmalı, ibadətlərin əvvəlindən sonuna qədər niyyəti eyni olmalı, Allahın hüzurunda

---

[70] **Səhihdir:** Əbu Davud, 1109; ət-Tirmizi, 3776; ən-Nəsai, 3/108; İbn Macə, 3600; Əhməd, 5/354.

olduğunu qəlbindən və xatirəsindən çıxarmamalı, Allah əmrini heç bir zaman unutmamalıdır. Əmr edilən ibadətlərin yerinə yetirilməsi mühüm deyildir. Əsas mühüm olan ibadətlərin Allah əmri olduğunu düşünərək yerinə yetirilməsidir. Məhz bu şəkildə edilən ibadətlər ancaq qulların Allaha daxilən olan ibadətləridir.

İnsan ibadət və itaətləri rüknləriylə, fərzləriylə, vacibləriylə, sünnətləriylə, məndub və müstəhəbləriylə tam olaraq yerinə yetirərkən səbrə möhtacdır. Çünki qul ibadət əsnasında Allahı xatirindən çıxarmayacaq, qəlbi Allah ilə hazır olub əzaları ibadətdən uzaqlaşmayacaq, əzaları ibadətdə hazır olub qəlbi Allahdan uzaqlaşmayacaqdır.

Üçüncü hal ibadət və itaətləri yerinə yetirdikdən sonrakı səbridir ki, bir çox səbəbləri vardır:

**a)** İcra olunan əməli batil edəcək bir şeyin edilməməsinə səbir etmək. Necə ki, Allah-taala buyurmuşdur: **«Ey iman gətirənlər! Sədəqələrinizi malını riyakarlıqla** (özünü xalqa göstərmək üçün) **sərf edən, Allaha və axirət gününə inanmayan şəxs kimi, minnət qoymaq və əziyyət verməklə puça çıxarmayın...»** (əl-Bəqərə, 264).

Yalnız itaət və ibadətləri icra etmək mühüm deyil. Mühüm olan onları batil edəcək şeylərdən qorumaqdır.

**b)** İnsanın öz ibadətlərini görərək onlarla özünü bəyənib, təkəbbürlənməsindən uzaq olmağa səbir etmək.

Çünki bu xüsusiyyətlər çox işlənən günahlardan daha zərərlidir.

**v)** Gizli edilən ibadətlərin yazıldığı dəftərdən açıq edilən ibadətlərin yazıldığı dəftərə keçirilməsinə səbir etməkdir. Qul özü ilə Allah arasında gizli bir əməl icra edər, o da gizli olunan ibadətlər dəftərinə yazılar, sonra onu söyləyərsə, açıq icra olunan ibadətlərin yazıldığı dəftərə köçürülər. Odur ki, itaət və ibədətlər icra olunduqdan sonra səbir dəftərinin təmizlənmiş olduğu zənn edilməsin.

Günahlardan uzaqlaşmağa səbrin zəruriliyi aydındır. İnsanın günahları tərk etməyə ən böyük yardımçısı pis vərdişlərin və bunlara kömək edən yoldaşlarının olduğu yerlərdən, onlarla söhbətdən uzaqlaşmasıdır. Pis adətlərdən, vərdişlərdən də mütləq vaz keçməlidir. Çünki adət və vərdişlər xüsusi xüsusiyyətlərdir. Bunlara şəhvət də əlavə olunduqda şeytanın ordusuna daha iki köməkçi ordu qoşulur ki, dini güc bunları məğlub edə bilməz.

**İkinci qisim**, insanın ixtiyarına aid olmayanlardır. İnsanın bunları yox etməyə gücü və qüvvəsi çatmadığından bunlara daha çox ehtiyacı vardır. Bir kimsənin malının oğurlanması, sevdiyi birinin ölməsi, xəstə olması kimi başına gələn müsibətlərin meydana

gəlməsində hər hansı bir ixtiyarı və təsiri yoxdur.

Bu qisim iki növdür.

Birinci növü insanın hər hansı bir ixtiyarı və təsiri olmayan şeylərdir. Burada dörd məqam vardır.

Birinci məqam acizlikdir ki, bu da sızlanma, şikayət etmə, qəzəblənmə məqamıdır. Bunları ancaq ağılı, dini və insanlığı az olanlar edər. Çünki bunları icra etmək müsibəti iki qat artırmaqdır.

İkincisi, səbir məqamıdır. Səbir ya Allah üçün olur, ya da insanlıq naminə.

Üçüncüsü, razılıq məqamıdır. Bu səbir məqamından daha yüksəkdir. Bu məqamın vacib olmasında ixtilaf vardır. Lakin səbrin vacib olmasında ittifaq edilmişdir.

Dördüncüsü, şükür məqamıdır. Bu da razılıq məqamından daha yüksəkdir. Çünki qul bu məqamda bəlanı nemət bilir və ona şükür edər.

İkinci növü insana başqaları tərəfindən hədəf edilmiş döymək və söymək kimi şeylərdir. Burada da yuxarıdakı dörd məqamdan əlavə daha dörd məqam var.

Birincisi, əfv etmə və vaz keçmə məqamıdır.

İkincisi, qəlbin intiqam almağı istəməsindən, hər zaman cinayəti düşünüb onun acısından və onunla sıx olmaqdan uzaqlaşması məqamdır.

Üçüncüsü müqəddarata inanma məqamıdır. Sənə əziyyət və cəfa verən hər nə qədər zalımdırsa da, onu öncədən təyin edən, o zalımın əliylə bu işi meydana gətirən əsla zalım deyildir. İnsanların sənə verdiyi əziyyət və cəfa yayın istisi, qışın soyuğu kimi zəruri olub onu dəf etməyin mümkün deyildir. İstinin və soyuğun əziyyətinə və cəfasına qəzəblənən ağıllı deyildir. Kainatda hər nə meydana gəlirsə, yolları, səbəbləri müxtəlif olsa da, qədərlə meydana gəlir. Yəni hər hansı bir şeyin müəyyən bir şəkildə meydana gəlməsi Allahın əzəldən diləməsi ilədir.

Dördüncüsü, pislik edənə yaxşılıq etmək, pisliyə yaxşılıqla cavab vermək məqamıdır. Bu məqamda bir çox faydalar və mənfəətlər vardır. Bunları ancaq Allah bilir. Bu yüksək məqamı əldən qaçıran kəs digər aşağı məqamlara razı olmamalıdır.

## Fəsil

**Üçüncü qisim**, gəlməsində insanın ixtiyarı olub, yerləşdikdən sonra yox edilməsində ixtiyarı olmayan şeylərə səbir etməyə

ehtiyacıdır. Məsələn, eşqin əvvəli ixtiyaridir, sonu isə çarəsizlikdir. Xəstə olmanın səbəbləri insanın əlindədir, xəstələnəndən sonra onun yox edilməsi əlində deyildir. Necə ki, sərxoş edici bir şeyi içmək insanın əlindədir, içdikdən sonra sərxoş olmaması əlində deyildir. Bunların əvvəlində səbir etmək fərzdir. Bunların əvvəlində səbri əldən qaçıran üçün sonda səbir etməsi, nəfsinin və kefinin arzu və istəklərinə boyun əyməməsi fərzdir.

Burada şeytanın çaşdırıcı hiyləsi və oyunu vardır. O da bir kimsənin yasaqların icrasına məcbur olduğunu ya da müalicə üçün istifadəsinin (insanın şərab və nəcisdən müalicə üçün istifadə etməsi kimi) mübah olduğunu göstərməkdir. Bir çox fiqh alimləri buna icazə vermişlərsə də, bu cəhalətdir[71]. Çünki bunlarla müalicə nəinki xəstəliyi yox edir, əksinə, daha da şiddətləndirir və qıcıqlandırır.

Haram və nəcis olanlarla müalicə olanlardan bir çoxu həm dinlərini, həm də dünyalarını yıxıblar. Belə xəstəliklərin ən faydalı müalicə yolu səbir və təqvadir. Belə ki Allah-taala buyurub: **«...Əgər səbir edib Allahdan qorxsanız, əlbəttə, bu, məqsədə müvafiq işlərdəndir»** (Ali-İmran, 186);

**«...Kim Allahdan qorxub pis əməllərdən çəkinsə və səbir etsə, Allah yaxşı işlər görənlərin mükafatını əsla zay etməz!...»** (Yusif, 90).

Dini xəstəliklərin əlacı səbir və təqvadır. Bunlar bir-birindən ayrılmazdır.

Bir pisliyə təşəbbüs göstərib asi olan, buna səbir etməklə savab qazanırmı? Qeyri ixtiyari olan həmin səbəbdən meydana gələn günahlara görə əzab olunurmu?

Bu suallara belə cavab verilir ki, o kəs ki haram olana təşəbbüs göstərdikdən sonra peşman olub, Allah üçün səbir edərsə, savab qazanır. Çünki təşəbbüs göstərdiyi səbəbdən meydana gələn müsibətə qarşı səbir etməsi nəfsi üçün cihad olduğundan yaxşı əməl sayılır. Allah-taala yaxşı əməl edənlərin mükafatını zay etməz.

Pisliyin səbəbinə təşəbbüs etdikdən və o səbəbdən meydana gələn günahlara görə əzab verilir. Biri haram olan içkini içib, sərxoş olub, sərxoş ikən cinayət etsə, həm içdiyinə görə, həm də etdiyi cinayətə görə cəzalandırılır. Sərxşoluğa səbəb olan içki haram olduğuna görə sərxoşluqda üzr yoxdur. Ona görə Allah-taala haram etdiyi səbəblərə təşəbbüs göstərənləri cəzalandırdığı kimi, o səbəblərdən meydana gələn günahlara görə də cəzalandırır. Əmr

---

[71] Çünki bu peyğəmbər sünnəsinə müxalifdir. Tariq bin Suveyd içki haqqında Peyğəmbərdən soruşduqda, o qadağan etmişdir. Tariq bin Suveyd: "Ey Allahın peyğəmbəri, axı o dərmandır"- deyərkən Peyğəmbər demişdir: "Şübhəsiz ki, o dərman yox, xəstəlikdir!" Müslim, 1984; "Zəd əl-Məad", 4/154-158.

etmiş olduğu səbəblərə və bu səbəblərdən meydana gələn yaxşılıqlara görə də mükafatlandırılır. Buna görə bidət və pozğunluğa dəvət edən kimsə, onları edən qədər günah yazılır[72]. Çünki onlar bu günahı ona uyduqdan sonra etdilər. Bunun üçün Adəmin öz qardaşını öldürən oğluna qiyamətə qədər adam öldürənlərin günahından yazılır[73]. Allah-taala buyurub: **«Qiyamət günü öz günahlarına tamamilə, nadanlıqları üzündən yoldan çıxartdıqları adamların günahlarına da qismən yüklənsinlər...»** (ən-Nəhl, 25);

**«Şübhəsiz ki, onlar həm öz günahlarına, həm də öz günahları ilə yanaşı, daha neçə-neçə günahlarla** (yoldan çıxartdıqları kimsələrin günahları ilə) **yüklənəcəklər...»** (əl-Ənkəbut, 13).

Kimsə bir pisliyin səbəbinə təşəbbüs göstərər, amma onun ixtiyarı olmadan o səbəbdən meydana gələn pisliklərdən necə tövbə edər?! Çünki bu pisliklər faktiki olaraq onun əməllərindən deyil. Halbuki, insan ancaq öz ixtiyarı ilə etdiyi pisliklərə görə tövbə edir.

Cavabı budur ki, o pisliklər onun təşəbbüs göstərdiyi səbəblərdən doğmuşdur. Odur ki, bu pisliklərə görə tövbə etməli, peşman olmalı, bir daha belə pisliklərin səbəblərinə təşəbbüs etməkdən özünü çəkindirməlidir.

Əgər o səbəbdən doğmuş pislik başqa kimsələrlə əlaqəli olarsa, bunun tövbəsi bacardığı qədər o kimsəni razı salmaqdır.

Bunun üçün bidətə dəvət edənin tövbəsi, dəvət etdiyi şeyin bidət və pozğunluq olduğunu, bunların hidayət və doğru yola zidd olmasını açıqlamasıdır. Belə ki, Allah-taala insanları azdırmaq üçün Allahın endirdiyi açıq hökmləri və doğru yolu gizlətməklə günah etmiş əhli kitabın tövbə etmələri üçün, öz vəziyyət və əməllərini düzəltdikdən sonra, düzəldiklərini insanlara açıqlamalarını şərt edərək buyurmuşdur: **«Kitabda** (Tövratda) **insanlara aşkar etdiyimiz dəlillərdən sonra göndərdiyimiz nişanələri və doğru yol göstərən ayələrimizi gizlədən şəxslər Allahın lənətinə düçar olar və bütün lənət edə bilənlər də onlara lənət oxuyar! Mən ancaq tövbə edənləri, yaxşı işlər görənləri və** (Tövratda buyurduqlarımı) **bəlli edənləri əfv edənəm, mərhəmətliyəm!»** (əl-Bəqərə, 159-160).

---

[72] Əbu Hureyrə Peyğəmbərin belə dediyini rəvayət etmişdir: "Kim doğru yola dəvət edərsə, əcrindən heç bir şey əskilmədən onunla eyni əcri qazanar. Kim də azğınlığa dəvət edərsə, günahlarından heç bir şey əskilmədən onunla eyni günahı qazanar". Müslim, 2674.

[73] Abdullah bin Məsud Peyğəmbərin belə dediyini rəvayət etmişdir: "Hər dəfə zülümlə insan öldürməyə görə Adəm oğluna günah vardir. Çünki ilk dəfə qətli o törətmişdir". əl-Buxari, 3335, 6867, 8321; Müslim, 1677.

Belə ki, zəif möminlərin qəlblərini sındırıb, Allahın elçisinin düşmənləri olan yəhudi və müşriklərə sığınmalarını və zahirən müsəlman kimi görünmələrini onlara təlqin etməklə günah etmiş münafiqlərin tövbələrinin qəbul edilməsi üçün, əvvəlcə özlərinin iman gətirmələri, sonra o zəif möminlərin hallarını düzəltmələrini, onların yəhudi və müşrikləri buraxıb Allaha sarılmalarını, zahirən müsəlman olmağı buraxıb daxilən müsəlman olmalarını söyləmələri şərtdir. Tövbənin şərtləri və mahiyyəti bu cür anlaşılır.

Yardım yalnız Allahdandır.

# ON DÖRDÜNCÜ BÖLMƏ

## Səbrin insanlara çox ağır gəlməsi

İnsana səbrin ağır gəlməsi, əmələ çağıran şeyin qüvvətli və əməlin asan olmasına bağlıdır. Əməldə bu iki ünsür cəmləndikdə insanın o əməldən uzaqlaşmağa səbir etməsi çətindir. Əməldə bu iki ünsür olmadıqda, o əməldən uzaqlaşmağa səbir etməsi asandır. İnsanın adam öldürməyə, oğurluq etməyə, içki içməyə, əxlaqsız əməlləri etməyə səbir etməsi asandır. Əməldə bu iki ünsürdən biri olub digəri olmazsa, bir cəhətdən asan, digər cəhətdən çətin olur.

Adam öldürməyə, oğurluq etməyə, içki içməyə, çirkin əməllər etməyə dəvət edən qüvvənin olmadığı kimsənin bunlardan uzaqlaşmağa səbir etməsi asandır. Bu əməllərə dəvət edən şeyin güclü olması və bu əməlləri etmək özü üçün asan olan kimsənin bunlardan uzaqlaşmağa səbir etməsi çox çətindir. Buna görə zülmdən uzaqlaşmağa səbir edən hökmdarın, çirkin işlərdən uzaqlaşmağa səbir edən gəncin, ləzzətlərdən və şəhvətlərdən uzaqlaşmağa səbir edən varlının Allah dərgahında böyük dərəcələri vardır.

Müsnəd əsərində Peyğəmbərin belə dediyi verilmişdir: "Sənin Rəbbin eşqlə oyun oynamayan gənci çox sevər"[74].

Başqa bir hədisdə də bəyan edildiyi kimi Allah-taala Qiyamət günündə səbirləri kamil və çətin səbir olduğu üçün yeddi xislətli adamı Ərşin kölgəsində sığındıracaqdır:[75]

imamın səbri - qəzəbli və sakit halda bölüşdürmədə, hökmündə ədalətli olmasıdır;

gəncin səbri - Allah-taalanın ibadət və itaətinə davam edib, nəfsinin və ehtirasının arzu və istəklərinə uymamasıdır;

oğlanın səbri - məscidlərə daim getməsidir;

sədəqə verənin səbri - sədəqə verməsindən yanındakıların xəbərdar olmayacaq qədər gizli verməsidir;

gözəl qadının çirkin iş görməyə dəvət etdiyi kimsənin səbri - mən Allahdan qorxuram deyərək haramdan uzaqlaşmasıdır;

Allaha görə sevənin səbri - görüşmələrinin və ayrılmalarının da

---

[74] **Səhihdir:** Əhməd, 4/151; İbn Əbi Asim, "əs-Sünnə", 571; ət-Tabərani, "əl-Kəbir", 17/266/853; Əbu Yəla, 1749.

[75] Allahın yeddi nəfəri Qiyamət günü Öz kölgəsində saxlayacağı haqqında Əbu Hureyrənin rəvayəti. əİ-Buxari, 660; Müslim, 1301.

Allaha görə olmasıdır;

Allah qorxusundan ağlayan kimsənin səbri - insanlardan gizlətməsidir.

Buna görə zina edən yaşlının, yalançı hökmdarın və təkəbbürlü kasıbın qiyamət günü əzabları çox şiddətli olacaqdır[76]. Çünki onların bu haramlara dəvət edən gücləri zəif olanda səbir etmələri asandır. Səbir etməyib bu günahları etmələri, Allaha qarşı baş qaldırmalarının və təkəbbürlüyünün dəlilidir.

Dilin və cinsiyyət orqanının günahlarından uzaq durmağa səbir etmək, səbir növlərindən ən çətinidir. Çünki bu işlərə dəvət edənlər çox qüvvətli olduğundan bu günahların işlənilməsi çox asan olur. Söz gəzdirmə, qeybət etmə, yalan söyləmə, daim münaqişə etmə, gizli və açıq olaraq birisini tərifləmə, insanların sözlərini təqlid etmə, sevmədiyi kimsəni həddindən artıq tənqid etmə, sevdiyi kimsəni çox tərifləmə kimi dilin günahlarından olanlar insanın meyvəsidir. Yəni insanın zövq aldığı günahlardır.

Günaha dəvət edən qüvvənin gücü ilə dilin hərəkətinin asan olması birləşdikdə səbir zəifləyər. Allahın elçisi Muaza: "Dilini qoru", digər hədisdə: "Biz danışdıqlarımıza görə cəzalandırılacağıqmı?"- soruşulduqda: "Məgər insanları atəşə üzü qoyulu sürükləyən dillərinin xataları deyilmi?!"- demişdir[77]. Xüsusi ilə dilin günahları insan üçün adət halını aldıqda onlardan uzaqlaşmağa səbir etmək də çox çətin olur. Buna görə gecələri namaz qılıb, gündüzləri oruc tutan, təqvası üzündən bir an belə ipək yastığa dayanmadığını gördüyün bir çox kimsənin söz gəzdirmədə, insanların namusları haqda danışmada, saleh alim və dindar kimsələrin qeybətini qılmaqda və bilmədiyi məsələlərdə Allaha isnad edib Ona iftira atma kimi böyük günahlarda dillərini saxlamadıqlarını görürsən.

Bir çoxlarının əli kiçik haramdan, bir damla şərabdan, iynə ucu qədər nəcasətdən sığındıqları halda zinadan çəkinmədiklərini görürsən. Rəvayətə görə birisi yad bir qadınla yalqız qalıb cinsi münasibətdə olmaq istədikdə: "Ey qadın, üzünü ört, çünki yad qadının üzünə baxmaq haramdır!" - demişdir.

Kufəlilərdən biri Abdullah bin Ömərdən ağcaqanadın qanı haqqında soruşmuşdur. O da: "Hələ bunlara bir baxın! Allahın

---

[76] Əbu Hureyrə Peyğəmbərin belə dediyini revayət etmişdir: "Allah Qiyamət günü üç nəfərlə nə danışmaz, nə onları təmizləməz, nə də onlara baxmaz, onlara şiddətli əzab olunacaq. Bunlar: zinakar qoca, yalançı hökmdar və təkəbbürlü kasıbdır". Müslim, 107.

[77] **Səhihdir:** ət-Tirmizi, 2616; İbn Macə, 2973; Əhməd, 5/231; Abdurrəzzaq, 11/194 ət-Tabərani, "əl-Kəbir", 20/130, 131. Araşdırmalar zamanı sənədlərdə zəif ravilər aşkarlansa da, təhqiqatçı yazır: Ümumən hədis səhihdir.

elçisinin qızının oğlunu öldürdülər, məndən ağcaqanadın qanını soruşurlar"- deyə cavab vermişdi.[78]

Buna bənzər bir hadisə də mənim başıma gəlib. Mən ihramda ikən adam öldürmə, mal soyğunçuluğu ilə tanınmış bir ərəb qəbiləsi məndən ihramlının bit öldürməsini soruşdu. Mən də: "Allahın haram buyurduğu canlara qıymaqdan çəkinməyənlər indi ihramlı ikən bit öldürmənin günahını soruşurlar" - cavabını verdim.

Nəticə olaraq, günahların növlərində səbrin çətin və ya asan olması, o günahlara dəvət edənin güclü və ya zəif olmasından asılıdır.

Əlidən rəvayət olunduğuna görə o demişdir: "Səbir üç qisimdir. Müsibətə qarşı səbir, itaət və ibadətləri icra edərkən çəkilən məşəqqətlərə səbir, günahlardan uzaqlaşmağa səbir.

Başına bir müsibət gələn kimsə, o müsibət gedincəyə qədər gözəl bir şəkildə səbir edərsə, Allah-taala onun üçün üç yüz dərəcə yazar.

Bir kimsə ibadət və itaətləri gözəl bir şəkildə icra etməyə səbir edərsə, Allah-taala onun üçün üç yüz dərəcə yazar.

Bir kimsə Allah-taaladan qorxaraq və Onun dərgahındakı savaba ümid edib günahlardan uzaqlaşmağa səbir edərsə, Allah-taala onun üçün doqquz yüz dərəcə yazar."[79]

Meymun bin Məhrən deyir ki, səbir iki qisimdir. Biri müsibətlərə qarşı səbirdir ki, bu gözəldir. Digəri isə günahlardan uzaqlaşmağa səbirdir ki, bu daha fəzilətli və daha üstündür[80].

**«Səbir etdiyinizə görə sizə salam olsun!...»** (ər-Rəd, 24) ayəsini Fudayl bin İyaz belə təfsir etmişdir: "Onlar əmr olunan itaət və ibadətləri icra edərkən səbir etdikləri üçün və yasaqlardan uzaqlaşmağa səbir etdikləri üçün mələklər hər qapıdan yanlarına gələcəklər, onlara: **«Səbir etdiyinizə görə sizə salam olsun!»** deyəcəklər."[81] Fudayl müsibətlərə səbir etməyi də əmr edilənlərə səbir etmək qisminə aid etmişdir.

Allah-taala hər şeyi yaxşı bilən dir.

[78] əl-Buxari, 5994.
[79] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əs-Sabr", 24; əd-Deyləmi, "Müsnəd əI-Firdovs", 2/416/3846; İbn əl-Cəuzi, "Mauduat", 3/184.
[80] İbn Əbi əd-Dünya, "əs-Sabr", səh. 18.
[81] İbn Əbi əd-Dünya, "əs-Sabr". 29; əl-Beyhəqi, "Şuabul-İman", 10039.

# ON BEŞİNCİ BÖLMƏ

## Səbir haqqında ayələr

İmam Əhməd (Allah ona rəhmət eləsin!) demişdir: "Allah-taala səbri Qurani-Kərimin doxsan yerində zikr etmişdir"[82].

Səbrin bir çox növləri haqqında ayələri qeyd edək.

**1.** Səbir əmr edilmişdir. Allah-taala buyurmuşdur: **«Səbir et. Sənin səbir etməyin ancaq Allahın köməyilədir...»** (ən-Nəhl, 127); digər bir ayədə: **«Sən Öz Rəbbinin hökmünə səbir et!...»** (ət-Tur, 48)- buyurmuşdur.

**2.** Bir əmrin ziddi qadağan olunub. Belə ki, Allah-taala: **«Peyğəmbərlərdən əzm sahibləri olanların səbir etdiyi kimi, sən də səbir et...»** (əl-Əhqaf, 35);

Başqa ayədə: **«**(Ühüd müharibəsində baş vermiş bəzi hadisələrə görə) **ruhdan düşməyin və qəmgin olmayın...»** (Ali-İmran, 139) - deyilir;

Digər ayədə: **«Sən öz Rəbbinin hökmünə səbir et və balıq sahibi** (Yunus peyğəmbər) **kimi olma...»** (Nun, 48)- demişdir.

Nəticə olaraq, yasaq edilənlərin hamısı əmr edilən səbrə ziddir.

**3.** Qurtuluş səbrə bağlanmışdır. Belə ki, Allah-taala: **«Ey iman gətirənlər!** (Dində vacib olan hökmləri yerinə yetirməyin zəhmətinə, düçar olduğunuz bəlalara) **səbir edin, dözün, hazır olun və Allahdan qorxun ki, bəlkə, nicat tapasınız»** (Ali-İmran, 200)- buyurmuşdur. Allah qurtuluşu ayədə göstərilənlərin hamısının icrasına bağlamışdır.

**4.** Səbir edənin mükafatının digər əməlləri edənlərin mükafatından qat-qat artıq olduğu xəbər verilmişdir: **«Səbir etdiklərinə görə onlara iki dəfə mükafat veriləcəkdir...»** (əl-Qəsəs, 54);

Həmçinin: **«...Yalnız** (dünyada Allah yolunda çətinliklərə) **səbir edənlərə saysız-hesabsız mükafat veriləcəkdir»** (əz-Zumər, 10)- buyurulmuşdur. Süleyman bin Qasim demişdir: "Hər əməlin savabı bilinir, amma səbrin savabı bilinməz."[83]

**5.** Dində rəhbər olmaq səbrə və yəqinliyə bağlanmışdır.

---

[82] "Mədaric əs-Salikin", 2/152.

[83] İbn Əbi əd-Dünya, "əs-Sabr", 20.

«(Çətinliklərə) **səbir etdikləri və ayələrimizə ürəkdən inandıqları üçün Biz onlardan əmrimizlə** (insanlara) **haqq yolu göstərən rəhbərlər təyin etmişdik»** (əs-Səcdə, 24) ayəsinə görə dini rəhbərliyin səbir və qəti bilik ilə əldə ediləcəyi açıqlanmışdır.

**6.** Allah-taala səbir edənlərlə bərabər olduğunu bəyan etmişdir. Allah buyurmuşdur: **«...Çünki Allah səbir edənlərlədir»** (əl-Ənfal, 46).

**7.** Allah-taala bu üç şeyin yalnız səbir edənlərə veriləcəyini bəyan etmişdir. Bunlar da, Allahın onları bağışlaması, onlara rəhm etməsi və onları doğru yola yönəltməsidir: **«Əlbəttə, Biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal, can** (övlad) **və məhsul qıtlığı ilə imtahan edərik.** (Belə imtahanlara) **səbir edən şəxslərə müjdə ver! O kəslər ki, başlarına bir müsibət gəldiyi zaman: "Biz Allahınıq** (Allahın bəndələriyik) **və** (öləndən sonra) **Ona tərəf** (onun dərgahına) **qayıdacağıq!" - deyirlər. Onları Rəbbi tərəfindən bağışlamaq və rəhmət** (Cənnət) **gözləyir. Onlar doğru yolda olanlardır»** (əl-Bəqərə, 155-157).

Sələflərdən biri başına gələn müsibətə görə təziyəyə gələnlərə demişdir: "Nə üçün səbir etməyim ki? Allah səbir edənə üç xislətin veriləcəyini vəd vermişdir ki, bunlardan hər biri dünyadan və dünyada olan hər şeydən daha xeyirlidir".

**8.** Allah-taala səbri yardımçı və müjdələyici edib, onunla yardım istənilməsini əmr etmişdir.

**«Səbir etmək və namaz qılmaqla** (Allahdan) **kömək diləyin!»** (əl-Bəqərə, 45) buyurmaqla, Allah bildirmişdir ki, səbri olmayanın yardımçısı yoxdur.

**9.** Allah-taala yardımı səbrə və təqvaya bağlamışdır: **«Bəli, əgər səbir edib** (Allahdan) **qorxsanız, onlar qəzəblə üstünüzə gəldikləri zaman Rəbbiniz artıq beş min nişan qoyulmuş mələklə sizə yardım edər»** (Ali-İmran, 125). Buna görə Allahın elçisi buyurmuşdur: "Bil ki, həqiqətən, yardım səbirlə bərabərdir."[84]

**10.** Allah-taala səbrin və təqvanın düşmənlərin hiylələrinə, tələlərinə qarşı ən böyük qalxan olduğunu və qul üçün bundan daha böyük bir qalxan olmadığını xəbər vermişdir: **«Əgər səbir edib özünüzü qorusanız** (Allahdan qorxsanız), **onların hiyləsi sizə heç bir zərər yetirməz...»** (Ali-İmran, 120).

**11.** Allah-taala səbir edənlərin yanına cənnətdə mələklərin girib salam verəcəklərini xəbər vermişdir: **«... Mələklər də hər bir qapıdan** (cənnət qapılarından) **daxil olub** (onlara)**:** (Dünyada Allah

---

[84] **Səhihdir:** Abdullah bin Abbasın rəvayətinin bir hissəsidir. ət-Tirmizi, 2635; Əhməd, 1/293; Təhqiqatçı araşdırmalardan sonra yazır: sənədi səhihdir və raviləri siqadır,

yolunda bütün çətinliklərə) **səbir etdiyinizə görə sizə salam olsun!...»** (ər-Rəd, 23-24).

**12.** Allah-taala özlərinə edilənin misliylə cəzalandırmağa icazə verdikdən sonra səbir etmələrinin isə daha xeyirli olduğuna and içmişdir: **«Cəza verəcək olsanız, sizə nə cəza verilibsə, eynilə həmin cəzanı verin. Əgər** (onlardan intiqam almayıb) **səbir etsəniz, bu, səbir edənlər üçün daha xeyirlidir»** (ən-Nəhl, 126).

Uca Allah andını "vav" hərfi ilə, sonra "lam" hərfi ilə, daha sonra cavabdakı "lam" hərfi ilə təkid edərək bildirmiş və səbir etmənin daha xeyirli olduğunu açıqlamışdır. Bu incəlikləri düşünün.

**13.** Allah-taala bağışlanmağı və böyük mükafatı səbir ilə saleh əmələ bağlamışdır: **«Səbir edənlər və yaxşı işlər görənlər müstəsnadır. Məhz onları** (günahlardan) **bağışlanma və böyük bir mükafat gözləyir»** (Hud, 11).

Allah-taala səbir edib saleh əməl görənləri özlərinə bir müsibət toxunanda ümidini kəsib nankor olmaqla və bir nemət verildikdə ərköyünləşib təkəbbürlənməklə tənqid olunanlardan istisna etmişdir. İnsan tənqiddən ancaq səbirlə və yaxşı əməllə qurtulur. Belə ki, bağışlanma və böyük mükafata ancaq bunlarla nail olmaq olar.

**14.** Allah-taala müsibətlərə səbir etməyi əzm edilən işlərdən etmişdir: **«Əlbəttə, hər kəs** (pisliyə) **səbir edib** (qisası) **bağışlasa,** (onun bu hərəkəti) **çox bəyənilən əməllərdəndir!»** (əş-Şura, 43);

Digər bir ayədə: **«Oğlum! Namaz qıl,** (insanlara) **yaxşı işlər görməyi əmr et, pis işləri qadağan elə.** (Bu yolda) **sənə üz verəcək müsibətlərə döz. Həqiqətən, bu** (dediklərim) **vacib əməllərdəndir!»** (Loğman, 17).

**15.** Allah-taala möminlərə yardım və zəfəri vəd etmişdir. Bu əzəli elmdə verilmiş vəddir. Allah-taala möminləri yardım və zəfərə ancaq səbir etmələri ilə çatacaqlarını xəbər verərək buyurmuşdur: **«...səbir etdiklərinə görə Rəbbinin İsrail övladına verdiyi gözəl sözlər** (vədlər) **tam yerinə yetdi»** (əl-Əraf, 137).

**16.** Allah-taala məhəbbətini səbrə və səbirlilərə bağlayaraq demişdir: **«Neçə-neçə peyğəmbər bir yığın allahpərəstlə birlikdə vuruşmuşlar. Lakin onlar Allah yolunda çəkdikləri müsibətlərə görə nə zəiflik, nə də acizlik göstərmiş, nə də** (kafirlərə) **boyun əymişlər. Allah səbir edənləri sevər!»** (Ali-İmran, 146).

**17.** Allah-taala Kitabının iki yerində xeyrə ancaq səbir edənlərin qovuşdurulacağını xəbər verərək: **«Elm verilmiş kəslər isə belə dedilər: "Vay halınıza!** (Ay yazıqlar) **iman gətirib yaxşı əməl edən kimsə üçün Allahın mükafatı daha yaxşıdır. Buna yalnız səbir edənlər qovuşarlar!"»** (əl-Qəsəs, 80) - buyurmuşdur.

Sonra quluna pisliyin qarşısını ən gözəl şəkildə almağı əmr etmiş, bunu etdiyi təqdirdə özü ilə arasında düşmənçilik olanın yaxın bir dost kimi olacağını xəbər vermişdir: **«Bu** (xislət) **yalnız səbir edənlərə verilir və yalnız böyük qismət** (savab, fəzilət) **sahiblərinə əta olunur!»** (Fussilət, 35).

**18.** Allah-taala ayələriylə ancaq səbir edib, şükür edənlərin faydalanıb öyüdü qəbul edəcəklərini xəbər vermişdir: **«Biz Musaya: "Tayfanı zülmətdən nura çıxart və Allahın** (vaxtilə onlara nemət verdiyi) **günlərini xatırlat. Bunda çox səbir və şükür edənlər üçün, sözsüz ki, neçə-neçə ibrətlər var!"** (- deyib) **onu möcüzələrimizlə** (peyğəmbər) **göndərdik»** (İbrahim, 5);

Digər ayədə: **«Sizə Öz qüdrət əlamətlərindən bəzisini göstərsin deyə, gəmilərin dənizdə Allahın lütfü ilə üzdüyünü görmürsənmi? Həqiqətən, bunda** (əziyyətlərə) **səbir,** (Allahın nemətlərinə) **şükür edən hər kəs üçün ibrətlər vardır!»** (Loğman, 31)- buyurmuşdur;

Başqa ayədə: **«...Biz onları pərən-pərən salıb dillərdə dastan etdik. Həqiqətən, bunda** (çətinliklərə) **səbir,** (nemətlərə) **şükür edən hər bir kəs üçün ibrətlər vardır!»** («Səba», 19)- buyurmuşdur.

Digər ayədə: **«Dənizdə dağlar kimi üzən** (gəmilər) **də Onun** (qüdrət) **əlamətlərindəndir. Əgər** (Allah) **istəsə, küləyi saxlayar, onlar da** (suyun) **üzündə durub qalarlar. Həqiqətən, bunda** (çətinliklərə) **səbir,** (nemətlərə) **şükür edən hər bir kəs üçün ibrətlər vardır!»** (əş-Şura, 32-33)- buyurmuşdur.

Quranın dörd yerində qeyd edilən bu ayələr Allahın ayələrindən ancaq səbir edib şükür edənlərin faydalanacaqlarını bildirir.

**19.** Allah-taala qulu Əyyubun səbrini ən gözəl şəkildə tərifləyərək: **«Biz onu səbir edən gördük. Nə gözəl bəndə! O,** (daim Allaha) **sığınan bir kimsə idi»** (Sad, 44)- demişdir.

Allah-taala Əyyubu səbirli görməklə onun gözəl bir qul olduğunu açıqlaması, başına bir bəla gəldikdə səbir etməyənin pisliyini bildirir.

**20.** Allah-taala iman gətirməyənlərin, haqq və səbir əhlindən olmayanların hamısının zərər və ziyanda olduqlarını bildirmişdir: **«And olsun axşam çağına ki, insan ziyan içindədir. Yalnız iman gətirib yaxşı əməllər edən, bir-birinə haqqı tövsiyə edən və səbri tövsiyə edən kimsələrdən başqa!»** (əl-Əsr, 1-3).

Buna görə imam Şafii demişdir: "Əgər insanlar bu surəyə əməl etsəydilər, bu surə onlara kifayət edərdi. Çünki qulun imanının kamilliyi elm qüvvəsiylə əməl qüvvəsinin kamilliyinə bağlıdır. Bunlar

da iman ilə saleh əməldir. Belə ki, qul öz nəfsini kamilləşdirməyə möhtac olduğu kimi başqalarını da kamilləşdirməyə möhtacdır. Bu da haqqı və səbri tövsiyə etməsidir. Bunların əsli, əsası və təməli də səbirdir.

**21.** Allah-taala sağ tərəf əhlini səbirlilər və mərhəmətlilər olduğunu bildirmişdir: **«Sonra da iman gətirən və bir-birinə səbir tövsiyə edən, mərhəmət tövsiyə edən kimsələrdən olmaqdır!»** (əl-Bələd, 17).

Bu ayədə səbir ilə mərhəmət vəsflərinin ancaq sağ tərəf sahiblərində olunduğu açıqlanmışdır. İnsanlar bu vəsflərə malik olmalarına görə dörd qisimdir.

Birinci qisim hər iki vəsfə malik olanlardır. Bunlar insanların ən xeyirliləridir.

İkinci qisim hər iki vəsfdən məhrum olanlardır. Bunlar da insanlann ən şərliləridir.

Üçüncü qisim özlərində səbir olub, mərhəməti olmayanlardır.

Dördüncü qisim isə mərhəməti olub, səbri olmayanlardır. Üçüncü və dördüncü qisim insanlar birinci qisim insanlardan çox aşağı, ikinci qisim insanlardan isə bir az yuxarı dərəcədə olanlardır.

**22.** Allah-taala səbri islamın əsaslarına və imanın məqamlarına yaxın etmişdir: **«Səbir etməklə və namaz qılmaqla** (Allahdan) **kömək diləyin!...»** (əl-Bəqərə, 45).

Səbri hər növ saleh əmələ yaxın bilmişdir: **«Səbir edənlər və yaxşı işlər görənlər müstəsnadır...»** (Hud, 11).

Səbri təqvaya yaxın edərək: **«Kim Allahdan qorxub pis əməllərdən çəkinsə və səbir etsə,** (bilin ki) **Allah yaxşı işlər görənlərin mükafatını əsla zay etməz!»** (Yusif, 90)- buyurmuşdur.

Səbri qətiyyətlə biliyə yaxın bilmişdir: «(Çətinliklərə) **səbir etdikləri və ayələrimizə ürəkdən inandıqları üçün Biz onlardan əmrimizlə** (insanlara) **haqq yolu göstərən rəhbərlər təyin etmişdik»** (əs-Səcdə, 24).

Səbri doğru söyləməyə yaxın bilmişdir: **«...doğru danışan kişilər və qadınlar, səbirli kişilər və qadınlar...»** (əl-Əhzab, 35).

Allah-taala səbri məhəbbətinə, onunla olmasına, zəfər və yardım etməsinə, gözəl mükafat verməsinə səbəb etmişdir. Bunların sadəcə bir qismi belə səbrin şərəfli və fəzilətli olmasına kifayət edər.

Allah hər şeyi doğru bilir!

## ON ALTINCI BÖLMƏ

### Səbir haqqında sünnədən hədislər

Ənəsdən rəvayət edildiyinə görə: "Allah elçisi körpəsinə ağlayan bir qadının yanından getmiş, ona: "Allahdan qorx və səbir et"- demişdir. Qadın: "Sən mənə gələn bu müsibəti anlamazsan»- cavabını vermişdir. Allahın elçisi keçib gedəndən sonra, ona: "Bu Allahın elçisi idi"- demişlər. Bu dəfə qadın peşman olaraq Allahın elçisinin yanına gəlmiş və: "Ey Allahın elçisi! Mən səni tanımadım"- deyərək üzr istəmişdir.

Allahın elçisi: "Səbir ancaq ilk anda bilinir" [başqa rəvayətdə isə: "müsibətin başa gəldiyi ilk andadır"]- buyurmuşdur."[85]

Hədisdəki "səbir müsibətin ilk başa gəldiyi andadır" ifadəsi aşağıdakı hədisə oxşayır: "Güclü kimsə insanlara güləşdə qalib gələn yox, qəzəblənəndə özünü ələ alan və iradəsinə sahib olan kimsədir."[86]

İnsanı kədərləndirən və üzən müsibət qəflətən gəldikdə qəlbi sarsıldar və onu narahat edər. Müsibət ilk gəldiyi anda səbir edilərsə, hiddəti qırılır, qüvvəti zəifləyir, səbri davam etdirmək asanlaşır. Çünki müsibət yeri olmayan qəlbə gəldikdə onun narahat edir ki, bu da onun ilk başa gəldiyi andır. Bundan sonra müsibət qəlbə daima gəldiyindən qəlb artıq onun yeri olur və qəlb ondan qurtulmaq çarəsi olmadığını anlayır, bu dəfə qəlbin səbri məcburi səbrə çevrilir. O qadın da sızlamanın ona heç bir fayda verməyəcəyini anlayıb Peyğəmbərin yanına gələrək üzr istəmiş, sanki: "Səbir etdim ey Allahın elçisi"- demək istəmişdir. Peyğəmbər də: "Əsil səbir müsibətin ilk anında olanıdır"- şəklində açıqlama vermişdir.

Eyni mənanı bildirən, Əbu Hureyrədən rəvayət olunan hədisə görə: "Peyğəmbər bir məzarın üzərinə qapanıb ağlayan qadının yanından keçərkən ona: "Ey Allahın qulu Allahdan qorx və səbir et"- dedi. Qadın da: "Ey Allahın qulu uşağımı itirdim"- dedi. Peyğəmbər yenə: "Ey Allahın qulu Allahdan qorx və səbir et"- dedi. Qadın: "Ey Allahın qulu başıma gələn müsibəti söylədim, anlamadınmı? Çəkil get başımdan"- dedi. Peyğəmbər getdi. Peyğəmbər gedəndən sonra əshabələrdən biri qadının yanına gəlib soruşdu: "Gedən möhtərəm

[85] əl-Buxari, 1252; Müslim, 926.
[86] əl-Buxari, 6114; Müslim, 2609. Əbu Hureyrənin rəvayətindən.

şəxs sənə nə dedi?". O da: "Mənə bunu dedi, mən də ona bunu dedim" - deyərək olanları anlatdı. Sonra əshabə soruşdu: "Onun kim olduğunu bilmirsənmi? Qadın: "Xeyr"- dedi. Əshabə: "Allahın elçisi idi"- dedi. Qadın bunu eşitdikdə peyğəmbərin getdiyi istiqamətə qaçaraq ona yetişib, üzr diləyərək: "Səbir edirəm ya Allahın elçisi" - dedi. Bundan sonra Allahın elçisi: "Çox gözəl. Amma səbir müsibətin başa gəldiyi ilk andadır " — buyurdu".

İbn Əbi əd-Dünya demişdir: "Bəşir bin əl-Vəlid əl-Kəndi və Saleh bin Malik demişdir ki, Səid bin Zərbi demişdir..." və yuxarıdakı hədisi rəvayət etmişdir.[87]

Əbu Übeydə: Bu hədisin mənası hər müsibət sahibini kədərdən və üzüntüdən təmizləyəcək şeyin səbir olmasıdır. Fəqət müsibətin ilk hiddətli hərarətli olduğu andakı səbir əsasdır - demişdir.

Mən bu hədisdən bir çox hökmlər çıxarıla bilər deyirəm.

**1.** Müsibətlərə səbir etmək vacibdir, çünki səbir qula əmr edilmiş olan təqvadandır.

**2.** Bir kimsənin başına gələn müsibət nə qədər şiddətli olursa olsun, ona yaxşılıqları əmr etmənin, pislikləri qadağan etmənin təbliğinin zəruri olmasıdır.

**3.** Müsibətin Allahdan gəldiyi söylənərək təkrar-təkrar yaxşılıqların əmr edilməsi, pisliklərin yasaqlanmasıdır.

**4.** Bu hədisin qadınların qəbirləri ziyarət etməsinin caiz olduğuna dəlil gətirilməsidir. Yəni Allahın elçisi o qadının qəbri ziyarət etməsini qadağan etməmiş, ancaq səbir etməsini əmr etmişdir. Əgər qadınların qəbirləri ziyarət etmələri haram olsaydı, bunun hökmünü əlbəttə, açıqlayardı.

Bu hadisə Allahın elçisinin həyatının sonuna yaxın vaxtlarda olmuşdur. Ona görə "Əbu Hureyrə hicrətin yeddinci ilindən sonra müsəlman olmuşdur" deyənlərə qarşı belə cavab verilmişdir.

Allahın elçisinin o qadına Allahdan qorxmasını və səbir etməsini əmr etməsi, onun ziyarət edib və ağlamasını inkar etməsidir.

Belə ki, qadının özünə əmr edənin əmrinə itaət etməsinin vacib olduğunu anladıqda dərhal onun arxasınca getməsi, Allahın elçisinin qadınların qəbir ziyarətini rədd etməsinin dəlilidir.

Əbu Hureyrə bu hadisədə şəxsən olduğunu söyləməmişdir. O halda bu hədis, bu hadisənin onun müsəlman olmasından sonra

[87] **Zəifdir:** Deyirəm ki: Sənədi çox zəifdir. Çünki Səid bin əz-Zərbinin hədisləri münkərdir və əcaib şeylər söyləyir. Əbu Yəla, (6067) çıxarış vermiş və sənədindəki Əbu Ubeydə ən-Nəci zəifdir. əl-Bəzzar da (792) çıxarış vermiş və sənədindəki Fəhd bin Hibban da zəifdir, hədisi münkərdir. Ümumən hədis zəifdir.

meydana gəlmiş olduğuna dəlalət etməz. Əgər Əbu Hureyrənin bu hadisədə iştirakını qəbul etsək belə, Allahın elçisi bu hadisədən sonra qadınların qəbir ziyarətlərini, qəbirlər üzərində məscid tikməsini və qəbirlər üzərinə mum yaxılmasını qadağan edib, bunları edənləri də lənətləmişdir.[88]

O qadının nəzarətini itirdiyi bir zamanda Allahın elçisinin özünü ona tanıtdırmaması şəfqət və mərhəmətdən dolayıdır. Əgər özünü ona bildirsəydi, o da onu dinləməsəydi həlak olardı. Çünki onun Allahın elçisi olduğunu bilmədiyi haldakı günahı, bilmiş olduğu haldakı günahından daha yüngüldür. Allahın elçisinin belə hərəkət etməsi ümmətinə çox şəfqətli və mərhəmətli olmasından irəli gəlir.

Müslimin "əs-Səhih" əsərində Ummu Sələmənin belə dediyi rəvayət olunur: "Mən Allahın elçisinin belə dediyini eşitdim: "Hər hansı bir müsəlmanın başına bir müsibət gəldikdə, Allahın buyurduğu kimi: **«Biz Allahdan gəldik və ancaq ona qayıdacağıq. Allahım, bu müsibətə görə ənə mükafat ver və mənə bunun ardınca daha xeyirlisin ehsan et»**- deyərsə, Allah-taala ona daha xeyirlisini ehsan edər".

Ummu Sələmə demişdir: "Əbu Sələmə vəfat edəndə mən: "Maraqlıdır, görəsən müsəlmanlar içində Əbu Sələmədən daha xeyirlisi varmı? O ailəsilə birgə ilk hicrət edənlərdəndir"- dedim. Bunun üzərinə Allah-taala onun yerinə şəxsən Allahın elçisini bəxş etdi, Allahın elçisi mənə Hatib bin Əbu Bəltə'anı elçi yolladı. Mən ona: "Bir qızım var. Həm də mən çox qısqanc bir insanam" — dedim. Bu sözümə cavab olaraq Allahın elçisi: "Qızını anasından gözü tox etmək üçün Allaha dua edərik. Artıq qısqanclığını yox etmək üçün isə mən Allaha dua edərəm" - dedi. Bundan sonra mən də Allahın elçisi ilə evləndim."[89]

Əbu Davud Ummu Sələmədən bu hədisi belə rəvayət etmişdir: "Allahın elçisi: "Sizdən birinizin başına bir müsibət gəldiyində: "Biz Allahınıq və Ona da qayıdacağıq. Allahım, müsibətimin əcrini yalnız Sənin dərgahından umuram, buna görə məni mükafatlandır, mənə bundan daha xeyirlisini bəxş et"- desin" buyurmuşdur".

Əbu Sələmə ölüm yatağındaykən: "Allahım, xanımım üçün məndən daha xeyirlisini bəxş et"- dedi. Əbu Sələmə vəfat etdikdə, Ummu Sələmə: "Biz Allahınıq və Ona da qayıdacağıq. Allahım müsibətimin əcrini yalnız Səndən umuram"- dedim. Sonra səbrin, qayıdışın, Allahın elçisinə tabe olmanın və Allahdan razı olmanın sonunu, aqibətini maraqla gözləyirdim. Səbrimin sonunda Allah

---

[88] **Zəifdir:** Əbu Davud, 3236; ət-Tirmizi, 320; ən-Nəsai, 4/95; Deyirəm: sənədindəki Əbu Saleh Mövla zəifdir.
[89] Müslim, 918.

dərgahında məxluqatın ən xeyirlisinin arvadı olma şərəfinə nail oldum".[90]

Əbu Musa əl-Əşaridən rəvayət edildiyinə görə Allahın elçisi belə demişdir: "Bir kişinin uşağı öləndə, Allah-taala mələklərinə: "Qulumun körpəsini aldınızmı?»- buyurur.

Mələklər: "Bəli"- deyir.

Allah-taala: "Qulumun qəlbinin meyvəsini (ciyər parasını) aldınızmı?"- soruşur.

Mələklər: "Bəli"- deyir. Bundan sonra Allah-taala: "Bəs qulum buna nə dedi?"- soruşduqda, mələklər: "Sənə həmd etdi və: Biz Allahınıq və Ona da qayıdacağıq dedi"- deyirlər. Allah-taala da: "O quluma Cənnətdə bir ev tikin və adını da **"həmd evi"** qoyun" - buyurur.”[91]

Ənəsdən rəvayət olunur ki, Allahın elçisindən belə deyəndə eşitdim: "Allah-taala buyurur ki, Hər hansı bir qulum gözlərindən məhrum qalma bəlasına düçar olduqda səbir edərsə, gözlərinin mükafatı olaraq mən onu Cənnətə qoyaram.”[92]

Ənəsdən rəvayət edildiyinə görə Allahın elçisi belə söylədi: "Allah-taala buyurur ki, hər hansı bir qulumun dünyada ən qiymətli olan iki gözünü aldığımda, mənim dərgahımda onun mükafatı ancaq Cənnətdir."[93]

Əbu Hureyrədən rəvayət edildiyinə görə Allahın elçisi belə demişdir: "Allah-taala buyurur ki, hər hansı bir qulumun iki sevgilisini (iki gözünü) çıxartdığımda səbir edib, səbrini Allah üçün edərsə, ona Cənnətdən başqa savab verməyə razı olmaram."[94]

Abdullah bin Amr bir əl-Asdan rəvayət olunduğuna görə Allahın elçisi belə buyurmuşdur: "Allah-taala mömin qulu dünya əhlindən məsələn, uşağı kimi ən çox sevdiyi birisini itirib səbir edər, səbrini Allah üçün edər və: "Biz Allahınıq və Ona da qayıdırıq"- desə, o quluna Cənnətdən başqa mükafat verməyə razı olmaz."[95]

Əbu Hureyrədən rəvayət edildiyinə görə Allahın elçisi belə dedi: "Allah-taala: "Mömin bir qulumun dünya əhlindən ən çox sevdiyi birisini aldıqdan sonra, o,savabını Allahdan diləyərək səbir edərsə, mənim dərgahımda onun mükafatı ancaq Cənnətdir" -

[90] **Səhihdir:** Əbu Davud, 3116; ət-Tirmizi, 35114; İbn Macə, 1598; Əhməd, 6/317.

[91] **Həsəndir:** əl-Tirmizi, 1021; İbn Hibban, 2948; Əhməd, 4/415; Təhqiqatçi sənədləri araşdırarkən zəif ravilərin olduğunu söyləsədə, ümumən hədisin həsən olduğunu demişdir.

[92] əl-Buxari, 5653.

[93] **Səhihdir:** ət-Tirmizi, 2400.

[94] **Səhihdir:** ət-Tirmizi, 2401.

[95] **Həsəndir:** ən-Nesai, 4/23.

buyurmuşdur."[96]

Ata bin Əbu Rəbahdan rəvayət edildiyinə görə İbn Abbas mənə: "Cənnət əhlindən bir qadını göstərimmi?"- dedi.

Mən: Bəli - dedim.

O: "Bu zənci qadındır. Bu qadın Allahın elçisinin yanına gəldi və: "Epilepsiyam (özündəngetmə) var və bu səbəbdən özümdən gedəndə örtüyüm açılır və bədənim görünür. Mənim üçün Allaha dua et"- dedi.

Allahın elçisi: "İstəyirsən səbir et, Cənnətlik ol, amma istəyirsən sənə şəfa verməsi üçün Allaha dua edim". Bunun üzərinə qadın: "Mən səbir edərəm. Amma bədənim açılır. Heç olmasa açılmaması üçün dua et".

Allahın elçisi dua etdi."[97]

Ata bin Yəsardan rəvayət edildiyinə görə Allahın elçisi belə demişdir: "Bir qul xəstə olduqda Allah-taala ona iki mələk göndərərək: **"Gedin baxın qulum ziyarətçilərə nə söyləyir"**- buyurur. Əgər o qul ki, onun yanına ziyarətçilər gəldikdə Allah-taalaya həmd və sənada olursa, Allah daha yaxşı bildiyi halda mələklər bunu Ona yüksəldirlər. Bunun üzərinə Allah-laala: **"Qul mənimdir, onu öldürsəm Cənnətə qoyaram, yaxşılaşdıraramsa, onun ətini daha xeyirlisl ilə, qanını daha xeyirlisi ilə dəyişərəm və günahlarını əfv edərəm"** - buyurur."[98]

Amr bin Şüeyb atasından, o da öz atasından rəvayət etdiyinə görə Allahın elçisi belə demişdir: "Allah-taala Qiyamət günündə məxluqat topladığı vaxt biri: "Səbirlilər haradadır?"- deyə çağıracaq. Az kimsələr qalxıb Cənnətə doğru sürətlə qaçacaqlar.

Mələklər onları qarşılayaraq: "Biz sizin sürətlə Cənnətə qaçdığınızı görürük, siz kimsiniz?" - deyəcəklər.

Onlar da: "Biz fəzilət əhliyik"- deyəcəklər.

Mələklər: "Sizin fəzilətiniz nədir?" - soruşduqda, onlar: "Bizə haqsızlıq edildikdə, bizə pislik ediləndə əfv edirdik, bizə sataşılanda yaxşılıqla cavab verirdik"- deyəcəklər. Bunun üzərinə onlara: "Cənnətə girin, gözəl əməl görənlərin mükafatı nə gözəldir"- deyiləcəkdir."[99]

İbn Məsuddan rəvayət edildiyinə görə belə deyir: "Allahın elçisi [Hüneyn günündə] qəniməti bölüşdürərkən bəzilərinə artıq verdi.

---

[96] əl-Buxari, 6224.

[97] əl-Buxari, 5652; Müslim, 2576.

[98] **Səhihdir:** Malik, "əl-Muvatta", 2/840/5.

[99] **Çox zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Hilm", 56. Sənədində Məhəmməd bin Ubeydullah bin Meysərə əl-Ərzəmi adlı mətruk ravinin olduğu çox zəif bir sənədlə rəvayət olunub.

[Aqra bin Habisə yüz dəvə, Uyeynə bin Hisnə də bir o qədər verdiyi kimi, bir dəstə şərəfli ərəblərə də verdi. O gün bu səbəbdən narazılıq yarandı.] Bəziləri: "Allaha and olsun! Bu bölüşdürmədə ədalət yoxdur. Bunda Allahın rizası gözlənilməmişdir " - dedilər.

Mən də: "Allaha and olsun ki, bunu Allahın elçisinə deyəcəyəm" - dedim və yanına getdim, olanları söylədim. [Allahın elçisinin rəngi dəyişdi, üzü qızardı. Sonra: "Allah və Rəsulu ədalətli olmazsa, kim olar?" - dedi.] Və: "Allah-taala Musaya rəhmət eləsin, bundan çox əziyyətə uğradıqda səbir etdi" - buyurdu.

[Mən də: "Bundan sonra Allahın elçisinə heç kimin sozünü çatdırmayacağam"- dedim]."[100]

əz-Zuhrinin Aişədən Allahın elçisinin belə dediyi rəvayət olunur: "Allah müsəlmanı onun üçün kəffarə olmadıqca heç bir müsibətə düçar etməz."[101]

Əbu Səid və Əbu Hureyrədən rəvayət edildiyinə görə, Allahın elçisi belə demişdir: "Hər hansı bir müsəlmanın başına yorğunluq, xəstəlik, fikir, kədər, acı və qayğıdan tikan batmasına qədər hər nə gəlirsə, Allah bunları o müsəlmanın xatalarına kəffarə edər."[102]

Aişənin rəvayət etdiyinə görə Allahın elçisi belə buyurmuşdur: "Bir möminin kiçik və ya böyük bir tikan canını incidirsə, Allah-taala buna görə mütləq onun dərəcəsini yüksəldər və qüsurunu silər."[103]

Əbu Hureyrədən rəvayət edildiyinə görə Allahın elçisi: "Kişi olsun, qadın olsun, bir mömin Allahına günahsız qovuşuncaya qədər başından, uşaqlarından, malından bəla əskik olmaz - demişdir."[104]

Səd bin Əbu Vəqqasdan rəvayət edilir: "Ey Allahın elçisi! İnsanların ən çox bəlaya uğrayanları kimlərdir?"- deyə soruşdum. O da: "Peyğəmbərlər, sonra saleh kimsələr, sonra bunlara yaxın olan kimsələrdir. Buna görə insan dininə bağlılıq dərəcəsinə görə bəla ilə imtahan edilir! Əgər dinində qüvvətlidirsə, bəlası şiddətli olur, əgər dinində zəifdirsə, bəlası da zəif olur. Qul günahsız, tərtəmiz olaraq yer üzündə gəzmədikcə, bəla onun ardınca olar"- dedi."[105]

İbn Məsuddan rəvayət edildiyinə görə belə deyir: "Allahın elçisinin yanına gəldim. Şiddəlli qızdırması vardı. "Ey Allahın elçisi, bu qızdırmadan son dərəcə şiddətli əziyyət çəkirsən"- dedim.

---

[100] əl-Buxari, 3405; Müslim, 1602.
[101] əI-Buxari, 5640; Müslim, 2572, (49).
[102] əl-Buxari, 5641, 5642; Müslim. 2573.
[103] Müslim, 2572, (47).
[104] **Həsəndir:** ət-Tirmizi, 2399; Əhməd, 2/287, 45; əl-Bəğəvi, 1436; İbn Hibban, 2913; əl-Hakim, 1/346, 4/314-315; əl-Beyhəqi, 3/374.
[105] **Səhihdir:** ət-Tirmizi, 2398: İbn Macə, 4023; Əhməd, 1/172, 173, 174, 180, 185; əl-Bəğəvi, 1432; əl-Hakim, 1/40, 41; əl-Beyhəqi, 3/372; İbn Hibban, 2901; ət-Təyalisi, 215; İbn Əbi Şeybə, "əl-Musənnəf", 3/233.

O: "Bəli, mən sizdən iki insanın çəkə biləcəyi qədər əziyyət çəkirəm "- dedi.

Mən soruşdum: "Sizə iki qat savab olduğu üçünmü?"

Allahın elçisi: "Bəli"- dedi. Sonra Allahın elçisi: "Bir müsəlmana xəstəlik və başqa bir səbəbdən əziyyət toxunarsa, Allah-taala mütləq onun günahlarını ağacın yarpaqlarını tökdüyünü kimi tökər"— buyurdu."[106]

Aişədən rəvayət edildiyinə görə o, belə demişdir: "Mən xəstəliyi Allahın elçisinin xəstəliyindən daha şiddətli bir kimsə görmədim."[107]

Mərfu[108] olaraq rəvayət edilən bir hədisdə deyilir: "Bir qulun Allah dərgahında əməli ilə çata bilmədiyi bir dərəcə vardır. Allah onun vücuduna bir bəla verməklə onu imtahan edər və bununla o dərəcəyə çatar."[109]

Aişədən rəvayət edildiyinə görə Allahın elçisi belə demişdir: "Körük dəmirin pasını təmizlədiyi kimi xəstəlik də möminin günahlarını təmizlər."[110]

Xəbbab bin əl-Ərətdən rəvayət edildiyinə görə belə demişdir: "Allahın elçisinin yanına halımıza görə şikayətə getdik. Kəbənin kölgəsində arxalığını yastıq edərək yatırdı.

"Bizim üçün Allahdan yardım diləməzsənmi? Bizim üçün Allaha dua etməzsənmi?"- dedik. Allahın elçisi: "Sizdən əvvəlki zamanda inanan bir nəfəri yaxalayaraq qazılmış quyuya atırlar. Sonra mişarla başdan ayağa iki yerə bölünür, dəmir daraqlarla ət və sümükləri daranırdı. Bu onu dinindən döndərmədi. Allaha and içirəm ki, Allah-taala bu işi (dinini) kamala çatdıracaq. Hətta atına minmiş bir kimsə Sənadan Hadramuta qədər gedəcək, Allahdan və qoyunlarının qurd yeməsindən başqa heç bir şeydən qorxmayacaqdır. Lakin siz tələsirsiniz" - buyurdu."[111]

Buxarinin digər rəvayətində: "Mən Allahın elçisinin yanına gəldim. Kəbənin kölgəsində arxalığına söykənmişdi. "Biz müşriklərdən çox çətinliklər çəkirik, Allaha dua etməzsənmi?" - dedik.

Allahın elçisi düzəldi və mübarək üzü qızardı, "Sizdən əvvəllər bir möminin əti və sümükləri dəmir daraqla daranırdı, amma onu

---

[106] əl-Buxari, 5648; Müslim, 2571.

[107] əl-Buxari, 5646; Müslim, 2570.

[108] Yəni səhabənin bir başa Peyğəmbərdən etdiyi rəvayət.

[109] **Həsəndir:** Əbu Yəla, "Müsnəd", 6095; İbn Hibban, 2908; əl-Hakim, 1/344.

[110] **Səhihdir:** əl-Buxari, "əI-Ədəbul-Mufrəd", 497; əl-Qadai, "əş-Şəhəb", 1406, 1407; İbn Hibban, 2936 və s.

[111] əl-Buxari, 3612.

dinindən döndərmədi"- buyurdu."[112]

Alimlər Xəbbabın: "Biz Allahın elçisinə daşların istiliyindən şikayət etdikdə şikayətimizi dinləmədi"[113] sözünə belə məna veriblər ki, Xəbbab deyir ki: "Biz kafirlərin isti daşlarla verdikləri işkəncələrdən alınlarımızda və əllərimizdə meydana gələn əziyyətlərdən şikayət etdikdə Allahın elçisi şikayətimizi dinləməyib bizə səbir etməmizi tövsiyə etdi."

Xəbbabın sözünə verilmiş bu məna, bəzi alimlərin: "Səcdə etməklə istinin şiddətindən alınlarında meydana gələn əziyyətə görə şikayət etmələri"- mənasını verməkdən daha münasibdir.

Xəbbabın sözünə ikinci mənanı verənlər namaz qılanın torpaq üzərinə şəcdə etməsinin vacib olduğuna dəlil gətirmişlər. Fəqət buna üç vəchlə cavab verilir:

Birincisi, hədisin ləfzində buna dəlil yoxdur.

İkincisi, səhabələr Allahın elçisi ilə bərabər olarkən onlardan biri torpaq üzərinə səcdə edə bilmədiyi zaman paltarını sərib üzərində səcdə etdiyini xəbər vermişdilər. Bundan anlaşılır ki, səhabənin yerə paltarını sərib üzərinə səcdə etməsi Allahın elçisinə çatır və bunu bildiyi halda onları bundan çəkindirmirdi.

Üçüncüsü, Hicazda istinin şiddəti alnın və əllərin torpaq üzürinə dəyməsinə mane olur. Hətta, yerin istisi üzü və əlləri bişirdiyindən rahat səcdə etmə imkanı olmur, namazın mütiliyini aparır və bədənə zərər verərək xəstələnməyə səbəb olur. Şəriət isə bunu əmr etməz.

Üsamə bin Zeyddən rəvayət edildiyinə görə: "Allahın elçisinin qızı: "Oğlum ölmək üzrədir, bizə gəlməsini rica edirəm" — deyə Allahın elçisinə xəbər göndərmişdi. Allahın elçisi qızına salam gondərdi və: "Alan Allahdır, verən də Odur, Onun dərgahında hər şeyin vaxtı bəllidir. Buna görə səbir etsin və Allahdan mükafatını gözləsin"- buyurdu. Yenə Allahın elçisinin qızı: "Allah xətrinə, mütləq gəlsin"- deyə and verərək atasına təkrar xəbər göndərdi. Allahın elçisi də yanında Səd bin Übadə, Muaz bin Cəbəl, Übeyy bin Kəb, Zeyd bin Sabit və daha başqaları olduğu halda qalxıb getdi.

Uşağı Allahın elçisinə verdilər. Onu qucağında oturtdu. Uşaq çox sürətlə nəfəs alıb-verirdi. Sanki canı köhnə bir tuluq içində idi. Onun bu halına Allahın elçisinin gözləri yaşardı.

Səd: "Ya Allahın elçisi, nə oldu sənə?"- deyə soruşdu.

Allahın elçisi: "Bu bir nemətdir, Allah onu istədiyi qullarının qəlblərinə yerləşdirir. Allah-taala ancaq mərhəmətli qullarına rəhmət

[112] əl-Buxari, 3852.
[113] Müslim, 619, (190).

edər"- buyurdu."[114]

İbn Abbasdan rəvayət edildiyinə görə: "Allahın elçisinin kiçik bir qızının ölüm vaxtı yaxınlaşdıqda onu qucağına aldı[115]. Sonra əlini onun üzərinə qoydu. Qız Allahın elçisinin yanında ruhunu təslim etdi, Ummu Ayman ağlamağa başladı.

Allahın elçisinin: "Ya Ummu Ayman, Allah rəsulu yanında ikən niyə ağlayırsan?" - deyə soruşdu." Ummu Ayman da: "Allahın Rəsulu ağlarkən, mən necə ağlamayım?"- deyə cavab verdi.

Allahın elçisi: "Mən aglamıram. Fəqət o göz yaşları rəhmətdir"- dedi. Sonra: "Mömin bütün hallarda xeyir içindədir. Bədənindən ruhu çıxarılarkən o yenə İzzətli və Qüdrətli Allaha həmd edər" — buyurdu."[116]

Ənəs belə dedi: "Əbu Təlhanın oğlu özü bayırda ikən öldü. Qadın görəndəki uşaq ölüb, onu evin bir tərəfində yerləşdirdi. Əbu Təlha gələndə soruşdu: "Uşaq necədir?" O dedi: "İndi rahatlaşdı"- dedi. Adam vəziyyətin fərqinə varmadı. Sonra birlikdə axşam yeməyini yedilər. Gecə yatdıqları vaxt cinsi münasibətdə oldular. Səhər qüsl etdikdən sonra çıxmaq istəyəndə bildi ki, uşaq ölüb, Əbu Təlha Allahın elçisinin yanına gedib hadisəni ona danışdı. Allahın elçisi: "Allahım bunların gecələrinə bərəkət ver"- dedi."[117]

İbn Üyeynə deyir: "Ənsardan bir adam: "Onun doqquz uşağını gördüm, hamısı da Quran əhli idilər" - dedi."

Qasım bin Məhəmməd deyir: "Arvadım ölmüşdü, buna görə təziyə üçün yanıma gələn Məhəmməd bin Kəb əl-Qurazi belə dedi: "İsrail oğullarından alim, fitva, müctəhid bir kimsənin bəyəndiyi və sevdiyi bir xanımı öldü. O buna çox üzüldü. Hətta, evinə girib, heç kimi qəbul etmirdi. Bir qədər sonra bir qadın bunu bilincə onun evinə gələrək, bir fitva soruşacağam"- dedi. Qasım qapıda gözləyərkən o adama xəbər verildi. O da qadının içəri girməsinə izn verdi.

Qadın bir məsələ haqqında soruşacağını söylədi. O da: "Nədir?" - dedi.

Qadın: "Mən bir qadından əmanət olaraq ləl-cəvahir alıb bir müddət taxdım. Sonra qadın xəbər göndərib istədi, onun zinətini qaytarımmı?"- deyə soruşdu.

O da: Bəli - dedi.

Qadın: "Vallahi o ləl-cəvahir uzun müddət məndə qaldı"- dedi.

O da: "Ləl-cəvahiratı o qadına mütləq qaytarmağın lazımdır"- cavabını verdi.

---

114 əl-Buxari, 5655; Müslim, 923.

115 Hədisdə Allahın elçisinin kiçik yaşında vəfat edən qızı Ruqiyədən bəhs edilir.

116 **Səhihdir:** ən-Nəsai, 4/12; Əhməd, 1/273-274, 297.

117 əl-Buxari, 1301; Müslim, 2144.

Buna cavab olaraq qadın: "Allah sənə rəhm eləsin, belə isə Allahın sənə əmanət olaraq verdiyi şeyi almasından niyə üzülürsən? Halbuki, Allah onu səndən almağa daha layiqdir"- dedikdə o adam həqiqəti dərk etdi. Allah onu o qadının sözüylə faydalandırdı."[118]

Mürrə oğullarından bir yaşlısı deyir: "Mən Kufəyə gələndə mənə Bilal bin Əbu Bürdəni tanıtdılar. Mən də bunda alınacaq ibrət dərsi vardır deyərək, həbs edilmiş evinə gəldim. Bir də gördüm ki, əziyyət və zərbələrdən tamamilə dəyişmiş, çör-çöp içindədir.

Mən: "Əlhəmdulilləh! Ey Bilal, Sən bizim yanımızdan keçərkən toz-torpaq yoxkən bulaşdığını görürəm. İndi bu haldasan, bu gün səbrin necədir?" - dedim.

Bilal: "Sən kimlərdənsən?"' — deyə soruşdu.

Mən də: "Mürrə bin İbad oğullarındanam " - dedim.

Bilal: "Sənə bir hədis danışım, güman edirəm ki, Allah-taala səni faydalandırar" - dedi.

Mən: "Haydı, danış"- dedim.

Bilal dedi: "Mənə Əbu Bürdə, o da Əbu Musadan rəvayət edərək belə dedi: "Allahın elçisi: "Bir qulun başına kiçik və ya böyük bir müsibət ancaq günahına görə gəlir. Beləliklə, Allah bir çoxlarını əfv edər" - buyurdu, sonra bu ayəni oxudu: **«Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların** (etdiyiniz əməllərin) **ucbatındandır!** (Bütün bunlara baxmayaraq) **Allah** (günahlarınızın) **çoxunu əfv edər»** (əş-Şura, 30).[119]

“Səhiheyn”də[120] Abdullah bin Məsuddan rəvayət edildiyinə görə belə deyir: "Allahın elçisi peyğəmbərlərdən biri haqqında danışarkən diqqətlə dinləyirdim. O peyğəmbərin qövmü onun üzünə vurmuş və qanatmışdılar. Bir yandan üzünün qanını silir, bir yandan da: "Allahım, qövmümü mühakimə etmə, çünki onlar bilmirlər" - deyirdi."

Peyğəmbərin bu duası onların əfvini, onlara dua etməyi, onlar üçün üzür diləməyi və şəfqət etməyi əhatə edir.[121]

Abdurrəhman bin Qasımdan rəvayət edildiyinə görə belə deyir: "Allahın elçisi: "Müsəlmanlar bir müsibətə uğradıqları zaman mənə gələcək müsibət onlara təsəlli olsun”- buyurmuşdur."[122]

---

118 Malik, "əl-Muvatta", 1/237/43.

119 **Zəifdir:** ət-Tirmizi, 3252; ət-Tirmizi zəif hesab etmişdir. Mən deyirəm: Onun dediyi kimidir və sənəddə iki nəfər naməlum ravi var: Ubeydullah bin Vazi'i və qoca.

120 Yəni iki səhih. əl-Buxari və Müslimin "əs-Səhih'" əsərləri nəzərdə tululur.

121 Hədisi əl-Buxari, 13477 rəvayət etmişdir. Müslimdə belə hədis yoxdur.

122 **Həsəndir:** Malik, 1/236/41; "ət-Tabaqat", 2/275; İbn Mübarək, "əz-Zühd", 467.

İbn Ömərdən rəvayət edildiyinə görə: "Allahın elçisi belə buyurur: "İnsanların arasına qarışıb onların əziyyətlərinə səbir edən möminin mükafatı, insanlara qarışmayıb onların əziyyətlərinə səbir etməyən möminin mükafatından daha böyükdür."[123]

Əbu Səid əl-Xudridin rəvayət edildiyinə görə: "Allahın elçisi: "Səbirdən daha xeyirli, səbirdən daha geniş bir nemət heç kimə verilməmişdir" - demişdir."[124] (əl-Buxari, Müslim)

Bəzi "Müsnəd"lərdə rəvayət edildiyinə görə Allahın elçisi belə buyurmuşdur: "Allah-taala: **«Mən qullarımdan hər hansı birinin bədəninə və ya malına və ya övladına bir bəla verməklə onu imtahan etdiyimdə gözəl bir səbirlə qarşılasa, qiyamət günü onun üçün tərəzi və hesab qurmaqdan həya edərəm" -** buyurmuşdur."[125]

Ənəs bin Malikdən rəvayət edildiyinə görə Allahın elçisi belə demişdir: "Mükafatın böyüklüyü bəlanın böyüklüyünə görədir. Şübhə yox ki, Allah-taata bir qövmü sevdimi, onları bəla verməklə imtahan edər. Kim bu bəlaya razı olursa, onun üçün Allah rizası vardır. Kim də bu bəlaya qəzəblənirsə onun üçün də Allah qəzəbi vardır."[126]

Bəzi "Müsnəd"lərdə mərfu olaraq rəvayət olunan hədisdə: "Allah-taala bir qulunu sevdiyi zaman onun başından bəlanı əskik etməz" - buyurulur.[127]

Cabir bin Abdullahdan rəvayət edildiyinə görə Allahın elçisi belə deyir: "Ummu Saibin (yaxud Ummu Museybin) yanına girdikdə: "Sənə nə oldu ey Ummu Saib (yaxud ya Ummu Museyb) ki, titrəyirsən?" - deyə soruşdu." O da: "Qızdırma! Allah xeyrini verməsin" - demişdir. Buna cavab olaraq: "Qızdırmanı söymə! Çünki o Adəm oğullarının günahlarını korüyün dəmir pasını apardığı kimi aparır" - buyurmuşdur."[128]

Əbu Hureyrədən rəvayət edildiyinə görə Allahın elçisi belə buyurmuşdur: "Bir kimsə bir gecə, məsələn, qızdırmalı olsa, səbir edərsə və bunun Allahdan olduğuna razı olarsa, anadan doğulduğu kimi günahlarından təmizlənər."[129]

---

[123] **Səhihdir:** əl-Buxari, "əl-Ədəbul-Mufrəd", 388; ət-Tirmizi, 2507; İbn Macə, 4032; Əhməd, 5/365 və s.

[124] Əbu Səid əl-Xudrinin rəvayət etdiyi hədisin bir hissəsidir. əl-Buxari, 1469; Müslim, 1053.

[125] **Zəifdir:** əl-Hakim, ət-Tirmizi, "Nəvadir əl-Usul", 222; əl-Mənavi, "Feydul-Qadir", 4/487 zəif deyərək razılaşmışdır.

[126] **Həsəndir:** ət-Tirmizi, 2396; İbn Macə, 4031.

[127] **Zəifdir:** əd-Deyləmi, Müsnəd əl-Firdovs, 1/251/972.

[128] Müslim,2575.

[129] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 83; "ər-Rida ən Allah", 75; "əs-Sabr", 180; əl-Beyhəqi, ‟Şuabul-İman", 7/167/9868.

Həsən əl-Bəsri: "Bir gecəlik qızdırma səbəbi ilə qulun bütün günahları əfv edilir" - demişdir.[130]

Əbu Səid Xudri belə deyir: "Allahın elçisinin yanına getdim, qızdırmalı idi. Əlimi paltarının üzürinə qoydum. Qızdırmanın istisini hiss etdim və: "Ey Allahın elçisi. Qızdırman nə qədər şiddətlidir?" - dedim.

O da: "Biz peyğəmbərlər zümrəsi beləyik. Mükafatımızın qat-qat artması üçün xəstəliyimiz şiddətli olur" - buyurdu.

Mən: "Ey Allahın elçisi! İnsanların ən şiddətli bəlaya məruz qalanları kimlərdir?" - deyə soruşdum.

Allahın elçisi: "Peyğəmbərlərdir" - buyurdu.

Mən: "Sonra kimlərdir?" - soruşdum.

Allahın elçisi: "Salihlərdir. İnsan kasıblıqla imtahan edilir, hətta geyinmək üçün ancaq bir əba tapıb onu geyinər. İnsan bitlə imtahan edilir, hətta bitlər onu öldürür. Onların başına gələn bu müsibətlər onlar üçün sizə verilən nemətlərdən daha xeyirlidir" - buyurmuşdur."[131]

Uqbə bin Amir əl-Cuhənidən rəvayət edildiyinə görə Allahın elçisi belə buyurmuşdur: "Hər əməl mütləq möhürlənir. Ancaq mömin xəstə olduğu zaman mələklər: "Ey Rəbbimiz, filan qulu əməldən saxladın" - deyərlər. Buna cavab Allah-taala**: «Qulum yaxşı olana qədər və ya ölənə qədər sağlam olarkən etdiyi əməlinin mislini yazın»** - buyurur."[132]

Əbu Hureyrə buyurmuşdur: "Bir müsəlman qul xəstə olduğu zaman sağındakı mələyə: **«Qulum üçün sağlam olarkən yazdığın yaxşı əməli yaz»** - deyilir. Solundakı mələyə: **«Xəstə olduğu müddətdə qulumun günahlarını yazma»** deyilir."

Əbu Hureyrənin yanında olan bir kimsə: "Kaş ki, mən də daim xəstə olaraq yatsaydım"- dedikdə, Əbu Hureyrə: "Qul günahlara ikrah edər"- dedi." Bunu İbn Əbid-Dünya söyləmişdir.[133]

İbn Əbid-Dünyadan rəvayət edildiyinə görə Nilal bin Bəssaq belə dedi: "Biz Əmmar bin Yasirin yanında otururduq, xəstəliklərdən bəhs edildi. Bu zaman bir bədəvi: "Mən heç xəstə olmadım" - dedi. Əmmar: "Sən bizdən deyilsən, çünki müsəlman bəla ilə imtahan edilir

---

[130] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 27; əl-Hakim, 4/314; ət-Təbərani, "əl-Kəbir", 7698; əl-Beyhəqi, "Şuabul-İman", 9924.

[131] **Səhihdir:** Əhməd, 3/94; İbn Macə, 4024; əl-Hakim, 4/307. Müslimin şərtlərinə görə sənədi səhihdir.

[132] **Səhihdir:** Əhməd, 4/146; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 12; ət-Təbərani, "əI-Kəbir", 17/246/782; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 1428.

[133] **Səhihdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 14; əl-Beyhəqi, "Şuabul-İman", 9948. Ləfz sonuncunundur.

ve ağacın yarpaqları töküldüyü kimi günahları tökülür. Kafir yaxud günahkar bəla ilə imtahan edilir və onun halı dəvənin halına bənzəyir. Açıb buraxıldığı vaxt nə üçün buraxıldığını, bağlandığı vaxt nə üçün bağlandığını bilməz" - dedi."[134]

Mamər bin Əzdi dedi: "Biz İbn Məsuddan xoşumuza gəlməyən bir şey eşitdikdə onu bizə açıqlayana qədər susardıq. Bir gün bizə İbn Məsud dedi: "Fikir verin, xəstəlik üçün mükafat yoxdur."

Bu söz acığımıza gəldi və bizə çox ağır gəldi. Sonra İbn Məsud: "Ancaq bu xəstəlik günahlarımıza kəffarə olur"- dedikdə çox sevindik və xoşumuza gəldi."[135]

Bu, İbn Məsudun elminin və fiqhinin kamilliyindəndir. Mükafat ixtiyari əməllərə və onlardan meydana gələnlərə görə verilir. Belə ki, «ət-Tövbə» surəsinin sonunda Allah-taala: **«Onların sərf etdikləri elə bir az-çox xərc, keçdikləri elə bir vadi olmaz ki, Allah əməllərinin qarşılığını daha gözəl versin deyə, əvəzində onlara savab yazılmamış»** (ət-Tövbə, 121) olduğunu qeyd etdiyi kimi bunlardan meydana gələn susuzluq, yorğunluq, aclıq və kafirləri qəzəbləndirmələrinə savab yazılacağını da qeyd etmişdir: **«...Allah yolunda onlara elə bir susuzluq, yorğunluq və aclıq üz verməz, kafirlərin qəzəbinə səbəb olan elə bir yerə ayaq basmaz və düşməndən elə bir bəla, müsibət görməzlər ki, bunların müqabilində onlara yaxşı bir əməl yazılmamış olsun!»** (ət-Tövbə, 120).

Buna görə savab bu iki növə bağlanmışdır. Amma xəstəliklərlə müsibətlərin savabı isə günahların əfv edilməsidir. Buna görə Allah-taala: **«Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların** (etdiyiniz əməllərin) **ucbatındandır!** (Bütün bunlara baxmayaraq) **Allah** (günahlarınızın) **çoxunu əfv edər»** (əş-Şura, 30) - buyurmuşdur.

Allahın elçisi müsibətlər haqqında: "Allah-taala onları xataların kəffarəsi edər"- buyurmuşdur.[136]

Həmçinin Allahın elçisi demişdir: "Xəstəlik günahları tökəndir. İtaət və ibadətlər dərəcələri yüksəldir. Müsibətlər də günahları tökər"- buyurmuşdur.[137]

---

[134] İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 15; əl-Beyhəqi, "Şuabul-İman", 9913; İbn Əbi Şeybə, 3/232. Deyirəm: ravilər siqadır və ravilər arasında əlaqə qırıqdır.

[135] İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 16; ət-Tabərani, "əl-Kəbir", 8506; əl-Heysəmi Məcmuə əz-Zəvaid, 2/301-də sənədi həsəndir demişdir.

[136] əl-Buxari, 5641, 5642; Müslim, 2573.

[137] Bu ləfzdə yoxdur və sünnədə bu mənanı verən dəlil var: "Xatalar xəstəliklə yarpağların ağacdan töküldüyü kimi tökülər". Abdullah bin Əhməd, "Zİyadət əl-Müsnəd", 4/70; ət-Tabərani, "əl-Kəbir", 1002; əl-Heysəmi, "Məcmuə əz-Zəvaid".

Allahın elçisi: "Allah-taala hər kimin xeyrini arzu edərsə, ona müsibət verər"[138], digər bir hədisdə: "Allah-taala hər kimin xeyrini arzu edərsə, onu dində fəqih edər"- demişdir.[139]

Yezid bin Meysərə demişdir: "Qul xəstə olur, onun Allah dərgahında xeyir naminə heç bir əməli yoxdur. Allah-taala bununla ona keçmiş günahlarının bir qismini xatırladır ki, Allah qorxusundan ağlamasıyla günahları, milçəyin başı kimi göz yaşlarıyla gözündən çıxar. Allah onu sağaldırsa, tər-təmiz sağlamlığa qovuşdurur. Ruhunu alırsa, tər-təmiz olaraq ruhunu alar."[140]

İbn Əyyaşın azad etdiyi köləsi Ziyad bin Ziyaddan və Peyğəmbərin əshabələrindən rəvayət edildiyinə görə demişlər: "Biz Allahın elçisinin yanına girdik. Onun hərarəti yüksək idi.

Biz: "Ah! Anamız-atamız sənə fəda olsun ey Allahın elçisi! Qızdırman nə qədər şiddətlidir" - dedik.

O da: "Biz peyğəmbərlər zümrəsiyik. Bizə bəlalar qat-qat verilir" - buyurdu.

Biz: "Sübhənallah " - dedik.

Allahın elçisi: "Təəccübləndiniz, elə deyilmi? Peyğəmbərlərdən birini bitlər öldürmüşdü, bilirdiniz?" - buyurdu.

Biz: "Sübhənallah " - dedik.

Allahın elçisi: "İnsanların ən şiddətli bəlaya uğrayanları peyğəmbərlərdir, sonra dərəcə-dərəcə salihlər gəlir" - buyurdu.

Biz: "Sübhənallah"- dedik.

Allahın elçisi: "Təəccübləndinizmi? Siz nemətlərə sevindiyiniz kimi, onlar da bəlalara sevinirlər” - buyurdu."[141]

Ubeydə bin Huzeyfə xalası Fatimədən rəvayət etdi ki, Fatimə belə deyir: "Biz bir neçə qadınla Allahın elçisini ziyarət etdik. Bir də baxdıq ki, qızdırmanın şiddətinə görə üstündə asılmış bir su bardağından su damcılayırdı.

Biz: "Ey Allahın elçisil Allaha dua etsənə, sənə şəfa versin (olmazmı?)" - dedik. Buna cavab olaraq Allahın elçisi: "İnsanların ən şiddətli bəlaya məruz qalanları peyğəmbərlərdir, sonra onlara yaxın olanlar, sonra onlara yaxın olanlar, sonra onlara yaxın olanlardır" - buyurdu."[142]

---

2/301.

[138] əl-Buxari, 5645.

[139] əl-Buxari, 3116; Müslim, 1037 (175).

[140] İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 17; Əbu Nəim, "əl-Hilyə", 5/240. Sənədi həsəndir.

[141] **Səhihdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 5. Təhqiqatçı zəif ravinin olduğunu deyir. Bax: orijinala səh. 138, 4-cü qeyd.

[142] **Səhihdir:** ən-Nəsai, "əl-Kəbir", 4/355, 379; Əhməd, 6/369; İbn Səid, "ət-TəbaqatuI-Kubra", 8/325, 326; əl-Hakim, 4/404.

Məsruq Aişədən rəvayət etdiyinə görə o belə deyir: "Mən xəstəliyi Allahın elçisinin xəstəliyindən daha şiddətli bir kimsə görmədim."[143]

"Xəstələnərkən xəstəliyi çox şiddətli olurdu. Hətta, çox vaxt on beş gün yatmazdı. Böyrəyinin ağrısı kəskinləşmişdi.

Biz: "Ey Allahın elçisi! Allaha dua etsənə, səndən bu xəstəliyi aparsın" - deyirdik.

O da: "Biz peyğəmbərlər zümrəsinin xəstəlikləri şiddətli keçir ki, bizim kəffarələrimiz olsun"- dedi."[144]

Əbu Səiddən rəvayət edildiyinə görə belə deyir: "Bir nəfər: "Ey Allahın elçisi! Başımıza gələn bu xəstəliklərdən bizim üçün fayda varmı, deyə bilərsənmi?" - deyə soruşduq.

Allahın elçisi: "Günahlara kəffarədir" - dedi.

Buna rəğmən Übey bin Kəb: "Ey Allahın elçisi, az da olsa?" - soruşdu.

Allahın elçisi: "Kiçik bir tikan da olsa" - buyurdu.

Əbu Səid deyir ki: "Übey bin Kəb həcdən, ümrədən, Allah yolunda cihaddan, fərz olan namazların camaatla qılmaqdan ayırmamaqla ölənə qədər xəstəliyin özündən getməməsini dua etdi."

Əbu Səid deyir ki: "Bir kimsə bundan sonra onun dərisinə toxunduğu zaman xəstəliyinin hərarətini hiss edirdi. Bu hərarət ölənə qədər davam etdi."[145]

Abdullah bin Ömər belə deyir: "Allahın elçisi: "İbadətlərini gözəl şəkildə edən bir qul xəstə olsa, ona vəkil olan mələyə: "Xəstəliklərdən qurtulana qədər sağlam ikən etdiyi əməlin mislini onun üçün yaz"- deyilir."[146]

Əbu Ümamətu əl-Bahili belə deyir: "Allahın elçisi dedi ki: "Sizdən biriniz qızılı odla yoxladığınız kimi Allah-taala (çox yaxşı bildiyi halda) sizdən birini bəla ilə yoxlayır. Allahın günahlardan qurtardığı bəladan xalis qızıl kimi çıxar, bəlaya səbir etmədiyindən daha artıq günaha batmış olanı bəladan qara qızıl kimi çıxar. "[147]

Həsən əl-Bəsrinin Allahın elçisindən mürsəl olaraq rəvayət etdiyi bir hədisdə: "Şübhə yoxdur ki, Allah-taala möminin bir gecə

---

143 əl-Buxari, 5646; Müslim, 2570.

144 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 9.

145 **Həsəndir:** ən-Nəsai "əl-Kəbir", 3/502, 503; Əhməd, 3/23; Əbu Yəla, 995; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 10; əl-Beyhəqi, "Şuabul-İman", 9970, 9971.

146 **Səhihdir:** Abdurrəzzaq, 20308; Əhməd, 2/203; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 26; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 1429; əl-Beyhəqi, 3/374.

147 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 27; əl-Hakim, 4/314; ət-Təbərani, "əl-Kəbir", 7698; əl-Beyhəqi, "Şuabul-İman", 9924.

çəkdiyi qızdırma səbəbi ilə bütün günahlarını əfv edər" - deyilir.[148]

İbn Əbi əd-Dünya deyir ki, İbn Mübarək demişdir: "Bu gözəl bir hədisdir.[149]

İbn Əbi əd-Dünya həmçinin demişdir: Sələfi salihlər bir gecə çəkilən qızdırmanın keçmiş günahlara kəffarə olacağını umardılar."[150]

Ənəs belə deyir: "Allahın elçisi bir xəstənin yanına girdi. Ona: "De: "Allahım, mən sənin təcili sağlamlığını, bəlaya səbrini və dünyadan çıxaraq rəhmətinə qovuşmaq istəyirəm". " - dedi."[151]

Aişə belə deyir: "Allahın elçisi: "Ağac yarpaqların tökdüyü kimi qızdırma da günahları tökər" - buyurdu."[152]

Əbu Hureyrə ziyarət etdiyi bir xəstəyə dedi ki, Allahın elçisi belə buyurdu: "Allah-taala: **"Qızdırma mənim atəşimdir, axirətdəki atəşdən nəsibi olsun deyə onu dünyada mömin quluma göndərirəm**" - buyurmuşdur."[153]

Mücahid: "Qızdırma hər bir mömінin oddan hissəsidir" - demiş, sonra: **«Sizdən elə bir kəs olmaz ki, ora varid olmasın. Bu, Rəbbinin buyurduğu vacib bir hökmdür»** (Məryəm, 71) ayəsini oxumuşdur.[154] Lakin Mücahid bu ayədəki **«sizdən elə bir kəs olmaz ki, ora varid olmasın»** ayəsinin mənasını qızdırma ilə təvil[155] etməmişdir. Çünki bu ayənin nazil olması qızdırma ilə təvil edilməsini kəskinliklə qəbul etməz. Mücahidin məqsədi Allah-taala bütün qullarının atəşə uğrayacaqlarını bildirməkdir. O halda qulun günahları xəstəlik səbəbi ilə əfv olunduğundan atəşə uğraması asan olur. Ondan tez qurtulur. Doğrusunu Allah bilir.

Mücahidin bu mənanı qəsd etməsinə Əbu Reyhanənin Allahın elçisindən: "Xəstəlik cəhənnəm körüyü olub, mömінin oddan nəsibidir"[156] - deyə rəvayət etdiyi hədis dəlalət edir.

---

[148] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əİ-Mərad vəl-Kəffərat", 28.
[149] İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", səh. 40.
[150] İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 29; əl-Beyhəqi, "Şuabul-İman", 9867; Əhməd, "əz-Zühd", səh. 280.
[151] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 30.
[152] **Səhihdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Keffərat", 32.
[153] **Səhihdir:** ət-Tirmizi, 2088; İbn Macə, 3470; Əhməd. 2/420; əl-Hakim, 1/345; İbn Əbi əd-Dünya, "əl-Mərad vəI-Kəffərat", 19; İbn Əbi Şeybə, 3/229.
[154] İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 20; əl-Beyhəqi, "Şuabul-İman", 368. Deyirəm: **sənədi zəifdir.**
[155] Mənanı yozmaq.
[156] **Həsəndir:** əl-Buxari, "ət-Tarix əl-Kəbir", 4/1/63; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 21; ət-Tahavi, "Muşkilə əl-Əsər", 2217; əl-Beyhəqi, "Şuabul-İman", 9846. Deyirəm: sənədində zəif ravi olsa da, hədisi Əbu Hureyrənin və Əbu Ümamənin hədisləri həsən edir.

Ənəs belə deyir: "Allahın elçisi: "Xəstəlikdən yaxşı olub sağlamlığa qovuşan müsəlmanın halı, saflığı və rəngi baxımından göydən yağan dolu kimidir" — buyurmuşdur."[157] İbn Əbi əd-Dünya rəvayət etmişdir.

İbn Əbi əd-Dünyanın həmçinin Əbu Ümamədən mərfu olaraq rəvayət edilən bir hədisdə: "Xəstə olaraq yatan bir müsəlman mütləq günahlardan təmizlənərək sağlamlığa qovuşar" - deyilir.[158]

Əbu Ümamə deyir ki, Peyğəmbər: "Qızdırmalı möminin vəziyyəti, oda salınıb pasından təmizlənən dəmirin vəziyyəti kimidir" - buyurmuşdur.[159]

Yenə Əbu Ümamədən mərfu olaraq rəvayət edilən hədisdə: "Qul xəstələndiyi zaman Allah-taala mələklərinə vəhy etmişdir: "Ey mələklərim, Mən qulumu iplərimdən biri ilə bağladım. Əgər onun ruhunu alsam, bagışlaram və əgər onu sağaltsam, günahlarından təmizlənmiş olar"- buyurulmuşdur. "[160]

Səhl bin Ənəs əl-Cuhəni atasından, o da öz atasından rəvayət etdi ki, babası belə deyib: "Mən Əbu Dərda xəstə ikən yanına girdim və: "Ey Əbu Dərda! Biz sağlam olmağı sevirik, amma xəstələnməyi sevmirik" - dedim. "

Əbu Dərda dedi: "Mən, Allahın elçisi belə deyərkən eşitdim: "Baş ağrısı və xəstəlik Ühüd dağı qədər günahı olsa da, xardal dənəsi qədər günahı qalmayanadək mömindən əl çəkməz."[161]

Ummu Sələmədən rəvayət edildiyinə görə Allahın elçisi belə buyurur: "Allah-taala ikrah etdiyi yolda olan qulunu, bəla verməklə imtahan edər. O başına gələn bəlanı Allahdan başqasına aid etməzsə, yaxud bu bəlanın getməsi üçün Allahdan başqasına dua etməzsə, Allah bəlanı günahlarına kəffarə edər, onu bu bəla ilə temizləyər".[162]

Atıy bin Qeys dedi: "Kəb xəstələndi. Dəməşq əhlindən bir neçə

---

[157] **Çox zəifdir:** ət-Tirmizi, 2806; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 22; əl-Bəzzar, "Kəşf əl-Əstar", 762; Əbu Şeyx, "Əmsəl əl-Hədis", 346; İbn Adiy, "əl-Kəlam", 7/ 2534; İbn əl-Cəuzi, "əl-Məuduat", 3/200, 201 və s.

[158] **Səhihdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 23; ət-Təbərani, "əl-Kəbir", 7485; əl-Beyhəqi, "Şuabul-İman", 9922; İbn Əsakir, 7/19/2.

[159] **Səhihdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 24; əl-Hakim, 1/348, 3/431; əl-Beyhəqi, 3/374; əl-Bəzzar, "Kəşf əl-Əstar", 756; İbn Əsakir, 9/427/2.

[160] **Həsəndir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 25; əl-Hakim, 4/313; ət-Təbərani, "əl-Kəbir", 7701; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 510.

[161] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 41, 219; Əhməd, 5/198; İbn Əsakir, 3/91/1; əi-Beyhəqi, "Şuabul-İman", 9901, 9902; ət-Təbərani, "əl-Əvsat", 634, 3119.

[162] **Hədis mövdudur:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəI-Kəffərat", 43. Deyirəm: Sənədi mövdudur. Sənədlərdə mətruk-müttəhim, siqa olmayan, yalançı ravilər var, hədis tamamilə mövdudur.

adam onu ziyarət etdi və ondan: "Ey Əbu İshaq necəsən?" - soruşdular.

O: "Yaxşıyam, günahı üzündən yaxalanmış bir bədənə Allah-taala istərsə, əzab edər, istərsə də, rəhm edər. Onu sağlamlığa qaytararsa, günahsız qaytarar" - dedi."[163]

Səid bin Vəhəb dedi: "Biz Salman əl-Farsi ilə birlikdə Kində qəbiləsindən bir nəfəri ziyarətə getdik. Salman dedi: "Bir müsəlman bəla ilə imtahan edilirsə, bəla onun keçmiş günahlarına kəffarə olur, geri qalan günləri üçün də ibrət olur. Bir kafir bəla ilə imtahan edildikdə, onun halı dəvənin halına bənzəyir. Açılıb buraxıldığı zaman nə üçün buraxıldığını, bağlandığı zaman nə üçün bağlandığını bilməz."[164]

Əbu Əyyub əl-Ənsari belə deyir: "Allahın elçisi ənsardan bir adamı ziyarət etdi və əyilib onun necəliyini soruşdu. O da: "Ey Allahın elçisi, yeddi gündür ki, yatmıram"- dedi."

Buna cavab olaraq Allahın elçisi buyurdu: "Ey qardaşım, səbir et. Girdiyin günahlardan çıxarsan "- buyurdu. Sonra Allahın elçisi: "Xəstəlik saatları günah saatlarını aparır"- dedi. "[165]

Əbu Hureyrə belə deyir: "Allahın elçisi bir bədəvidən: "Səni heç "ummu mildəm" xəstəliyi tutdumu?" - deyə soruşdu.

O: "Ey Allahın rəsulu, "ummu mildəm" nədir?"- dedi.

Allahın elçisi: "Dəri ilə qan arasında istilik verən xəstəlikdir"- dedi.

Bədəvi: "Mən buna heç tutulmadım " - dedi.

Allahın elçisi: "Ey bədəvi, səni heç baş ağrısı tutdumu?" - buyurdu.

Bədəvi: "Ya Allahın elçisi, baş ağrısı nədir?" - dedi.

Allahın elçisi: "Bir damar adamın başına vurur"- buyurdu.

Bədəvi: "Mən buna tutulmadım " - dedi.

Allahın elçisi: "Kim Cəhənnəm əhlindən birini görmək istəyirsə, buna baxsın " - buyurdu. "[166]

Ummu Süleym belə deyir: "Mən xəstələndim. Allahın elçisi məni ziyarətə gəldi və: "Ey Ummu Süleym! Odu, dəmiri və dəmirin

---

[163] İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 44; əl-Beyhəqi, "Şuabul-İman", 9823, Deyirəm: **sənədi zəifdir.**

[164] əl-Buxari, "əl-Ədəbul-Mufrəd", 493; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 45; İbn Əbi Şeybə, 3/231; Əbu Nəim, "əl-Hilyə", 1/206. Deyirəm: **sənədi səhihdir.**

[165] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 34; əl-Beyhəqi, "Şuabul-İman", 9823, Deyirəm: sənədindəki ravi **çox zəifdir.**

[166] **Səhihdir:** əl-Buxari, "əl-Ədəbul-Mufrəd", 495; Əhməd, 2/332; İbn Hibban, 2916; əl-Hakim, 1/347; əl-Bəzzar, 778; Təhqiqatçı həsən və zəif sənədlərin olduğunu, nəhayət ümumən səhih olduğunu demişdir.

pasını bilirsənmi?" — soruşdu.

Mən: Bəli - dedim.

Allahın elçisi: "Müjdə olsun sənə ey Ummu Suleym! Sən ağrılarından oda salınan dəmirin pasından qurtulduğu kimi qurtulursan" - buyurdu."[167]

Əshabələrdən biri qardaşlarından birini ziyarət etmək üçün yola çıxdı. Yolda onun xəstə olduğunu eşitdi. Yanına girdiyində: "Mən sənə həm sağlam bir insan ziyarətçisi, həm xəstə ziyarətçisi, həm də müjdəçi olaraq gəldim"- dedi.

O da: "Bu üç şeyi necə birləşdirdin?" - deyə soruşdu.

Səhabi: "Mən səni ziyarət elmək üçün yola çıxanda xəstə olduğunu bilmirdim. Buna görə sağlam adamın ziyarətçisiyəm. Yolda xəstə olduğunu eşitdim, buna görə də xəstə ziyarətçisiyəm. Allahın elçisindən eşitdiyim bir şeyi sənə müjdə edəcəyimə görə isə müjdəçi oldum" - dedi.

"Eşitdim ki, Allahın elçisi belə buyurur: "Qul əməli ilə Allah dərgahında bir dərəcəyə nail olmadığı zaman Allah onun bədəninə və ya malına və ya övladına bir bəla verməklə onu imtahan edər və sonra çatmadığı o dərəcəyə varana qədər bu bəlaya səbir etdirər. "[168] "

Həsən əl-Bəsri xəstəlikdən bəhs edərək belə dedi: "Diqqət edin, xəstəlik günləri müsəlman üçün pis günlər deyildir. O günlər müsəlmanın yolunu işıqlandırır. Axirətdən unutduğunu xatırladır, xatalarını örtür."[169]

Sələfi salihdən bəziləri belə dedi: "Dünyada müsibətlər olmasaydı, biz axirətə müflis olaraq girərdik."[170]

Ənəs bin Malikdən rəvayət edildiyinə görə Allahın elçisi Allahın istəyi ilə yarpaqların tökülməsinə diqqət etdikdən sonra demişdir: "Müsibətlər və xəstəliklər ümmətimin günahlarını bu ağacın yarpaqlarının tökülməsindən daha tez tökərlər."[171]

Əbu Hureyrədən mərfu olaraq rəvayət edilən bir hədisdə: "Hər

---

167 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 33; əl-Xatib əl-Bağdadi, "Tarix Bağdad",3/410, 411.

168 **Həsəndir:** əl-Buxari. "ət-Tarix əl-Kəbir". 1/73; Əbu Davud, 3090; Əhməd. 5/272; Əbu Yəla, 923; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 39; İbn Səid, "ət-Təbaqatul-Kubra", 7/477; ət-Tabərani, "əl-Kəbir", 22/318; "əl-Əvsat", 1153; əl-Beyhəqi, 3/374. Təhqiqatçı zəif sənədlərin olduğunu, nəhayət ümumən həsən olduğunu demişdir. Bax: orijinala səh. 146.

169 İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 55, 154; əl-Beyhəqi, "Şuabul-İman", 7/201/9991. Təhqiqatçı həsən və zəif sənədlərin olduğunu demişdir.

170 əl-Beyhəqi, “Şuabul-İman", 7/201/9991.

171 İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 57; əl-Beyhəqi, "Şuabul-İman", 9864. Təhqiqatçı çox zəif sənədin olduğunu demişdir.

hansı bir müsəlman (xəstə olduğu vaxt) mütləq Allah-taala ona mələklərdən ikisini vəkil edər. Allah-taala o müsəlman haqqında iki gözəl əmrindən birini, yəni ya ölməsini və ya sağalmasını hökm edənə qədər o iki mələk ondan ayrılmazlar.

Ziyarətçilər gəlib ondan: "Necəsən?" - soruşduqda: "Əl-Həmdulilləh yaxşıyam, həmd Allaha məxsusdur" - desə, mələklər ona: "Qanından daha yaxşı qan ilə səhhətindən daha yaxşı bir səhhətlə sənə müjdə olsun "- deyərlər. Əgər: "Şiddətli bəla çəkməkdəyəm " - deyərsə, mələklər ona: "Qanından daha pis bir qan ilə bəlandan daha uzun bir bəla ilə sənə müjdə olsun " - deyərlər. "[172]

Bu müsəlmanın "şiddətli bəla çəkməkdəyəm" deməsi, Allahın elçisinin xəstəliyində: "Vay başım»- deməsinə,[173] Sadın: "Ey Allahın elçisi! Xəstəliyim şiddətləndi, mən varlıyam"- deməsinə[174], Aişənin: "Vay başım"- deməsinə[175] zidd deyildir. Çünki onların belə demələri xəstəliklərini xəbər verməlari olub, Allah-taalaya, gələn ziyarətçilərə şikayət etmələri deyildir.

Xəstə Allaha həmd etdikdən sonra xəstəliyini söylərsə, bu şikayət deyildir. Əgər xəstəliyə əsəbləşərək xəbər verirsə, bu şikayətdir. Bu halda niyyət və məqsədə görə bir kəlmə ilə bəzən savab, bəzən də günah qazanır.

Sabit Bənnani dedi ki: "Həsən əl-Bəsri ilə Saffan bin Muhrəzin ziyarətinə getdik. Oğlu çıxıb atasının dizenteriya xəstəliyinə tutulduğunu və yanına girməməyimizi söylədi. Həsən əl-Bəsri: "Bu gün atanın ətinin, qanının alınması, onları torpağın yeməsindən daha xeyirlidir."[176]

Yenə Sabit bin Bənnani dedi ki: "Biz Rəbia bin əl-Harisi ziyarət etmək üçün yanına getdik. Xəstəliyi ağır idi. O: "Mənim bu halımda olanın qəlbini axirət doldurur, dünya onun gözündə milçəkdən də kiçik olur"- dedi.[177]

Ənəs, Peyğəmbərdən buyurur: "Qul üç gün xəstələnərsə, anadan təzə doğulmuş kimi günahlarından təmizlənər".[178]

Yenə də ondan Peyğəmbərin belə dediyi rəvayət olunur: "Xəstə

---

[172] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 47; əl-Beyhəqi, "Şuabul-İman", 9940. Təhqiqatçı zəif sənədin olduğunu demişdir.
[173] əl-Buxari, 5666.
[174] əl-Buxari, 1295; Müslim, 1628.
[175] əl-Buxari, 5666.
[176] **Səhihdir:** Əhmed, "əz-Zühd", səh. 257; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 50; İbn Səid, "ət-Təbaqatul-Kubra", 7/48. Deyirəm: sənədi səhihdir.
[177] İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 51. Deyirəm: ravi siqadır.
[178] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əI-Mərad vəl-Kəffərat", 61; ət-Tabərani, "əs-Sağir", 1/188, 189. Deyirəm: sənədi çox zəifdir.

sağalana qədər onun duası rədd olunmaz".[179]

İbn Məsud belə deyir: "Mən Allahın elçisi ilə birgə oturmuşdum. Allahın elçisi gülümsündü.

Biz: "Ey Allahın elçisi nəyə gülümsündün?" - dedik.

Allahın elçisi: "Bir möminin xəstəlikdən sızlanmasına təəccüb edirəm. Əgər o mömin xəsləliyin özü üçün nə qədər savab olduğunu bilsəydi, Allaha qovuşana qədər xəstə olmasını arzu edərdi"- dedi və ikinci dəfə gülümsəyərək, mübarək başını səmaya qaldırdı.

Biz: "Ey Allahın elçisi indi nəyə gülümsünərək başını səmaya qaldırdın?"- dedik.

Allahın elçisi: "Təəccüb etdim. İki mələk səmadan enib bir mömini namaz qıldığı yerdə axtarıb tapmadılar. Allah-taalanın hüzuruna gələrək: "Ey Rəbb, filan mömin qulun üçün gecə ilə gündüz arasında bu qədər əməl yazırıq. Sən onu həbs etdiyin (xəstələndirdiyin - tərc.) üçün əməlindən bir şey yazmadıq”- dedilər.

Allah-taala: "Qulum üçün gecə ilə gündüzdə etdiyi əməli yazın, ondan heç bir şey əskik etməyin. Onu həbs etdiyimin (xəstələndirməyimin) mükafatı mənə aiddir. Onun etmiş olduğu əməlin mükafatı da ona aiddir" - dedi. "[180]

İbn Məsud belə deyir: "Allahın elçisi: "Kimsə bir gecə qızdırmalı olaraq səbir etsə və bunun Allahdan gəldiyinə razı olsa, anasından doğulduğu kimi günahlarından çıxmış olur" - buyurdu."[181]

Yəhya Mərasil bin Kəsirdən rəvayət edildiyinə görə Allahın elçisi Salman Farsini görmədi, onu soruşdu. Xəstə olduğu xəbər verildi. Allahın elçisi ziyarət üçün yanına gələrək: "Allah sənin xəstəliyinə şəfa versin, günahını bağışlasın, ölənə qədər dinində və cismində sənə sağlamlıq bəxş etsin. Bu xəstəlikdə sənin üçün üç xislət var.

Birincisi Rəbbindən sənə bir öyüddür, ikincisi keçmiş günahların təmizlənir, üçüncüsü istədiyin duanı et. Çünki xəstənin duası qəbul edilir" - buyurdu. "[182]

Ziyad bin Rəbi deyir ki, Übey bin Kəbə: "Allahın kitabında məni üzən bir ayə vardır"- dedim.

O: Hansıdır? - soruşdu.

---

179 **Çox zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 70; əl-Beyhəqi, "Şuabul-İman", 10029. Deyirəm: senədi çox zəifdir.

180 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 75; əl-Beyhəqi, "Şuabul-İman", 9938; Əbu Nəim, "əl-Hilyə", 4/266, 267; ət-Təbərani, "əl-Əvsat", 1163; əl-Bəzzar, "Kəşf əl-Əstar", 766.

181 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 83, "ər-Rida ən Allah", 75; əl-Beyhəqi, "Şuabul-İman", 9868

182 **Çox zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 31; ət-Təbərani, "əl-Kəbir", 6106.

Mən: "**«...Pislik edən şəxs, onun cəzasını görəcək...»** (ən-Nisa, 123) ayəsidir" - dedim.

Kəb dedi: "Mən səni gördüyümdən daha çox fəqih bilirdim. Çünki bir möminin ayağının büdrəməsi, damar titrəməsi kimi bir müsibətin gəlməsi, ancaq günahına görədir. Allah-taala onun günahlarının bir çoxunu əfv edir."[183]

Aişədən bu ayəni soruşmuşdum, o da: "Mən bunu Allahın elçisindən soruşandan bəri heç kəs məndən soruşmadı" - dedi. Mən Allahın elçisindən bu ayənin mənasını soruşdum. Allahın elçisi: "Ey Aişə! Allah-taala qulunu başına gələn xəstəlik, bəla, tikan batması, ayaqqabısının bağının qırılması, hətta pulunu qabına qoyub onu tapa bilməyərək qorxması və sonra pul qabının tapılması kimi müsibətlərlə cəzalandırır. Çünki mömin günahlarından qırmızı qızılın körükdən çıxdığı kimi təmizlənir" - dedi."[184]

Allah-taala nazil etdiyi kitablardan birində qulunu sevdiyi üçün və onun öz qüsurlarını bilib təvazökarlıqla yalvaracağını, dua edəcəyini görmək üçün "onun xoşuna gəlməyən bir müsibətlə imtahan edərəm" - buyurmuşdur.[185]

Kəb demişdir: "«Tövrat»da Allah-taala: "Mömin qulum üzülməsəydi, kafiri əbədi qırılmayan bir dəmir sarğı ilə sarıyardım" - deyə yazmışdır."[186]

Məruf Kərxi dedi: "Şübhə yox ki, Allah-taala mömin qulunu xəstəliklə, ağrı və acılarla imtahan edər. Mömin öz yoldaşlarına şikayət edər. Allah-taala: "İzzət və Cəlalıma and olsun ki, mən səni bu ağrılar və xəstəliklərlə ancaq sənin günahını yumaq üçün imtahan etdim, ona görə şikayət etmə" - buyurur."

Əbu əd-Dünyanın dediyinə görə bir nəfər: "Ey Allahın elçisi, xəstəlik nədir?"- dedi.

Allahın elçisi: "Sən heç xəstə olmadınmı?"- dedi.

O da: Xeyr - deyə cavab verdi.

Allahın elçisi: "Yanımızdan qalx, sən mömin deyilsən" - buyurdu[187].

---

183 **Səhihdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 100; əl-Beyhəqi, "Şuabul-İman", 9814; İbn Cərir, "Təfsir", 5/187.

184 **Zəifdir:** ət-Tirmizi, 2991; Əhməd, 2/218; İbn Cərir, "Təfsir", 5/189; ət-Təyalisi, "Müsnəd", 1584; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 10!; əl-Beyhəqi, "Şuabul-İman", 9809.

185 İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 94; Əbu Nəim, "Hilyətul-Övliya", 4/180; əl-Beyhəqi, "Şuabul-İman", 9787. Deyİrəm: sənədi səhihdir.

186 İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 103; Əbu Nəim, 5/381. Deyirəm: sənədi səhihdir, ravilər siqadır.

187 **Zəifdir:** Əbu Davud, 3089; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 1440; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 196; əl-Beyhəqi, ''Şuabul-İman", 9916.

Abdullah bin Məsudun xəstəliyi şiddətlənəndə ziyarətə gələn yoldaşları yanına girdi.

Xanımı: "Canım sənə fəda olsun. Səni nə yedirə bilirik, nə də içirdə bilirik"- dedi. Bundan sonra o zəif səslə: "Sümüklərim çürüdü, yatmağım uzandı. Vallahi! Haqq taalanın savabımı dırnaq ucu qədər azaltmasını istəmirəm" - deyə cavab verdi.[188]

Xalid bin Valid zövcəsini boşadı. Ondan soruşdular: "Ey Əbu Süleyman! Niyə görə onu boşadın?!"

O da: "Ondan şübhələndiyim və ya xoşuma gəlmədiyi üçün boşamadım. Fəqət mənim yanımda heç bir bəlaya uğramadı, həmişə rahat idi" - dedi.[189]

Bir hədisdə: "Bir möminin təzyiqi yüksələr və ya düşərsə mütləq Allah-taala onun üçün bir yaxşılıq yazar, bir günahını əfv edər, bir dərəcə yüksəldər " - deyilir.[190]

Bu hədis müsibətlərin ancaq günahları örtəcəyinə dair olan hədisə zidd deyildir. Çünki yaxşılığın yazılması müsibətlərə səbir etməyə görədir. Səbir də qulun əməlidir.

Səhabələrdən biri, bir xəstəni ziyarət etdi və ona: "Xəstə üçün dörd şey vardır ki, ondan qələm qaldırılır, sağlam olarkən etdiyi əməlinin mükafatının misli onun üçün yazılır. Xəstəlik onun oynaq yerlərindəki pislikləri çıxarır. Yaşasa əfv edilmiş olaraq yaşayar, ölərsə bağışlanaraq ölür"- dedi. Sonra xəstə: "Allahım, mən xəstə olaraq yatmağa davam edim" - dedi.[191]

Əbu Yəhya Suheyb bin Sinin belə deyir: "Allahın elçisi demişdir: "Möminin işinə təəccüb edirəm. Çünki işinin hamısı onun üçün xeyirlidir. Bu məziyyət yalnız mömінə məxsusdur. Çünki sevinərsə şükür edər, bu onun üçün xeyirlidir, başına bir bəla gəlirsə səbir edər, bu da onun üçün xeyirlidir - buyurmuşdur."[192]

---

[188] İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 197; "ər-Rida ən Allah", 78; İbn Mübarək, "əz-Zühd", 463; İbn Səid, "ət-Təbaqatul-Kubra", 6/160; Əhməd, "əz-Zühd", səh. 359.

[189] **Həsəndir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 203; İbn Kəsir, "əl-Bidayə vən-Nihayə",7/115.

[190] **Zəifdir:** ət-Tabərani, "əl-Əvsat", 1157; əl-Hakim, 1/347; İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 207; əl-Beyhəqi, "Şuabul-İman", 9860.

[191] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 209. Deyirəm: sənədində cahillər var.

[192] Müslim, 2499; Əhməd, "əl-Müsnəd"; 5/26; ət-Təyalisi, 211.

# ON YEDDİNCİ BÖLMƏ

## Səbrin fəziləti haqqında əshabın sözləri

İmam Əhməd Vəki'idən, o da Malik bin Miğvəldən, o da Əbu əs-Səfərdən nəql etdi: "Əbu Bəkr xəstələndi. Ziyarətə gələnlər ona: "Sənə həkim çağıraqmı?"- dedilər. O da: "Məni həkim gördü"- dedi. Onlar: "Bəs nə söylədi?"- dedilər. O: "İstədiyini et"- dedi."[193]

İmam Əhməd dedi: "Ömər bin Xəttab demişdir: "Biz yaşayışımızın ən xeyirlisini səbirlə tapdıq.[194]

O, həmçinin demişdir: "Səbirlə ən üstün yaşayışa çatdıq. Əgər səbrin bir adam olduğu fərz edilərsə, o ən yaxşı adam olardı."[195]

Əli bin Əbu Talib demişdir: "Diqqət edin, imana nisbətdə səbir, bədənə nisbətdə baş kimidir. Baş kəsiləndə cəsəd ölür". Sonra səsini yüksəldib: "Diqqət edin, səbri olmayanın imanı yoxdur."[196]

Sonra dedi: "Səbir büdrəməyən bir minikdir."[197]

Həsən əl-Bəsri: "Səbir xeyir xəzinələrindən bir xəzinə olub Allah-taala onu öz dərgahında ən yaxşı olan quluna verir" - demişdir.[198]

Ömər bin Abdul-Əziz: "Allah-taala quluna bir nemət verib, onu ondan alıb yerinə səbri verirsə, mütləq aldığı nemətdən daha xeyirlisini verir" - demişdir.[199]

Meymun bin Mihran: "Bir insan böyük ya kiçik bütün yaxşılıqları, ancaq səbri sayəsində əldə edir" - demişdir.[200]

Süleyman bin Qasım: "Hər əməlin savabı ancaq səbirlə bilinir. Məsələn, Allah-taala: **«...Yalnız səbir edənlərə saysız-hesabsız mükafat veriləcəkdir!»** (əz-Zumər, 10) - demişdir.[201]

Ariflərdən birinin cibində bir kağız parçası vardı, hər zaman

---

193 Əhməd, "əz-Zühd" səh. 140; Əbu Nəim, "Hilyətul-Övliya", 1/34.

194 Əhməd, "əz-Zühd", səh. 146; Əbu Nəim, "Hilyəlul-Övliya", 1/50; İbn Mübarək, "Zəvaid əz-Zühd", 630; İbn Əbi əd-Dünya, "əs-Sabr", 47; İbn Həcər, "Fəth əl-Bari", 11/303. Deyirəm: əsərin Ömərə aid olmasına şəkk yoxdur.

195 İbn Əbi əd-Dünya, "əs-Sabr", 6. Deyirəm: **sənədi zəifdir.**

196 İbn Əbi əd-Dünya, "əs-Sabr", 8. Araşdırmaların sonunda təhqiqatçı deyir:

197 "Ər-risalətul-quşəyriyyə", səh. 185.

198 İbn Əbi əd-Dünya, "əs-Sabr", 16.

199 İbn Əbi əd-Dünya, "əs-Sabr", 22; əl-Beyhəqi, "Şuabul-İman", 7/212/10038.

200 İbn Əbi əd-Dünya, "əs-Sabr", 19; Əbu Nəim, "Hilyətul-Övliya", 4/90

201 İbn Əbi əd-Dünya, "əs-Sabr", 116.

ona baxardı. Orada: **«Sən Öz Rəbbinin hökmünə səbir et! Şübhəsiz ki, sən Bizim gözümüzün qabağındasan...»** (ət-Tur, 48) ayəsi yazılmışdı.[202]

Ömər bin Xəttab: "Səbir ilə şükür iki dəvə olsaydılar, hansına mindiyimin fərqinə varmazdım" - demişdir.[203]

Məhəmməd bin Şubrumə: "Başına bir bəla gələndə bil ki, "yaz buludu kimi o dəqiqə açılar"- deyirdi.[204]

Süfyan bin Uyeynə: **«**(Çətinliklərə) **səbir etdikləri və ayələrimizə ürəkdən inandıqları üçün biz onlardan** (İsrail oğullarından) **əmrimizlə (**insanlara) **haqq yolu göstərən rəhbərlər təyin etmişdik»** (əs-Səcdə, 24) ayəsini belə təfsir etmişdir: "Onlar hər işin əvvəli olan səbrə sarıldıqları üçün Biz də onları rəhbərlər etdik."[205]

Əhnəf bin Qeysdən: "Həlimlik nədir?"- soruşulduqda, o: "Xoşa gəlməyən bir şeyə səbir etməkdir"- demişdir.[206]

Vəhb demişdir: "Hikmət" adlı əsərdə yazılmışdır ki, qəzəbin sonu yorulmaqdır, həlimliyin sonu rahatlıqdır, səbrin sonu zəfərdir."[207]

Urva bin Zubeyr yanında çox yaraşıqlı və ən gözəl üzlü oğlu Məhəmmədlə Valid bin Abdul-Məlikin yanına gəlmişdi. Valid: "Qüreyş gəncləri belə olurlar"- dedi və onlara nəzəri dəydi. Bundan sonra Məhəmməd bir gecə heç yatmadı və çıxıb heyvanların axuruna düşdü və heyvanlar onu öldürüncəyə qədər ayaqladılar. Daha sonra atası Urvanın ayağına bir yara çıxdı. Valid ona həkimlər göndərdi. Həkimlər müayinədən sonra: "Əgər ayağın kəsilməzsə, bütün bədəninə yayılar və ölərsən» - dedilər. Urva ayağının kəsilməsinə razı oldu. Həkimlər alətlə ayağını kəsməyə başlayıb sümüyə çatanda onun başı yastığa düşdü və bir saat huşsuz qaldıqdan sonra ayıldı. Üzündən tər axırdı, o isə təhlil və təkbir[208] edirdi. Kəsilən ayağını əlinə alıb sağa-sola çevirdikdən sonra: "Məni səninlə daşıtdıran Allaha and edirəm ki, səninlə heç bir harama, heç bir günaha, Allahın razı olmadığı heç bir yerə getmədim"- dedi. Sonra bu ayağının yuyulub, ətirlənib, kəfənlənib, müsəlman qəbiristanlığında dəfn edilməsini xahiş etdi.

Urva Mədinəyə gələndə dostları təziyə və başsağlığı üçün onun

---

[202] "Ər-risalətul-quşəyriyyə", səh. 186, 187.
[203] İbn Əbi əd-Dünya, "əs-Sabr", 7. Deyirəm: **sənədi zəifdir.**
[204] "Ər-risalətuİ-quşəyriyyə", səh. 187.
[205] "Ər-risalətul-quşəyriyyə", səh. 188.
[206] İbn Əbi əd-Dünya, "əl-Hilm", 73.
[207] İbn Əbi əd-Dünya, "əl-Hilm", 72.
[208] Təhlil- əlhəmdulilləh, təkbir- Allahu əkbər.

yanına gəldilər. O isə: "Bu yolçuluğumuz bir az yordu bizi" - deyib başqa bir şey söyləmədi. Sonra da: "Daha Mədinədə qala bilmərəm, çünki mən burada müsibətə gülənlərin və nemətə həsəd edənlərin arasındayam"- deyib, Aqiq adlanan yerdəki fermasına getdi. Daim orada qaldı. Fermaya qayıdanda ona İsa bin Təlha: "Sənə irad tutan nə pisdir! Zəhmət olmazsa, sənə gələn müsibətin yerini mənə göstər"- dedi. O da dizinə qədər açıb göstərdi. İsa ona dedi: "Vallahi, biz səni güləşçi kimi böyütməmişik. Allah-taala ağlın, dilin, gözün, əllərin və iki ayağından biri kimi vücudunun çoxunu sənə saxlamışdır, daha nə istəyirsən"- dedi. Urva: "Ey İsa! Sənin kimi heç kim mənə belə ürək-dirək vermədi"- dedi.

Həkimlər onun ayağını kəsərkən ondan: "Ağrını hiss etməyəsən deyə sənə bir şey içirəkmi?» - soruşmuşlar. O da: "Allah-taala, Onun əmrinə qarşı çıxacağımı, səbrimi görmək üçün məni imtahan edir" - demiş və onları qəbul etməmişdir. Dəstəmaz alarkən o ayağını məsh edirdi."[209]

Qatadə deyir ki, bir nəfər Loğman peyğəmbərdən soruşmuşdur: "Hansı şey daha xeyirlidir?" O: "Ardınca sıxıntı gəlməyən səbir"- demişdir. O adam: "İnsanların ən xeyirlisi kimdir?"- soruşduqda, o: "Özünə verilənə qane olan kəs"- demişdir. O adam: "İnsanların ən alimi kimdir?"- soruşduqda, o: "İnsanların elmini öz elminə qatan kəs"- dedi. "Mal xəzinəsi, yoxsa elm xəzinəsi daha xeyirlidir? -soruşulduqda", o: "Subhanallah! Yanında xeyir istənildikdə mövcud olan, olmadıqda isə özünü pisliklərdən qoruyan mömin alimdir. Möminə özünü çəkindirməsi kifayətdir."[210]

Hibban bin Əbu Cəbələ: "Dərdini yayan kəs səbir etməmiş olur"- demişdir. İbn Əbi əd-Dünya bunu mərfu hədis kimi rəvayət etmişdir.[211] Doğru mənası isə "dərdindən insanlara şikayət edən səbir etməmiş olur, Allaha şikayət edərsə, səbrinə xələl gəlməz"- deməkdir.

Yenə Hibban bin Əbu Cəbələ **«...gözəl səbir...»** (Yusif, 18) ayəsini belə təfsir etmişdir: "Şikayətsiz səbirdir". Bunu İbn Əbi Dünya mərfu hədis kimi rəvayət etmişdir.[212]

Mücahid **«...gözəl səbir...»** ayəsi haqqında: "Sızlanma olmayan

---

209 İbn Əbi əd-Dünya, "əl-Mərad vəl-Kəffərat", 139, 141; "əs-Sabr", 154; Əbu Nəim, "Hilyətul-Övliya", 2/178; "əl-Mərufat vat-Tarix", 1/552, 553; əz-Zəhəbi, "Sira Aləm əl-Nubəla", 4/430, 431.

210 Əhməd, "əz-Zühd", 1/154; İbn Əbi əd-Dünya, "əs-Sabr", 154.

211 **Zəifdir:** əl-Beyhəqi, "Şuabul-İman", 10047; Abdurrəzzaq, "Təfsir", 1/2/327-328; İbn Cərir, "Təfsir", 13/32.

212 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əs-Sabr", 110; İbn Cərir ət-Təbəri, "Təfsir", 12/99.

səbirdir”- demişdir.[213]

Amir bin Qasim **«...gözəl səbir...»** (Yusif, 18 və 83) ayələri haqqında: "Müsibətə razı olub təslim olmaqdır"- demişdir.[214]

Sələfdən bəziləri **«...gözəl səbir...»** (Yusif, 18 və 83) ayələri haqqında: "Ondan şikayətlənməməkdir"- demişlər.[215]

Qatadə **«...Dərd-qəmdən gözlərinə ağ gəldi. O,** (bütün dərdini) **içində çəkirdi»** (Yusif, 84) ayəsi haqqında: "Üzüntüsünü udur və xeyirdən başqa heçnə söyləmir”- demişdir.[216]

Yəhya bin Muxtar Həsən əl-Bəsridən rəvayət etdiyinə görə Həsən əl-Bəsri bu ayədəki "kəzim": "Çox səbir edəndir" - demişdir.[217] Qatadə isə "kəzim": "Üzüntüsünü gizlədəndir" - demişdir.

Həsən əl-Bəsri: "Allah dərgahında iki udumdan daha sevimli bir şey yoxdur. Birincisi kədərli və üzücü bir müsibətin qəmini və kədərini udub onu gözəl tərzdə dəf etməkdir. İkincisi hirsini boğub onu həlimliklə dəf etməkdir" - demişdir.

Səid bin Cubeyr: "Səbir – qulun başına gələn müsibətin Allahdan olduğunu etiraf etməsi və onun savabını yalnız Allahdan ummasıdır. Bir kəs şiddətə səbir edərkən bəzən sızlanır, amma onda səbirdən başqa bir şey görünməz” - demişdir.[218]

O, həmçinin: "Qulun başına gələn müsibətin Allahdan olduğunu etiraf etməsi" ifadəsi sanki: **«Biz Allahınıq...»** (əl-Bəqərə, 156) ayəsinin təfsiridir. Belə ki, qul özünün Allahın mülkü olduğunu, sahibi də onu istədiyi kimi sərf edəcəyini etiraf etməsidir. "Və onun savabını yalnız Allahdan ummasıdır" ifadəsi də sanki: **«...Ona tərəf qayıdacağıq!»** (əl-Bəqərə, 156) ayəsinin təfsiridir. Belə ki, Allah-taala bizi səbrimizə görə mükafatlandırır, müsibətin savabını itirmir. "Bir kəs şiddətə səbir edərkən bəzən sızlanır"- ifadəsi, yəni səbir dözümlük, möhkəmlik deyildir, səbir qəlbi qəzavü-qədərə qəzəblənməkdən, dili isə şikayətdən saxlamaqdır. Kimin qəlbi qəzavü-qədərə qəzəbli halda dözüm göstərərsə, səbir edən sayılmaz.

Yunus bin Yezid demişdir: "Rəbiə bin Əbu Abdurrəhmandan səbrin sonunun nə olmasını soruşduqda, o dedi: "Müsibət baş verəndəki halı müsibətdən əvvəlki halı ilə eyni olsun".

Qeys bin əl-Həccac Allah-taalanın: **«Gözəl səbir etmək»** (əl-Məaric, 5) ayəsi haqqında demişdir: "Müsibətə düçar olan camaat

---

[213] Abdurrəzzaq, "Təfsir", 1/2/318; İbn Cərir ət-Təbəri, "Təfsir", 2/99.
[214] İbn Əbi əd-Dünya, "əs-Sabr", 116.
[215] əs-Suyuti, "əd-Dərul-Mənsur", 4/514; İbn Əbi Hatimə görə həsəndir.
[216] Abdurrəzzaq, "Təfsir", 1/2/327; İbn Cərir ət-Təbəri, “Təfsir", 13/27; əs-Suyuti, "əd-Dərul-Mənsur", 4/568.
[217] İbn Əbi əd-Dünya, "əs-Sabr", 116; İbn Cərir ət-Təbəri, "Təfsir", 13/27.
[218] Abdullah bin Mübarək, "əz-Zühd", 111; İbn Əbi əd-Dünya, "əs-Sabr", 116.

arasında tanınmamalıdır".

Şəmmar müsibətə düçar olana təziyə verərkən demişdir: "Rəbbinin hökmünə səbir et".

Əbu Əqil demişdir: "Vaqid bin Abdullah bin Ömərin ölümündə Səlim bin Abdullah bin Öməri əlində qamçı gördüm. Yas mərasimində səslə ağı deyən qadını vurardı".

Abdullah bin Məhəmməd bin İsmail ət-Təmimi demişdir: "Allaha haqqı ilə səbir edənə Allahın Öz haqqı vacibdir. Sənin düçar olduğun müsibəti daha faciəli başqa müsibətlə birləşdirməkdən çəkin. Çünki o sənə düçar olduğun iki müsibətin ən böyüyü və uğradığın iki bədbəxtliyin ən xoşa gəlməzidir, vəssalam".

İbn Əbi əs-Səmmak təziyədə olduğu bir nəfərə: "Səbrə sarıl, əcrini yalnız Allahdan umanlar səbir edib sızlanmaqdan Allaha sığınırlar"- demişdir.

Ömər bin Abdul-Əziz demişdir: "Müqəddərata razı olmaq qiymətli bir məqamdır. Fəqət Allah-taala səbri gözəl bir sığınacaq etmişdir". Ömər bin Abdul-Əzizin oğlu Abdul-Məlik öləndə onun cənazə namazını qıldıqdan sonra: "Allah sənə rəhmət etsin. Sən mənim dəstəyimdin və yardımçımdın"- dedi. Adamlar ağlayırdı, amma onun gözündən bir damla yaş düşmürdü.

Mitraf bin Abdullahın oğlu öləndə təziyəyə gələnləri gülər üzlə qarşıladıqdan sonra: "Müsibət qarşısında sarsılmağa görə Allahdan utanıram"- demişdir.

Ömər bin Dinar demişdir: "Ubeyd bin Umeyr demişdir ki: "Sızlanmaq, göz yaşı tökmək, qəlbin hüznlü olması deyil, fəqət əsil sızlanmaq pis söz söyləmək və ya pis zənn etməkdir".

İbn Əbi əd-Dünyanın bildirdiyinə görə Həsən bin Abdul-Əziz əl-Cərəvi demişdir: "Mənim çox sevdiyim bir oğlum öldü. Anasına: "Allahdan qorx və savabını, yalnız Allahdan umaraq səbir et"- dedim. O da: "Belə böyük müsibətin savabını sızlanmaqla itirəcək qədər düşüncəsiz deyiləm" - dedi".

Yenə İbn Əbi əd-Dünyanın rəvayət etdiyinə görə Qureyşdən olan yaşlı biri belə demişdir: "Bəsrə qazisi və əmiri olan Ubeydullahın atası Həsən bin Hüseyn öləndə təziyəyə gələnlər söhbət etdikləri evdə aralarında: "Bir insanın sızlandığı və ya səbir etdiyi necə bilinir?" - deyə mübahisə etdilər və sonda: "Başına müsibət gələn biri, müsibət gəlmədən öncə etdiyi hər hansı bir şeyi tərk edirsə, sızlanmış olur" - deyə razılığa gəldilər".

Xalid bin Əbu Osman əl-Qurəşi demişdir: "Ölən oğlum üçün təziyəyə gələn Səid bin Cubeyr məni başım örtülü təvaf edərkən gördü. Başımdan örtüyü alıb: "Miskinlik sızlanmaqdandır" - dedi".

## Fəsil

Fiqh alimlərindən bir çoxlarının rəyinə görə müsibətə uğrayan birinin tanınması üçün başını örtməsi qorxulu deyil, çünki təziyə etmək sünnətdir, başın örtülməsində tanınıb təziyə edilməsi üçün asanlıq vardır deməsi düşündürücüdür. Fəqihlərin bu sözlərini İbn Teymiyyə qəbul etməmişdir. Şübhə yoxdur ki, sələf-salehdən heç biri belə etməyib. Belə bir şey əshabə və təbiunun heç birindən nəql olunmamışdır. Bütün əsərlər bu sözləri açıq olaraq rədd edir.

İshaq bin Raheveyh bunu inkar edərək demişdir: "Başına müsibət gələn birinin hər zaman geydiyi bir şeyi tərk etməsi sızlanmaqdandır".

Nəticə olaraq deyilir ki, sələf-saleh başlarına müsibət gələndə müsibətdən əvvəlki qiyafələrində hər hansı bir şeyi dəyişdirmədikləri kimi, etdikləri işləri də buraxmazdılar. Çünki müsibətdən əvvəlki hər hansı bir şeyi buraxmaq səbrə ziddir. Allah hər şeyi daha yaxşı bilir.

# ON SƏKKİZİNCİ BÖLMƏ

## Müsibətlər qarşısında ağlamaq, fəryad etmək, paltarı cırmaq, cahiliyyə sözlərini demək

**Meyit üzərində ağlamaq.** Əhməd bin Hənbəl və Əbu Hənifənin məzhəbinə görə həm öldükdən əvvəl, həm də sonra caizdir. Bunu Əbu İshaq əş-Şirazi seçmişdir. İmam əş-Şafii və ardıcıllarından bir çoxu ölümdən sonra ağlamağı məkruh bilib, ruhun çıxmasından öncə isə ağlamağa izin vermişlər. Bunların dəlilləri aşağıdakı hədisdir:

Cabir bin Atikdən: "Allahın elçisi Abdullah bin Sabiti ziyarət etməyə gələndə, o ölüm ayağında idi. Peyğəmbər onu çağırdı, amma cavab vermədi. Sonra da: "Ey Əbu ər-Rəbi! İlahi qədər olan ölümün qarşısında boyun əydik"- buyurdu. Qadınlar uca səslə ağlamağa başladılar. Cabir bin Atiq onları susdurmağa çalışdı. Allahın elçisi: "İşin olmasın. Qoy vücub vaqe olanda kimsə ağlamasın"- buyurdu. Oradakılar: "Ey Allahn elçisi vücub nədir?"- soruşdular, Allahın elçisi: "Ölümdür" - dedi."[219]

İbn Ömərdən rəvayət edildiyinə görə Allahın elçisi buyurmuşdur: "Həqiqətən ölü, ailəsinin ona ağlamasına görə əzab çəkir."[220]

İmam əş-Şafii ilə ardıcılları: "Bu əzab ancaq ölümdən sonra olur, çünki ölməyən kəsə meyit deyilməz" - demişlər.

İbn Ömər deyir: "Allahın elçisi Uhud döyüşündən qayıdanda Bəni Abdul-Əhşəl qadınlarının ölüləri üçün ağladıqlarını eşitdi və: "Lakin Həmzənin isə ağlayanları yoxdur" - dedi. Ənsar qadınlar Allah elçisinə yaxınlaşaraq Həmzə üçün ağlamağa başladılar. Allahın elçisi ayılaraq: "Rəhmət olsun onlara ki, buraya gəlib bu vaxta qədər ağladılar. Deyin onlara getsinlər və bu gündən sonra ölüyə ağlamasınlar"- buyurdu."[221]

Bu hədis ağlamanın mübah olduğunu bildirən əvvəlki hədisi hökmdən salmışdır.

---

219 **Səhihdir:** Malik, 1/33/36; Əbu Davud, 3111; ən-Nəsai, 4/13; Əhməd, 5/446; əl-Hakim, 1/351-352; əl-Beyhəqi, 4/69-70; ət-Təbərani, "əl-Kəbir", 1779; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 1532; İbn Hibban, 3189-3190.

220 əl-Buxari, 1286; Müslim, 928.

221 **Səhihdir:** İbn Macə, 1591; Əhməd, 2/40, 84, 96; İbn Səid, "ət-Tabaqatul-Kubra", 3/17; Əbu Yəla, 3576, 3610; əl-Hakim, 3/195.

Ölümdən əvvəl və ölümdən sonra ağlamanın arasındakı fərqə gəlincə, ölməmişdən əvvəl xəstənin yaxşı olmasına ümid olduğuna görə ona ağlamaq onun üçün üzülmək deməkdir. Xəstə öldükdə yaxşılaşma ümidi qalmadığına görə hökm kəskinləşir. Buna görə də ağlamaq artıq fayda verməz.

Bir kimsə üçün ölməzdən əvvəl və ölümündən sonra ağlamağa icazə verənlərin dəlili budur:

Cabir bin Abdullah belə demişdir: "Uhud günü atam şəhid oldu. Mən ağlamağa başladım, Camaat mənə mane olmağa çalışırdı. Allahın elçisi isə bir şey demirdi. Xalam Fatimə də ağlamağa başladı. Sonra Allahın elçisi (xalama şəhidin yüksək mərtəbəsini təziyə ilə bildirərək): "Ey Fatimə! Ona ağlasanız da, ağlamasanız da siz şəhidi qaldırana qədər mələklər qanadlarıyla onu kölgələndirib duracaqlar"- buyurdu."[222]

əl-Buxari və Müslimin rəvayətlərinə görə, İbn Ömər belə demişdir: "Sad bin İbadə özündə olan bir xəstəliyi ucbatından səhhətinə görə şikayət edirdi. Allahın elçisi Abdur-Rəhman bin Afv, Sad bin Əbu Vəqqas və Abdullah bin Məsud ilə birgə Sadı ziyarətə getmişdilər. Sadın yanına girdikdə ailəsi tərəfindən əhatəyə alındığını gördükdə Allahın elçisi: "Yoxsa öldümü?"- deyə soruşduqda: "Xeyr, ey Allahın elçisi, ölməyib"- deyə cavab verdilər. Allahın elçisi mütəssir olub ağlamağa başladı. Onun ağladığını görən ətrafdakılar da ağlamağa başladılar. O: "Eşitməmisiz ki, Allah gozyaşı ilə qəlb üzüntüsünə görə insana əzab etməz"- və əliylə dilinə işarə edib: "Əsas bunun üzündən ya əzab edər və ya rəhm edər"- dedi. "[223]

Müslim və əl-Buxari Usamə bin Zeydin belə dediyini rəvayət etmişlər: "Allah elçisinin qızının uşağı ölüm ayağında idi. Yanlarına getdi. Uşağı ona verdilər. Uşaq can verirdi. Sanki canı əski tuluq içində idi. Allahın elçisinin gözlərindən yaş axdı. Sad ona: "Nə oldu, ey Allahın elçisi" - dedi. Allahın elçisi: "Bu Allah-taalanın qullarının qəlbinə qoyduğu rəhmətdir, O ancaq mərhəmətli qullarına rəhm edər"- dedi."[224]

İmam Əhmədin "Müsnəd" əsərində rəvayət olunduğuna görə İbn Abbas demişdir: "Allahın elçisinin qızı Ruqiyyə vəfat edəndə qadınlar ağladılar. Ömər onları susdurmağa çalışdı. Allahın elçisi dedi: "Ey Ömər qoy ağlasınlar, (qadınlara) siz də şeytanın anqırtısından çəkinin. Əgər ağlamaq gözdən və qəlbdən gəlirsə, Allahdandır və rəhmətdəndir. Əgər dildən, əldən gəlirsə, (yəni dil

[222] əl-Buxari, 1244; Müslim, 2471, 130.
[223] əl-Buxari, 1304; Müslim, 924.
[224] əl-Buxari, 5655; Müslim, 923.

bağırır, əl də yaxa cırırsa) bu da şeytandandır".[225]

Yenə İmam Əhmədin "Müsnəd" əsərində Aişənin rəvayəti verilir: "Sad bin Muaz vəfat edəndə cənazəsində Allahın elçisi, Əbu Bəkr və Ömər var idi. Ruhum əlində olan Allaha and olsun ki, mən evdən seyr edirdim. Atamın ağlamasını Ömərin ağlamasından ayıra bilmirdim."[226]

Yenə İmam Əhmədin "Müsnəd" əsərində Əbu Hureyrədən rəvayət edilmişdir: "Allahın elçisinin yanından bir cənazə keçdi, ona qadınlar ağlayırdı. Mən və Ömər bin Xəttab Allah elçisinin yanında idik. Öınər qadınların ağlamasına mane olmaq istədi. Allahın elçisi: "Ey Xəttabın oğlu, bu saat onlardan əl çək, çünki indi insanın kədərli olduğu, gözlərin ağladığı və ölünün həyat xatirəsi daha təzə olduğu bir zamandır"- dedi".[227]

Ət-Tirmizinin rəvayətinə görə Cabir bin Abdullah demişdir: "Allahın elçisi Abdur-Rəhman bin Aufun əlini tutub oğlu İbrahimin yanına gələndə oğlu can verirdi. Allahın elçisi uşağı qucağına alıb ağladı. Abdur-Rəhman bin Auf ona: "Ağlayırsan, sən bizi ağlamaqdan çəkindirmədinmi?" - dedi. Allahın elçisi: "Mən sizi ağlamaqdan çəkindirməmişəm, ancaq sizə iki axmaq və zil səsi qadağan etdim. Biri müsibət anında üzlərini cırmaqlayarkən və yaxalarını cırarkən çıxarılan səsdir, digəri isə şeytanın qışqırığıdır."[228] ət-Tirmizi hədis həsəndir demişdir.

Əbu Davudun rəvayətinə görə Əbu Hureyrə demişdir ki: "Allahın elçisi bir dəfə anasının qəbrini ziyarət etdikdə ağladı və ətrafında olanları da ağlatdı".[229]

Aişə rəvayət etmişdir: "Allahın elçisi vəfat edən süd qardaşı Osman bin Mazunu öpdü. Hətta göz yaşları mübarək üzünə axırdı."[230]

Əl-Buxarinin rəvayətinə görə Ənəs bin Malik demişdir: "Allahın elçisi Cəfər bin Əbu Talib və yoldaşlarının Muta döyüşündə şəhid olduqlarını xəbər verərkən iki mübarək gözündən yaş axırdı."[231]

Əl-Buxarinin rəvayətinə görə Aişə demişdir ki: "Allahın elçisi vəfat edəndə Əbu Bəkr onu öpdü və ağladı."[232]

Bu on iki dəlil ölüyə ağlamanın məkruh olmadığını bildirir.

---

[225] **Həsəndir:** Əhməd, 1/237-238, 335; İbn Sad, "ət-Tabaqatul-Kubra", 8/37. Deyirəm: sənədi zəifdir, lakin Əbu Hureyrənin hədisi buna şahiddir.
[226] **Həsəndir:** Əhməd, 6/141-142.
[227] **Həsəndir:** ən-Nəsai. 4/19; İbn Macə, 1587; Əhməd, 2/333. Deyirəm: sənədi zəifdir, lakin İbn Abbasın hədisi buna şahiddir.
[228] **Həsəndir:** ət-Tirmizi, 1005. Deyirəm: ət-Tirmizinin dediyi kimi həsəndir.
[229] Müslim, 796, (107).
[230] **Səhihdir:** Əbu Davud, 3163; ət-Tirmizi, 989; İbn Macə, 1456; Əhməd, 6/43.
[231] əl-Buxari, 3630.
[232] əl-Buxari, 4455-4457.

Cənazə üçün ağlamağı qadağan edən hədislər üzü cırmaqlayaraq, paltarını cıraraq çığır-bağırla ağalmağı qadağan edir. Bundan əlavə Ömərin rəvayət etdiyi hədisin bəzi ləfzlərində: "Ölən kimsəyə ailəsinin bəzilərinin ağlamasına görə əzab olunur" və bəzi ləfzlərində isə: "Çığırıb-bağırmaqlarına görə əzab olunur" – deyilir.[233]

Əl-Buxarinin rəvayətinə görə Ömər Xalid bin Validin vəfatında ağlaşan qadınlara mane olarkən: "Qadınlarla işiniz olmasın, qoy ağlasınlar![234] Üstlərinə torpaq tökülənə qədər və fəryad qoparılana qədər sakitcə ağlamaqda bir qadağan yoxdur" - demişdir.[235]

Həmzə haqqında yuxarıda keçən "bu gündən sonra ölüyə ağlamasınlar" hədisi mübah olan ağlamağı hökmdən salmışdır deyə iddia etmək doğru deyil. Çünki o hədisin mənası: "Bu gündən sonra Uhudda şəhid edilənlərdən hər hansı birinə ağlamasınlar"- deməkdir.

Ağlamanın mübah olduğu haqqındakı dəlillərin çoxu Uhud döyüşündən sonradır. Ağlamanın mübah olduğunu bildirən hədislərdən biri Əbu Hureyrənindir. Əbu Hureyrə hicrətin yeddinci ilində islamı qəbul etmiş və Allahın elçisinin söhbətlərini eşitmişdir.

Cəfər bin Əbu Talib və yoldaşlarının şəhidliyi ilə bağlı ağlamağa dair hədis Uhud döyüşündən sonra olub. Çünki onların şəhid olması hicrətin səkkizinci ilində baş verib. Peyğəmbərimizin qızı Zeynəbə ağlamağa dair hədis Uhud döyüşündən sonradır. Çünki onun vəfatı da hicrətin səkkizinci ilində olub. Sad bin Muaza ağlamağa dair hədis də Uhud döyüşündən sonradır, çünki onun ölümü hicrətin beşinci ilində baş verib. Allah elçisinin anasının qəbri üstündə ağlaması da Uhud döyüşündən sonradır, çünki bu ziyarət hicrətin səkkizinci ilində Məkkə fəth olarkən edilib.

"Ölümdən əvvəl xəstəyə üzülərək ağlamaq caizdir, ölümdən sonra isə üzülmək yoxdur"- deməələri caiz deyildir. Çünki ölümdən əvvəl ağlayan üzülərək ağlayar, öldükdən sonrakı üzülmə isə daha şiddətlidir. Bu səbəbdən xəstənin yaxşılaşma ümidi olan yerdə ağlamağa rüsxət verilirsə, yaxşılaşma ümidi kəsilən yerdə də ağlamağa rüsxət verilməlidir. Allahın elçisi: "Göz yaş tökər, qəlb üzülər. Rəbbimi qəzəbləndirən bir söz deməyin, amma biz sənə görə hüznlüyük ey İbrahim!" - deyərək buna işarə etmişdir.[236]

Əhməd bin Hənbələ görə həm "nədb", həm də "nəyəha"[237]

---

[233] əl-Buxari, 1292; Müslim, 927 (17); və İbn Ömərin gələcəkdə veriləcək hədisinin çıxarışları.

[234] əl-Buxari, 3/160.

[235] Bu əl-Buxarinin sözünün təfsiridir və cumhur elm əhli razılaşmışlar.

[236] əl-Buxari. 1303; Müslim, 2315.

[237] **Nədb** - ölənin yaxşı əməllərini sayaraq səslə ağlamaqdır. **Nəyəha** - başına torpaq tökərək, saçlarını yolaraq, çığır-bağırla ağlamaq, fəryad qoparmaq,

haramdır. Ondan edilən digər rəvayətə görə isə "nəyəha" günahdır.

Şafiilərə və digər fəqihlərə görə də "nəyəha" haramdır.

İbn Abdul-Bərr demişdir: "Nəyəhanın həm kişilər üçün, həm də qadınlar üçün caiz olmadığında alimlər yekdildirlər".

Hənbəlilərin sonrakı dövr alimlərindən bəziləri: "Nəyəha tənzihən məkruhdur (bəyənilmir)" - demişlər.

Əbu Xəttab "Hidayə" adlı əsərində demişdir: "Nədb", "nəyəha", üzlərini cırmaqlamaq, yaxalarını cırmaq, ayaq yalın gəzmək bəyənilmir.

Doğru olanı isə bunların haram olmasıdır. Çünki əl-Buxari və Müslimin rəvayətlərinə görə Abdullah bin Məsud demişdir:

"Allahın elçisi: "Hər kim ölü üçün əlinin içi ilə yanaqlarını döyər, yaxalarını cırar və cahiliyyə adəti üzrə ağı deyərək çığırıb-bağırırsa o, bizdən deyil" - buyurmuşdur".[238]

Əl-Buxari və Müslimin rəvayətlərinə görə Əbu Burdə demişdir: "Əbu Musa bərk xəstələndi, huşunu itirəndə başı xanımının qucağında idi. Bu zaman qadınlardan biri şivən qopardı. Ancaq Əbu Musa ona bir şey demədi. Ayılıb özünə gələndə: "Allahın elçisinin uzaq olduğu hər kəsdən mən də uzağam. Allahın elçisi müsibət zamanında çığırıb-bağıran, saçını yolan, paltarını cıran qadınlardan uzaq olurdu" - dedi".[239]

Əl-Buxari və Müslimin rəvayətlərinə görə Muğəyrə bin Şubə Allahın elçisinin belə dediyini eşitmişdir: "Hansı ölüyə nəyəha edilirsə, buna görə ona əzab olunur."[240]

Əl-Buxari və Müslimin rəvayətlərinə görə Ummu Atiyyə demişdir: "Allahın elçisi biz qadınlardan islamı qəbul etməyə görə beyət alanda, nəyəha etməyəcəyimizə də söz almışdı. Beş qadından başqa heç biri o vaxt verdiyi sözə əməl etmədi".[241]

Əl-Buxarinin rəvayətinə görə İbn Ömər demişdir: "Allahın elçisi: "Ölən kimsəyə edilən fəryada görə qəbirdə əzab olunur" - buyurub."[242]

Müslimin rəvayətinə görə Əbu Malik əl-Əşari demişdir: "Allahın elçisi: "Ümmətimdə cahiliyyə adətlərindən qalma dörd şey var ki, tərk etməzlər: "Əsl-nəcabəti ilə öyünmək, başqasının nəsəbinə tənə etmək, ulduzlardan yağış yağmasını istəmək və fəryad qoparmaqdır" - buyurduqdan sonra bunları da əlavə etdi: "Yas tutan qadın ölənə

---

şaxsey-vaxsey etməkdir.

238 əl-Buxari, 1297; Müslim, 103.

239 əl-Buxari, 1296; Müslim, 104.

240 əl-Buxari, 1291; Müslim, 933.

241 əl-Buxari, 1306; Müslim, 936.

242 əl-Buxari, 1292.

qədər əvvəl tövbə etməzsə, Qiyamət günü üstündə qətrandan paltar və qoturdan bir köynək olduğu halda qəbirdən qaldırılar."[243]

Useyd bin Əbu Useyd beyət edən qadınların birinin belə dediyini nəql etmişdir: "Allahın elçisi ona qarşı üsyan etməyəcəyimizə dair biz qadınlardan beyət alanda, ölüyə ağlayarkən üzümüzü cırmaqlamayacağımıza, şaxsey-vaxsey etməyəcəyimizə, yaxalarımızı cırmayacağımıza, saçlarımızı dağıtmayacağımıza dair söz almışdı."[244]

İmam Əhməd "Müsnəd" əsərində rəvayət etdiyinə görə Ənəs demişdir: Allahın elçisi qadınlardan beyət alanda ölüyə ağlayarkən çığırıb-bağırmayacaqlarına dair söz alanda biz: "Ey Allahın elçısi, bir qrup qadın cahiliyyə dövründə bizim "nəyəha"mızda iştirak ediblər. İslamda biz də onların "nəyəha"larında iştirak edəkmi?" - soruşduq. Buna cavab olaraq Allahın elçisi dedi: "İslamda başqalarının "nəyəha"larına qoşulmaq yoxdur."[245]

Yuxarıda qeyd olunan hədisdə: "...Əgər dildən və əldən gəlirsə (dil çığırır, əl də yaxa cırırsa), bu şeytandandır" - buyurulmuşdur.[246]

Yenə yuxarıdakı hədisdə: "...Ancaq iki axmaq və zil səsi qadağan etdim. Biri müsibət anında üzlərini cırmaqlayarkən və yaxalarını cırarkən çıxardan səsdir, digəri isə şeytanın qışqırığıdır"- buyurulmuşdur.[247]

İmam Əhməd "Müsnəd" əsərində rəvayət etdiyinə görə Əbu Musa demişdir: "Allahın elçisi: "Fəryad edərək ağlayan qadın: "Ey mənim qolum-qanadım, ey mənim köməkçim, ey mənim qazanc gətirənim" - deyərsə, ölüdən: "Sən idinmi onun qolu-qanadı, sən idinmi onun köməkçisi, sən idinmi onun qazanc gətirəni?" - soruşulacaq və dirinin ağlaması ucbatından ölüyə əzab edilir" – buyurmuşdur".[248]

Əl-Buxarinin rəvayətinə görə Numan bin Bəşir demişdir: "Abdullah bin Rəvaha bir dəfə xəstələnəndə huşunu itirmişdi. Bacısı Əmrə onu ölmüş sandı və: "Ey mənim arxam və dayağım" - deyərək, Abdullah bin Rəvahanın yaxşılıqlarını sadalayaraq ağlamağa başladı. Huşu qayıtdıqdan sonra İbn Rəvaha bacısına: "Ey bacı, sən mənim yaxşılıqlarım haqqında nə söylədinsə, bir mələk: "O sənsənmi?" -

---

[243] Müslim, 934.
[244] **Səhihdir:** Əbu Davud, 3131; əl-Beyhəqi, 4/64.
[245] **Səhihdir:** Abdurrəzzaq, 6690; ən-Nəsai, 4/16; Əhməd, 3/197; əl-Beyhəqi, 4/62.
[246] **Həsəndir:** Əhməd 1/237-238, 335; İbn Sad, "ət-Tabaqatul-Kubra". 8/37. Deyirəm: sənədi zəifdir, lakin Əbu Hureyrənin hədisi buna şahiddir.
[247] **Həsəndir:** ət-Tirmizi, 1005. Deyirəm: ət-Tirmizinin dediyi kimi həsəndir.
[248] **Həsəndir:** Əhməd, 4/414.

soruşdu" və onun ağlamasını qadağan etdi. Abdullah bin Rəvaha öləndə bacısı daha ona ağlamadı."[249]

Başına torpaq tökərək, saçlarını yolaraq, paltarını cıraraq, ölənin yaxşılıqlarını sadalayaraq, çığırıb-bağıraraq ağlamaq nə üçün haram edilməsin? Çünki bunlar Allahın qəzəbini, səbrə zidd hərəkətləri, üzünə vurmaq, saçı yolmaq kimi özünə zərər verənləri, özünə həlak olmağı diləməyi, zülmü Allahdan bilməyi, paltarı cıraraq malı tələf etməyi, ölüdə olmayan yaxşılıqları ona isnad etməyi əhatə edir. Hətta bunlardan biri ilə belə ağlamanın kəskinliklə haram olmasına şübhə yoxdur.

Çığırıb-bağırmadan sadəcə ağlamanın mübah olmasını deyənlərin dəlili bu hədisdir: "Hərb demişdir: "Vail bin əl-Əsqa ilə Əbu Vail çığırıb-bağırmadan ağlamanı eşidirdilər və susardılar".

Əl-Buxari və Müslimin rəvayətlərinə görə Ummu Atiyyə demişdir: **"«Ya Peyğəmbər! Mömin qadınlar Allaha heç bir şərik qoşmayacaqları, oğurluq və zina etməyəcəkləri, övladlarını öldürməyəcəkləri, özgə kişilərdən olan uşaqlarını yalandan ərlərinə isnad etməyəcəkləri və heç bir yaxşı işdə sənin əleyhinə çıxmayacaqları barədə sənə beyət etmək üçün yanına gəldikləri zaman onların beyətini qəbul et və Allahdan onların bağışlanmasını dilə. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!»** (əl-Mumtəhinə, 12) ayəsi nazil olanda Allahın elçisinin qadınlardan aldığı beyətdə "nəyəha" da var idi. Mən: "Ey Allahın elçisi, yalnız filan ailəyə ediləcək müstəsna olsun, çünki onlar cahiliyyə dövründə mənim "nəyəha"mda iştirak ediblər. Buna görə mənim də onun "nəyəha"sında iştirakım lazım deyilmi?" - dedim. Buna cavab olaraq Allahın elçisi: "Yaxşı filan ailəyə ediləcək nəyəha müstəsna olsun" - buyurdu."[250]

Əl-Buxari və Müslimin digər rəvayətində Ummu Atiyyə demişdir: "Beyət edərkən Allahın elçisi bizə Allaha heç bir şərik qoşmayacağımıza dair ayəni oxudu və bizə "nəyəha"nı (şaxsey-vaxseyi) qadağan etdi. Sonra içimizdən bir qadın əlini qaldıraraq: "Filan qadın mənim "nəyəham"da iştirak etmişdi, mən də ona borcumu qaytarmaq istəyirəm" - dedi". Ummu Atiyyə dedi: "Allahın elçisi ona heç bir şey demədi, qadın getdi, sonra geri dönüb beyət etdi".

"Nəyəha"nı bəyənməyənlər: "Allahın elçisinin beyət edən qadınların bəzisinə "nəyəha" etməyə izin verməsi, "nəyəha"nın haramlı deyil, nöqsansız məkruh olduğunu bildirməsidir" - demişlər. Ona görə ağlamanın haram olduğunu bildirən dəlilləri üzü

[249] əl-Buxari, 4267.
[250] əl-Buxari, 4892; Müslim, 937.

cırmaqlayaraq, saçı yolaraq, yaxasını cıraraq ağlamağa aid etmək və ağlamanın caiz olduğunu bildirən dəlilləri də üzü cırmaqlamayaraq, saçı yolmayaraq, yaxasını cırmayaraq sadəcə ağlamağa aid edərək bu dəlilləri tapmaq mümkündür.

"Nəyəha"nın haram olduğu iddiasında olanlar belə deyirlər: İnsanlardan kim olur olsun hər hansı bir kimsə Allah elçisinin sünnətinə qarşı çıxa bilməz. Hədislər də bir-birinə zidd ola bilməz. "Nəyəha"nın haram olduğunu bildirən dəlillər səhihdir, mənaları aydındır, təvil ehtimalı yoxdur. Mənaları aydın olan dəlillərin təvil edilməyəcəyi barəsində fikir ayrılığı yoxdur. Allahın elçisinin filankəslərə ediləcək "nəyəha" müstəsna olsun dediyi qadınla heç bir şey söyləmədiyi qadına gəlincə, iki səbəbə görə bunların "nəyəha" etmələrinə icazə verilmişdir. Birincisi, bu iki qadından başqa digər qadınlar da "nəyəha" üçün icazə istədikdə Allahın elçisi: "İslamda başqalarının "nəyəha"larında iştirak etmək yoxdur"— buyurmuşdur. İkincisi, bu iki qadının "nəyəha"da iştiraklarına izin verilməsi islamı yeni qəbul etmələrinə görədir. Çünki onlar ağlamanın caiz olanı ilə haram olunanını fərqləndirə bilmirdilər. Hər hansı bir şəri hökmün açıqlanmasının ehtiyac olan andan gecikdirilməsinə icazə verilmir. Buna görə o iki qadına başqalarının "nəyəha"larında iştirak etmələri üçün icazə verilmə hökmü yalnız onlara məxsus olduğu bilinir.

Çığırıb-bağırmadan, qəzəblənmədən, doğru söyləyərək, vəfat edənin yaxşılıqlarını saymaq haram deyil və vacib olan səbrə də zidd deyildir. İmam Əhməd "Müsnəd" əsərində bunu açıqlamışdır.

Ənəs belə demişdir: "Əbu Bəkr peyğəmbərimiz vəfat edərkən yanına girib ağzını Allahın elçisinin alnına, əllərini də mübarək başının yanlarına qoyub: "Vay peyğəmbər! Vay dost" - dedi."[251]

əl-Buxarinin rəvayətinə görə, Ənəs belə demişdir: "Allahın elçisi xəstələnib halı ağırlaşanda Fatimə: "Atam vay! Nə yaman sıxıntı çəkirsən"- dedi. Buna cavab olaraq Allahın elçisi: "Bu gündən sonra artıq atan üçün bir sıxıntı yoxdur, qızım" - buyurdu. Allahın elçisi vəfat edəndə Fatimə: "Atam!... Allahın dəvətinə cavab verdi... Atam vay!... Gedəcəyin yer Firdovs Cənnəti... Ay ata! dərdimizi artıq cəbrailə ərz edəcəyik " - deyə huşunu itirdi. Allahın elçisi dəfn edilərkən də yenə Fatimə: "Peyğəmbərin üstünə torpaq atmağa könlünüz necə razı oldu?"- deyirdi."[252]

Allahın elçisi oğlunun vəfatında: "Ey İbrahim! Bizim könüllərimiz sənin ayrılığına çox hüznlü və kədərlidir"[253] - deyərək, üzüntüsünü bildirmişdi. Bu kimi sözlərdə müqəddərata qarşı

[251] Əhməd, 2/31. Deyirəm: sənədi zəifdir.
[252] əl-Buxari, 4462.
[253] əl-Buxari, 1303; Müslim, 2315.

sızlanmaq, Allaha qarşı üsyan və Allahın qəzəblənəcəyi bir şey yoxdur. Belə sözlər səssiz ağlamaq kimidir.

## Fəsil

Allahın elçisinin: "Ölü, ona edilən fəryada görə əzab çəkir"[254] - sözü, Ömər bin Xəttabın, Abdullah bin Ömərin və Muğirə bin Şubənin rəvayətləri ilə bildirilir. Bu hədisə oxşarını İmran bin Hüseyn və Əbu Musa da rəvayət ediblər.

Hədislərin ifadə etdiyi fəryad üzündən ölüyə əzab olunması məsələsində alimlərin fikri müxtəlifdir. Belə ki, alimlərdən bəzilərinə görə, Allah-taala məxluqatını istədiyi kimi idarə edir. Allahın hərəkətləri müzakirə olunmaz. Ölüyə, ona edilən şaxsey-vaxsey və fəryad ucbatından əzab edilməsi ilə onun özünün etdiyi pisliklərinə görə əzab edilməsi arasında fərq yoxdur. Çünki Allah-taala hər şeyin Yaradıcısıdır. Allah-taala günahsız uşaqlara, heyvanlara, dəlilərə də acı çəkdirir.

Alimlərin bəzilərinə görə bu hədislər səhih deyil. Çünki möminlərin anası hz. Aişə bu hədisləri inkar etmiş və: **«Heç bir günahkar başqasının günahına yüklənməz»** (İsra, 15; ən-Nəcm, 38; Fatir, 15; əl-Ənam, 164; əz-Zumər, 7) ayəsini dəlil gətirmişdir. Həzrəti Ömər ilə oğlunun rəvayət etdikləri hədis Aişəyə danışılanda, Aişə: "Onların yalan demələri və bununla ittiham edilmələri heç kimin ağlına gəlməz, fəqət qulaq xata edə bilər" - demişdir. Aişə demişdir ki: "Allahın elçisi bir dəfə bir yəhudinin məzarı yanından keçəndə: "Ailəsinin ağlaması ucbatından bu qəbirdəkinə əzab edilir "- buyurdu.[255]

Əl-Buxari və Müslimin rəvayətlərinə görə Aişə demişdir: "Allahın elçisi: "Şübhəsiz ki, Allah-taala, ailəsinin ağlamağına görə kafirin əzabını artırır"- buyurdu."[256] Aişə sözünə davam edərək: "Sizə Quran yetər. Allah: **«Heç bir günahkar başqasının günahına yüklənməz»** (əl-Ənam, 164) - buyurmuşdur"- dedi.

Alimlərdən bir qisminə görə, bu hədislər səslə ağlamağı vəsiyyət edənlərə aiddir. Çünki ərəblər cahiliyyə dovründə ailələrinə ölərkən ağlamalarını, şaxsey-vaxsey etmələrini vəsiyyət edirdilər. Bir çox ərəb şairi bu adəti öz şerlərində tərənnüm ediblər. "Muallaqatu-Səb'ə"nin[257] birinin sahibi olan Tarafa bin Abdın bu beyti o

---

[254] əl-Buxari, 1292; Müslim, 927 (17).
[255] əl-Buxari, 1289; Müslim, 931.
[256] əl-Buxari, 1288; Müslim, 929.
[257] İslamdan əvvəl ərəb şairlərinin bəyənilən şerləri yazılmış, Kəbənin divarında

qəbildəndir:

Ey sevgilim Ummu Məbəd!
Ölümümü layiqincə elan et.
Ölümümdən mütəəssir olub,
yaxanı parça-parça et".

Yenə eyni qəbil şairlərdən biri olan Ləbid bin Rəbia müsəlman olmazdan əvvəl iki qızına belə vəsiyyət etmişdi: "Atanız ölən gün üzünüzü cırmaqlayın, saçlarınızı qırxmayın, "atamız qonşusunun qayğısına qalar, dostuna xəyanət və zülm etməzdi" deyərək bir il yas tutun. Sonra sağ və salamat olun. Hər kim ki, tam bir il ağlasa, o, artıq üzürlü sayılır".

Digər bir qisim alimə görə, ölüyə nəyəha – onun sağlığındakı adəti və qövmünün adəti olanlara şamil olunur. Çünki ölən kəs həyatda ikən qövmünü və qəbiləsini fəryaddan çəkindirməməsi, öldükdən sonra onun özü üçün ediləcək fəryada razı olduğunun dəlilidir. Bunu İbn Mübarək və başqaları deyiblər.

Əbu əl-Bərəkət bin Teymiyyə demişdir: Son fikir bu mövzuya dair fikirlərin ən səhihidir. Çünki hər kimsə öləndə ona fəryad ediləcəyini bildiyi halda bunun tərk edilməsinin vəsiyyət etmədiyi təqdirdə, buna razı olmuş olur və şəriətlə qadağan olan bir şey icra edilirkən, qarşısını almağa gücü çatdığı halda, qadağan etməyən kimi olur. Amma səslə ağlamamağı və fəryad etməməyi vəsiyyət edərək ölən kəs, sonradan vəsiyyətinin ziddinə olan işlərə görə əzab görməz. Çünki onun bu xüsusda heç bir günahı yoxdur. Nəticə olaraq səslə ağlamaqdan və çığır-bağırdan dolayı əzab görməmək üçün bunların edilməməsini vəsiyyət etmək lazımdır. Bir kimsə özünə fəryad edilməsini vəsiyyət edərsə, yaxud ediləcəyini bildiyi halda tərk etmələrini vəsiyyət etməzsə, ailəsinin ağlamasına görə ona əzab olunması öz günahı ucbatındandır. Buna görə **«Heç bir günahkar başqasının günahına yüklənməz»** ayəsinə riayət edildiyinə görə - "Ölüyə ailəsinin ona ağlaması ucbatından əzab olunur"- hədisi həm möminə, həm də kafirə şamil olunur. Bu hədisi, rəvayətçiləri etimad olunan kimsələr olduğu üçün Aişənin inkar etməsinə etibar edilməz. Çünki bunlar Aişənin olmadığı yerdə olurlar. Bu beş böyük əshabə haqqında yanıldı və xata etdi deyilməz. Allahın elçisinin Yəhudi haqqında yuxarıda keçən bu beş əshabənin rəvayət etdiyi hədisi, Allahın elçisinin başqa vaxt söyləməsinə mane deyildir.

Həzrəti Aişənin: "Allahın elçisi: "Allah-taala, ailəsinin ağlaması ucbatından kafirin əzabını artırır"- buyurdu"- deyə rəvayət etməsi ilə öz əleyhinə dəlil gətirmiş olur. Başqasının hərəkətinə görə kafirin

---

asılan yeddi əski.

əzabı artırılırsa, halbuki bu, yuxarıdakı ayənin zahirinə ziddir, başqasının hərəkətinə görə müsəlmanın əzabı da artırılır. Çünki Allah-taala müsəlman quluna zülm etməyəcəyi kimi, kafirə də zülm etməz. Allah hər şeyi haqqıyla biləndir.

## Fəsil

Bu hədislərin heç bir tə'vilə ehtiyacı yoxdur. Çünki bu hədislərdə bir müşkül olmadığı kimi, Quranın zahirinə və şəri qaydaların hər hansı birinə də müxalif deyildir. Ona görə Allahın elçisi: "Ölü, ailəsinin ona ağlaması və nəyəhası ucbatından cəza ("iqab") çəkir" buyurmayıb, "əzab görür"- buyurmuşdur. "Əzab" kəlməsinin mənası, "iqab" kəliməsinin mənasından daha ümumidir. O halda ölüyə əzab olunması, iqab olunmasını zəruri etməz. Buna görə əzab sözündən məqsəd, ölən kimsənin ağlayan adamları görərək üzülməsidir. Hədislərin birində: "Səfər, əzabdan bir parçadır"[258]- buyurulmuşdur. Bu əzab (ailəsinin ağlamasına görə ölünün üzülməsi), həm ölü möminə, həm də ölü kafirə aiddir. Hətta bir adam bu dünyada qonşusunun çəkdiyi əzab-əziyyəti və cəfanı gördükdə üzüldüyü kimi, bir ölü yaxınlağındakı qəbirdə əzab edilən kimsəyə acıyır və üzülür. Bir ölünün ailəsi cahiliyyə dövrünə xas ağlayarsa, ölünün qəbirdə bu səbəbdən acı və ağrı dadması nəzərdə tutulur.

Bu hədislərin şərhi ilə tutduğumuz yol budur. Uğur Allah-taaladandır!

[258] əl-Buxari, 3001; Müslim, 1927.

# ON DOQQUZUNCU BÖLMƏ

## İman iki cürdür: Səbir və Şükür

İman, səbir ilə şükürdən ibarətdir. İman iki sinifdir: bir sinfi səbir, digər sinfi şükürdür. Sələf-salihindən bir çoxları: "Səbir imanın yarısıdır"- demişlər.

Abdullah bin Məsud demişdir: "İman iki sinifdir. Bir sinfi səbir, digər sinfi şükürdür. Bundan əlavə Allah-taala İbrahim surəsində (5), əş-Şura surəsində (33), Səba surəsində (19), Loğman surəsində (31) səbirlə şükrü birləşdirərək: **«...Bunda çox səbir və şükür edənlər üçün, sözsüz ki, neçə-neçə ibrətlər var!...» -** buyurmuşdur. İmanın belə təsnif edilməsinin bir çox səbəbləri var.

**1.** Qəlblə təsdiq və dillə iqrar etmək. Əməl (itaət və ibadət etmək) və niyyətdən ibarət olan iman, əslində iki qisimdir: biri əməl, digəri isə tərkdir. Əməl Allah-taalaya itaət və ibadət deməkdir ki, şükrün mahiyyətidir. Tərk isə günahdan uzaqlaşmağa səbir etməkdir. Din bütövlükdə bu iki şeydən ibarətdir. Biri əmr edilənləri icra etmək, digəri yasaqları tərk etməkdir.

**2.** İman iki əsas üzərində qurulmuşdur. Biri yəqin, digəri səbirdir: Bu aşağıdakı kəlamlarda zikr edilmişdir: **«**(Çətinliklərə) **səbir etdikləri və ayələrimizə ürəkdən inandıqları üçün biz onlardan (**İsrail oğullarından) **əmrimizlə** (insanlara) **haqq yolu göstərən rəhbərlər təyin etmişdik»** (əs-Səcdə, 24). "Yəqin"- əmrin, qadağanın, savabın və cəzanın gerçək mənalarının bilinməsinin qayəsidir. "Səbir" ilə də əmrlərin yerinə yetirilməsi, yasaqlardan nəfsin uzaqlaşdırılması nəzərdə tutulmuşdur. Əmrin, qadağanın, savabın və cəzanın Allah tərəfindən olduğunu təsdiq etmək, ancaq yəqinliklə hasil olur. Əmrləri yerinə yetirməyə davam etmək, qadağalardan nəfsi çəkindirmək, ancaq səbirlə mümkün olur. Buna görə əmrləri yerinə yetirməklə, yasaqları tərk etməklə imanın yarısı səbir, digər yarısı isə şükür olmuş olur.

**3.** İman söz və əməldən ibarətdir. Söz qəlbin və dilin təsdiqidir. Əməl isə qəlblə əzaların əməlidir. Yəni bir kimsə Allahı qəlbi ilə təsdiq edib, dili ilə iqrar etməzsə, mömin olmaz. Məsələn, Allah-taala Firon qövmündən xəbər verərək: **«**(Möcüzələrimizin) **həqiqiliyinə daxilən möhkəm əmin olduqları halda, haqsız yerə və təkəbbür üzündən onları inkar etdilər...»** (ən-Nəml, 14) - buyurmuşdur.

Allah-taala həmçinin Ad və Səmud qövmündən xəbər verərək: **«Biz Ad və Səmud da məhv etdik** (Onların başlarına nələr gətirdiyimiz xaraba qalmış) **məskənlərindən sizə bəllidir. Şeytan əməllərini onlara gözəl göstərib gözləri görə-görə onları haqq yoldan çıxartdı»** (əl-Ənkəbut, 38) – buyurmuşdur. Həmçinin Allah-taala Musa peyğəmbərin Firona belə dediyini xəbər verərək: **«**(Musa da) **ona: "Sən bunların məhz göylərin və yerin Rəbbi tərəfindən açıq-aşkar möcüzə olaraq endirildiyini, sözsüz ki, bilirsən. Mən isə, ey Firon, səni artıq məhv olmuş zənn edirəm!"- ...»** (əl-İsra, 102) - buyurmuşdur. Bu kimsələr qəlbi ilə Allah-taalanı bildilər, fəqət bilməklə mömin olmadılar. Yenə əgər bir kimsə, qəlbində olmayan şeyi dili ilə söyləyirsə, bununla mömin yox, münafiqlərdən olur. Yenə bir kimsə qəlbilə bilib dili ilə təsdiq edərsə, Allah-taalanı və Onun elçisini sevmədikcə, Allah dostlarına dost, düşmənlərinə düşmən olmadıqca, qəlbi ilə Allaha təslim olub, Onun elçisinə tabe olub, şəriəti tam olaraq qəbul etmədikcə, yalnız qəlbilə bilib, dililə iqrar etməklə mömin sayılmır. Əmrləri tam yerinə yetirmədikcə iman kamil olmaz.

Bu dörd dayaq və ünsür imanın əsaslarıdır. Bunlar elm və əməldən ibarətdir ki, hər biri ancaq səbirlə əldə edilir. Buna görə iman iki qisimdir. Biri səbirdir. Digəri isə səbirdən doğan elmlə olan əməldir.

**4.** Nəfsin iki gücü vardır. Biri irəli atılma gücü, digəri isə sığınma gücüdür. Nəfs bu iki qüvvənin hökmləri arasında dolaşır. Sevdiyi bir şeyin üstünə atılır, xoşlanmadığından qaçır və çəkinir.

**5.** Dinin hamısı Allah-taalanın rəhmətinə ümid etməklə əzabından qorxmaqdan ibarətdir. Buna görə mömin həm Allahın rəhmətinə ümid edər, həm də əzabından qorxar. Məsələn, Allah-taala əl-Ənbiya surəsinin 90-cı ayəsində buyurmuşdur: **«...Onlar xeyirli işlər görməyə tələsər, ümid və qorxu ilə** (rəhmətimizə ümid bəsləyib əzabımızdan qorxaraq) **Bizə ibadət edərlər».**

Əl-Buxarinin rəvayətinə görə, Allahın elçisi yatağına girdikdə sağ tərəfi üstündə yatardı, sonra bu duanı edərdi: "Allahım! Özümü Sənə təslim etdim, üzümü Sənə çevirdim, işimi Sənə tapşırdım, arxamı Sənə dayadım, ümidim də sənədir, qorxum da Səndəndir, Səndən sığınacaq yer varsa, o da Sənsən. Kitabına inandım və göndərdiyin peyğəmbərlərə iman etdim ".[259]

Bir möminin Allahın rəhmətinə ümid etməsi və əzabından qorxması lazımdır. Allahın rəhmətinə ümid elmək və əzabından qorxmaq ancaq səbirlə olur. Allahın əzabından qorxmaq mömini

---

[259] əl-Buxari, 6313; Müslim, 2710.

səbrə sövq edər, rəhmətinə ümid etmək isə şükür etməyə gətirər.

**6.** Qulun bu dünyada etdiklərinin hamısı ya ona həm bu dünyada, həm də axirətdə fayda verər, yaxud həm bu dünyada, həm axirətdə zərərli olar və yaxud birində faydalı, digərində zərərli olar. Bunlardan ən şərəflisi qulun axirətdə ona fayda verəcək olanını etməsi, zərər verəni tərk etməsidir. Qulun özünə faydalı olanı şükür, zərərliləri tərk etməsi isa səbirdir.

**7.** Qul əmrlərdən, yasaqlardan və müqəddəratdan qurtulmaz. Bu üç şey qula fərz olan səbirlə, şükürdür. Qul əmrləri icra edərək şükür edər, yasaqları tərk etməyə və müqəddərata səbir edər.

**8.** Qul üçün iki dəvətçi var. Biri dünyaya və dünyanın şəhvət və ləzzətinə dəvət edər, digəri isə Allaha, axirətə və axirətdə Allahın dostları üçün hazırlanmış əbədi nemətlərə dəvət edər. Şəhvət və həvəsə dəvəti qəbul etməmək səbirdir. Allaha və axirətə dəvəti qəbul etmək isə şükürdür.

**9.** Din əzm və səbat (qərarlı olmaq) kimi iki əsasdan ibarətdir. Şəddad bin Əvs demişdir: Allahın elçisi namazlarında belə dua edərdi: "Allahım! Səndən işlərimdə səbatı, doğruluğa qarşı əzmi diləyirəm. Səndən nemətlərinə şükür və yenə Sənə gözəl ibadət etmə gücünü verməyini diləyirəm. Səndən dürüst bir qəlb və doğru bir dil istəyirəm. Səndən bildiyin xeyirləri istəyirəm. Bildiyin şərlərdən Sənə sığınır və xatalarıma görə Səndən əfv diləyirəm. "[260]

Şükrün əsli və əsası təqva ilə əməl etməyin sağlam olmasıdır. Səbrin əsli və əsası səbatın qüvvətli olmasıdır. Hər hansı bir qul təqva ilə əməl etmək və səbatla qüvvətləndirilirsə, Allahın yardımına qovuşmuş olur.

**10.** Din iki təməl üzərində qurulmuşdur. Biri haqq, digəri isə səbirdir. Bunlar: **«...bir-birinə haqqı tövsiyə edən və səbri tövsiyə edən kimsələrdən başqa!»** (əl-Əsr, 3) ayəsi ilə bildirilmişdir. Quldan haqqa özünün əməl etməsi və onu insanlara tövsiyə etməsi tələb olunur. Məhz, bu şükrün mahiyyətidir. Buna görə səbir imanın yarısıdır. Allah hər şeyi daha doğru bilir!

---

[260] **Həsəndir:** ən-Nəsai, 3/54; ət-Tabərani, "əl-Kəbir", 7180. Təhqiqatçı bu hədisin çoxlu araşdırmaları zamanı sənədlərdə zəif sənədlər olsa da, ümumən hasən olmasını demişdir.

# İYİRMİNCİ BÖLMƏ

## Səbirlə Şükürdən hansının daha fəzilətli və üstün olması haqqında mübahisə

Əbu əl-Fərəc İbn əl-Cauzi bu mövzuda üç fikir söyləmişdir.

Birincisi, səbir daha fəzilətli, daha üstündür.

İkincisi, şükür daha fəzilətli daha üstündür.

Üçüncüsü, səbirlə şükür hər ikisi eynidir. Belə ki, Ömər bin Xəttab demişdir: "İki dəvə fərz edilsə, hansını minsəm əhəmiyyət vermərəm".

İndi ardıcıllıqla səbir və şükrün hansının üstün olmasını iddia edənlərin lehinə və əleyhinə olan dəlilləri Allahın izni ilə göstərək.

## Səbrin fəzilətli və üstün olduğunu iddia edənlərin dəlilləri

Allah-taala səbri və səbir edənləri mədh edərək səbri əmr etmiş, dünya və axirətin xeyrini səbrə bağlamışdır. Qurani Kərimin doxsana yaxın yerində səbir zikr edilmişdir.[261] Səbir haqqında yuxarıda göstərilən ayələr və hədislər səbrin şükürdən üstün olduğuna dəlalət edir. Səbrin şükürdən üstün olduğuna Allahın elçisinin bu mübarək sözü kifayətdir: "Yemək yedirib şükür edən, oruc tutub səbir edən kimidir."[262] Allahın elçisi bu mübarək sözünü səbrin şükürdən üstün və dərəcəsinin ondan yüksək olduğunu bildirmək üçün demişdir. Çünki Allahın elçisi yemək yedirib şükür edəni, oruc tutub səbir edənə bənzətmişdir. Bənzədilənin mərtəbəsi bənzəyənin mərtəbəsindən daha yüksəkdir. Hədisdə, "yemək yedirib şükür edən" bənzəyən, "oruc tutub səbir edən" isə bənzədiləndir. Daima özünə bənzədilən bənzədəndən daha üstün olur. Məsələn, digər bir hədisdə: "Şərab içməyə davam edən, bütə tapınan kimidir"- buyurmuşdur.[263]

---

[261] "Mədaricus-Salikin", 2/152.

[262] **Səhihdir:** ət-Tirmizi, 2486; Abdurrəzzaq, 19573; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 2832; Əhməd, 2/283; Əbu Yəla, 6582; əl-Hakim, 4/136; İbn Hibban, 314.

[263] **Həsəndir:** Əhməd, 1/272; Abdurrəzzaq, 17070; əl-Bəzzar, 1934; ət-Tabərani, "əl-Kəbir", 1248; İbn Adiy, 4/1525; İbn Hibban, 314; Əbu Nəim, 9/253; Abdullah bin Abbasın rəvayəti. Deyirəm: sənədi zəifdir.

Səbir və şükür haqqında dəlilləri müqayisə etdikdə, səbir haqqında dəlillərin şükür haqqında dəlillərdən qat-qat çox olduğunu görərik. Bundan başqa namaz və cihad əməllərin ən fəzilətlisi və ən üstünü olduğu üçün bunlar haqqında hədislər daha çoxdur.

Səbir dini məsələlərin hamısında lazımdır. Bundan başqa səbrin imandakı yeri, bədəndə baş kimidir. Allah-taala şükür edənə daha artıq verəcəyini xəbər verərək: **«Yadınıza salın ki, o zaman Rəbbiniz bunu bildirmişdi: "Əgər** (mənə) **şükür etsəniz, sizə** (olan nemətimi) **artıracağam"»** (İbrahim, 7)- buyurduğu halda, səbir edənlərin mükafatının hesabsız olduğunu xəbər verərək: **«...Yalnız səbir edənlərə saysız-hesabsız mükafat veriləcəkdir!»** (əz-Zumər, 10)- buyurmuşdur.

Allah-taala həmçinin şükür edənlərin mükafatını mütləq olaraq zikr edib: **«...Lakin Allah şükür edənlərə mükafat verər»** (Ali-İmran, 144)- buyurduğu halda, səbir edənlərin mükafatını "ehsan" ilə qeyd edərək: **«...dözənləri etdikləri yaxşı əməllərin müqabilində mükafatlandıracağıq!»** (ən-Nəhl, 96) -buyurmuşdur.

Əbu Hureyrə rəvayət etmişdir ki, Allahın elçisi buyurmuşdur: "Uca və Qüdrətli Allah buyurdu ki: **"Adəm övladının hər əməli özünündür. Yalnız oruc müstəsnadır, o, mənim üçündür. Onun mükafatını Mən verəcəyəm"**.[264]

Müslimin rəvayətində: "Adəm oğlunun hər əməli qat-qat verilir. Bir yaxşılığı, on mislindən yeddi yüzə qədər mükafatlandırılır. Yalnız oruc müstəsna onun mükafatını mən verirəm "- buyurulur.[265]

Çünki oruc nəfsin səbir etməsindən, arzu və istəklərindən çəkindirməsindən ibarətdir. Necə ki, yuxarıdakı hədisin davamında: "Çünki qulum, yeməsini, ehtiraslarını, sırf məndən ötrü tərk edir"- buyurulub. Bundan başqa Allahın elçisindən: "Hansı əməl daha fəzilətlidir"- soruşulduqda: "Oruca sarıl, çünki onun tayı-bərabəri yoxdur"- demişdir.[266]

Səbir - həvəsə, pis arzu və istəklərə dəvət edənin çağırışından nəfsini çəkindirmək olduğu üçün, oruc da yeməyə, içməyə və cinsi yaxınlıq arzularına dəvəl edənin çağırışlarından nəfsi çəkindirir: **«Ey iman gətirənlər! Səbir və dua ilə** (namazla Allahdan) **kömək diləyin...»** (əl-Bəqərə, 153) ayəsindəki səbir, orucla təfsir edilmiş və ramazan ayına səbir ayı deyilmişdir.

Sələf-salehdən bəziləri demişlər: "Oruc səbrin yarısıdır. Çünki

---

264 əl-Buxari, 5927; Müslim, 1151 (161).

265 Müslim, 1151 (164).

266 **Səhihdir:** ən-Nəsai, 4/165-166; Əhməd, 5/238-239, 255, 258; Abdurrəzzaq, 7899; ət-Təbərani, 7464; İbn Hibban, 3425-3426; İbn Xuzeymə, 1893; əl-Hakim, 1/421.

səbir, şəhvətə və qəzəbə dəvət edənin çağırışından nəfsini qorumasıdır: Ona görə ki, nəfs xoşa gələn bir şeyin ləzzətinə qovuşmaq üçün onu arzu edir. Xoşuna gəlməyən və özünə acı olan və ağrı verən şeyi məzəmmət etdiyi üçün ona qəzəb edir. Oruc qəzəb şəhvətinə deyil, yalnız mədə şəhvətilə cinsi şəhvətə qarşı səbir etmək olduğundan, tam kamil oruc, ancaq nəfsin həm qəzəb, həm də şəhvət qüvvələrindən çəkindirməsi ilə olur. Belə ki, Allahın elçisi buna işarə edərək: "Sizdən biriniz oruclu olduğu halda cahillik etməsin və heç kimlə didişməsin, şayəd biri onu söyərsə və ya vurarsa: "Mən orucluyam"- desin " - buyurmuşdur."[267]

Allahın elçisi şəhvət qüvvəsi ilə qəzəb qüvvəsinin bərabər olmasını bildirmişdir. Oruclu adam bunlarla orucunu pozmaqdan çəkinməlidir. Mədə şəhvəti ilə cinsi şəhvət orucu pozar, qəzəb isə orucun savabını azaldar. Belə ki, bir hədisdə deyilir: "Oruclu bir kəs yalan danışıb, yalançılıqla iş görməkdən çəkinməzsə, yeməyi-içməyi buraxıb boş-boşuna ac galmasın. Allah dərgahında bunun heç bir qiyməti yoxdur."[268]

Səbrin şükürdən daha fəzilətli və üstün olduğuna bu ayə kifayətdir: **«Həqiqətən, Mən səbir etdiklərinə görə onları mükafatlandırdım. Onlar nicat tapanlardır!»** (əl-Muminun, 111).

Allah-taala bu ayədə **«Səbirlərinin mükafatı olaraq onları qurtarmış»** olduğunu bəyan etmişdir. Allah buyurmuşdur: **«...Allah səbir edənlərlədir»** (əl-Bəqərə, 153). Qul üçün Allahın Özü ilə bərabər olmasının tayı-bərabəri olan heç nə yoxdur. Ariflərdən biri demişdir: "Səbir edənlər həm dünya, həm də axirət xeyrini əldə etmişlər. Çünki onlar Allahla bərabər olma şərəfinə nail olmuşlardır. Allah: **«Sən öz Rəbbinin hökmünə səbir et! Şübhəsiz ki, sən Bizim gözümüzün qabağındasan»** (ət-Tur, 48) - buyurmuşdur. Bu ayə Allah-taalanın hökmünü qoruma və mühafizə etməyi səbir etməyə aid etmişdir.

Allah səbir edənlərə üç şey vəd etmişdir ki, bunlardan hər biri dünyadan və dünyada olanlardan daha xeyirlidir. Bunlar Allahın səbir edənlərə məğfirəti, rəhməti və hidayətidir. Belə ki, Allah buyurmuşdur: **«Əlbəttə, Biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal, can və məhsul qıtlığı ilə imtahan edərik.** (Ya Məhəmməd! Belə imtahanlara) **səbir edən şəxslərə müjdə ver! O kəslər ki, başlarına bir müsibət gəldiyi zaman: "Biz Allahınıq və Ona tərəf qayıdacağıq!" - deyirlər. Onları Rəbbi tərəfindən bağışlanmaq və rəhmət gözləyir. Onlar doğru yolda olanlardır!»** (əl-Bəqərə, 155-157). Bu ayə hidayətin yalnız səbir edənlərə məxsus olduğunu

[267] əl-Buxari, 1904; Müslim, 1151 (123).
[268] əl-Buxari, 1903.

bildirir. Allah-taala iki ayədə səbrin əzmkar işlərdən olduğunu xəbər verərək, Elçisinə peyğəmbərlərdən əzmkarların səbri kimi səbir etməsini əmr etmişdir.

Dəlillər dünyadan çox şey əldə etmək mümkün olduğu halda, az şeylə kifayətlənmənin və zahidliyin daha xeyirli olduğunu göstərir. Dünyadan azla kifayətlənmək səbir edənlərin halı, çox şey əldə etmək isə şükür edənlərin halıdır.

İsa peyğəmbərdən soruşdular: "İki kimsə bir xəzinəyə rast gəlib, onlardan biri ona bir təpik vurub iltifat etmədi, digəri isə onu alıb Allah yolunda xərclədi. Bunlardan hansı daha fəzilətlidir?" İsa cavab verdi: "Ona iltifat etməyib ondan üz çevirən Allah dərgəhında daha fəzilətlidir". Belə ki, Allahın elçisinə yerdəki xəzinələrin açarları təklif edildikdə onları almayaraq: "Bir gün ac, bir gün tox olaram "[269]-deməsi də səbrin üstün olduğunu bildirir. Şayəd Allahın elçisi bunları alsaydı, Allah yolunda sərf edərdi. Fəqət bunları almayıb, səbir məqamını və zahidliyi üstün tutdu.

İnsanlığın kamilliyi üç şeydədir: bilinməsi zəruri olan faydalı elmlər, icra olunması şərt olan saleh əməllər və bu elmlərlə saleh əməllərə bağlı olan hallardır. Bu elmlərin, saleh əməllərin və halların ən fəzilətlisi və üstünü Allah-taalanı və Onun adlarını, sifətlərini və fəzilətlərini bilməkdir. Allah-taalanın razılığı üçün əməli icra etməkdir. Qəlbi Allaha bağlayaraq Onu sevmək, əzabından qorxmaq və rəhmətinə ümid etməkdir. Dünyada ediləcək işlərin ən şərəflisi və üstünü bunlardır. Axirətdə ən üstün və fəzilətli mükafat bunlara veriləcəkdir.

Məqsədlərin ən əzəmətlisi, ən böyüyü Allahı tanımaq, Onu sevmək, Ona itaət və ibadət edərək yaxın olmağa çalışmaqdir. Ən böyük həzzi, zövqi Onun xatırlanmasından almaq və Ona qovuşmağı şiddətlə arzu etmək dünya və axirət səadətinin elə özüdür. Məhz bunlar, bilavasitə icrası zəruri olan qayə və məqsədlərdir. Qul gerçək səadətin bunlar olduğunu, ancaq gözündən qəflət pərdəsi götürülüb dünyadan ayrılaraq, axirət yolçuluğu başlananda anlayacaqdır. Qul dünyada ikən bunların gerçək səadət olduğunu bir anlığa anlasa da, bunu tam mənası ilə anlaya bilməz. Çünki dünyada qulun qarşısına imtahan edildiyi bir çox minnət və məşəqqətlər çıxır. Məhz bunlar onun həqiqi səadəti anlamasına mane olurlar. Şayəd bunlar olmasaydı, o, həqiqi səadəti kəskin olaraq bilərdi.

Bütün elmlər və bilgilər Allahın varlığını, birliyini və Onun ad və sifətlərini təsdiq etməyə bağlıdır. Elmlərin fəzilətdə fərqli olmaları Allah-taalaya yaxınlaşdırmalarına görədir. Allaha ən çox

[269] **Çox zəifdir:** ət-Tirmizi, 2347; Əhməd, 5/254.

yaxınlaşdıran elm, elmlərin ən üstünü və ən yüksəyidir.

Qəlbin halı da belədir. Qəlbi məqsədə ən çox yaxınlaşdıran hal, halların ən şərəflisi və ən üstünüdür.

Əməllər də belədir. İstənilən səadətin əldə edilməsinə daha çox yaxınlaşdıran əməllər digər əməllərdən daha fəzilətlidir. Bundan əlavə namazla cihad, əməllərin ən fəzilətlisi və ən üstünüdür. Çünki istənilən məqsəd və səadətə ən çox yaxınlaşdıran bunlardır. Buna görə qayə və məqsədə ən çox yaxınlaşdıran bir şey, ona az yaxınlaşdıranından daha fəzilətlidir.

Allahı, Onun adlarını və sifətlərini tanımağa və Onu sevməyə əzabdan qorxmağa və rəhmətinə ümid etməyə hazırlanmış olan bir qəlbə yardım edən əməllər, belə olmayan əməllərdən daha fəzilətlidir. Bir çox əməllər Allaha yaxınlaşdırmaqda ortaq olduqda, ən çox yaxınlaşdıranı daha üstündür. İtaət və ibadətlər Allaha yaxınlaşdırmaqda ortaq olduqlarından əlavə hamısının Allah üçün edilməlidir.

Günahlar qəlbi qayə və məqsədlərdən uzaqlaşdırmada ortaq olduqlarından qadağan edilmişlər.

İtaət və ibadətlərin Allaha yaxınlaşdırmada, günahların isə Allahdan uzaqlaşdırmada olan təsirləri dərəcələrinə görədir. Burada bilinməsi lazım olan mühüm bir əmr və qayda vardır. Bu da müəyyən bir əməlin sahibinə görə daha fəzilətli və üstün olmasıdır. Məsələn, malını xərcləməyən varlının sədəqə verməsi, nafilə olaraq gecə namaz qılıb, gündüz oruc tutmasından daha fəzilətlidir. Düşmənin ondan qorxduğu cəsur və igid bir kəsin, Allahın düşmənləri qarşısında bir saat cihad etməsi, həcc etməsindən, oruc tutmasından, sədəqə verməsindən daha fəzilətlidir. Sünnəti, halalı, haramı, xeyir və şər yollarını bilən bir alimin insanlara qarışıb, onlara dinlərini öyrətməsi, onun bir guşəyə çəkilib namaz qılmasından, Quran oxumasından daha fəzilətlidir.

Bəndələri arasında hökm etməsi üçün Allah-taalanın təyin etdiyi rəhbərin, haqlı ilə haqsızı ayırmaq məqsədi ilə cəzaları tətbiq etmək üçün bir saat oturması, başqasının illər boyu nafilə ibadət etməsindən daha fəzilətlidir. Qadınlara qarşı şəhvəti qalib olan birinin oruc tutması, başqalarının zikr etməsindən, sədəqə verməsindən daha fəzilətlidir. Belə ki, Allahın elçisi Amr bin əl-Ası, Xalid bin Validi və digərlərini əmir, vali, vergi yığan təyin edib, Əbu Zəri təyin etməmiş və ona: "Görürəm ki, sən zəifsən, özüm üçün sevdiyim şeyi sənin üçün də sevirəm. Amma iki nəfərə belə əmir olma, yetimin malına sahib olma"[270] - buyurmuşdur. Allahın elçisi

[270] Müslim, 1826.

Əbu Zərə və başqalarına oruc tutmalarını əmr edərək: "Oruca sarılın, çünki onun tayı-bərabəri yoxdur"- demişdir. Allahın elçisi birinə qəzəblənməməyi əmr etdiyi kimi[271], digər birinə də Allahı daim zikr etməsini əmr etmişdir.[272]

Allah-taala bir bəndəsinin kamilliyini istədikdə, onun istedadı və qabiliyyəti olan şeydəki gücünü və qüvvəsini istifadə etməyə müvəffəq edər və o da, bu yolda gücünü və qüvvəsini istifadə etməklə başqalarından üstün olar. Məsələn, deyirlər ki, filankəs irəliləməkdədir, onun qarşısını ala bilməyənlər isə: "O, qısa yolla ən yüksək məqama çatacaqdır"- deyirlər.

Mədə ağrısından şikayət edən bir xəstə bunun dərmanını içdikdə fayda görür, lakin baş ağrısının dərmanından istifadə etsə, fayda görməz. Nəfsə və həvəsə uyma xəstəliyini, özünü bəyənmə xəstəliyini, çox Quran oxuma, çox elm əldə etmə, zikr etmə, ibadət etmə müalicə etməz. Bunu, ancaq onu qəlbdən çıxarmaqla, onun ziddi olan təvazökarlığı qəlbə yerləşdirməklə müalicə etmək olar.

Əgər: "Çörək yoxsa, su daha üstündür"- soruşulsa, buna: "Yerinə görə çörək, yerinə görə su üstündür"- deyə cavab verilir. Elə isə malı xeyir yolunda sərf edərək şükür etmək saleh bir əməldir ki, bununla qəlbdəki xəsislik getmiş olur. Çünki bu səbəbdən dünya sevgisi qəlbdən çıxır. Bunun sayəsində qəlb Allahı tanımağa və onu sevməyə hazırlanmış olur. Məhz bunlar qəlbdəki xəstəliklərin əlacıdır. Çünki qəlbdəki xəstəlik, qəlbi məqsədindən və qayəsindən uzaqlaşdırır. Zahid olan kasıb, bu xəstəlikdən və müalicəsindən uzaq olduğu üçün istənilən səadəti əldə etmək üçün var qücü ilə çalışır.

"Şəriət çalışmağa təşviq etdiyi halda, kasıblar niyə çalışmırlar?"- deyə soruşulduqda, ona belə cavab verilir: Həkimin bir dərmanı tərifləməsi ilə, məhz dərmanın özü nəzərdə tutulmadığı kimi, özü-özünə o dərmanla hasil olunan şəfadan da üstün olması nəzərdə tutulmur. Çünki əsas təriflənən dərman deyil, hasil olan şəfadır. Odur ki, əməllər də qəlbdəki xəstəliklərin dərmanlarıdır. Qəlbdəki xəstəliklər çox bilinməz. Şəriət qəlbin əməl ilə əldə edilən şəfasına təşviq edir. Belə ki, qan alan kəs xəstəni zəhərli qandan qurtarırsa, zəkat alan kasıb da varlıları simiclik xəstəliyindən qurtarmış olur. Elə isə səbir edənlərin halı, səhhət və gücünü qoruyanların halı kimidir. Şükür edənin halı isə, xəstəlikdən qurtulmaq üçün müxtəlif dərmanlarla müalicə olunan kimidir.

---

[271] əl-Buxari, 6116. Əbu Hureyrənin rəvayəti.

[272] **Səhihdir:** əl-Tirmizi, 3375; İbn Macə, 3793; Əhməd, 4/190; İbn Hibban, 814; əl-Hakim, 1/495.

## Şükrün fəzilətli və üstün olduğunu iddia edənlərin dəlilləri

Şükrün daha üstün olduğunu iddia edənlər, səbrin daha üstün olduğunu iddia edənlərə belə deyirlər: Siz həddinizi aşdınız. Aşağı dərəcədə olan səbir məqamını, özündən üstün dərəcədə olan şükür məqamından yuxarı qaldırırsız. Belə etməklə vəsiləni qayə və məqsəddən, başqasından dolayı etmək istənilən şeyi, məhz edilməsi istənilən şeydən, kamil olan bir əməli daha mükəmməl olan bir əməldən və fəzilətli olan bir şeyi daha fəzilətli olan bir şeydən üstün kimi təqdim edirsiniz. Bundan əlavə, şükrün haqqını tam vermədiniz. Halbuki, Allah-taala yaratdıqlarından tələb etdiyi şükrü Özünün xatırlanmasına yaxın edərək bunların hər ikisini də məxlugatından istəmişdir. Səbir bunlara gedən bir yoldur və bunların xidmətçisi və köməkçisidir. Allah-taala buyurub: **«Belə olduqda siz Məni xatırlayın ki, Mən də sizi yada salım! Mənə şükür edin, Məni danmayın!»** (əl-Bəqərə, 152).

Yenə Allah-taala şükrü imana yaxın edib, insanlar şükür edər və iman gətirərsə, onlara əzab etmək üçün bir qərəzin olmadığını xəbər verərək buyurmuşdur: **«Əgər siz şükür etsəniz və iman gətirsəniz, Allah sizə nə üçün əzab versin ki! Allah şükrə qiymət verəndir, biləndir!»** (ən-Nisa, 147).

Yenə Allah-taala bəndələrindən şükür edənlərə, lütf və ehsanını təhsis etdiyini xəbər verərək buyurmuşdur: **«Beləliklə, onları bir-birilə imtahana çəkdik ki, onlar desinlər: "Əcaba, Allahın aramızda lütfünü rəva görüb bəxş etdiyi kimsələr bunlarmıdır? Məgər Allah şükür edənləri daha yaxşı tanıyan deyildirmi?"»** (əl-Ənam, 53).

Allah-taala insanları şükür edənlər və nankorlar (küfr edənlər) olmaq üzrə iki qismə ayırmış və ən çox məzəmmət etdiyi varlıqların nankorlar olduğunu, ən çox sevdiyi varlıqların isə şükür edənlər olduğunu xəbər vermişdir. Allah-taala insanlar haqqında buyurmuşdur: **«Biz ona haqq yolu göstərdik. İstər şükür edən** (mömin), **istər nankor** (kafir) **olsun»** (əl-İnsan, 3).

Allah-taala Süleyman peyğəmbərdən xəbər verərək buyurmuşdur: **«...**(Süleyman) **onu yanında hazır durmuş görüncə dedi: "Bu, Rəbbimin lütfündəndir. Məni imtahana çəkməyi üçündür ki, görək şükür edəcəyəm, yoxsa nankor olacağam! Kim şükür etsə, yalnız özü üçün şükür edər; kim nankor olsa, həqiqətən, Rəbbim** (onun şükrünə) **möhtac deyil, kərəm sahibidir!"»** (ən-Nəml, 40).

Digər bir ayədə buyurur: **«Yadınıza salın ki, o zaman Rəbbiniz bunu bildirmişdi: "Əgər** (Mənə) **şükür etsəniz, sizə**

(olan nemətimi) **artıracağam. Yox, əgər nankorluq etsəniz, Mənim əzabım, həqiqətən, şiddətlidir!"»** (İbrahim, 7).

Başqa bir ayədə buyurmuşdur: **«Əgər küfr etsəniz** (Allahın nemətlərini dansanız, bunun zərəri Allaha yox, ancaq sizin özünüzə olar)**. Çünki Allah sizə əsla möhtac deyildir. Amma bəndələrinin küfr etməsi Ona xoş getməz. Əgər şükür etsəniz, sizin bu şükrünüz Ona xoş gələr...»** (əz-Zumər, 7).

Qurani Kərimin bir çox yerində şükrün qarşısında ziddi olan küfr zikr edilmişdir. Belə ki, Allah-taala buyurmuşdur: **«Məhəmməd ancaq bir peyğəmbərdir. Ondan əvvəllər də peyğəmbərlər gəlib getmişlər. Əgər o ölsə və ya öldürülsə, siz gerimi dönəcəksiniz? Halbuki, geri dönən şəxs Allaha heç bir zərər yetirməz. Lakin Allah şükür edənlərə mükafat verər»** (Ali- İmran 144).

Şükür edənlər iman nemətilə səbat edib geriyə dönməmişlər, yəni kafir olmamışlar. Allah-taala nemətin artmasını şükrə bağlamışdır. Şükrün sonu olmadığı kimi, Allahın nemətinin də sonu yoxdur.

Allah-taala, varlandırmağı, duanı qəbul etməyi, ruzi verməyi, bağışlamağı və tövbəni qəbul etməyi Öz istəyinə bağladığı halda, şükrün mükafatını sonsuz olaraq verəcəyini vəd etmişdir. Varlandırma haqqında: **«...əgər Allah istəsə, sizi Öz nemətindən mütləq dövlətli edəcəkdir...»** (ət-Tövbə, 28), duanı qəbul etmə haqqında: **«...O əgər istəsə, yalvardığınız bəlanı aradan qaldırar...»** (əl-Ənam, 41), bağışlama haqqında: **«Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlar...»** (ən-Nisa, 48), tövbəni qəbul etmə haqqında: **«...Allah istədiyi kəsin tövbəsini qəbul edər...»** (ət-Tövbə, 15), şükrün mükafatını vermə haqqında isə: **«...Lakin Allah şükür edənlərə mükafat verər....Şükür edənləri də, əlbəttə, mükafatlandıracağıq!»** (Ali-İmran, 145)- buyürmuşdur.

Allahın düşməni İblis, məqamların ən böyüyü və ən yüksəyi olan şükür məqamının qədrini və qiymətini bildikdə, insanları onun yolundan döndərməyə var qüvvəsi ilə çalışacağını xəbər vermişdir: **«Sonra onların qarşılarından və arxalarından, sağlarından və sollarından gələcəyəm və Sən onların əksəriyyətini şükür edən görməyəcəksən!»** (əl-Əraf, 17).

Allah-taala bəndələrindən şükür edənlərin az olduğunu xəbər vermişdir: **«...Bəndələrimdən şükür edəni azdır!»** (Səba, 13).

İmam Əhməd rəvayət edir: "Ömər bin Xəttab bir nəfərin: "Allahım, məni azlardan et!"- dediyini eşitdikdə, demişdir: "Bu azlar kimlərdir?" O da: "Ey möminlərin əmiri, Allah-taalanın: **«...Əslində onunla birlikdə çox az adam iman gətirmişdi»** (Hud, 40), başqa

ayədə: **«...Bəndələrimdən şükür edəni azdır!»** (Səba, 13), yenə başqa ayədə: **«...Yalnız iman gətirib yaxşı işlər görənlərdən savayı! Onlar da çox azdırlar!...»** (Sad, 24),- buyurduğunu eşitməmisən?" - deyə cavab vermişdir. Ömər də: "Doğru söyləyirsən" - demişdir".

Allah-taala yer üzündəki bütün insanlara, göndərdiyi peyğəmbərini şükür etməsinə görə iki dəfə tərifləyərək: **«Ey Nuhla birlikdə mindirib apardığımız** (tufandan xilas etdiyimiz) **kəslərin nəsli! Həqiqətən, o** (Nuh Allahın nemətlərinə) **çox şükür edən bir bəndə idi!»** (əl-İsra, 3)- buyurmuşdur. Bu ayədə Nuh zikr edilərək, bəlli bir qayə üçün istifadə edilməsinə və insanlara onun zürrüyəti olmaları ilə xitab edilməsində ona tabe olmalarına işarə vardır. Çünki Allah-taala məxluqatını tufanda suya qərq etdikdən sonra onun zürrüyətindən başqa nəsil saxlamamışdır. Belə ki, Allah: **«Məhz onun nəslini** (qiyamətə qədər yer üzündə) **baqi etdik»** (əs-Saffat, 77)- buyurmuş və zürrüyətinə şükür etməkdə atalarına oxşamalarını əmr etmişdir. Çünki Nuh çox şükür edən bir bəndə idi.

Allah-taala, Ona şükür edənin ancaq ibadət edən olduğunu, şükür etməyənin isə ibadət əhlindən olmadığını xəbər verərək buyurmuşdur: **«...Əgər Allaha ibadət edirsinizsə, Ona şükür edin!»** (əl-Bəqərə, 172).

Allah-taala, Musa peyğəmbərə ona verilən peyğəmbərliyi, risaləti və kəlamı şükür etməklə almasını əmr edərək buyurmuşdur: **«...Ya Musa! Mən Öz risalətimlə və danışığımla insanlardan səni seçib üstün tutdum. İndi sən verdiyimi al və şükür edənlərdən ol!»** (əl-Əraf, 144).

Həddi-buluğa çatan adama Allah-taalanın ilk tövsiyəsi Ona, valideynlərinə şükür etməsi olmuşdur: **«Biz insana ata-anasına** (yaxşılıq etməyi, valideyninə yaxşı baxmağı, onlarla gözəl davranmağı) **tövsiyə etdik. ...Mənə və ata-anana şükür et. Axır dönüş Mənədir!»** (Loğman, 14).

Yenə Uca Allah razılığının Ona şükür etməkdən irəli gəldiyini xəbər verərək buyurmuşdur: **«...Əgər şükür etsəniz, sizin bu şükrünüz Ona xoş gələr...»** (əz-Zumər, 7). Allah-taala, nemətlərinə şükür edən İbrahim peyğəmbərdən xəbər verərək buyurmuşdur: **«Həqiqətən, İbrahim Allaha müti, batildən haqqa tapınan bir imam idi. O, heç vaxt müşriklərdən olmamışdı. O,** (Allahın) **nemətlərinə şükür edən idi...»** (ən-Nəhl, 120-121). Yəni Allah-taala İbrahimin, onun xeyirdə nümunəvi öndər olduğunu, Allaha daimən itaət və ibadət etdiyini, yalnız Ona yönəlib başqalarından üz çevirdiyini xəbər vermiş, sonra bu sifətlərlə birgə olmasını, Allahın nemətlərinə şükür edən olmasıyla bitirərək Xəlilullahın qayə və

məqsədi etmişdir.

Allah-taala bəndələrin yaradılmasının qayəsini xəbər verərək belə buyurmuşdur: **«Allah sizi analarınızın bətnlərindən heç bir şey bilmədiyiniz halda çıxartdı. Sonra sizə qulaq, göz və qəlb verdi ki, bəlkə, şükür edəsiniz!»** (ən-Nəhl, 78). Digər ayədə buyurmuşdur: **«Həqiqətən, Bədrdə zəif olduğunuz halda, Allah sizə yardım etdi.** (Allaha) **şükür edən olmaq üçün Allahdan qorxun!»** (Ali-İmran, 123). Ayədəki «şükür edən» sözü, onları zəfər çalan etməsinin və onlara təqvanı əmr etməsinin vəsiləsi ola bilər. Allahın məxluqatını yaratmasının və onlara əmr etməsinin hikməti şükür etməkdir. Belə ki, Uca Allah əmrinin və peyğəmbər göndərməsinin qayə və hikmətini belə açıqlayır: **«Həmçinin sizə ayələrimizi oxumaq, sizi təmizləmək, Kitabı, hikməti və bilmədiklərinizi öyrətmək üçün sizə öz içərinizdən bir peyğəmbər göndərdik. Belə olduqda siz Məni xatırlayın ki, Mən də sizi yada salım! Mənə şükür edin, Məni danmayın!»** (əl-Bəqərə, 151-152).

Əgər səbir başqasından ötrü arzu edilirsə, şükür ancaq bizim özümüzə aid edilir. Səbir şükrə apardığı üçün tərifəlayiqdir. Ona görə, səbir şükrün xidmətçisidir.

əl-Buxari və Müslimin əsərlərində rəvayət olunduğuna görə, Allahın elçisi namaz qıldığı vaxt ayaqları şişənə qədər dururdu. Ona: "Sən niyə belə edirsən? Halbuki, Allah-taala sənin keçmiş və gələcək bütün günahlarını bağışlamıştır"- deyildikdə, o: "Şükür edən qul olmayımmı?"- deyə cavab vermişdir.[273]

İmam Əhmədin "Müsnəd" əsərində və ət-Tirmizinin etdiyi rəvayətdə deyilir: "Allahın elçisi Muaza: "Allaha and olsun mən səni sevirəm, hər namazın sonunda: "Allahım, mənim Səni zikr etməyimə, Sənə şükür etməyimə və Sənə gözəl şəkildə ibadət etməyimə yardım et!"— deməyi unutma demişdir."[274]

İbn Əbi əd-Dünyanın rəvayət etdiyinə görə, İbn Abbas demişdir: "Allahın elçisi buyurmuşdur: "Dörd şey vardır ki, onlar kimə verilirsə, dünya və axirət xeyri verilmiş olur: "Şükür edən qəlb, zikr edən dil, bəlaya səbir edən bədən və malına və özünə xəyanət etməyən qadın."[275]

Yenə İbn Əbi əd-Dünyanın rəvayətinə görə, Aişə demişdir: "Allahın elçisi buyurmuşdur: "Allah, quluna bir nemət verdikdə o da

[273] əl-Buxari, 4836; Müslim, 2819.

[274] **Səhihdlr:** əl-Buxari, "əl-Ədəbul-Mufrəd", 690; Əbu Davud, 1522; ən-Nəsai, 3/35.

[275] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 34; əl-Beyhəqi, "Şuabul-İman", 4429; əl-Tabərani, "əl-Kəbir", 11275, "əl-Əvsat", 7212; Əbu Nəim, "əl-Hilyə", 3/65.

onun Allahdan olduğunu bilirsə, mütləq onun üçün şükür savabını yazar. Allah, qulunun etdiyi günahına görə peşman olduğunu gördükdə, mütləq o istiğfar etmədən əvvəl onu bağışlayar. Bir nəfər bir dinara bir paltar alıb, onu geyinib və Allaha həmd edərsə, o paltar dizindən aşağı keçməmiş Allah onu bağışlayar. "[276]

Müslimin "əs-Səhih" əsərində Allahın elçisinin belə dediyi rəvayət olunur: "Şübhə yoxdur ki, yeməkdən sonra buna görə Allaha həmd edən, suyu içdikdən sonra buna görə Allaha həmd edən qulundan Allah razı olur."[277]

Bu böyük mükafat, yəni Allahın razı olması, mükafatların ən böyüyüdür. Allah buyurmuşdur: **«...Allahdan olan bir razılıq isə daha böyükdür...»** (ət-Tövbə, 72).

Hədislərin birində deyilir: "Uca Allah bir quluna şükür etməyi bəxş edərsə, onu artığından məhrum etməz, Çünki Allah: **«...Əgər** (Mənə) **şükür etsəniz, sizə olan nemətimi artıracağam..."»** (İbrahim, 7)- buyurmuşdur."[278]

Həsən əl-Bəsri demişdir: "Allah-taala neməti ilə dilədiyi qədər faydalandırır. Nemətə şükür edilmədiyi təqdirdə onu əzaba çevirir."[279] Bundan əlavə şükrə "hafiz"- qoruyucu adı da verilmişdir. Çünki şükür mövcud olan nemətləri qoruyur, mövcud olmayan nemətlərin əldə edilməsinə isə vasitəçi olur.

Əli bin Əbu Talib Həmədanlı bir adama: "Nemətə şükür ilə çatmaq olar. Şükürlə nemət artar. Şükür ilə nemət bir yerdədirlər. Quldan şükür kəsilmədikcə, Allahın da nemətinin artması kəsilməz" — demişdir.[280]

Ömər bin Abduləziz demişdir: "Allahın nemətlərini Allaha şükür etməyə bağlayın "[281]. Şükür nemətlərin bağıdır.

Mutarrif bin Abdullah demişdir: "And olsun ki, sağlam olarkən şükür etməyim, bəlaya düçar olub səbir etməyimdən daha xeyirlidir."[282]

Həsən əl-Bəsri demişdir: "Əlinizdə olan nemətlərdən daima

---

[276] **Çox zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur". 47; əI-Beyhəqi, "Şuabul-İman", 4/253.
[277] Müslim, 2734.
[278] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 3; əl-Beyhəqi, "Şuabul-İman", 4208;
[279] İbn Əbi əd-Dünya, "əş-Şukur", 17. Deyirəm: sənədi zəifdir.
[280] İbn Əbi əd-Dünya, "aş-Şukur", 18. Deyirəm: sənədi zəifdir.
[281] İbn Əbi əd-Dünya, "əş-Şukur", 27; əl-Beyhəqi, "Şuabul-İman", 4226; Əbu Nəim, "Hilyətul-Övliya", 5/340. Deyirəm: sənədi zəifdir.
[282] İbn Əbi əd-Dünya, "əş-Şukur", 28, 65, 185; əl-Beyhəqi, "Şuabul-İman", 4121; Əhməd, "əz-Zühd", səh. 242; Vaki'i, "əz-Zühd", 201; Əbu Nəim, "əl-Hilyə", 2/200; Abdurrəzzaq, 20467. Deyirəm: sənədi səhihdir.

söhbət açın. Çünki nemətləri xatırlamaq şükürdür".[283] Allah-taala elçisinə Rəbbinin nemətlərini xatırlamasını əmr etmişdir: **«Və** (həmişə) **Rəbbinin sənə olan nemətindən söhbət aç!»** (əd-Duha, 11). Allah-taala daima quluna verdiyi nemətinin əsər-əlamətini (izini) onda görməyi sevir. Çünki quluna verdiyi nemətin izinin görünməsi dillə şükürdür.

Sufyan əs-Səvri demişdir: "Davud peyğəmbər Allaha Üzünün kəráminə və Cəlalının izzətinə layiq həmd olsun demişdir. Allah da: **«Ey Davud, mələkləri savab yazmaqdan yordun»** - deyə vəhy etmişdir”.[284]

Əbu Rəca əl-Utaridi demişdir: "Bir gün İmran bin Huseyn əynində nə bundan əvvəl, nə də bundan sonra görmədiyim ipək paltarda yanımıza gəldi və Allahın elçisinin: "Allah-taala bir quluna verdiyi nemətinin əlamətini qulunda görməyi sevir" — buyurduğunu dedi. "[285]

Amr bin Şueyb atasından, atası da öz atasından, o da Allahın elçisindən onun belə dediyini rəvayət etmişdir: "Təkəbbürlük etmədən, israf etmədən yeyin-için, sədəqə edin. Çünki Allah-taala verdiyi nemətinin əlamətini qulunda görməyi sevir."[286]

Əbu əl-Əhvas atasından nəql edir: "Mən pərişan halda Allahın elçisinin yanına gəldim. O məndən soruşdu: Malın varmı? Mən: Bəli - dedim. Allahın elçisi soruşdu: Nəyin var? Mən də: "Hər cür malım var. Allah mənə dəvə, at, qoyunlar verdi" - dedim. Sonra Allahın elçisi: "Elə isə Allah sənə nemət veribsə, o nemətləririn əsər-əlaməti və şərəfi üstündə görünsün" - buyurdu."[287]

Bir mürsəl hədisdə deyilir: “Allah-taala qulunun yeməsində, içməsində nemətinin əlamətini görməyi sevir."[288]

Bəkr bin Abdullahın mərfu olaraq rəvayət etdiyi hədisdə deyilir: "Bir nəfərə sərvət verilərsə, onun üzərində nemətin əlaməti

---

283 İbn Əbi əd-Dünya, "əş-Şukur", 33; əl-Beyhəqi, "Şuabul-İman", 4107; İbn Mübarək, "əz-Zühd", 1434. Deyirəm: sənədi zəifdir.
284 **Səhihdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 37; əl-Beyhəqi, "Şuabul-İman", 4262.
285 **Səhihdir:** Əhməd, 4/438; İbn Əbi əd-Dünya, "əş-Şukur", 50; əl-Beyhəqi, "Şuabul-İman", 6200; İbn Sad, "ət-Tabaqat"; 4/291; ət-Tabərani, "əl-Kəbir", 8/112/281; və s.
286 İbn Əbi əd-Dünya, "əş-Şukur", 51; Əhməd, 2/181; əl-Hakim, 4/135; əl-Beyhəqi, "Şuabul-İman", 4251; İbn Sad, "ət-Tabaqat"; 4/291; ət-Tabərani, "əl-Kəbir", 8/112/281; və s. Deyirəm: ümumən hədis səhihdir.
287 **Səhihdir:** Əbu Davud, 4063; ət-Tirmizi, 2006; ən-Nəsai, 8/196; Əhməd, 3/473, 4/136-137; ət-Təyalisi, 1303-1304; İbn Əbi əd-Dünya, "əş-Şukur", 52; İbn Hibban, 3410, 5416-5417; əl-Hakim, 4/181; İbn Sad, 6/28; ət-Tabərani. 19/607/622; və s.
288 **Çox zəifdir:** İbn Əbi əd-Dünya, “əş-Şukur", 53.

görünərsə, ona Allahın dostu və Allahın nemətini anladan deyilir. Bir nəfərə sərvət verilərsə, onun üzərində nemətin əlaməti görünməzsə, ona da Allahın məzəmmət etdiyi və Allahın nemətinin düşməni deyilir."[289]

Fudayl bin İyad demişdir ki, belə nəql edirlər: "Bir nəfər Allahın nemətini qəlbi ilə bilib, dili ilə həmd edərsə, bu həmdi tamam olmadan Allah onun nemətini artırır. Çünki, Allah-taala: **«Əgər** (Mənə) **şükür etsəniz, sizə olan nemətimi artıracağam»** (İbrahim, 7) - buyurmuşdur. Və dedi: "Nemət haqqında danışmaq şükürdəndir."[290]

Allah-taala bir qüdsi hədisdə demişdir: "Ey Adəm övladı! Mənim nemətim içində olduğun halda, daima Mənə qarşı günah işlədirsən. Məndən qorx, əks halda Mənə qarşı etdiyin günahlara görə səni pərişan edərəm. Ey Adəm övladı, Məndən qorx və istədiyin yerdə yat"[291]

əş-Şabi demişdir: "Şükür imanın yarısıdır, yəqinlik imanın hamısıdır."[292]

Əbu Qilabə demişdir: "Şükür etsəniz dünya sizə zərər verməz."[293]

Həsən əl-Bəsri demişdir: "Allah-taala bir qövmə nemət verəndə onlardan şükür etmələrini istəyər. Əgər şükür edərlərsə, nemətlərini artırmağa qadirdir. Əgər nankorluq edərlərsə, nemətini onların əleyhinə əzaba çevirməyə qadirdir."[294]

Allah-taala nemətlərinə şükür etməyən nankorları məzəmmət etmişdir.

Həsən əl-Bəsri demişdir: "**«İnsan öz Rəbbinə qarşı çox nankordur»** (əl-Adiyat, 6), başına gələn müsibətləri sayar, nemətləri unudar.[295] Bu səbəbdən Allahın elçisi Cəhənnəm əhlinin çoxunun qadınlar olduğunu xəbər vermişdir: "Onlardan birinə dünya qədər yaxşılıq etsən, sonra səndən (xoşuna gəlməyən) bir şey görsə: "Mən səndən heç bir xeyir görmədim"- deyər."[296]

Əgər ərinin nemətinin şükrünü tərk edənin halı belə olursa,

---

[289] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 54; "əl-İyal", 364.
[290] İbn Əbi əd-Dünya, "əş-Şukur", 56. Deyirəm: sənədi zəifdir.
[291] **Zəifdir:** İbn Əbi əd-Dünya, "aş-Şukur", 57; əl-Beyhəqi, "Şuabul-İman", 4215.
[292] **Həsəndir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 58; əl-Beyhəqi, "Şuabul-İman", 4448.
[293] İbn Əbi əd-Dünya, "əş-Şukur", 59. Deyirəm: sənədi həsəndir.
[294] İbn Əbi əd-Dünya, "əş-Şukur", 60; əI-Beyhəqi, "Şuabul-İman", 4216. Deyirəm: sənədi səhihdir.
[295] İbn Əbi əd-Dünya, "əş-Şukur", 62; əl-Beyhəqi, "Şuabul-İman", 4629. Deyirəm: sənədi səhihdir.
[296] əl-Buxari, 29; Müslim, 907.

Allah nemətinin şükrunü tərk edənin halı gör necə olur.

Şair yaxşı deyib:

Ey işində zülm edən kimsə!
Zülm, zülm edən kimsənin əleyhinə döndəriləcəkdir.
Sən bu zülmünə nə vaxta qədər davam edəcəksən?
Müsibətlərdən şikayət edirsən, nemətləri unudursan.[297]

İbn Əbi əd-Dünyənin rəvayətinə görə Nüman bin Bəşir söyləmişdir: "Allahın elçisi demişdir: "Neməti xatırlamaq şükürdür. Neməti xatırlamağı tərk etmək nankorluqdur. Aza şükür etməyən, çoxa şükür etməz. İnsanlara şükür etməyən Allaha şükür etməz. Camaat bərəkətdir. Camaatdan ayrılmaq əzabdır".[298]

Mutarrif bin Abdullah demişdir: "Sağlamlığa və şükrə baxdım, hər ikisində həm dünyanın, həm də axirətin xeyrini gördüm. And olsun ki, sağlam olarkən şükür etməyim, bəlaya düçar olub səbir etməyimdən daha xeyirlidir".[299]

Bəkir bin Abdullah əl-Müzəni demişdir: "Belində yük olan bir hambal: "Allaha həmd olsun, Allahım məni bağışla" - deyərkən gördüm. Mən onun çiynindən yükünü düşürməsini gözləyib, ondan soruşdum: "Bundan başqa bir şey bilmirsən?" O: "Çox şey bilirəm... Allahın kitabını oxuyuram. Yalnız qul, nemətlə günah arasındadır. Allah-taalaya verdiyi nemətlərinə görə həmd edirəm. Günahlarıma görə bağışlamasını diləyirəm"- dedi. Bəkir bin Abdullah dedi: "Hambal Bəkirdən daha fəqihdir (elmlidir)".[300]

Ət-Tirmizinin rəvayət etdiyinə görə, Cabir bin Abdullah demişdir: "Allahın elçisi əshabələrinin yanına gəlib onlara «ər-Rəhman» surəsini əvvəlindən axırına qədər oxudu, onlar sakit durdular. Allahın elçisi dedi: "Cin gecəsində mən bu surəni cinlərə oxuyanda onlar sizdən daha gözəl cavab verdilər. **«**(Ey cinlər, insanlar!) **Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!»** (ər-Rəhman, 13) ayəsinə çatanda, onlar: "Xeyr, ey Rəbbimiz! Nemətlərindən heç bir şeyi təkzib etmirik. Həmd Sənə məxsusdur!" - dedilər ".[301]

Mis'ar dedi: "Davudun ailəsinə: **«... Siz ey Davud ailəsi!**

---

[297] İbn Əbi əd-Dünya, "əş-Şukur", 63; əl-Beyhəqi, "Şuabul-İman", 4630.

[298] **Həsəndir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 64; əl-Beyhəqi, "Şuabul-İman", 4105. Deyirəm: sənədləri çox zəif və həsən olsada ümumən hədis həsəndir.

[299] İbn Əbi əd-Dünya, "əş-Şukur", 28, 65, 185; əl-Beyhəqi, "Şuabul-İman", 4121; Əhməd, "əz-Zühd", səh. 242; Vaki'i, "əz-Zühd", 201; Əbu Nəim, "əl-Hilyə", 2/200; Abdurrəzzaq, 20467. Deyirəm: sənədi səhihdir.

[300] İbn Əbi əd-Dünya, "əş-Şukur", 66. Deyirəm: sənədi zəifdir.

[301] **Həsəndir:** ət-Tirmizi, 3291; əl-Hakim, 2/473: İbn Əbi əd-Dünya, "əş-Şukur". 69; əl-Beyhəqi, "Şuabul-İman", 4013.

(Allaha) **şükranlıqla itaət edin!...»** (Səba, 13) deyiləndə, elə bir saat yox idi ki, onun qövmündən olanlar o saatda namaz qılmasın."[302]

Avn bin Abdullah demişdir: "Fəqihlərdən biri: "Mən xeyir olan hər işlə bərəbər şəri gördüm. Ancaq sağlamlıqla şükürdə şər yoxdur. Bəlaya uğrayanların bir çoxu şükür edər, sağlam olanların bir çoxu şükür etməz. Siz Allahdan hər ikisini istəyin".[303]

Əbu Ümamə demişdir: "Ömər bin Xəttab paltar geyinib çiyinlərinə çatmamış: "Övrətimi örtəcək və həyatımı bəzəyəcək paltarı mənə geydirən Allaha həmd olsun!"- dedikdən sonra qollarını keçirib paltarı geyindi və biləklərindən uzun hissəsini kəsdi. Sonra dedi: "Allahın elçisi belə deyərkən eşitdim: "Bir kimsə təzə paltar geyinər və: "Övrətimi örtəcək və həyatımı bəzəyəcək paltarı mənə geydirən Allaha həmd olsun!" - deyər və qısaltdığı paltarı başqasına sədəqə edərsə, sağlığında və ölümündə Allahın hifzində və himayəsində olar".[304]

Avn bin Abdullah demişdir: "Bir nəfər təzə paltar alıb geyinərək Allaha həmd edərsə, Allah onu bağışlayar", Bunu eşidən adam: "Gedim bir paltar alım geyinim və Allaha həmd edim" - dedi".[305]

Şureyh demişdir: "Bir adamın başına bir müsibət gələrsə, mütləq bu müsibətdə Allahın üç neməti vardır. Birincisi, o müsibətin dinində olmamasıdır. İkincisi, o müsibətdən daha böyüyünün olmamasıdır. Üçüncüsü, o müsibət mütləq onun başına gəlməli idi, gəldi".[306]

Ömər bin Abdul-Əzizin oğlu Abdullah demişdir: "Atam Ömər bin Abdul-Əziz, özünə Allahın bəxş etdiyi nemətə baxarkən mütləq: "Allahın nemətini küfrə çevirməkdən, onu tanıdıqdan sonra nankorluqdan və onu təriflədikdən sonra unutmaqdan Sənə sığınıram"- deyərdi".[307]

Ruh bin əl-Qasım demişdir: "Özünü ibadətə həsr edən bir nəfər: “Nə xurma qurumuşu yeyərəm, nə də şükrünü edərəm"- deyərkən bunu eşidən Həsən əl-Bəsri demişdir: "Bu axmaq adam içdiyi soyuq suyun şükrünü edə bilirmi?"[308]

---

[302] **Səhih məqtu'u:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 64; əl-Beyhəqi, "Şuabul-İman", 4524.

[303] İbn Əbi əd-Dünya, "əş-Şukur", 77. Deyirəm: sənədi zəifdir.

[304] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 75; İbn Mübarək, 749; əI-Hakim, 4/1944; ət-Tirmizi, 4560; İbn Macə, 3557; Əhməd, 1/44.

[305] İbn Əbi əd-Dünya, "əş-Şukur", 76. Deyirəm: sənədi çox zəifdir.

[306] İbn Əbi əd-Dünya, "əş-Şukur", 80.

[307] İbn Əbi əd-Dünya, "əş-Şukur", 67. Deyirəm: sənədİ zəifdir.

[308] **Səhihdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 72; əl-Beyhəqi. "Şuabul-İman", 4263; Əhməd, "əz-Zühd", 264.

Qüdsi hədisdə Allah-taala deyir: "Ey Adəm oğlu! Mənim xeyrim sənə nazil olur (gəlir), amma sənin etdiyin pisliklər Mənə yüksəlir. Mən səni nemətlərimlə sevirəm, sən isə günahlarınla Mənə qəzəblənirsən. Şərəfli bir mələk sənin qəbahətlərini dayanmadan mənə yüksəldir".[309]

Əbu Əli demişdir: "Qonşumun gecə vaxtı belə dediyini eşitdim: "Ya Allah! Sənin xeyrin Mənə enməkdədir, mənim pisliklərim Sənə yüksəlməkdə. Neçə şərəfli mələk mənim çirkin əməllərimi Sənə yüksəldir. Sənin mənə ehtiyacın olmadığın halda, məni nemətlərinlə sevirsən. Mən Sənə həmişə möhtac olduğum halda, günahlarla Sənə qəzəblənirəm. Sən bu xüsusda mənə dəstək olur, günahlarımı örtür və mənə ruzi verirsən".[310]

Əbu Muğəyrədən: “Ey Məhəmmədin atası, sabahı necə açdın?"- soruşulduqda, belə cavab verdi: "Allahın nemətlərinə qərq olaraq və onların şükründən aciz olaraq sabahladıq. Rəbbimiz bizə möhtac olmadığı halda bizi sevir, biz isə ona möhtac olduğumuz halda ona qəzəblənirik".[311]

Abdullah bin Sə'ləbə belə demişdir: "İlahi! Kəramınə görə Sənə itaət edilib üsyan edilməz, mülayimliyinə görə Sənə üsyan edilir, sanki Sən görmürsən. Yer üzündəkilər hər an Sənə üsyan etdikləri halda Sən onlara yaxşılıq edirsən".[312]

Müaviyə bin Qurrə təzə paltar geyərkən: "Bismilləh vəlhəmdulilləh (Allahın adı ilə, Allaha həmd olsun!)"- deyərdi.[313]

Ənəs bin Malik demişdir: "Bir qul özünü ibadətə həsr edirsə, Allah-taala onun ruzisini göylərdən və yerdən keçirərək insanlara təslim edər, onlar da onu hazır vəziyyətə gətirirlər, sonra o ruzi o qula verilər. O qul ruzini aldıqda şükür etməsi vacib olar, əgər şükür etməzsə, həmd-sənaya layiq olan Allah o ruzini Özünə şükür edən kasıb qullarına verər".[314]

Bir nəfər Əbu Təmimidən soruşdu: "Sabahı necə açdın? O: "İki nemət arasında sabahladım. Onlardan hansının üstün olduğunu bilmirəm. Birincisi, Allah-taalanın günahlarımı örtməsidir. Bu səbəbdən heç kim mənə onlara görə ayıb etmir. İkincisi, Allah-taalanın insanların qəlbinə mənə qarşı sevgi hissini qoymasıdır ki,

---

309 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 43; əl-Beyhəqi, "Şuabul-İman", 4269; Əbu Nəim, "əl-Hilyə", 2/377.
310 İbn Əbi əd-Dünya, "əş-Şukur", 44.
311 İbn Əbi əd-Dünya, "əş-Şukur", 45.
312 İbn Əbi əd-Dünya, "əş-Şukur", 46; Əbu Nəim, "əl-Hilyə", 6/246.
313 İbn Əbi əd-Dünya, "əş-Şukur", 48.
314 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur". 49.

mən ona əməlimlə çatmamışam"- cavabını verdi".[315]

Abdullah bin Səlam dedi: "Musa peyğəmbər soruşdu: "Ey Rəbbim! Sənə layiq olan şükür nədir?" Allah-taala cavab verdi: "Dilin daima zikrilə məşğul olsun".[316]

Əbu Hureyrə demişdir: "Qubalı ənsarlardan bir nəfər Allahın elçisini dəvət etdi, birlikdə getdik. Allahın elçisi yeməyini yeyib, əllərini yaxalayarkən belə dua etdi: "Yedirən, yedirilməyən, bizə bəxş edən, bizə doğru yolu göstərən, bizi doyuran və içirən, hər gözəl bəla ilə imtahan edən, məclisindən qovulmayan və tərk olunmayan, bizi nemətinə küfr edənlərdən etməyən və hər zaman Özünə ehtiyac duyulan Allaha həmd olsun. Yemək yedirən, içirən, çılpaqları geyindirən, zəlalətdən qurtarıb doğru yola gətirən, zülmətdən nura çıxaran, məxluqatlarının bir çoxundan bizi üstün edən Allaha həmd olsun. Aləmlərin Rəbbinə həmd olsun!"[317]

Hüseyn bin Sabahın "Müsnəd" əsərində Ənəs bin Malikdən Allahın elçisinin belə dediyi rəvayət olunur: "Allah-taala bir quluna mal və ya övlad neməti verdikdə, o da: **"Maşallah və lə quvvətə illa billah**"- deyərsə, onlarda ölümdən haşqa bir bəla görməz”.[318]

Aişə demişdir: "Allahın elçisi evə girəndə yerə düşmüş çörək qırıntılarını gördü, onları təmizlədi və: "Ey Aişə! Allahın sənə verdiyi bu nemətlərin qədir-qiymətini bil, çünki bir nemət bir evdən uzaqlaşarsa, onlar asanlıqla geri qayıtmaz"- buyurdu".[319]

İmam Əhmədin etdiyi rəvayətə görə Əbi əl-Xələd belə demişdir: "Davud peyğəmbərin dua edərkən belə dediyini oxudum: "Ya Rəbb! Sənə necə şükür edim. Çünki Sənin şükrünə ancaq Sənin nemətinlə yetişərəm". Buna cavab olaraq: "Ya Davud! Səndə olan nemətlərin hamısının Məndən olduğunu bilmirsən?" O da: "Bilirəm, ya Rəbb!"- dedi. Uca Allah: "Bunu bilərək şükür edərsən səndən razı olaram" - buyurdu".[320]

Səid bin Abdul-Əziz demişdir: "Allah nemət verib şükür etdirən, bəla verib səbir etdirən, hər cür qüsur və nöqsandan uzaqdır" duası

---

315 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 40.

316 **Səhihdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 39; Əbu Yala, "Tabaqat əl-Hənəbilə". 1/194; İbn Mübarək, əz-Zühd", 942; əl-Beyhəqi, "Şuabul-İman", 114.

317 **Həsəndir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 15; əl-Hakim, 1/546; əl-Beyhəqi, "Şuabul-İman", 4067; İbn Sünni, 487; Ibn Hibban, 5219; Əbu Nəim, "al-Hilyə", 6/246.

318 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 1: Əbu Yəla, "Tabaqat əl-HənəbiIə", 1/193; əl-Beyhəqi, "əl-Əsma vas-Sifət", 339.

319 **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 2; əl-Beyhəqi, "Şuabul-İman", 4236.

320 **Çox zəifdir:** Əhməd, "əz-Zühd", 91; Əbu Nəim, "əl-Hilyə", 6/56; İbn Əbi əd-Dünya, "əş-Şukur", 5; əl-Beyhəqi, "Şuabul-İman", 4101.

Davud peyğəmbərin dualarındandır".[321]

İmam Əhməd Abdullah bin Harisin belə dediyini rəvayət etmişdir: "Allah-taala Davud peyğəmbərə: "Məni sev, ibadətimi sev və Məni bəndələrimə sevdir!"- deyə vəhy etmişdir. O da: "Ya Rəbb! Bu sevgi, Sənə və bəndələrinə aiddir. Mən Səni bəndələrinə necə sevdirim?"- soruşdu. Uca Allah buna cavab olaraq: "Mənim haqqımda onların yanında gözəl tərzdə danış ki, onlar Məndən ancaq gözəl olanları bilsinlər"- buyurmuşdur".[322]

Rəbbimin Əzəməti və Cəlalı çox yüksəkdir, Adı çox mübarəkdir, Şanı çox ucadır, Sifətləri çox müqəddəsdir, Sənası çox böyükdür. Ondan başqa bir məbud yoxdur!

İmam Əhməd demişdir: "Bizə Abdur-Rəzzaq bin İmran dedi ki: "Vəhb belə deyerkən eşitdim: "Mən Davud ailəsinin kitabında bunların yazıldığını gördüm: "Allah-taala buyurur ki: "İzzət və Cəlalıma and olsun, əgər bir nəfər Mənə sarılarsa, göydəkilər və yerdəkilər ona pislik etmək istəsələr, Mən onun üçün çıxış yolu qoydum. Bir nəfər Mənə sarılmazsa, onun göydəki çarələrini kəsərəm, ayaqlarının altındakı torpağı yerə batırıb onun işini təxirə salaram, sonra onu öz başına buraxaram. Mən quluma mal cəhətindən kifayətəm, qulum Mənə itaət və ibadətdə olarsa, Məndən istəməmiş ona verərəm. Mənə dua etməzdən əvvəl duasını qəbul edərəm. Mən onun ehtiyacını ondan daha yaxşı bilirəm".[323]

İmam Əhməd Səyyardan, o da Həfsdən, o da Sabitdən nəql etdi ki, Sabit deyib: "Davud peyğəmbər gecə ilə gündüzün saatlarını ailəsi arasında bölüşdürdü. Gecə ilə gündüzün hər saatında mütləq Davudun ailəsindən biri namaz qılardı. Çünki Allah-taala bu ayəni onlar üçün nazil etdi: **«... Siz ey Davud ailəsi!** (Allaha) **şükranlıqla itaət edin! Bəndələrimdən şükür edən azdır!...»** (Səba, 13)".[324]

İmam Əhməd Cabir bin Zeyddən, o da Muğirə bin Uyəynədən nəql olunmuş rəvayətdə xəbər verir ki: "Davud peyğəmbər: "Ya Rəbbi! Bu gecə məxluqatından biri Səni məndən çox zikr etdimi?" - dedi. Uca Allah: "Bəli, qurbağalar" - dedi. Davud peyğəmbər: "Ya Rəbb! Sənin şükrünə gücüm necə yetər? Axı mənə nemət verən Sənsən, bir nemətdən sonra digərini verirsən, nemətlər də Səndən, şükür də Səndəndir. Buna görə Sənin şukrünə gücüm necə yetər?" Uca Allah da: "Ya Davud, indi Məni tanıdın" - buyurdu".[325]

İmam Əhməd Abdur-Rəhmandan, o da Rəbi'i bin Sabihdən nəql

---

321 **Zəifdir:** Abdullah bin Əhməd, "Zəvaid əz-Zühd", səh. 98.
322 Abdullah bin Əhməd, "Zəvaid əz-Zühd", səh. 91.
323 Əbu Nəim, 4/25-26; İbn Mübarək, "əz-Zühd", 318.
324 Əhməd, "əz-Zühd", 1/141; Əbu Nəim, "əl-Hilyə", 2/327.
325 Əhməd, "əz-Zühd", səh. 88; əl-Beyhəqi, "Şuabul-İman", 4100.

etdi ki, Həsən əl-Bəsri demişdir: "Davud peyğəmbər: "Ya Rəbb! Hər tükümün iki dili olarsa, dünya durduqca gecə-gündüz Səni təsbih etsələr, verdiyin bir nemətin haqqını ödəyə bilmərəm" - dedi".[326]

İbn Əbi əd-Dünya Əbu İmran əl-Cuvvənidən nəql etdi ki, Əbi əl-Xələd demişdir: "Musa peyğəmbər: "Ya Rəbb! Sənə necə şükür edim? Bütün əməllərim, mənə ehsan etdiyin nemətlərin ən kiçiyini belə əvəz edə bilməz" - dedi. Uca Allah: "Ya Musa, indi Mənə şükür etmiş oldun" - deyə vəhy etdi".[327]

Bəkir bin Abdullah demişdir: "Bir adam, "əlhəmdulilləh" ("Allaha həmd olsun") deyərsə, mütləq buna görə ona bir nemət verilər. Bu nemətin mükafatı təkrar "əlhəmdulilləh" deməkdir. Bunu söylədiyinə görə təkrar bir nemət də verilir. Beləcə, Allahın nemətləri qurtarmaz".[328]

Həsən əl-Bəsri demişdir: "Allahın elçisi bir nəfərin: **"Əlhəmdulilləhi bil-isləm"** ("İslama görə Allaha həmd olsun") - dediyini eşitmiş və ona: "Böyük bir nemətə görə Allaha həmd edirsən".[329]

Xalid bin Mi'dan demişdir ki, Abdul-Məlik bin Mərvan belə deyərkən eşitdim: "Bir nəfərin **"əlhəmdu-lil-ləhi-lləzi ənamə aleynə va hədənə lil-isləm"** ("Bizə nemətini verən və islama yönəldən Allaha həmd olsun") deməsinə görə, Allah dərgahında şükür etmə xüsusunda bundan daha üstün, daha sevimli bir dua yoxdur".[330]

Süleyman bin ət-Teymi demişdir: "Allah-taala, Öz əzəmətinə layiq şəkildə bəndələrini nemətləndirir. Onlardan qüdrətlərinə görə şükür etmələrini istəyir".[331]

Həsən əl-Bəsri sözünə belə başlayardı: "Həmd Allaha məxsusdur. Ey Rəbbimiz! Bizi yaratdığın, bizə ruzi verdiyin, bizə doğru yolu göstərdiyin, bizi öyrətdiyin, bizi pozğunluqdan qurtardığın, bizim qəm-qüssəmizi apardığın üçün, ancaq Sənə həmd edirik. İslama, Qurana görə Sənə həmd olsun! Bizə ailə, mal və can sağlığı verdiyin, düşmənlərimizi pərişan etdiyin, bizə bol-bol ruzi verdiyin, bizə əmin-amanlıq verib bir yerə yığdığın, bizə gözəl

---

[326] İbn Əbi əd-Dünya, "əş-Şukur", 25; Əhməd, "əz-Zühd", səh. 88; əl-Beyhəqi, "Şuabul-İman", 4259. Deyirəm sənədlər zəif və səhihdir.
[327] İbn Əbi əd-Dünya, "əş-Şukur", 6; Əhməd, "əz-Zühd", səh. 85; əl-Beyhəqi, "Şuabul-İman", 8/360. Deyirəm sənədləri çox zəifdir.
[328] İbn Əbi əd-Dünya, "əş-Şukur", 7; əl-Beyhəqi, "Şuabul-İman", 4095. Deyirəm sənədi zəifdir.
[329] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur”, 9; əl-Beyhəqi, "Şuabul-İman'", 4179. Deyirəm sənədi zəifdir.
[330] İbn Əbi əd-Dünya, "əş-Şukur", 10. Deyirəm sənədi həsəndir.
[331] İbn Əbi əd-Dünya, "əş-Şukur", 8; əl-Beyhəqi, "Şuabul-İman", 4578.

sağlamlıq verdiyin və istədiyimiz hər şeyi verdiyin üçün, Sənə çoxlu həmd-sənalar olsun! Ey Rəbbimiz! Bizə verdiyin köhnə, təzə, gizli, aşkar, xüsusi, ümumi nemətlər üçün, ancaq Sənə həmd olsun! Sağ olsaq da, meyit olsaq da Sənə həmd olsun! Razı olana qədər və razı olanda da həmd Sənədir".[332]

Həsən əl-Bəsri demişdir: "Musa peyğəmbər: "Ya Rəbb! Adəm peyğəmbər Sənin ona verdiyin nemətlərinin şükrünü necə ödəyə bilər? Axı Sən onu Öz əlinlə yaratdın, ona ruhundan üfürdün, onu Cənnətə saldın, ona mələklərin səcdə etməsini əmr etdin və onlar da səcdə etdilər". Buna cavab olaraq Uca Allah buyurdu: "Ya Musa! Adəmin bunların Məndən olduğunu bildiyi üçün Mənə həmd etməyi, Mənim ona verdiyim nemətlərin şükrüdür".[333]

Sad bin Məsud əs-Səqafi demişdir: "Nuh peyğəmbərə "çox şükür edən qul" adı verilmişdir. Çünki o Allaha həmd etmədən təzə paltarı geyinməz, yeməyi yeməzdi".[334]

Əli bin Əbu Talib ayaqyolundan çıxdıqda əli ilə qarnını məsh edər və: "Bu nə böyük nemətdir, fəqət insanlar bunun şükrünü bilməzlər"- deyərdi.[335]

Məxləd bin Hüseyn demişdir: "Şükür günahları tərk etməkdir".[336]

Əbu Hazim: "Allaha yaxınlaşdırmayan hər nemət bəladır və müsibətdir"- demişdir.[337]

Əbu Süleyman: "Nemetləri xatırlamaq, Allahı sevməyi zəruri edər"- demişdir.[338]

Həmmad bin Zeyd Leysdən nəql edərək demişdir: "Mən Mədinəyə gəldikdə Abdullah bin Salamla qarşılaşdım. Mənə: "Allahın elçisinin girdiyi evə girməzsən ki? Sənə qovun və xurma yedirəcəm"- dedi. Sonra bunları danışdı: "Allah-taala insanları Qiyamət günü topladığı vaxt onlara verdiyi neməti xatırladar. Qul soruşar: "Bunun əlaməti nədir?" O deyər: "Sən sıxıntıda olanda mənə dua etdin, mən o sıxıntını aradan götürdüm. Sən bir vaxt səfərdə olanda məndən yardım dilədin, Mən də sənə yardım etdim. Allah-taala xatırladar, qul

---

[332] İbn Əbi əd-Dünya, "əş-Şukur", 11; əl-Beyhəqi, "Şuabul-İman", 4460.
[333] İbn Əbi əd-Dünya, "əş-Şukur", 12; əl-Beyhəqi, "Şuabul-İman", 4427.
[334] İbn Əbi əd-Dünya, "əş-Şukur", 14; İbn Əsakir, 17/335/1; İbn Cərir, Təfsir, 15/19; İbn Əsir, "Əsədul-Ğabə", 2/372; ət-Tabərani, "əl-Kəbir", 5420.
[335] İbn Əbi əd-Dünya, "əş-Şukur", 13; əl-Beyhəqi, "Şuabul-İman", 4468. Deyirəm: sənədində mətruk, muttəhim və yalançı var.
[336] İbn Əbi əd-Dünya, "əş-Şukur", 41; əl-Beyhəqi, "Şuabul-İman", 4547. Deyirəm: sənədi həsəndir.
[337] İbn Əbi əd-Dünya, "əş-Şukur", 20; Əbu Nəim, "əl-Hilyə", 3/230; əl-Beyhəqi, "Şuabul-İman", 4537. Deyirəm: sənədi zəifdir.
[338] İbn Əbi əd-Dünya, "əş-Şukur", 21. Deyirəm: sənədi zəifdir.

da xatırlayar! Allah-taala: "Sən filankəsin qızını istədin, səninlə bərabər onu istəyənlər çox idi, onu sənə verdim, o birilərini rədd etdim".[339] Sonra sözünə davam edərək dedi: "Allahın hüzurunda qulu da Ona nemətlərini sayacaqdırmı?! Deyib hey ağladı. Sonra dedi: "Allah-taaladan bir qulunu hüzurunda oturdub və sonra sual əzabına tutmamasını arzu edirəm".[340]

Leys bin Əbu Süleym Osmandan, o da İbn Sirindən nəql etdi ki, Ənəs bin Malik demişdir: "Allahın elçisi demişdir: "Qiyamət günündə nemətlər, yaxşılıqlar və pisliklər gətirilir. Uca və Qüdrətli Allah nemətlərindən hər birinə: "Yaxşı əməllərdən haqqını al"- buyurur. O da yaxşı əməllərdən heç birini buraxmayıb alar".[341]

Bəkir bin Abdullah əl-Muzəni demişdir: "Birinin başına bir bəla gəldikdə Allaha dua edər, Allah da onu yox edər. Sonra şeytan gəlib şükrünü azaltmaq üçün ona deyər: "Bu iş asan idi". O dedi: "Bəla daha şiddətli idi, fəqət Allah-taala onu məndən yox etdi" - deməlidir".[342]

İbn Əbi əd-Dünyanın Sadaqa bin Yəsardan etdiyi rəvayətinə görə Sadaqa bin Yəsar belə demişdir: "Davud peyğəmbər mehrabda ikən yanından kiçik bir şey keçdi. Ona baxıb yaradılışını düşünüb heyrət edərək: "Allah buna da əhəmiyyət verirmi?"- dedi. Allah da ona dil verdi, o da: "Ey Davud! Sən özünü bəyənirsən? Canım əlində olan Allaha and olsun ki, mən Allah-taalanın mənə verdiyi fəzilətə, sənə verilən fəzilətdən daha çox şükür edirəm"- dedi".[343]

Əyyub demişdir: "Şübhəsiz Allahın qulu üzərindəki nemətlərinin ən böyüyü, onun Allahın elçisinin gətirdiyini təsdiq etməsidir".[344]

Süfyan əs-Səvri demişdir: "Kim bəlanı nemət, bolluğu müsibət saymasa, fəqih olmaz"- deyərlər.[345]

Zazan demişdir: "Allahın nemət verdiyi kimsə üzərindəki haqqı, onun həmin nemətlə günah etməməsidir".[346]

İbn Əbid-Dünya dedi ki, mənə Mahmud əl-Vərraq belə oxudu: "Allahın nemətinə şükür edəndə mənə başqa bir nemət verilir ki, ona da ayrı bir şükür vacib olur. O halda hər bir işdə qarşılıqlı olaraq Allah-taala bir nemət verir. Hər nə qədər günlər uzansa və ömür davam etsə də genişlik və bolluq içində sevinc ümumi olur. Darlıq və

[339] İbn Əbi əd-Dünya, "əş-Şukur", 22. Deyirəm: sənədi zəifdir.
[340] İbn Əbi əd-Dünya, "əş-Şukur", 23. Deyirəm: sənədi zəifdir.
[341] İbn Əbi əd-Dünya, "əş-Şukur", 24. Deyirəm: sənədi çox zəifdir.
[342] İbn Əbi əd-Dünya, "əş-Şukur", 26. Deyirəm: sənədi səhihdir.
[343] İbn Əbi əd-Dünya, "əş-Şukur", 35; əl-Beyhəqi, "Şuabul-İman", 4260.
[344] İbn Əbi əd-Dünya, "əş-Şukur", 79. Deyirəm: sənədi səhihdir.
[345] İbn Əbi əd-Dünya, "əş-Şukur", 81; Əbu Nəim, "əl-Hilyə", 7/55, 8/242; İbn Əbi Hatim, "əc-Cərh və ət-Tədil", 1/94. Deyirəm: sənədi səhihdir.
[346] İbn Əbi əd-Dünya, "əş-Şukur", 82.

qıtlıq olarsa, sonu mükafat olur. Qıtlıqla bolluğun hər birində Allahın elə bir neməti vardır ki, o xəyallara, quruya və dənizə sığmaz".[347]

Əbu Hureyrə Allahın elçisinin belə dediyini rəvayət edir: "Allah-taala buyurur: "Mənim dərgahımda mömin qulum daima xeyirdədir. Mən onun canını alarkən də o mənə həmd edər"[348].

Məhəmməd bin əl-Munkədir demişdir: "Bir qadına göz vuran gənc yanından keçərkən ona: "Ey cavan oğlan, bu, Allahın sənə verdiyi nemətlərin mükafatıdırmı?"- dedi".[349]

Həmməd bin Sələmə Sabitdən, o da Əbu əl-Aliyədən nəql edərək demişdir: "Mən insanın iki şey arasında həlak olmayacağına ümid edirəm, biri, Allaha həmd etdiyi nemət, digəri isə istiğfar etdiyi günahdır".[350]

İbn Səmmak Məhəmməd bin əl-Həsənə Rəqqanın qazisi olduğu zaman belə bir məktub yazdı: "Bundan sonra təqva heç vaxt qəlbindən çıxmasın, Allahdan sənə verdiyi nemətlərə az şükür etməyə və onunla günah etməyə görə qorx. Çünki hər bir nemətdə bir hüccət və bir günah var. Nemətin hüccət olması onunla günah işlənməsidir, günah olması nemətə az şükür edilməsidir. Şükrü zay etdiyinə və ya günah işlədiyinə, yaxud da hansısa bir haqqında qüsur etdiyinə görə Allah səni əfv etsin".[351]

Rəbi bin Əbu Rəşidin yanından iflic olan bir adam keçərkən, Allaha həmd etdi, sonra oturub ağladı. Ondan soruşdular: "Səni ağladan nədir?" O da: "Cənnət və Cəhənnəm əhlini xatırladım. Cənnət əhlini əfv olunanlara və Cəhənnəm əhlini bəlaya uğrayanlara bənzətdim. Məni ağladan budur"- cavabını verdi.[352]

Əbu Hureyrənin rəvayətinə görə, Allahın elçisi buyurmuşdur: "Sizdən biriniz Allahın verdiyi nemətin qədir-qiymətini bilmək istəsə, özündən aşağıda olana (kasıba) baxsın, yuxarıda olana (varlı) olanlara baxmasın".[353]

İbn Mübarək Yezid bin İbrahimdən, o da Həsəndən, o da Əbu Dərdadan nəql edərək demişdir: "Bir kimsə Allahın nemətini yalnız yeməkdən, içməkdən ibarət olduğunu bilirsə, onun əməli az və əzabı hazır olar".[354]

---

[347] İbn Əbi əd-Dünya, "əş-Şukur", 83.
[348] **Səhihdir:** Əhməd, 2/341-361; əl-Bəzzar, "Kəşf əl-Əstar", 781; İbn Əbi əd-Dünya, "əş-Şukur", 84. Deyirəm: sənədləri həsən və səhihdir.
[349] İbn Əbi əd-Dünya, "əş-Şukur", 86.
[350] İbn Əbi əd-Dünya, "əş-Şukur", 88; əl-Beyhəqi, "Şuabul-İman", 4513. Deyirəm: sənədi səhihdir.
[351] İbn Əbi əd-Dünya, "əş-Şukur", 89.
[352] İbn Əbi əd-Dünya, "əş-Şukur", 90; Əbu Nəim, "əl-Hilyə", 5/78.
[353] **Çox zəifdir:** İbn Mübarək, "əz-Zühd", 1433; İbn Əbi əd-Dünya, "əş-Şukur", 91.
[354] İbn Mübarək, "əz-Zühd", 1551; İbn Əbi əd-Dünya, "əş-Şukur", 92; əl-Beyhəqi,

Yenə İbn Mübarək Malik bin Ənəsdən, o da Ənəsdən nəql edərək demişdir: "Ömərin bir nəfərə salam verdiyini, onun da salamı aldığını eşitdim. Ömər o adamdan: Necəsən? - soruşmuşdur. O: "Allaha həmd etdiyimi sənə bildirirəm" - demişdir. Ömər də: "Səndən bu cavabı gözləyirdim" - dedi".[355]

Yenə İbn Mübarək Məsuddan, o da Əlqəmə bin Mərsəddən, o da İbn Ömərdən nəql edərək demişdir: "Biz bir gündə dəfələrlə qarşılaşıb, bir-birimizin halını soruşmağı arzu edirdik ki, bununla yalnız Uca və Qüdrətli Allaha həmd edək".[356]

**«Məgər Allahın göylərdə və yerdə olanları sizə ram etdiyini, aşkar və gizli nemətləri sizə bolluca ehsan etdiyini görmürsünüzmü?»** (Loğman, 20) ayəsindəki "nemət" kəlməsini Mücahid "**Lə iləhə illəllah"** kimi təfsir etmişdir.[357]

İbn Uyeyne demişdir: "Allah-taala qullarına **"Lə iləhə illəllah"**dan daha üstün nemət verməmişdir və **"Lə iləhə illəllah"** axirətdə insanlar üçün dünyadakı su kimidir".[358]

Sələf-salehdən biri bayram xütbəsində: "Ey möminlər! Siz çiçək kimi sabahladız. İnsanlar parçaları toxuyur siz onları geyinirsiz, insanlar verirlər siz alırsınız, insanlar heyvanları bəsləyirlər siz onları minirsiniz, insanlar əkib-becərirlər siz yeyirsiniz" - deyərək ağladı və camaatı ağlatdı.[359]

Abdullah bin Qurt əl-Əzdi adlı əshabə qurban bayramında moizə etmək üçün minbərə çıxanda camaatın əynində rəngbərəng paltarlar görüb: "Nə qədər doyurucu böyük bir nemətdir, nə qədər açıq bir kəramətdir və ehsandır. Bir qövmün əlindən nemətdən daha tez gedən bir şey yoxdur. Nemət əldən gedəndən sonra bir daha geri dönməz. Nemət, ancaq nemət verilən kəsin onu verən Allaha həmdi ilə sabit və daimi olur" - demişdir.[360]

Salman Farsi demişdir: "Bir adama sərvət verildi, sonra əlindən alındı, o, Allaha şükür etdi. Hətta, bir həsirdən başqa bir-şeyi qalmadı, o yenə Allaha həmd-səna etdi. Başqa bir şəxsə sərvət verildi. Bu şəxs

---

"Şuabul-İman", 4467; Əbu Nəim, "əl-HiIyə", 1/210.

[355] Malik, əl-Muvatta, 2/961; İbn Mübarək, "əz-Zühd", 1551; əl-Buxari, "əl-Ədəbul-Mufrəd", 1132; İbn Əbi əd-Dünya, "əş-Şukur", 93; əl-Beyhəqi, "Şuabul-İman", 4450. Deyırəm: sənədi səhihdir.

[356] İbn Mübarək, "əz-Zühd", 1551; İbn Əbi əd-Dünya, "əş-Şukur". 94; əl-Beyhəqi, "Şuabul-İman", 4451. Deyirəm: sənədi kəsikdir.

[357] İbn Əbi əd-Dünya, "əş-Şukur", 95; İbn Cərir, "ət-Təfsir", 21/78; əl-Beyhəqi, "Şuabul-İman", 4502. Deyirəm: sənədi səhihdir.

[358] İbn Əbi əd-Dünya, "əş-Şukur", 96; əl-Beyhəqi, "Şuabul-İman", 4500; Əbu Nəim, 7/272. Deyirəm: sənədi səhihdir.

[359] İbn Əbi əd-Dünya, "əş-Şukur", 97. Deyirəm: sənədi zəifdir.

[360] İbn Əbi əd-Dünya, "əş-Şukur", 98. Deyirəm: sənədi həsəndir.

o kasıba dedi: "Mənə de görüm, nəyə görə Allaha şükür edirsən?" Kasıb cavab verdi: "O şeylərə görə həmd və şükür edirəm ki, onların yerinə bütün insanlara verilən sərvət mənə verilsəydi, onları insanlara verməzdim". "Onlar nədir?"- deyə varlı soruşduqda, kasıb: "Gözlər, dil, əllər və ayaqlardır"- cavabını verdi.[361]

Bir nəfər Yunus bin Übeydə kasıblığına görə şikayət etdi. Yunus ona dedi: "Gözlərini yüz min dirhəmə verirsənmi?" O: Xeyr - dedi. "Əllərini yüz min dirhəmə verərsənmi". O: Xeyr- dedi. "Ayaqlarını yüz min dirhəmə verərsənmi". O: Xeyr- dedi. Yunus ona Allahın nemətlərini xatırlatdıqdan sonra cavab verdi: "Sənin yüz minlərlə dirhəmin olduğu halda, sən kasıblıqdan şikayət edirsən".[362]

Əbu Dərda: "Səhhət mülkdür"- deyərdi.[363]

Cəfər bin Məhəmməd demişdir: "Atam qatırını itirmişdi və: "Allah onu mənə qaytarsa, Allahın razı qalacağı şəkildə həmd edəcəyəm" - dedi. Bir az sonra qatır belində yəhəri ilə gəldi. Ona minib paltarlarını yığdıqdan sonra üzünü səmaya tutub: "Əlhəmdulilləh"- dedi və buna heç nə əlavə etmədi. Ona dedilər: "Bəs Allahın razı olacağı şəkildə həmd edəcəkdin?" O dedi: "Etmədiyim bir şey qaldımı? Etməli bir şey qaldımı? Həmdin hamısını Allah üçün etdim!"[364]

İbn Əbi əd-Dünyanın Sad bin İshaq bin Kəb bin Ucrədən, o da atasından, o da babasından nəql etdiyi rəvayətə görə, babası demişdir: "Allahın elçisi ənsardan bir əsgər dəstəsini göndərdi və dedi: "Əgər Allah onları sağ-salamat və qənimətlə geri qaytarsa, Uca Allaha şükür etmək mənə borc olsun". Bir müddət sonra dəstə sağ-salamat və qənimətlə qayıtdı. Əshabələrin bəziləri peyğəmbərə dedilər: "Əgər Allah onları sağ-salamat və qənimətlə geri qaytarsa, Uca Allaha şükür etmək mənə borc olsun"- dediyini eşitmişik. Allahın elçisi buyurdu: "Allahummə ləkəl həmdu şukrən və ləkəl mənnu fadlən (Allahım! Həmd-səna və fəzilətli minnət sənə məxsusdur) deməklə onu etmişəm".[365]

Abdur-Rəhman bin Yezid bin Əsləmə nəql edir ki, Məhəmməd bin əl-Munkədir Əbu Həzimə demişdir: "Ey Əbu Həzim, mənimlə qarşılaşıb mənə xeyir-dua edənlər çoxdur. Mən onları heç tanımıram və onlara yaxşılıq da etməmişəm. Əbu Həzim ona dedi: "Bunun sən tərəfdən olduğunu zənn etmə, fəqət bunun Allah tərəfindən olduğunu düşün və Ona şükür et". Sonra Əbu Abdur-Rəhman: **«Həqiqətən,**

---

[361] İbn Əbi əd-Dünya, "əş-Şukur", 100; əl-Beyhəqi, "Şuabul-İman", 4462.
[362] İbn Əbi əd-Dünya, "əş-Şukur", 101; əl-Beyhəqi, "Şuabul-İman", 4463.
[363] İbn Əbi əd-Dünya, "əş-Şukur", 102.
[364] İbn Əbi əd-Dünya, "əş-Şukur", 106; əl-Beyhəqi, "Şuabul-İman", 4082.
[365] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 105; əl-Beyhəqi, "Şuabul-İman", 4081.

**iman gətirib yaxşı işlər görənlər üçün Rəhman bir sevgi yaradacaqdır»** (Məryəm, 96) ayəsini oxudu".[366]

Əli bin əl-Cəd Abdul-Əziz bin Əbu Sələmədən nəql etdi ki, Abdul-Əziz mənə dedi: "Mənim özünü təsdiq edəcəyim bir nəfər Əbu Bəkir əs-Siddiqin dua edərkən belə dediyini eşitdim: "Allahım! Səndən hər şeydə nemətin hamısını istəyirəm. Sən razı olana qədər və razı olandan sonra bütün nemətlərə şükür etməkdə, mənə uğur verməyini diləyirəm. Çətin işlərin deyil, asan işlərin xeyirlisini diləyirəm".[367]

Həsən əl-Bəsri demişdir: "Allah-taala quluna bir nemət verəndə, o: "Əlhəmdulilləh"- deyərsə, mütləq o adam daha çox şeyi Allaha vermiş olur".[368]

İbn Əbi əd-Dünya Süfyan bin Uyəynənin: "Həsən əl-Bəsrinin bu sözü xatalıdır. Çünki qulun hərəkəti Allahın hərəkətindən üstün ola bilməz"- dediyini rəvayət etmişdir.[369]

Alimlərdən bəziləri Həsən əl-Bəsrinin bu sozünü belə açıqlayıblar: "Allaha həmd etmək vacib olan hər kəsə Allah nemət versə və verdiyi neməti bildirdikdə, o da Allaha layiqincə şükür edərsə, onun həmdi Allahın verdiyi nemətdən daha üstün olar".

Mən deyirəm ki, Süfyan bin Uyəynənin sozü Həsən əl-Bəsrini məzəmmət etmir. Çünki qulun "əlhəmdulilləh" deməsi Allahın nemətlərindən biridir. Qulun verilən nemətə görə Allaha həmd etməsi də Allahın nemətlərindən bir nemətdir. Nemətlərin biri digərindən daha böyükdür. Şükür neməti isə mal, vəzifə, məqam, uşaq, arvad və oxşar nemətlərdən daha böyükdür. Buna görə qulun hərəkəti Allahın hərəkətindən üstün ola bilməz. Qulun şükür hərəkəti Allahın bəzi hərəkətlərindən üstün ola bilər. Çünki qulun hərəkəti də Allahın hərəkətlərindəndir. Şübhə yoxdur ki, Allahın hərəkətlərindən bəzisi bir-birindən üstündür.

Alimlərdən bir qismi deyiblər: "Allah-taalanın bizə dünyadan vermədiyi nemətləri verdiyi nemətlərdən daha üstündür. Çünki Allah-taala elçisi üçün dünya ilə razılaşmamışdır. O halda Allahın elçisi üçün razı olub sevdiyi şeyi sevərik, elçisi üçün xoş bilmədiyi və nifrət etdiyi şeyə biz də nifrət edərik".[370]

Yenə İbn Əbi əd-Dünya rəvayət etmişdir ki, bir qisim alim deyib: "Bir alimin özünə dünyadan verilən nemətə görə Allaha həmd

---

[366] İbn Əbi əd-Dünya, "əş-Şukur", 108; Əbu Nəim, "əl-Hilyə", 3/233.
[367] İbn Əbi əd-Dünya, "əş-Şukur", 110. Deyirəm: sənədi zəifdir.
[368] İbn Əbi əd-Dünya, "əş-Şukur", 111: əl-Beyhəqi, “Şuabul-İman”, 4094. Deyirəm: sənədi zəifdir.
[369] əl-Beyhəqi, 8/355.
[370] Bax: İbn Əbi əd-Dünya, "əş-Şukur", 112.

etməsi lazım olduğu kimi, verilməyən nemətlərə də həmd etməsi lazımdır. Çünki özünə verilən nemətə görə sorğu-sual olunacaqdır. Fəqət özünə artıq mal verilmədiyi təqdirdə qəlbi məşğul olmaz, əzaları yorulmaz, bu səbəbdən varlığı ilə, mənliyi ilə və qəlb rahatlığı ilə Allaha şükür edər".[371]

İbn Əbi əl-Nəvari demişdir ki, Fudayl bin İyad ilə Sufyan bin Uyəynə bir gecə oturub sabaha qədər nemət haqqında danışdılar. Sufyan: "Allah bizə filan-filan nemətləri verdi. Bizə belə ehsanlar etdi..."- deyərək, Allahın nemətlərini sabaha qədər sadaladı.[372] Abdullah bin Davud Sufyan bin Uyəynin: **«Ayələrimizi yalan hesab edənləri haradan olduğunu özləri də bilmədən tədriclə məhvə yaxınlaşdıracağıq!»** (əl-Əraf, 182) ayəsinin təfsirini belə verdiyini danışmışdır: "Allah onlara bol-bol nemət verər və onları şükür etməkdən uzaq edər"[373]. Sufyandan başqası da: "Hər dəfə günah etdikcə, Allah onlara nemət verir" - demişdir.[374]

Sabit əl-Bənnanidən "istidrac" sözünün mənasını soruşanda, o da: "İstidrac"- Allahın şükrü zay edən qullarına məkridir, yəni zahirən lütf, daxilən qəhərdir- deyə cavab vermişdir.''[375]

Yunus bu ayəni təfsir edərkən demişdir: "Qulun Allah dərgahında bir məqamı olur. Qul o məqamı mühafizə edər və həmin məqamda qalır. Sonra Allahın ona verdiyi nemətə şükür edər, Allah da ona daha şərəfli məqam verər, verilən nemətin şükrünü zay edərsə, Allah onu yavaş-yavaş məhvə yaxınlaşdırar. Onun şükrü zay etməsi, "istidrac", yəni məhvidir".[376]

Əbu Həzim demişdir: "Allah-taalanın dünyadan mənə vermədiyi nemətləri, mənə verdiyi nemətlərdən daha böyükdür. Çünki Allah-taala nemət verdiyi bir çox qövmlər buna görə həlak olmuşlar.[377] Allaha yaxınlaşdırmayan hər bir nemət bəladır. Allah sənə nemətlərini bir-birinin ardınca verdiyi halda, sən də Ona üsyan etsən, bu nemətin məhv olmasından həzər et".[378]

İmam Auzai moizələrinin birində demişdir: "Ey insanlar! İçində olduğunuz nemətlərlə Allahın qəlblərə yaxınlaşan atəşindən qaçmaq

---

[371] İbn Əbi əd-Dünya, "əş-Şukur", 113.
[372] İbn Əbi əd-Dünya, "əş-Şukur", 114.
[373] İbn Əbi əd-Dünya, "əş-Şukur", 115, 116; əl-Beyhəqi, "əl-Əsma vəs-Sifət", səh. 489; Əbu Nəim, "əl-Hilyə", 7/7. Deyirem: sənədi səhihdir.
[374] Əvvəlki hədisin axırı.
[375] İbn Əbi əd-Dünya, "əş-Şukur", 117: əl-Beyhəqi. "əl-Əsma vəs-Sifət", səh. 489. Deyirəm: sənədi zəifdir.
[376] İbn Əbi əd-Dünya, "əş-Şukur", 118.
[377] İbn Əbi əd-Dünya, "əş-Şukur", 120; Əbu Nəim, "əl-Hilyə", 3/233. Deyirəm: sənədi zəifdir.
[378] İbn Əbi əd-Dünya, "əş-Şukur", 31. Deyirəm: sənədi səhihdir.

qüvvəsi qazanın. Çünki çox az faydalı bir yurdda olursunuz. Dünyadan ən çox faydalanan qövümlərdən sonra onların yerinə siz gəldiniz. Onların ömürləri sizinkindən daha uzun, sizdən daha qüvvətli, görkəmləri daha böyük idi. Onlar dağları parçaladılar, qayaları yardılar, məmləkətləri dolaşdılar, çox şiddətli vuruşurdular, bədənləri qapı kimi enli idi. Belə olmalarına rəğmən bir müddət sonra yox oldular, onlardan əsər-əlamət qalmadı, evləri bomboş qaldı, unuduldular, onlardan birini hiss edirsinizmi? Onlar qafil olan qövmün gecələdikləri yerdə hər şeydən xəbərsiz oynayırdılar. Sonra siz Allahın əzabının onlar gecə yatarkən yaşadığı yerlərinə endiyini və onlardan çoxunun yurdlarında diz üstdə çöküb həlak olduqlarını bilirsinizmi? Sağ qalanlar isə onların başına gələnlərə, əllərindən gedən nemətə, bomboş qalan məskənlərinə baxırdılar. Bunlarda Allahın ağrılı əzabından qorxanlar üçün əlamətlər və ibrətlər vardır. Onlardan sonra sizin də, dünyanın da ömrü qısalmaqdadır. Zamanın bolluq və bərəkəti qalmamışdır. Dünyada ancaq şəri qoruyanlar, bulanlıq çöküntülər, qorxunc ibrətlər və sair pisliklər, fitnələrin göndərilməsi, zəlzələlərin davam etməsi, rəzil olmuş nəsillər qalmışdır. Bu səbəbdən quruda və suda fəsadlar meydana çıxdı. Ehtiras, acgözlük, hədsiz həvəs, tamah, çox yaşama və boş ümidlərlə özlərini aldadanlara oxşamayın. Allah-taala bizi də, sizi də əzabından qorxan, rəhmətinə ümid edən, axirət üçün hazırlananlardan etsin.[379]
"Şükür günahı tərk etməkdədir" - deyirlər.[380]

İbn Mübarək, Sufyan əs-Səvrinin: "Bəlanı nemət, bolluğu müsibət saymayan kimsə fəqih deyildir" - dediyini nəql etmişdir.[381]

Mərvan bin Həkəm İslamı anladığı zaman belə deyirdi: "Mən İslama Allahın neməti ilə qovuşdum, etdiyim yaxşı əməllər və iradəmlə qovuşmadım. Çünki mən günahkaram."[382]

Şair demişdir:

"Bir çox yerlərə girdim. Əgər orada ölsəydim, qövmüm üçün çox pis bir nümunə olardım. Fəqət Allah-taala, o pisliklərdən məni hifz edib, ən böyük neməti olan İslama qovuşdurdu. Allah-taalanın səhər-axşam, gizli-aşkar o qədər çox neməti vardır ki..."[383]

Bir qrup adamın pislik etməsi ilə bağlı Osman bin Əffana

---

[379] İbn Əhi əd-Dünya, "aş-Şukur", 30. Deyirem: sənədi zəifdir.

[380] İbn Əbi əd-Dünya, “əş-Şukur", 41; əl-Beyhəqi, "Şuabul-İman", 4547. Deyirəm: sənədi həsəndir.

[381] İbn Əbi əd-Dünya, "aş-Şukur", 81; Əbu Nəim, "əl-Hilya", 7/55, 8/242; İbn Əbi Hatim, "əc-Cərh və ət-Tədil", 1/94. Deyirəm: sənədi səhihdir.

[382] İbn Əbi əd-Dünya, "əş-Şukur", 121. Deyirəm: sənədi zəifdir.

[383] Əhməd bin Musa əs-Səqafinin şerindən parça. İbn Əbi əd-Dünya, "əş-Şukur", 123.

şikayət edildikdə, o, onları yaxalamaq üçün həmin yerə getdi, lakin yanlarına çatmamış onlar dağılışdılar. Osman, öz qarşısında bir müsəlmanın rəzil edilmədiyinə görə Allaha şükür üçün bir kölə azad etdi.[384]

Yezid bin Harun rəvayət edir ki, bizə Usbuğ bin Yezid belə danışdı: "Nuh peyğəmbər ayaqyolundan çıxarkən deyərdi: "Mənə nemətin ləzzətini daddıran, faydalı olan hissəsini bədənimdə saxlayan, əziyyət verən hissəsini məndən yox edən Allaha həmd olsun". Bundan əlavə ona çox şükür edən qul adı verilmişdir".[385]

İbn Əbi əd-Dünyanın rəvayətinə görə Aişə demişdir: "Allahın elçisi hər dəfə ayaqyolundan onu ("Əlhəmdulilləh" - tərc.) deməmiş çıxmazdı".[386]

Bir nəfər Əbu Həzimdən soruşmuşdur: "Ey Əbu Həzim, gözlərin şükrü nədir?" O cavab verdi: "Gözlərinlə yaxşı bir şey görəndə ondan bəhs etməyin, onlarla pis bir şey gördükdə onu da görməməyindir". Adam soruşdu: "Qulaqların şükrü nədir?" O dedi: "Qulaqlarınla bir yaxşı şey eşitdikdə onu bəlli etməyindir (yadda saxlamağındır), onlarla bir pis şey eşitdikdə onu eşitməməyindir". Adam soruşdu: "Əllərin şükrü nədir?" O cavab verdi: "Əllərinlə sənə aid olmayanı almamağındır, Allahın onlardakı haqqını qadağan etməyindir". Adam sual etdi: "Qarnın şükrü nədir?" O belə cavab verdi: "Mədənin alt hissəsi yemək üçün, üst hissəsi elm üçün olmalıdır". Adam soruşdu: "Fərcin[387] şükrü nədir?" O dedi: "Allah-taala belə buyurur: **«O kəslər ki, ayıb yerlərini qoruyub saxlayarlar; Ancaq zövcələri və cariyələri istisna olmaqla. Onlar qınanmazlar. Bundan artığını istəyənlər həddini aşanlardır!»"** (əl-Muminun, 5-7). Adam soruşdu: "Ayaqların şükrü nədir?" O da cavab verdi: "Sənin qiptə etdiyin bir kəs öləndə həyatda ikən getdiyi yoldan getməyindir. Pis bir kəs öləndə Allaha şükür edərək onun getdiyi yoldan getməməyindir. Dili ilə şükür edib bütün əzaları ilə şükür etməyənin halı, paltarının bir tərəfindən tutub tərpənməyənin halı kimidir. Çünki paltar o halda onu istidən, soyuqdan, qardan və yağmurdan qorumaz".[388]

---

384 İbn Əbi əd-Dünya, "əş-Şukur", 124; Deyirəm: sənədi zəifdir. Abdullah bin Əhməd, "Zəvaid əz-Zühd", səh. 121; Əbu Nəim, "əl-Hilyə", 1/60. Deyirəm: sənədində qırıq olsa da həsəndir.

385 İbn Əbi əd-Dünya, "əş-Şukur", 128; əl-Beyhəqi, "Şuabul-İman", 4155; Deyirəm: sənədi səhihdir.

386 İbn Əbi əd-Dünya, "əş-Şukur", 127; əl-Beyhəqi, "Şuabul-İman", 4154; əl-Aqili, "əd-Duafəul-Kəbir", 1/214. Deyirəm: sənədi zəifdir.

387 kişinin cinsiyyət orqanı.

388 İbn Əbi əd-Dünya, "əş-Şukur'", 129;. Əbu Nəim, "əI-Hilyə", 3/243. Deyirəm: sənədi zəifdir.

İbn Mübarək belə deyib: "Həbəşistan hökmdarı Nəcaşi bir gün ora hicrət edən Cəfər ilə yoldaşlarına hüzuruna gəlmələri üçün xəbər göndərdi, onlar da gəldilər. Nəcaşi köhnə paltar geyinmiş və bir otaqda torpaq üzərində oturmuşdu. Cəfər: "Onu bu vəziyyətdə gördükdə ondan qorxduq"- dedi. Nəcaşi rəngimizin dəyişdiyini gördükdə dedi: "Sizə sevindirici bir xəbər verəcəyəm. Mənə məmləkətinizdən bir müşahidəçi gəlib xəbər verdi ki, Allah-taala elçisinə yardım edib düşmənlərini həlak etmiş, filankəs-fllankəs əsir edilmiş və filankəs-filankəs də öldürülmüşdür. Bunlar Bədir adlanan yerdə qarşılaşmışlar. Sanki, mən oranı görürəm. Çünki mən orada Bəni Dəmrə qəbiləsindən bir nəfərin heyvanlarını otarmışdım". Cəfər ondan soruşdu: "Köhnə paltar geyinib altına döşəkcə qoymadan torpaq üstündə oturmaqdan məqsədin nədir?" O da belə cavab verdi: "Biz Allah-taalanın İsa peyğəmbərə nazil etdiyi İncildə görürük ki, Allahın qulları üzərindəki haqqı, Allah qullarına yeni bir nemət ehsan edəndə qulların Allaha qarşı təvazökar olmalarıdır. Allah, elçisinə yardım edib zəfər qazandırmaqla yeni bir neməti ehsan etdiyinə görə mən də Allah üçün təvazökarlıq etdim".[389]

Həbib bin Übeyd demişdir: "Allah-taala quluna bir bəla verdiyi zaman o bəlada qul üçün bir neməti vardır. Çünki o bəladan daha şiddətlisini verməmişdir".[390]

Abdul-Məlik bin İshaq demişdir: "Allah-taala insanların bir qisminə necə şükür edəcəklərini görmək üçün rəhmət, bir qisminə də necə şükür edəcəklərini görmək üçün bəla vermişdir".[391]

İmam Əhmədin rəvayətinə görə, Allahın elçisini sevindirən bir şey olanda, Allaha şükür etmək üçün səcdə edərdi.[392]

Abdur-Rəhman bin Avf demişdir: "Allahın elçisi yanımıza gəldi. Sonra məscidə girib, üzü qibləyə döndü, səcdə etdi. Səcdəni uzatdı. Mən: "Ya Allahın elçisi, sən elə bir səcdə etdin ki, mən Allah-taala sənin ruhunu aldığını sandım". Allahın elçisi dedi: "Cəbrayıl gəlib, Allah-taalanın səni müjdələdiyini buyurdu: "Ümmətindən hər kim, sənə salavat etsə, mən də ona rəhmət edərəm. Hər kim də sənə salam versə, mən də ona salam verərəm". Bunu eşitdikdə mən Allaha şükür üçün səcdə etdim".[393]

---

389 İbn Əbi əd-Dünya, "əş-Şukur", 130; əl-Beyhəqi, "Dəlail ən-Nəbəviyyə", 3/134.
390 həsən sənədlə İbn Əbi ad-Dünya, "əş-Şukur", 131.
391 İbn Əbi əd-Dünya, "əş-Şukur", 132; Əbu Nəim, "əl-Hilyə", 5/85.
392 **Həsəndir:** Əbu Davud, 2774; ət-Tirmizi, 1578; İbn Macə, 1394; əd-Dəraqutni, 1/410, 4/148; əl-Hakim, 1/276; əI-Beyhəqi, 2/370. Deyirəm: sənədində zəif var.
393 **Həsəndir:** Əhməd, 1/191; İsmail əl-Qadi, "Fadlus-salat alən-nəbi", 7; əl-Hakim, 1/550; əI-Beyhəqi, 2/371; İbn Əbi əd-Dünya. "əş-Şukur", 138. Deyirəm: sənədlərində zəif var.

Sad bin Əbu Vaqqas demişdir: "Biz Allahın elçisi ilə birlikdə Məkkədən Mədinəyə getmək üçün yola çıxdıq. Azvərin[394] yaxınlığında qonaq qaldıq. Allahın elçisi mübarək əllərini qaldıraraq bir saat Allaha dua etdi, sonra səcdə etdi. Uzun müddət səcdədə qaldı, sonra səcdədən qalxıb yenə bir saat dua etdi. Sonra yenə səcdə etdi. Bunu üç dəfə təkrarladı. Allahın elçisi buyurdu: "Mən Rəbbımdən ümmətim üçün şəfaətimi qəbul etməsini istədim. Mənə ümmətimin üçdə birini verdi. Buna görə Rəbbimə səcdə etdim. Sonra başımı qaldırdım, Rəbbimdən ümmətimi istədim, digər üçdə birini verdi. Buna görə yenə Rəbbimə səcdə etdim. Sonra başımı qaldırdım, Rəbbimdən ümmətimi istədim, digər üçdə birini də verdi. Buna görə yenə Rəbbimə səcdə etdim".[395]

Məhəmməd bin İshaq "Kitabul-futuh" adlı əsərində yazır: "Bədir döyüşü günü Əbu Cəhilin öldürüldüyünü müjdə edənə Allahın elçisi onu ölü gördüyünə dair Özündən başqa heç bir ilah olmayan Allaha üç dəfə and içməyini istədi, o da and içdi. Buna görə Allahın elçisi səcdə etdi".[396]

Səid bin Mənsur demişdir: "Əbu Bəkir əs-Siddiq Museyləmə əl-Kəzzabın öldürüldüyünü eşitdikdə səcdə etmişdir".[397]

İmam Əhməd rəvayət etmişdir: "Əli döşlü bir nəfəri Xavaric tərəfində görəndə səcdə etmişdir".[398]

Peyğəmbərin vaxtında Kəb bin Malik tövbəsinin qəbul olunduğunu eşidəndə Allaha səcdə etdi.[399]

Əgər desələr ki: "Allahın nemətləri qullarına daimidir. Daimi olan nemətlərə deyil, yeni nemətə şükrün edilməsini lazım edən nədir? Halbuki, daimi olan nemətlər daha böyükdür". Buna bir neçə cəhətdən cavab vermək olar.

Birincisi, yeni nemət daimi neməti xatırladır. İnsan yeni nemətə daha çox bağlanır.

İkincisi yeni nemət yeni qulluq lazım edir. İnsana ən asan olan Allah dərgahında ən sevimli olan, Allaha şükür üçün edilən səcdədir.

Üçüncüsü, yeni nemət insanlara daha çox təsir edir, qəlblər ona

---

394 Mədinədən Məkkəyə gedən yol üstündə yer adı.

395 **Zəifdir:** Əbu Davud, 2775; əl-Beyhəqi, 2/370. Deyirəm: sənədində zəif var.

396 **Zəifdir:** əl-Beyhəqi, "Dəlail ən-Nəbəviyyə", 3/89. Əbu Cəhilin ölüm xəbərini səcdəsiz variantda əl-Buxari, (3962) və Müslim, (1800) rəvayət edib.

397 **Zəifdir:** İbn Əbi Şeybə, "əl-Musənnəf", 12/295; əl-Beyhəqi, 2/371; Abdurrəzzaq, 3/358.

398 Əhməd, 1/107, 108, 147; Deyirəm: sənədi zəifdir. İbn Əbi Şeybə, "əl-Musunnəf", 12/295; əl-Beyhəqi, 2/371; Abdurrəzzaq, 3/358.

399 Abdurrəzzaq, 3/357/9561; İbn Macə, 1393. Deyirəm: sənədi əl-Buxari və Müslimin şərtlərinə əsasən səhihdir. Hədisin tam mətni əl-Buxari, (4418); Müslim, (2769)-də verilib.

daha çox bağlanır. Buna görə bir kimsəyə yeni nemət veriləndə təbrik edilir, nemət alınanda təziyə verilir.

Dördüncüsü, yeni nemətlər insanın sevincini və fərəhlənməsini və genişlənməsini zəruriləşdirir. Çox yeni nemət insanı azğınlığa və ərköyünləşməyə sürükləyir.

Qulun Allah üçün səcdə etməsi, acizliyini, qul olduğunu və boyun əyməsini etiraf və iqrar etməsindən ibarətdir. Buna görə Allahın verdiyi nemətə nəfsin, sevinəcəyi, fərəhlənəcəyi və genişlənəcəyindən əlavə, o neməti səcdə ilə qarşılaması, o nemətin davam etməsi üçün daha layiqdir. Bir qul yeni verilən neməti cahillərin Allah tərəfindən verilən neməti azğınlıq və ərköyünlüklə və Allahın sevmədiyi bir sevinclə qarşıladıqları kimi qarşılayarsa, o nemətin əldən tez çıxmasına, hətta əzaba çevrilməsinə və məhv olmasına səbəb olür. Nəcaşinin yuxarıda deyildiyi kimi, etməsi: Allah, bir quluna nemət verirsə, qulun o nemətə qarşı təvazökar olmasını sevər.

Əl-Əla əl-Muğəyrə demişdir: "Həsən əl-Bəsri gizlənmişdi. Ona zalım Həccacın öldüyünü müjdələyəndə Allah üçün səcdə etdi".[400]

## Fəsil

Allah-taala, nemət verdiyi quluna nemətini bildirmək üçün, o qapısını örtdüyü vaxt bir dilənçi göndərib ondan bir şey istər. Bu dilənçinin bir şey istəməsiylə Allahın ona nemət verdiyi düşünülməlidir.

Salam bin Əbu Muti demişdir: "Bir xəstəni ziyarət üçün yanına getdikdə öz-özünə inildədiyini gördüm. Mən ona dedim: "Küçəyə atılmışları, sığınacaq yeri olmayanları, xidmət edənləri olmayanları xatırla". Bir müddət sonra onun yanına gedəndə, onun öz-özünə: "Küçəyə atılmışları, sığınacaq yeri olmayanları, xidmət edənləri olmayanları xatırla" - dediyini gördüm".[401]

Abdullah bin Əbu Nuh demişdir: "Bir nəfər sahillərin birində mənə demişdir: "Sən Allahın sevmədiklərini nə qədər etdin? O, sənə sevdiklərini nə qədər verdi?" Mən: "Bunları saya bilmərəm, o qədər çoxdur ki"- dedim. O dedi: "Allah sənə üzücü, rəzil edici bir şey etdimi?" Mən dedim: "Allaha and olsun ki, yox! İstədiyim heç nəyi məndən əsirgəmədi, nə istədimsə, verdi. Yardım istəyəndə yardım

[400] İbn Əbi əd-Dünya, "əş-Şukur", 137, zəif isnadla; Əbu Nəim, "əl-Hilyə", 5/85; zəif isnadla. Ümumən əsərin bu yollarla ona aid olması sabitdir.

[401] İbn Əbi əd-Dünya, "aş-Şukur", 140; Əbu Nəim, "əl-Hilyə", 6/189. Deyirəm: sənədi zəifdir.

etdi". O dedi: "Adəm övladından biri bu yaxşılıqları sənə etsəydi, onların əvəzi nə olardı?" Mən dedim: "Ona əvəzini verməyə gücüm çatmazdı". O dedi: "O halda, öz nəfsinə Allaha şükür etməyi öyrətməyin daha yaxşıdır. Çünki köhnə-təzə bütün nemətləri sənə verən yalnız Allahdır. And olsun Allaha ki, Allaha şükür etmək, bəndələrinə mükafat verməkdən daha asandır. Çünki Allah, qullarının həmd etmələri ilə şükür etdiklərinə razı olur, yəni onlara bir nemət verildikdə, əlhəmdulilləh desələr, o nemətə şükür etmiş olarlar".[402]

Sufyan əs-Səvri demişdir: "Allah-taala dünyada nemət verdiyi qulunu axirətdə rəzil etməz. Çünki nemət verdiyi qulunun nemətini tamamlamaq Allahın haqqıdır".[403]

İbn Əbi əl-Həvari demişdir: "Mən Əbu Muaviyəyə dedim: "Allah-taalanın üzərimizdəki tövhid neməti nə qədər əzəmətlidir ki, onu bizdən almaması üçün Allaha dua edib istəyirik". O dedi: "Qulu üçün neməti tamamlamaq Allahın haqqıdır. Neməti tamamlamamaq Allahın şəninə yaraşmaz. Allah üçün bir əməl edilsə, onu qəbul edər".[404]

İbn Əbi əl-Həvari demişdir: "Bir qadın mənə: "Mən evimdə olarkən qəlbimdə məşğul idim"- dedi. Mən də: "Qəlbini məşğul edən nə idi?"- deyə soruşdum. O dedi: "Bir göz qırpımında Allahın mənə verilən nemətlərini bilmək istəyirdim, yaxud göz qırpımında mənə verilən nemətin şükrünü yerinə yetirdikdə buraxdığım qüsuru bilmək istəyirdim". Mən ona dedim: "Sən ağılların gücü çatmayacaq bir şeyi öyrənmək istəyirsən".[405]

İbn Zeyd demişdir: "Bir məclisdə kim Allaha həmd edərsə, buna görə Allah-taala, o məclisdə olanların hamasının ehtiyacını yox edər”.[406]

Allah-taalanın endirdiyi kitabların birində deyilir: "Mömin bəndəmi sevindirin. Çünki ona hər hansı bir şey gəlirsə, mütləq "Əlhəmdulilləh", "maşaallah" deyər. Mömin bəndəmi qorxudun, çünki o, ikrah etdiyi bir şeylə qarşılaşdıqda, mütləq "əlhəmdulilləh", "əlhəmdulilləh" deyər. Qulumu sevindirdiyim kimi, onu qorxutduğumda da Mənə həmd edər. Qulum hər zaman Mənə həmd

402 İbn Əbi əd-Dünya, "əş-Şukur", 141.

403 İbn Əbi əd-Dünya, "əş-Şukur", 142; Əbu Nəim, "əl-Hilyə", 6/7. Deyirəm: sənədi həsəndir.

404 İbn Əbi əd-Dünya, "əş-Şukur", 143-144; Əbu Nəim, "əl-Hilyə", 8/272. Deyirəm: sənədi səhihdir.

405 İbn Əbi əd-Dünya, "əş-Şukur", 145. Deyirəm: sənədində qırıq var.

406 İbn Əbi əd-Dünya, "əş-Şukur", 146; Əbu Yəla, "Tabaqat əl-Hənəbilə", 1/136. Deyirəm: sənədi səhihdir.

etdiyi üçün onu Cənnətə salın".[407]

Vəhb demişdir: "Bir abid Allah-taalaya əlli il ibadət etdi. Allah-taala ona: "Sənin günahlarını əfv və məğfirət etdim"- dedi. O da: "Ya Rəbb, mənim üçün nəyi bağışladın, çünki mən günah işlətməmişəm". Allah-taala onun boynundakı bir damara əmr etdi, o damar da ağrımağa başladı. O abid yatmadı, namaz qılmadı, sonra damarın ağrıması dayandı, o da yatdı. Sonra da bir mələk gəldi boynundakı ağrıdan ona şikayət etdi? Mələk ona dedi: "Rəbbin buyurur ki, sənin əlli illik ibadətin bu damarın sakit olmasının əvəzidir".[408]

İbn Əbid-Dünya söylədi: "Davud peyğəmbər demişdir: "Ya Rəbb! Mənə verdiyin ən kiçik nemətini mənə bildir". Allah-taala ona: "Ya Davud! Nəfəs al!"- deyə vəhy etdi. O da nəfəs aldı. Allah-taala ona dedi: "Bu sənin üzərində olan ən kiçik nemətimdir".[409]

## Fəsil

Bununla, Zeyd bin Sabit ilə İbn Abbasın hədisindən Əbu Davudun rəvayət etdiyi hədisin mənası açıqlanır:

"Həqiqətən, Allah-taala göy və yer əhlinə əzab versəydi, onlara zülm etmədən əzab verərdi. Onlara rəhm etsəydi, rəhməti onlar üçün əməllərindən daha xeyirli olardı".[410]

Əl-Buxarinin "əs-Səhih" əsərində rəvayət edildiyinə görə: Allahın elçisi buyurdu: "Ey əshabələrim, sizdən heç biriniz əməlləri ilə nicat tapmayacaq". Əshabələr soruşdu: "Hətta sən də, ey Allahın elçisi?" Allahın elçisi: "Bəli mən də. Ancaq məni Allahın fəziləti və rəhməti bürümüşdür. Çünki qulun heç bir əməli Allahın bir nemətinin belə əvəzi ola bilməz"- deyə cavab verdi.[411]

Fəqihlərdən bəzisinin "bir kimsə həmd növlərinin ən fəzilətlisi ilə Allaha həmd edəcəyinə and içsə, andına əməl etmək üçün: **"Əlhəmdulilləhi həmdən yuvafi ni'mətə və yukafi məzidəhu"** - deməlidir" sözü nə Allah elçisinin hədisidir, nə də əshabələrdən birinin sözüdür. Ola bilsin ki, Adəm peyğəmbər haqqında yəhudilərin rəvayətidir.

---

[407] İbn Əbi əd-Dünya, "əş-Şukur", 147; əl-Beyhəqi, "Şuabul-İman", 4174; Əbu Yəla, "Tabaqat əl-Hənəbilə", 1/136. Deyirəm: sənədi çox zəifdir.

[408] İbn Əbi əd-Dünya, "əş-Şukur", 148; Əbu Nəim, "əl-Hilyə", 4/68; əl-Beyhəqi, "Şuabul-İman", 4302; Deyirəm: sənədi zəifdir.

[409] İbn Əbi əd-Dünya, "əş-Şukur", 149; əl-Beyhəqi, "Şuabul-İman", 4303.

[410] **Səhihdir:** Əbu Davud, 4699; İbn Macə, 77; Əhməd. 5/182, 185, 189; İbn Hibban, 727; at-Tabərani, "əl-Kəbir", 4940; əl-Beyhəqi, 10/204 və s.

[411] əl-Buxari, 6463; Müslim, 2816.

Allahın elçisindən səhih olaraq rəvayət olunan budur: **"Əlhəmdulilləhi kəsiran, teyyibən, mubarəkən fihi, ğeyri məkfiyyin və lə muvaddəin və lə mustağni ənhu Rabbənə"**.

Bir qulun həmd və şükrü nəinki Allahın nemətlərinin hamısının əvəzi, heç bircə nemətinin belə qarşılığı deyil. Fəqət bəzi fəqihlərin dediyi həmd səhih bir vəchlə olunur, yəni nemətlərə əvəz olacaq və nemətlərin artmasına eyni olacaq şəkildə Allah-taalaya həmd etməkdir. Belə ki, bir qulun: "Allahım! Yerlərin və göylərin dolusu, bunların arasının dolusu, bunların dolusundan sonra Sənin dilədiklərinin dolusu, qumların, torpaqların, çınqılların, yağış damlalarının, canlı varlıqların nəfslərinin, yaratdığın və yaradacağın bütün varlıqların sayı qədər Sənə həmd olsun" - deməsi, Allahın layiq olduğu həmddən xəbər verib, qulun edəcəyi həmd deyildir.

## Fəsil

Əbu əl-Məlih demişdir: "Musa peyğəmbər: "Ey Rəbbim, ən fəzilətli şükür nədir?" - dedi. Allah da: "Bütün hallarda Mənə şükür etməyindir".[412]

Bəkir bin Abdullah qardaşına demişdir: "Mənə bir şey öyrət". O da: "Mən nə deyəcəyimi bilmirəm, ancaq bir qul onu Allaha yaxınlaşdıran həmd və bağışlanma diləməkdən yorulmamalıdır. Çünki Adəm oğlu nemət ilə günah arasındadır. Nemət faydalı olmaz, amma həmd və şükürlə faydalı olar. Günah da ancaq tövbə və bağışlanma diləməklə islah olunar"- dedi. "Mənə istədiyimdən çox şey dedin" - dedim.[413]

Abduləziz bin Əbu Davud demişdir: "Məhəmməd bin Vasi'in əlində bir yara gördüm. Məhəmməd bin Vasi'i mənim bundan üzüldüyümü görüb dedi: "Bu yarada, Allah-taalanın mənim üzərimdə nə qədər böyük bir neməti var, bilirsənmi? Çünki, Allah-taala bu yaranı mənim göz bəbəyimdə, dilimdə və beynimdə salmamışdır". Onun yarası məni rahat etdi".[414]

Əl-Cureyrinin Əbu əl-Vərddən, o da Cəllacdan, o da Müaz bin Cəbəldən rəvayət edərək demişdir: "Allahın elçisi bir adamın yanına gəldi. O adam: "Allahım, mən Səndən nemətin tamamını[415] istəyirəm"

---

[412] İbn Əbi əd-Dünya, "əş-Şukur", 151. Deyirəm: sənədi çox zəifdir.

[413] İbn Əbi əd-Dünya, "əş-Şukur", 150. Deyirəm: sənədi çox zəifdir.

[414] İbn Əbi əd-Dünya, "əş-Şukur", 152; Əbu Nəim, "əl-Hilyə", 2/352; Deyirəm: sənədi zəifdir.

[415] Qarşıda görəcəyik ki, nemətin tamamı - "Ayağının biri sırat körpüsü üzərində ikən digərini Cənnətə qoymağındır"- deyiblər.

- dedi. Allahın elçisi ona: "Ey Adəm övladı, nemətin tamamı bilirsənmi nədir?" O da: "Ey Allahın elçisi özümə xeyir ümid etdiyim bir dua ilə dua etdim" - dedi. Allahın elçisi dedi: "Nemətin tamamı Cəhənnəmdən qurtuluş, Cənnətə girməkdir".[416]

Təmim bin Sələmə: "Mənə deyiblər ki, bir kimsə yeməyə Allahın adı ilə başlasa ("Bismilləh" deyərsə), sonunda Allaha şükür etsə ("Əlhəmdülilləh" deyərsə), Qiyamətdə o yemək nemətindən soruşulmaz"- demişdir.[417]

## Şükrün səbirdən üstünlüyü

Şübhə yox ki, Allah-taala sağlamlığın istənilməsini sevər. Allah-taaladan sağlamlıqdan daha sevimli bir şey istənilməmişdir.

"Müsnəd" əsərində[418] Əbu Salihdən, o da Əbu Hureyrədən nəql edərək demişdir: "Əbu Bəkir minbərə çıxdı və dedi: "Ey möminlər, Allahdan can sağlığı istəyin. Çünki qula imandan sonra sağlamlıqdan daha xeyirli bir şey verilməmişdir".[419]

Bunlar şükrün səbirdən üstün olduğuna dəlalət edir. Digər bir hədisdə: "Şübhə yox ki, insanlara bu dünyada bağışlanma və sağlamlıqdan daha üstün bir şey verilməmişdir. O halda bunları Allah-taaladan istəyin"- buyrulmuşdur.[420]

Allahın elçisi əmisi əl-Abbasa demişdir: "Ey əmi, dualarında sağlamlığı çox istə".[421]

ət-Tirmizi əl-Abbasın belə dediyi rəvayət edir: "Ey Allahın elçisi, mənə bir şey öyrət onu Allahdan istəyim". O dedi: "Allahdan sağlamlıq istə!" Bir neçə gün sonra yenə Allahın elçisinin yanına gəlib dedim: "Ey Allahın elçisi, mənə bir şey öyrət, onu Allahdan istəyim". O mənə dedi: "Ey Abbas! Ey Allah elçisinin əmisi, Allahdan dünyada və axirətdə salamatlıq dilə".[422]

---

[416] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 156; əl-Buxari, "əl-Ədəbul-Mufrəd", 725; ət-Tirmizi, 3527; Əhməd, 5/231; ət-Tabərani, "əl-Kəbir", 20/27; Əbu Nəim, "əl-HiIyə", 6/204. Deyirəm: sənədi zəifdir.

[417] İbn Əbi əd-Dünya, "əş-Şukur", 159. Deyirəm: sənədi səhihdir.

[418] Bu sənədlə "Müsnəd"də yoxdur.

[419] **Səhihdir:** Əhməd, 1/3, 5; əl-Buxari, "əl-Ədəbul-Mufrəd", 724; ən-Nəsai, "əl-Kubra", 6/220; İbn Macə, 3849; al-Hakim, 1/529.

[420] **Səhihdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 154; ən-Nəsai, "əl-Kubra", 6/221; əl-Bəzzar, "əl-Bəhr əz-Zaxxar", 23; Əbu Bəkr əl-Mərvəzi, "Müsnəd Əbu Bəkr", 53.

[421] **Həsəndir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 153; ət-Tabərani, 11/261-262/11908; əl-Təbəri, "Təhzib əl-Əsər", 1196; al-Hakim, 1/529.

[422] **Səhihdir:** ət-Tirmizi, 3514; əl-Buxari, "əl-Ədəbul-Mufrəd", 726; Əhməd, 1/209; əl-Həmidi, 461; ət-Təyalisi, 1279; əl-Bəzzar, 4/139/1313, 1314; İbn Əbi

Allahın elçisi Taif günü duasında demişdir: "İlahi! Qüvvətimin zəif olduğunu, çarəsiz qaldığımı, xalq qarşısında həgirliyimi Sənə ərz edirəm. İlahi, əgər mənə qarşı qəzəbli deyilsənsə, çəkdiyim zəhmətlərə, bəlalara heç əhəmiyyət verməyərəm, amma bu da var ki, Sənin afiyətin daha genişdir"[423]. Allahın elçisi Allahın afiyətinə sığınmışdır. Belə ki, bir duasında da: "Allahım, Sənin qəzəbindən razılığına sığınıram, Sənin əzabından afiyətinə sığınıram, Səndən Sənə sığınıram" - buyurmuşdur.[424]

Başqa hədisdə: "Allahdan bağışlanma, afiyət və salamatlıq istə"- deyilir[425]. Bu duada istənilənlər keçmiş zamanda edilmiş günahların bağışlanmasını, indiki zamandakı afiyəti, gələcək zamandakı afiyətin davamı ilə salamatlığı əhatə edir.

Abdullah ət-Təymi belə dedi: "Allahdan afiyəti çox istəyin. Çünki bəlaya uğramış kimsənin bəlası nə qədər şiddətli olursa-olsun, dua etməyə afiyətdə olan şəxsdən daha layiqli deyildir. Çünki afiyətdə olan şəxs bəlaya uğramayacağına arxayın deyil. Bu gün bəlaya uğrayanlar, dünən afiyətdə olanlardır. Sabah bəlaya uğrayacaqlar, bu gün afiyətdədirlər. Əgər bəla xeyir gətirərsə, biz bəla əhlindən deyilik. Yəni bəla bizim doğru yola gəlməyimizə və savab qazanmağımıza səbəb olursa, bu bəla bəla deyil, əksinə, bu bizim üçün bir nemətdir. Çünki çox bəlalar vardır ki, sahibini həm dünyada yorar və həm də axirətdə rəzil edər. Uzun zaman Allaha üsyan edən kimsənin ömrünün geri qalan hissəsində onu dünyada həlaka sürükləyəcək və axirətdə isə rəzil edəcək bəlaya uğramasından əmin deyildir".

Abdulla ət-Təymi bunları anlatdıqdan sonra: "Nemətlərini saya bilməyəcəyimiz, onun üçün nə qədər əməl etsək qarşılığını verə bilməyəcəyimiz, dünya durduqca bizə ömür verilib nemətləri içində yaşayaraq nemətlərini əskildə bilməyəcəyimiz Allaha həmd olsun" – dedi.[426]

Allahın elçisi bir nəfərin yanından keçərkən onun Allahdan səbir dilədiyini görüb, ona: "Sən bəla dilədin. Allahdan afiyət dilə"- dedi.[427]

---

Şeybə, "Musənnəf", 10/206; ət-Tabərani, "əd-Dua", 1295.

[423] **Zəifdir:** ət-Tabərani, "əl-Kəbir", 13/73/181; əl-Heysəmi, "Məcmuə əz-Zəvaid" (6/35) kitabında demişdir: "Hədisi ət-Tabərani rəvayət edib, rəvayətçilərindən İbn İshaq müdəllisdir".

[424] Müslim, 486.

[425] **Həsəndir:** ət-Tirmizi, 3558; Əhməd, 1/3; əl-Bəzzar, "al-Bəhr əz-Zaxxar", 1/94/34; Əbu Bəkr əl-Mərvəzi, "Müsnəd Əbu Bəkr", 47.

[426] İbn Əbi əd-Dünya, "əş-Şukur", 157.

[427] **Zəifdir:** Ibn Əbi əd-Dünya, "əş-Şukur", 156; əl-Buxari, "əl-Ədəbul-Mufrəd", 725; ət-Tirmizi, 3527; Əhməd, 5/231; ət-Tabərani, "əl-Kəbir", 20/27; Əbu Nəim,

Müslimin "əs-Səhih" əsərində rəvayət olunur: "Allahın elçisi zəifləyib quşcuğaza dönmüş bir xəstəni ziyarət etdi. Allahın elçisi ondan: "Allaha bir şeylə dua edir və ya ondan bir şey istəyirsənmi?"- deyə soruşdu. O: "Bəli, Allahım, mənə axirətdə nə cəza verəcəksənsə, onu bu dünyada verməyini diləyirəm" - dedi. Allahın elçisi: "Subhənəllah! Sənin buna gücün çatmaz. Sən, "Allahım, bizə həm bu dünyada, həm də axirətdə həsənət ver və bizi cəhənnəm əzabından qoru" duasını et - dedi"[428]. Allahdan dilədi və Allah şəfa verdi.

ət-Tirmizidən olan rəvayətə görə Əbu Hureyrə demişdir: "Allahın elçisindən əzbərlədiyim bu duanı heç vaxt unutmaram: "Allahım, məni sənin şükrünə təzim edənlərdən, səni çox zikr edənlərdən, sənin nəsihətinə əməl edənlərdən, sənin əmirlərini və qadağalarını qoruyanlardan et".[429]

Şeyban demişdir: "Həsən əl-Bəsri bir məclisdə oturarkən belə deyərdi: Allahım, bizi müsəlman etdiyin üçün yalnız Sənə həmd edirik. Bizə Quranı bəxş etdiyin üçün yalnız Sənə həmd edirik. Bizə ailə, var-dövlət verdiyin üçün, bol ruzi verdiyin üçün, əmin-amanlıq və afiyət verdiyin üçün, Səndən hər dilədiyimizi bizə verdiyin üçün yalnız Sənə həmd edirik. Bizə çoxlu nemət və çoxlu xeyir verdiyin üçün, bizdən bir çox şərləri və pislikləri yox etdiyin üçün yalnız Sənə həmd edirik. Sənin əl-Cəlil, əl-Bəqi, əd-Daim olan sifətlərin üçün yalnız Sənə həmd edirik".[430]

Sələf-salehdən bəziləri demişlər: "Allahım, dinimizdə və dünyamızda, keçmiş və gələcək nemətlər, afiyət və ehsan yalnız Səndəndir. Sən birsən və Sənin şərikin yoxdur. Odur ki, yalnız Sənə həmd edirik, minnət, fəzilət, həmd Sənə məxsusdur. Bizə və bütün məxluqata verdiyin nemətlərin sayı qədər Sənə həmd olsun. Səndən başqa heç bir ilah yoxdur".[431]

Mucahid demişdir: İbn Ömər səfərdə ikən səhər açılanda səsini qaldıraraq üç dəfə: "Allah-taalanın bizim üzərimizdə haqqı olan həmdini, nemətlərini və gözəl bəlalarını hər kəs haqq olaraq bilsin!" - deyə səslənərdi. Sonra: "Allahım bizə yoldaş ol! Fəzilətindən bizə bəxş et. Oddan Allaha sığınırıq. Günahlardan dönüş və itaət üçün güc də ancaq Allahdandır" - deyərək, bunu üç dəfə təkrarlayardı".[432]

---

"əl-Hilyə", 6/204. Deyirəm: sənədi zəifdir.

428 Müslim, 2688.

429 **Zəifdir:** ət-Tirmizi, 3667; Əhməd, 2/311, 477; Əbu Davud əl-Təyalisi, 2553; əl-Beyhəqi, "əd-Dəavat", 232.

430 İbn Əbi əd-Dünya, "əş-Şukur", 161, 201.

431 İbn Əbi əd-Dünya, "əş-Şukur", 160; Əbu Yəla, "Tabaqat el-Hənəbilə", 1/194.

432 **Səhihdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 163; Abdurrəzzaq, "əl-Musənnəf", 11/343/20929.

İmam Əhməd demişdir: "Allah-taala Musa bin İmrana: "Ya Musa, ayıq ol! Özünə dostlar tut. Mənim məhəbbətim üzrə dostluq etməyənlə yoldaşlıq etmə, çünki o sənin düşmənindir və qəlbini sındırar. Şükür etməyin üçün və nemətin artması üçün Məni çox xatırla" - deyə vəhy etdi".[433]

Əl-Həsən əl-Bəsri demişdir: "Allah-taala Adəm peyğəmbəri yaratdığı zaman cənnətlikləri onun sağ tərəfindən, cəhənnəmlikləri isə onun sol tərəfindən çıxardı. Onlardan kimisi kor, kimisi kar kimi, kimisi də başqa xəstəliklə yer üzündə qovrulmağa başladılar. Adəm dedi: "Ya Rəbbim! Övladlarımı nə üçün eyni etmədin?" Allah-taala buyurdu: "Ey Adəm, Mənə şükür etmələrini istədim".[434]

"Əs-Sünnən" əsərində rəvayət olunur ki: "Allahın elçisi demişdir: "Bir kimsə səhərə çıxdıqda: "Allahım, mənə verdiyin nemət və məxluqatından hər birinə verdiyin nemət, ancaq Səndəndir. Sən birsən, Sənin şərikin yoxdur, həmd də, şükür də, ancaq Sənə məxsusdur" - deyərsə, o, həmin günün şükrünü yerinə yetirmiş olur. Kim bu duanı axşam edərsə, o gecənin şükrünü əda etmiş olur".[435]

Hədislərin birində: "Bəlaya uğradıqda səbir edənlər, onlara verilənlərə şükür edənlər, onlara haqsızlıq edildikdə bağışlayanlar, haqsızlıq etdikdə əfv diləyənlər əmin-amanlıqdadır. Hidayətə yetişənlər də onlardır".[436]

Allahın elçisi bir nəfərə üç şeyi tövsiyə edərək: "Ölümü çox xatırla ki, başqa şeylərə başın qarışmasın, daima dua et, çünki etdiyin duanın nə zaman qəbul ediləcəyini bilməzsən, şükür etməyə davam et, çünki şükür nemətin artmasına səbəbdir".[437]

Allahın elçisi yeməkdən sonra: "Məni yedirən, məni içirdən, mənə hidayət verən, hər gözəl bəla ilə məni imtahan edən Allaha həmd olsun! Ruzi verən, yenilməz qüvvətə sahib olan Allaha həmd olsun! Allahım, bizə verdiyin faydalı şeyləri və bizə ruzi kimi verdiyin faydalı şeyləri bizdən alma, bizi Sənə şükür edənlərdən et!" - deyə dua edərdi.[438]

Allahın elçisi yeməkdən sonra: "Yedirən, içirən, yeməyi-içməyi asanlaşdıran, yeməyin faydasız olan hissəsinin bayıra çıxmasına yol

---

[433] **Səhihdir:** Əhməd, "əz-Zühd", səh. 108; Əbu Nəim, "əl-Hilyə", 8/222; İbn Əbi əd-Dünya, "əş-Şukur", 164.

[434] İbn Əbi əd-Dünya, "əş-Şukur", 165; əl-Beyhəqi, "Şuabul-İman", 4127.

[435] **Zəifdir:** Əbu Davud, 5073; ən-Nəsai, "əl-Kubra", 6/5, "Əməlul-Yaum vəl-Leylə", 7; İbn Sunni, "Əməlul-Yaum vəl-Leylə", 14; İbn Əbi əd-Dünya, "əş-Şukur", 166; əl-Beyhəqi, "əd-Dəavatul-Kubra", 41, "Şuabul-İman", 4059.

[436] **Çox zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 167; ət-Təbərani, "əl-Kəbir", 6614; əl-Beyhəqi, "Şuabul-lman", 4117; Əbu Nəim, "Əxbar əsbəhan", 2/225-226.

[437] **Çox zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 168; Əbu Nəim, "əl-Hilyə", 7/305.

[438] **Hədis mövdudur:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 170; "əl-Mizan", 1/642.

qoyan Allaha həmd olsun"- duasını edərdi.[439]

Urvə bin Zubeyrin qarşısına yemək qoyulanda bu duanı etməsə, əl vurmazdı: "Bizə hidayət verən, bizi yedirən, bizi içirən, bizə nemət verən Allaha həmd olsun. Allah böyükdür. Allahım, bizi nemətinə alışdırdın, biz bütün şərəf və yaxşılıqlarla səhərə çıxdıq. Bütün xeyir və yaxşılıqlarla axşamladıq. Nemətinin tamamını və onun şükrünü Səndən diləyirik. Sənin xeyir və ehsanından başqa xeyir və ehsan yoxdur. Ey salehlərin İlahı! Ey Aləmlərin Rəbbi! Səndən başqa ilah yoxdur. Həmd Allaha məxsusdur. Allahdan başqa ilah yoxdur. Allahın istədiyi olur. Qüvvət ancaq Allahın yardımı ilədir. Allahım bizə ruzi kimi verdiyin şeyi bizim üçün bərəkətli et, bizi Cəhənnəm odunun əzabından qoru".[440]

Vəhb bin Münəbbih demişdir: "Nemətlərin ən böyükləri üçdür. Birincisi, islam nemətidir ki, nemətlər ancaq onunla tamam olur. İkincisi, afiyət nemətidir ki, həyat ancaq onunla xoş olur. Üçüncüsü, zənginlik nemətidir ki, yaşamaq ancaq onunla tamam olur".[441]

Səid əl-Cəriri Həccdən qayıdarkən demişdi: "Allah bizə səfərimizdə filan, filan nemətləri versin". Sonra dedi: "Şükürdən əmələ gələn nemətlər qədər".[442]

Vəhb, gözləri kor, cüzamlı, iflic, çılpaq, yaralı bir nəfərin yanından keçdi. O adam Allahın verdiyi nemətlərə görə Allaha həmd edirdi. Bunu eşidən Vəhbin yanındakı başqa adam ona: "Səndə nemətlərdən hansı nemət qalmışdır ki, ona görə Allaha həmd edirsən!"- dedi. O da belə cavab verdi: "Sən hələ bir şəhər əhalisinə bax. Bax gör onların çoxluğuna. Orada məndən başqa Allahı tanıyan yoxdur. Mən Allaha nə üçün həmd etməyim ki?".[443]

Peyğəmbərdən belə dediyi rəvayət olunur: "Allah-taala bəndəsinə bir nemət verdikdə o da buna görə Allaha həmd edirsə, nemətin şükrünü əda etmiş olur".[444]

---

[439] **Səhihdir:** Əbu Davud, 3851; ən-Nəsai, "əl-Kubra", 4/201; "Əməlul-Yaum vəl-Leylə", 285; İbn Sunni, "Əməlul-Yaum vəl-Leylə", 472; İbn Hibban, 5220; ət-Təbərani, "əl-Kəbir", 4082; əl-Əvsat, 5384, əd-Dua, 897; İbn Əbi əd-Dünya, "əş-Şukur", 171; əl-Beyhəqi, "əd-Dəavatul-Kubra", 455, "Şuabul-İman", 4160; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 2830.

[440] İbn Əbi əd-Dünya, "əş-Şukur", 169. Deyirəm: sənədi səhihdir.

[441] İbn Əbi əd-Dünya, "əş-Şukur", 172; Əbu Nəim, "əI-Hilyə", 4/68. Deyirəm: sənədi zəifdir.

[442] İbn Əbi əd-Dünya, "əş-Şukur", 173; Əbu Nəim, "əl-Hilyə", 6/200.

[443] İbn Əbi əd-Dünya, "əş-Şukur", 174; Əbu Nəim, "əl-Hilyə", 4/68; əl-Beyhəqi, "Şuabul-İman", 4177.

[444] **Çox zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 175; əl-Hakim, 1/507-508; əl-Beyhəqi, "Şuabul-İman", 40904; "Feyd-əl-Qadir", 5/429; əl-Əlbani, "əd-Daif", 2010.

Əli bin Əbu Talib xatırlatmışdır ki: "Buxtunassərın yanına Budanyal gətirildi. Onun həbs edilməsi əmr olundu. Onu zindana saldılar və yanına iki vəhşi aslan buraxdılar. Beş gün sonra zindanın qapısını açarkən onun namaz qıldığını, aslanların da zindanın bir tərəfində yataraq ona toxunmadıqlarını gördülər. Buxtunəssır ondan soruşdu: "Zindana salınanda sən nə söylədin ki, aslanlar sənə toxunmadılar?" O cavab verdi: "Onu xatırlayanı unutmayan Allaha həmd olsun, özünə təvəkkül edəni başqasına buraxmayan Allaha həmd olsun. Çarələrimizin kəsildiyi vaxt dayağımız olan Allaha həmd olsun. Əməllərimizə güvənmədiyimiz vaxt tək ümid yerimiz olan Allaha həmd olsun. Üzüntümüzdən sonra sıxıntımızı yox edən Allaha həmd olsun. Gözəl əməlin əvəzinə gözəl mükafat verən Allaha həmd olsun. Səbirlə dərdlərdən və bəlalardan qurtaran Allaha həmd olsun".[445]

Allahın elçisi güzgüyə baxarkən deyərdi: "Vücudumu və əxlaqımı gözəl yaradan, başqasında çirkin olan şeyi mənə zinət edən Allaha həmd olsun".[446]

İbn Sirin demişdir: "İbn Ömər güzgüyə çox baxardı. Hətta səfərə çıxanda da özü ilə güzgü götürürdü. Ondan soruşdum ki: "Güzgüyə nə üçün çox baxırsan?" Cavabında dedi: "Başqasının üzündə çirkin olan şeyi mənim üzümdə gözəl edən Allaha həmd etmək üçün baxıram".[447]

Əbu Bəkir bin Əbu Məryəmdən: "Nemətin tamamı nədir?"- soruşulduqda, o: "Ayağının biri sırat körpüsü üzərində ikən digərini Cənnətə qoymağındır"- cavabını verdi.[448]

Bəkir bin Abdullah demişdir: "Ey Adəm övladı! Allahın sənin üzərində olan nemətini bilmək istəyirsənsə, iki gözünü yum və kor olanların necə yaşadığını düşün".[449]

Muqatil, **«Məgər Allahın göylərdə və yerdə olanları sizə ram etdiyini, aşkar və gizli nemətləri sizə bolluca ehsan etdiyini görmürsünüzmü?»** (Loğman, 20) ayəsini təfsir edərkən demişdir: "Aşkar (zahiri) nemət islamdır, gizli (batini) nemət Allahın günahlarınızı örtməsidir".[450]

İbn Şəvzəb demişdir: "Abdullah bin Məsud: "Allah-taalanın

---

[445] İbn Əbi əd-Dünya, "əş-Şukur", 176.

[446] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 177; əl-Beyhəqi, "Şuabul-İman", 4145; "Məcmua əz-Zəvaid", 1/138-139.

[447] İbn Əbi əd-Dünya, "əş-Şukur", 178. Deyirəm: sənədi zəifdir.

[448] Yaxşı sənədlə İbn Əbi əd-Dünya, "əş-Şukur", 181.

[449] İbn Əbi əd-Dünya, "əş-Şukur", 182.

[450] İbn Əbi əd-Dünya, "əş-Şukur", 183; əl-Beyhəqi, "Şuabul-İman", 4184. Deyirəm: sənədi zəifdir.

Cəhənnəm əhlinə də neməti vardır. Çünki Allah-taala onlara etdiyi əzabdan daha şiddətli əzab etmək istəsəydi, əlbəttə, edərdi"- demişdir.[451]

Əbu Süleyman əd-Dərani demişdir: "Qiyamət günü Allaha dost olanların bir çox xislətləri vardır: kərəm, səxavət, həlim, şəfqət, rəhm, şükür, yaxşılıq, səbir".[452]

Əbu Hureyrə demişdir: "Biri bəlaya uğramış bir başqasını görəndə: "Sənə verdiyi bəladan mənə afiyət verən və yaratdığı bütün məxluqatın bir çoxundan fəzilətli edən Allaha həmd olsun" - deyərsə, o nemətin şükrünü əda etmiş olur".[453]

Abdullah bin Vəhb demişdir ki, Abdur-Rəhman bin Zeyd belə deyərkən eşitdim: "Şükür həmdin əsasını və fürularını (ikinci dərəcəli olanlarını) əhatə edir". O demişdir: Bədənindəki, qulağındakı, gözündəki, əllərindəki, ayaqlarındakı və digər əzalarındakı nemətlərin hər biri Allah-taalanın bizə verdiyi nemətləridir. Qulun bədəndəki nemətləri Allah-taalaya itaətdə istifadə olunmalıdır. Ruzidə də başqa bir nemət var. Qula Allahın ruzi kimi verdiyi nemət də Allah-taalaya itaətdə istifadə olunmalıdır. Kim belə edərsə, tam şükr, yəni əsasını və fürularını etmiş olur".[454]

Kəb demişdir: "Allah dünyada quluna bir nemət verərsə, o da buna görə Allaha şükür edərək təvazökar olarsa, mütləq Allah-taala dünyada ona həmin nemətin faydasını ehsan edər, axirətdə də o nemətin səbəbi ilə onun dərəcəsi yüksələr. Allah-taala quluna dünyada bir nemət verərsə, o da buna görə Allaha şükür edərək təvazökarlıq etməzsə, mütləq Allah-taala dünyada ona həmin nemətin faydasını qadağan edər və onun üçün Cəhənnəm təbəqələrini açar, istəsə əzab verər, istəsə də əfv edər".[455]

Əl-Həsən əl-Bəsri demişdir: "Allahın nemətini yalnız yeməkdə, içməkdə, geyimdə görən kəsin elmi az, əzabı isə hazırdır".[456]

Əl-Həsən əl-Bəsri bir gün Bəkir əl-Muzəniyə dedi: "Ey Əbu Abdullah, qardaşların üçün dua et. O da Allaha həmd-səna etdikdən, Allahın elçisinə salavat dedikdən sonra dedi: "Vallahi üzərimdəki və

---

[451] İbn Əbi əd-Dünya, "əş-Şukur", 184; əl-Beyhəqi, "Şuabul-İman", 4184. Deyirəm: sənədi zəifdir.

[452] İbn Əbi əd-Dünya, "əş-Şukur", 186; Əbu Nəim, "əl-Hilyə". 9/226. Deyirəm: sənədi səhihdir.

[453] **Həsəndir:** İbn Əbi əd-Dünya, "əş-Şukur", 187; əl-Beyhəqi, "Şuabul-İman", 4129; ət-Tirmizi, 3432; ət-Tabərani, əl-Əvsat, 4724, əs-Sağir, 1/241, əd-Dua, 799. Deyirəm: sənədi zəifdir.

[454] İbn Əbi əd-Dünya, "əş-Şukur", 188. Deyirəm: sənədi səhihdir.

[455] İbn Əbi əd-Dünya, "əş-Şukur", 189; Əbu Nəim, "əl-Hilyə", 6/43. Deyirəm: sənədi zəifdir.

[456] İbn Əbi əd-Dünya, "əş-Şukur", 190. Deyirəm: sənədi zəifdir.

sizin üzərinizdəki nemətlərin hansının daha fəzilətli, daha üstün olduğunu bilmirəm: ağız yolu neməti, yoxsa yeməyin faydalı olmayan qisminin bayıra çıxarılma yolu neməti". O dedi: "Yeməyin faydalı olmayan qisminin bayıra çıxarılma yolu, əlbəttə, yemək nemətinə daxildir".[457]

Aişə demişdir: "Bir qul suyu içsə, su da əziyyət vermədən daxil olar və faydasız qismi bayıra çıxarsa, o qulun bu nemətə şükür etməsi vacib olur".[458]

Əl-Həsən əl-Bəsri demişdir: "Ləzzətlə daxil olan və faydasız qismi rahatlıqla bayıra çıxan o qədər nemət vardır ki. Bu məmləkətin hökmdarlarından bir hökmdar xidmətçilərindən bir oğlanın bardaqdan bir parç su götürüb içdiyini görüb ona: "Kaş ki, məndə sənin kimi su içə biləydim" - demişdi. Çünki o hökmdar onun kimi su içə bilmirdi. Su içdiyi zaman, o suyun hər qurtumu onun üçün bir ölüm olurdu. Bu cür su içmək nə qədər böyük bir nemətdir".[459]

Alimlərdən birinin öz qardaşına yazdığı məktubda deyilir: "Bundan sonra bil ki, çox günahkar olmağımıza rəğmən Allahın bizə verdiyi nemətləri sayıb qurtara bilmərik. Bunlardan hansına şükür edəcəyimizi bilmirik: bizi sevindirən gözəl nemətlərinəmi yoxsa, qəbahətlərimizin örtülməsi nemətinə".[460]

Əl-Həsən əl-Bəsriyə bir nəfərin insanlara qarışmadığını xəbər verdilər. əl-Həsən onun yanına gəlib, səbəbini soruşduqda, o belə cavab verdi: "Mən günah ilə nemət arasında axşamlayıb səhərə çıxıram. Günahdan bağışlanma diləməklə, nemətə görə Allaha şükür etməklə məşğul olduğum üçün insanlara qarışmağa vaxtım yoxdur". əl-Həsən ona belə cavab verdi: "Ey Allahın qulu, doğrusu sən mənə görə əl-Həsəndən daha fəqihsən, beləcə davam et".[461]

İbn Mübarək Əli bin Salihin: "**«..."Əgər** (mənə) **şükür etsəniz, sizə** (olan nemətimi) **artıracağam"»** (İbrahim, 7) ayəsindəki "artıraram" kəlməsi ilə "Allahın itaətinin artırılması" arzu edilmişdir" - dediyini eşitmişdir. Çünki, Allahın itaətinin artırılması nemətlərin ən böyüklərindəndir.[462]

İbn Əbi əd-Dünya Muharib bin Dəsərin gecələri bəzən səsini yüksəldərək belə dediyini xatırlatmışdır: "Tərbiyələndirdiyin bir

---

[457] İbn Əbi əd-Dünya, "əş-Şukur", 191; əl-Beyhəqi, "Şuabul-İman", 4158.
[458] İbn Əbi əd-Dünya, "əş-Şukur", 192. Deyirəm: sənədi çox zəifdir.
[459] İbn Əbi əd-Dünya, "əş-Şukur", 193; əl-Beyhəqi, "Şuabul-İman", 4159. Deyirəm: sənədi həsəndir.
[460] İbn Əbi əd-Dünya. "əş-Şukur", 194.
[461] İbn Əbi əd-Dünya, "əş-Şukur", 196. Deyirəm: sənədi zəifdir.
[462] İbn Mübarək, "əz-Zühd", 320; İbn Cərir, "əl-Təfsir", 13/186; İbn Əbi əd-Dünya, "əş-Şukur", 198; əl-Beyhəqi, "Şuabul-İman", 4212. Deyirəm: səhihdir.

kiçik uşaq mənəm, həmd ancaq Sənədir. Qüvvətləndirdiyin zəif mənəm, həmd ancaq Sənədir. Varlandırdığın kasıb mənəm, həmd ancaq Sənədir. Evləndirdiyin subay mənəm, həmd ancaq Sənədir. Geyindirdiyin çılpaq mənəm, həmd ancaq Sənədir. Yoldaş olduğun qonaq mənəm, həmd ancaq Sənədir. Qaytardığın yol azan mənəm, həmd ancaq Sənədir. Şəfa verdiyin xəstə mənəm, həmd ancaq Sənədir. Ehsan etdiyin dilənçi mənəm, həmd ancaq Sənədir. Duası müstəcəb olan duaçı mənəm, həmd ancaq Sənədir. Ey Rəbbimiz! Çoxlu həmd yalnız Sənə məxsusdur".[463]

Moizəçilərdən bəzisi xütbəsində deyərdi: "Ey möminlər! Allah-taala sizin üçün gözəl bir burun cızmış, onu yüksəldərək gözəl bir şəkilə salmışdır. Sonra sizin üçün yuvarlaq gözlər, onları yummaq üçün qapaqlar vermiş, qapaqlara kirpiklər qoymuş, sonra sizi haldan-hala salmışdır. Ana və atanızın qəlbini sizə qarşı şəfqətli və mərhəmətli etmişdir. Allah-taalanın nemətləri sizi bürümüş və sarımışdır".[464]

**«Əgər Allahın nemətlərini sayacaq olsanız, sayıb qurtara bilməzsiniz...»** (İbrahim, 34) ayəsi haqqında bəzi alimlər belə demişlər: "Nemətlərin bilinməsi üçün bir sərhəd qoymayan, ancaq nemətlərinin sonsuzluğunu bilməyi mümkün edən Allah pak və nöqsansızdır. Belə ki, Özünün dərk edilməsi üçün bir sərhəd qoymamış, ancaq dərk edilməyəcəyini bilməyi dərk etdirmişdir. Allah-taala, nemətlərini bilməkdən aciz olduğumuzu bilməyi şükür etmişdir. Həmçinin, Allah-taalanın dərk edilməyəcəyini bilmələrini iman etmişdir. Çünki bəndələrin Allahın nemətlərini tam bilmələri mümkün deyil".[465]

Abdullah bin Mübarək Musanna bin əl-Sabbahdan, o da Amr bin Şuaybdan, o da atasından, o da babasından rəvayət etmişdir ki, babası Allahın elçisinin belə dediyini eşitdi: "Hər kimdə iki xislət olarsa, Allah onu səbir edən, şükür edən yazar. Kimdə də bu iki xislət olmazsa, onu səbir edən, şükür edən yazmaz. Dinini yaşamaqda özündən üstün olana baxıb ona uyğunlaşan və dünyəvi yaşayışda özündən aşağıda olana baxıb özünü ondan üstün etdiyi üçün Allaha həmd edənə Allah-taala səbir edən və şükür edən yazar. Dində özündən aşağıda olana, dünyəvilikdə özündən üstün olana baxıb özündə olmayan nemətə görə üzülən kəsi Allah səbir edən və şükür edən yazmaz".[466]

---

[463] İbn Əbi əd-Dünya, "əş-Şukur", 199; əl-Beyhəqi, "Şuabul-İman", 4276, səhihdir.
[464] İbn Əbi əd-Dünya, "əş-Şukur", 200; əl-Beyhəqi, "Şuabul-İman", 4150, səhihdir.
[465] İbn Əbi əd-Dünya, "əş-Şukur", 202; əl-Beyhəqi, "Şuabul-İman", 4304.
[466] İbn əl-Mübarək, "əz-Zühd", 180; İbn Əbi əd-Dünya, "əş-Şukur", 204; ət-Tirmizi, 2512; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 4102; əl-Albani, "əd-Daif", 1924;

Bu isnad ilə Abdullah bin Amrdan mövquf olaraq rəvayət edilən hədisdə deyilir: "Dörd xislət kimdə olarsa, Allah-taala onun üçün Cənnətdə bir ev tikər: "**Lə iləhə illəllah**"da (tək Allaha ibadət etməkdə - tərc.) davam etməsi, başına bir müsibət gəldikdə, "**innə lilləhi və innə ileyhi raciun**" ("biz Allahınıq və Ona da qayıdırıq") deməsi, özünə bir şey veriləndə şükür edib "**əlhəmdulilləh**" deməsi və günah işlətdiyi zaman Allahdan bağışlanma diləməsi üçün "**əstəğfirullah**" deməsi ".[467]

Mücahid **«...Həqiqətən, o** (Nuh Allahın nemətlərinə) **çox şükür edən bir bəndə idi!»** (əl-İsra, 3) ayəsini belə təvsir etmişdir: "Nuh peyğəmbər, bir şey yediyi vaxt mütləq Allah-taalaya həmd edərdi. Nuh peyğəmbər, bir şey içdiyi vaxt mütləq Allah-taalaya həmd edərdi. Gəzərkən mütləq Allaha həmd edərdi. Bir şey tutduğu vaxt mütləq Allah-taalaya həmd edərdi. Buna görə Allah-taala onu "çox şükür edən bir qul idi"- deyə tərifləmişdir".[468]

Məhəmməd bin Kəb demişdir: "Nuh peyğəmbər yeməkdən sonra "əlhəmdulilləh", su içdikdən sonra "əlhəmdulilləh", miniyinə minəndə "əlhəmdulilləh" deyərdi. Buna görə onu "çox şükür edən bir qul idi" – deyə adlandırmışdır".[469]

İbn Əbi əd-Dünya hakimlərin birindən nəql etmişdir ki: "Allah-taala insana günahlarına görə əzab verməsəydi, nemətlərinə şükür üçün ona üsyan edilərdi".[470]

Allah-taalanın qulu üzərindəki iki növ haqqı vardır ki, bunlar bir-birindən ayrılmazdırlar: Birincisi, Allahın əmrləri ilə qadağalarıdır ki, bunlar tamamilə Allahın qulu üzərindəki haqqıdır. İkincisi, Allahın quluna verdiyi nemətlərin şükrüdür. Allah-taala nemətlərinə şükür edilməsini və əmrlərinin yerinə yetirilməsini istəyir. Bəndəyə vacib olan isə üzərində Allahın nemətlərinin daima olduğunu, o nemətlərin şükürdən aciz olduğunu, Allahın əfv və bağışlamasına möhtac olduğunu, Allah ona yardım etmədiyi təqdirdə həlak olacağını bilməsidir. Bəndə Allahın dinində nə qədər bilikli olursa, üzərindəki vacibatı daha mükəmməl görür, qüsurunun daha böyük olduğunu anlayır. Din yalnız açıq haramları tərk etməkdən ibarət olmayıb, haramları tərk etməklə birlikdə Allah dərgahında

---

zəifdir.

467 İbn əl-Mübarək, "əz-Zühd", 182; İbn Əbi əd-Dünya, "əş-Şukur", 205; zəifdir.

468 İbn əl-Mübarək, "əz-Zühd", 941; İbn Əbi əd-Dünya, "əş-Şukur", 206; əl-Beyhəqi, "Şuabul-İman", 4157; İbn Əsakir, 17/335/1; ət-Təbəri, ət-Təfsir, 15/16; səhihdir.

469 İbn əl-Mübarək, "əz-Zühd", 940; İbn Əbi əd-Dünya, "əş-Şukur", 207; əl-Beyhəqi, "Şuabul-İman", 4157; Abdullah bin Əhməd, "Zəvaid əz-Zühd", səh. 66-67; həsəndir.

470 İbn Əbi əd-Dünya, "əş-Şukur", 208; əl-Beyhəqi, "Şuabul-İman", 4227; zəifdir.

sevimli olan əmrlərin hamısının yerinə yetirilməsindən ibarətdir. Alimlərdən bir çoxları Allah dərgahında sevimli olan əmrlərdən ancaq bütün insanların ortaq olduqları əmrləri edirlər. Məsələn, cihad etmək, yaxşılıqları əmr etmək, pislikləri qadağan etmək, Allah üçün, elçisi üçün və Allahın qulları üçün nəsihət etmək, Allaha və Allahın dininə, Kitabına və Elçisinə yardım etmək və s. vaciblərdir. Bunları etmələri bir yana qalsın, bunları etməmə istəyi heç yadlarından da çıxmır.

Allah dərgahında insanların din baxımından ən zəifi, ən güclüsü hər nə qədər dünyanı tərk edib, özünü ibadətə bağlasa belə, bu vacibləri tərk edənlərdir. Adamlar içərisində Allahın qadağaları müzakirə olunanda Allah üçün üzləri qızarıb qozəblənənlər, Allahın dininə yardım etmədə var-dövlətini xərcləyənlər çox azdır.

Əbu Ömər və başqaları qeyd etmişlər ki: "Allah-taala mələklərdən birinə bir şəhəri yerə batırmasını əmr etmiş, mələk də: "Ya Rəbbi! Onların arasında bir zahid və abid olan zəif filankəs var" - demişlər. Allah-taala: "Birinci ondan başla və səsini mənə eşitdir. Çünki mənə üsyan edilərkən heç bir zaman onun üzü də qızarmadı" – buyurmuşdur”.[471]

Allahın nemətini görən kimsə, insan və cinlərin etdiyi yaxşı əməlləri etsə belə, öz yaxşı əməllərini görməz. Çünki Allahın nemətləri onun əməllərindən çoxdur. Onun bütün əməlləri bir nemətin belə əvəzi ola bilməz. Qulun payına düşən, Allahın üzərində olan haqqını daima gözləməsidir.

İmam Əhməd Həccacdan, o da Cərir bin Hazimdən nəql etdi ki, Vəhb belə söyləmişdir: "Musa peyğəmbər dua edən birinin yanından keçirdi. Musa: "Ey Rəbbim, quluna mərhəmət et, çünki mən ona acıdım" - dedi. Allah-taala ona: ”O adam qüvvəsi kəsilənə qədər menə dua etsə, Mənim üzərindəki haqqıma baxmadıqca[472] duasını qəbul etmərəm" - deyə vəhy etdi".

Üzərində vacib olan neməti görən bəndə öz yaxşı əməllərini görməz, daima özünü həqir və zəlil bilər. O, Allahın rəhmətinə nə qədər də yaxındır. Yardımına sığınılacaq ancaq Allahdır.

---

[471] **Çox zəifdir:** ət-Təbərani, "əl-Əvsat", 4390; əl-Beyhəqi, "Şuabul-İman”, 7595; İbnul Arabi, 199.

[472] Əhməd, "əz-Zühd", səh. 111.

# İYİRMİ BİRİNCİ BÖLMƏ

## Səbir edənlərlə Şükür edənlərin hökm və fərqi

Səbirlə şükrün hər biri öz aralarında ölçülməli, hansının ağır və hansının yüngül olduğunun bilinməsi lazımdır. Bu isə, ancaq hər birinin bilinməsindən sonra mümkündür. Biz indiyə qədər səbrin mahiyyətini, qisim və növlərini göstərdik. İndi isə şükrün həqiqətini və mahiyyətini göstərək.

"Əs-Səhah" əsərində deyilir: "Şükr"- sənə, yaxşılıq edəni etdiyi xeyirxahlığına görə tərifləməkdir. Belə ki, "şəkərtuhu və şəkərtu ləhu"- ona şükür etdim deyilir. Bu kəlmənin ləm[473] hərfi ilə istifadəsi daha fəsahətli olur. Çünki Allah-taala: **«**(Və sonra da yedirtdikləri kimsələrə belə deyərlər:) **"Biz sizi ancaq Allah rizasından ötrü yedirdirik. Biz sizdən** (bu ehsan müqabilində) **nə bir mükafat, nə də bir təşəkkür istəyirik»** (əl-İnsan, 9) - buyurmuşdur. Bu ayədəki "şəkurən" kəlməsinin "əl-u'qud" kimi məsdərinin olma ehtimalı olduğu kimi, "əl-burud" və "əl-kəfur" kimi cəm forması olması ehtimalı da var.

"Əş-Şukran" (təşəkkür etmə, yaxşılıq bilmə) kəlməsinin əksi "əl-kufran"-dır (nankorluq). "Təşəkkərtu ləhu" kəlməsi "şəkərtu ləhu" kimidir. Az yem ilə idarə edən heyvana "əş-şəkur" deyilir. Şiddətli yağış yağarkən "iştəkərət əs-səma" deyilir. Döş südlə dolduqda "iştəkərətəd-daru" deyilir. Bir ağacın gövdəsinin ətrafından pöhrələr çıxdıqda "şəkərət əş-şəcərə" deyilir. "əş-Şukru" kəlməsinin törənməsi üzərində bir az düşün və şükrün lüğətdəki mənasını, əmr edilən şükrün mənasını, Rəbbin mükafatı olan şükrün mənası ilə müqayisə et. Bunların hamısında "əlavə" və "artma" mənasını taparsan. Həmçinin, verilən yemə nisbətən daha çox kökələn heyvana "dabhətu-şəkur" deyilir.

Bir qulun şükrünün üç rüknü və əsası var və o qulun şükür edən olması üçün bu üç rüknün və əsasın olması lazımdır. Birincisi, qulun üzərində olan Allahın nemətini etiraf etməsidir. İkincisi, qulun üzərində olan bu nemətə görə Allah-taalaya həmd-səna etməsidir. Üçüncüsü, qulun özünə verilmiş nemətləri, Allahın razılığının qazanmasına sərf etməsidir.

---

[473] Ərəb əlifbasının hərflərindən biri.

Alimlərin şükür haqqında fikirləri: Alimlərdən bir qismi demişdir: "Şükür, Allah-taalanın nemətlərini Ona boyun əyərək etiraf etməkdir".

Bəziləri deyirlər ki, şükür, bəndənin özünə edilən xeyirxahlığı anmaqla yaxşılıq edəni tərifləməsidir. Bəndənin şükrü, ona edilən xeyirxahlığı anmaqla Allah-taalaya həmd-səna etməsidir.[474]

Nemətin şükrü, minnət və ehsanı görmək, hörmət və təzimi qorumaq, nemət verənin xidmətində durmaqdır.[475]

Nemətin şükrü, özünü nemətdə tüfeyli görməyindir.[476]

Şükür, bəndənin şükürdən aciz olduğunu bilməsidir.[477]

Şükür üzərinə şükür etmək, şükürdən daha mükəmməldir. Yəni qulun etdiyi şükrünü, Allahın yardımı və inayəti ilə olduğunu bilməsidir. Allahın bir qulunu şükür etməyə müvəffəq etməsi, nemətlərin ən böyüklərindəndir. Bir qulun şükür üzərinə şükür etməsi, sonra bu şükür üzərinə Allaha şükür etməsi özünü nemətə sahib və layiq bilməməsidir.[478]

Şükür, qulun güc və taqətini Allaha ibadət və itaət etməyə sərf etməsidir.[479]

Şakir, əlində mövcud olan nemətə şükür edəndir, şəkur isə əlində mövcud olmayan nemətə şükür edəndir.[480]

Şakir, veriləndə şükür edəndir, şəkur verilməyənə şükür edəndir.[481]

Şakir, mənfəətə şükür edəndir, şəkur qadağan olunana şükür edəndir.[482]

Şakir, bəxşiş və ehsana şükür edəndir. Şəkur, bəlaya şükür edəndir.[483]

Cuneyd demişdir: "Mən yeddi yaşında uşaq ikən əs-Sər'anın qucağında oynayırdım. Camaat şükür haqqında danışırdı.

O məndən soruşdu: "Ey oğlan, şükür nədir?" Mən dedim ki: "Neməti ilə Allaha asi olmamaqdır". O dedi: "Qorxuram ki, bu sözü dilinlə söyləyəsən, qəlbinə girməmiş olsun". Mən onun bu sözünə görə ömür boyu ağladım".[484]

---

474 "Ər-risalətul-quşəyriyyə", səh. 174.
475 "Ər-risalətul-quşəyriyyə", səh. 174.
476 "Ər-risalətul-quşəyriyyə", səh. 174.
477 "Ər-risalətul-quşəyriyyə", səh. 174.
478 "Ər-risalətul-quşəyriyyə", səh. 174.
479 "Ər-risalətul-quşəyriyyə", səh. 175.
480 "Ər-risalətul-quşəyriyyə", səh. 175.
481 "Ər-risalətul-quşəyriyyə", səh. 175.
482 "Ər-risalətul-quşəyriyyə", səh. 175.
483 "Ər-risalətul-quşəyriyyə", səh. 175.
484 "Ər-risalətul-quşəyriyyə", səh. 175.

Şibli demişdir: "Şükür, nemətləri görmək deyil, nemət verəni görməkdir."[485] Bu söz məncə doğru deyil, çünki neməti nemət verəndən görmək şükrün tamamındandır.

Demişlər ki: "Şükür, mövcud olan neməti bağlayar, mövcud olmayan neməti ovlayar".[486]

Əbu Osman demişdir: "Avam yediyi, içdiyi, geydiyi nemətlərə şükür edər, xüsusi adamlar (zikir, elm əhli - tərc.) isə, qəlblərinə gələn feyz və ilhamlara şükür edərlər."[487]

Hökmdar bir nəfəri həbs etdi. Onun dostu: "Allaha şükür etsin" – deyə xəbər göndərdi. Məhbusu döydülər, dostu yenə ona: "Allaha şükür etsin" - deyə xəbər göndərdi. Bir məcusi də həbs edilərək onun yanına salındı. Məcusinin ayağı zəncirlə bağlandı. Zəncirin bir ucu bu adamın ayağına bağlandı. Məcusi ishaldan əziyyət çəkirdi. Hər dəfə o ayaqyoluna girəndə, bu da məcusi işini qurtarana qədər orada gözləyirdi. Dostu ona yenə: "Allaha şükür etsin" - deyə xəbər göndərdi. Məhbus öz dostuna: "Nə vaxta qədər Allaha şükür edəcəyəm, bundan da böyük bəla olarmı?" - dedi. Dostu ona: "Məcusinin ayağına bağlanan zəncirin bir ucunun sənin ayağına bağlandığı kimi onun belində olan zünnar[488] (küfr əlaməti) sənin belinə bağlansaydı, halın necə olardı? Buna görə Allaha şükür et" – dedi".[489]

Bir nəfər Səhl bin Abdullahın yanına gəlib ona dedi: "Evimə oğru girib, əşyalarımı aparıb". Səhl ona: "Allaha şükür et, əgər şeytan qəlbinə girib imanını oğurlasaydı, nə edərdin?" - dedi.[490]

Demişlər ki, şükr, bir qulun layiq olmadığı halda ona verilən ehsan və nemətə görə Allaha etdiyi həmd-senadan ləzzət almasıdır.[491]

Demişlər ki, sənə edilən yaxşılıqların əvəzini verməkdən aciz olsan dilinlə şükür etməyə davam et.[492]

Demişlər ki, dörd şey var ki, faydası yoxdur: karla fikir mübadiləsi etmək, şükür etməyənə nemət vermək, şoran yerə toxum əkmək, gün işığında şam yandırmaq.[493]

Şükür - qəlb, dil, bədən üzvləri ilə edilir. Qəlb, tanımaq və sevmək üçündür. Dil, həmd və səna etmək üçündür. Bədən üzvləri

---

[485] "Ər-risalətul-quşəyriyyə", səh. 175.
[486] "Ər-risalətul-quşəyriyyə", səh. 175.
[487] "Ər-risalətul-quşəyriyyə", səh. 175.
[488] Məcusilərin bellərinə bağladığı toxunma kəmər.
[489] "Ər-risalətul-quşeyriyyə", səh. 176.
[490] "Ər-risalətul-quşəyriyyə", səh. 176.
[491] "Ər-risalətul-quşəyriyyə", səh. 176.
[492] "Ər-risalətul-quşəyriyyə", səh. 176.
[493] "Ər-risalətul-quşəyriyyə", səh. 176-177.

isə, Allahın itaətində istifadə edilmək və Ona asilikdən uzaq tutulmaq üçündür.

Şairlərdən biri demişdir: "Mənim üç əzam neməti anladır. Əlim, dilim və içimdə gizli olan qəlbim".

Şükür, hərəkətlərə məxsusdur, həmd isə sözlərə məxsusdur. Həmdin səbəbi şükrün səbəbindən daha ümumidir. Şükür bağlı nemət olmaq etibari ilə və edildiyi əza etibari ilə həmdin edildiyi əzalardan daha ümumidir. Allaha həmd ediləcək şeylər isə şükür ediləcək şeylərdən daha ümumidir. Çünki Allah-taalaya adlarına və sifətlərinə, hərəkətlərinə və nemətlərinə görə həmd edilir. Həmdin edildiyi üzvlər şükrün edildiyi üzvlərdən daha azdır. Çünki şükür həm qəlblə, həm dillə və həm də digər üzvlərlə edilir. Həmd isə qəlblə və dillə edilir.

Bunları bildiksə, deyə bilərik ki, səbirlə şükrün hər biri digərinin mahiyyətinə daxildir. Buna görə bunlardan hər birinin varlığı digərinin varlığına bağlıdır. Ancaq bunlardan hər birinə üstün olması etibari ilə özəl ad verilmişdir. Belə olmasa şükrün mahiyyəti səbir, iradə və hərəkətlə birləşər. Çünki şükür Allaha itaət və ibadət etmək və Ona üsyan etməməkdir. Səbir bunların əslidir. İtaət və ibadəti əda edərkən çəkilən məşəqqətlərə səbir etmək və günahlardan uzaqlaşmağa səbr etmək şükrün özüdür. Səbir əmr edildikdə səbir etmək şükürdür.

Yuxarıdakı bu açıqlamadan "səbir ilə şükrün bir olduğu anlaşılır" kimi bir fikir ağla gəlir. Halbuki, bu nə ağılla, nə lüğətə görə, nə də adət-ənənəyə görə mümkün deyil. Çünki Allah-taala bunları fərqləndirmişdir.

Bəli, bunların mənaları ayrıdır. Ancaq biz bunların bir-birindən ayrılmaz olduqlarını və bunlardan hər birinin varlığının digərinin varlığına möhtac olduğunu bəyan etdik. Şükür səbirdən ayrıldığı zaman onun şükür olması batil olur. Səbir şükürdən ayrıldığı zaman onun səbir olması da batil olur. Birincisi açıqdır, ikinciyə gəlincə səbir şükürdən ayrıldığı təqdirdə nankorluq olur. Nankorluğun səbrə zidd olması qəzəbə zidd olmasından daha böyükdür.

Belə bir sual edilsə ki, burada başqa bir qisim vardır ki, nə nankorluq olur, nə də şükür olur. Əksinə, məcburi səbir olur. Buna görə şükrün həqiqəti edilmədiyi kimi səbir də səbir olmaqdan çıxmaz. Belə cavab verilir ki, bizim sözümüz itaət olan əmr edilmiş səbir haqqında olub, heyvanların səbri kimi məcburi səbir haqqında deyildir. İtaət olan səbri, ancaq şükür edən kəs edər. Fəqət şükür edənin şükrü, səbrinin içinə daxil olsa, hökm səbrə aiddir. Belə ki, şükür edənin səbri də şükrünün içinə daxil olursa, hökm şükrə aid olur.

İman məqamlarının birindən digərinə keçdikdə yox olmaz, əksinə aşağı dərəcədə olan məqam yuxarı dərəcədə olan məqamın içinə girər. Belə ki, iman ehsanın içinə girdiyi kimi, səbir də riza məqamları içinə girər. Bu, səbrin yox olması deyildir. Riza məqamı da təfvid məqamının içinə girdiyi kimi qorxu və rica məqamları da məhəbbət məqamlarının içinə girir. Bu, o demək deyil ki, qorxu və rica məqamı yox olur.

Allah-taala qullarını müsibətlərlə imtahan etdiyi kimi nemətlərlə də sınağa çəkir. Allah buyurur: **«Hər bir kəs** (hər bir canlı) **ölümü dadacaqdır.** (Dözüb-dözməyəcəyinizi, şükür edəcəyinizi, yaxud nankor olacağınızı) **yoxlamaq məqsədilə Biz sizi şər və xeyirlə** (xəstəlik, yoxsulluq, ehtiyac və sağlamlıq, var-dövlət və cah-cəlalla) **sınağa çəkərik. Və siz** (qiyamət günü əməllərinizin əvəzini almaq üçün) **ancaq Bizim hüzurumuza qaytarılacaqsınız!»** (əl-Ənbiya, 35);

Digər ayədə: **«İnsana gəldikdə, nə zaman Rəbbin onu imtahana çəkib ehtiram etsə, ona bir nemət versə, o: "Rəbbim mənə ehtiram göstərdi!" - deyər. Amma nə zaman** (Rəbbi) **onu imtahana çəkib ruzisini əskiltsə: "Rəbbim məni alçaltdı** (mənə xor baxdı)**!» - söyləyər»** (əl-Fəcr, 15-16) deyilir.

Başqa bir ayədə: **«Biz yer üzündə olanları onun** (sakinləri) **üçün** (və ya onun özünə məxsus) **bir zinət yaratdıq ki, onlardan hansının daha gözəl əməl sahibi olduğunu yoxlayıb ayırd edək»** (əl-Kəhf, 7) deyilir.

Yenə başqa bir ayədə: **«Hansınızın əməlcə daha gözəl olduğunu sınamaq** (bəlli etmək) **üçün ölümü və həyatı yaradan Odur...»** (əl-Mülk, 2) deyilir.

Yenə başqa bir ayədə: **«Ərşi su üzərində ikən hansınızın daha gözəl əməl** (itaət) **sahibi olacağını sınayıb bilmək üçün göyləri və yeri altı gündə yaradan Odur...»** (Hud, 7) deyilir.

Allah-taala yerləri, göyləri yaratdı, məxluqatı üçün öncədən ömür müəyyən etdi. Yer üzündəki varlıqları imtahan və sınamaq üçün yaratdı. Bu imtahan qulların xeyirdə, şərdə, bolluqda, qıtlıqda səbir və şükür imtahanlarıdır. Zənginlik, sağlamlıq, vəzifə və qüdrət nemətlərinə sahib olanın imtahanı bunlara sahib olmayanın imtahanından daha böyükdür. Allaha itaətə səbir etmək ən çətin səbirlərdəndir. Belə ki, Allahın razı olmuş əshabələri demişlər: "Biz kasıblıqla imtahan edildikdə səbir etdik, zənginliklə imtahan edildikdə səbir edə bilmədik".[494]

Kasıblıq neməti, xəstəlik neməti, dünya malının alınması və

[494] ət-Tirmizi, 2464. Abdurrəhman bin Aufun rəvayəti. Deyirəm: deyildiyi kimidir.

bunun səbəbləri neməti, insanların əziyyət çəkməsinin neməti bəzən nemətlərin ən böyüklərindən olur. Çünki bu nemətlərə şükür etmənin fərz olması, bu nemətlərin zidlərinə şükür etməkdən daha vacibdir. Çünki Allah-taala nemətləri ilə imtahan edər, bəla və müsibətləri ilə də nemət verər.

Şükür ilə səbrin hansının üstün olmasına gəlincə, səbir ilə şükür Allahın əmrində, qadağalarında, qəza və qədərində bəndə üçün lazım olan iki haldır. Bu səbir ilə şükür göz qırpımı müddətində belə biri digərindən ayrılmazdır. Bunlardan hansının daha üstün olduğunu soruşmaq hiss və hərəkətdən hansının üstün olduğunu və ya yeməklə içməkdən hansının üstün olduğunu, yaxud da qulun qorxu (Allahın əzabından qorxması) ilə ümidinin (Allahın rəhmətinə ümidi) hansının üstün olduğunu soruşmaq kimidir. İtaət və ibadətlər ancaq səbir və şükürlə əta edilir. Qadağalardan da ancaq səbir və şükürlə uzaqlaşmaq olar. Qul başına təqdir edilmiş müsibətlər gəldikdə səbir edərsə, şükrü səbrinə daxil olur. Belə ki, şükür edənin səbri də şükrünə daxildir. Bunu belə açıqlamaq olar ki, Allah taala qulunu nəfsi və həvəsi ilə imtahan etdi, qula bunlarla mübarizə aparmağı vacib etdi. Yəni hər vaxt nəfsi ilə mübarizəyə davam edəcəkdir. Belə ki, əmr edilmiş itaət və ibadətləri yerinə yetirərək şükür edəcək, istək və həvəsindən uzaqlaşmağa səy edəcəkdir. Varlı olsun, kasıb olsun nəfs və istəklərinə qarşı onun daima mübarizə aparması lazımdır.

Bu məsələ şükür edən varlı və səbir edən kasıbın hansının üstün olduğu məsələdir. Bu məsələ haqqında alimlərin üç fikri vardır. Bu üç fikri Əbu əl-Fərəc İbn əl-Cauzi və digərləri nəql etmişlər. Nəticə olaraq: "Şükür edən varlı ilə səbir edən kasıbdan hansı daha çox təqva sahibidirsə, o fəzilətlidir"- deyiblər. Təqvada eyni olurlarsa, fəzilətdə də eyni olurlar. Çünki Uca Allah insanları sağlamlıq və bəla ilə üstün etmədiyi kimi kasıblıq və zənginliklə də üstün etməmişdir, ancaq təqvalı olmaqla üstün etmişdir. Belə ki, Allah-taala buyurmuşdur: **«Ey insanlar, Biz sizi bir kişi və bir qadından yaratdıq. Sonra bir-birinizi tanıyasınız deyə, sizi xalqlara və qəbilələrə ayırdıq. Allah yanında ən hörmətli olanınız, Allahdan ən çox qorxanınızdır...»** (əl-Hucurat, 13).

Bir hədisdə: "Ərəbin ərəb olmayandan, ərəb olmayanın ərəbdən üstünlüyü yoxdur, ancaq təqvalı olmaq var. İnsanlar Adəmdən törənmişlər, Adəm də torpaqdan yaradılmışdır..." - deyilir.[495]

Təqva iki əsil və əsasa bağlıdır: biri səbir, digəri şükürdür. Varlı

[495] **Səhihdir:** Əhməd, 5/411.

ilə kasıbın hər biri üçün səbirlə şükür lazımdır. Varlı və kasıbdan hansının səbri ilə şükrü mükəmməldirsə, o üstün olur.

Deyilir ki: "Kasıbın səbri mükəmməl, varlının də şükrü mükəmməl olarsa, bunlardan hansi fəzilətlidir?" - deyə soruşulsa, buna belə cavab vərilir: bunlardan vəzifə və vəziyyətində Allahdan ən çox qorxanı üstündür. Bu olmasa, fəzilətli olmaq düşünülməzdir. Çünki varlının şükründəki təqvası kasıbın səbrindəki təqvasından daha üstün ola bilir. Kasıbın da bəzən səbrindəki təqvası varlının şükründəki təqvasından daha üstün ola bilir. Buna görə varlı zənginliyi ilə üstün, kasıb yoxsulluğu ilə üstündür deyilmir. O halda şükür edən varlı səbir edən kasıbdan üstündür deyilməsi doğru olmadığı kimi, səbir edən kasıb şükür edən varlıdan üstündür deyilməsi də doğru deyildir. Çünki şükür ilə səbir imanın iki miniyidir, bunların olması vacibdir. Şükür edən varlı ilə səbir edən kasıbdan hansı daha çox vacib və mənduba[496] sarılmışsa o üstündür. Çünki üstünlük vacib və mənduba sarılmağa bağlıdır. Belə ki, qüdsi hədisdə Allah-taala deyir: **"Mənə qulum heç bir şeylə yaxınlaşmaz, ancaq ona fərz olunmuşlara davam etməklə yaxınlaşar, Qulum nafilə[497] ibadətlərlə Mənə durmadan yaxınlaşar və nəhayət Mən onu sevərəm"**.[498] Buna gorə şükür edən varlı ilə səbir edən kasıbdan hansı vacibatlara daha çox sarılırsa və daha çox nafilə ibadətlərini əta edirsə, o üstündür.

Peyğəmbərdən belə dediyi rəvayət olunub: "Ümmətimin kasıbları varlılarından yarım gün, yəni beş yüz il əvvəl cənnətə girəcəklər"[499].

Bu hədis, kasıbların varlılardan fəzilətli olmasına dəlalət etmirmi? - deyə soruşulsa, demək olar ki, hədis kasıbların varlılardan nə qədər əvvəl Cənnətə girmələrinə dəlalət etsə də, kasıbların dərəcə və məqamda varlılardan üstün olduğuna dəlalət etmir. Şükür edən varlı ilə ədalətli hökmdar hesabat verməkdən gecikdiyi üçün, Cənnətə girəndə dərəcəsi və məqamı daha yüksək olur.

Deyilir ki: "Kasıblar Allahın elçisinə varlıların kölə azad etmələri və sədəqə vermələrinə görə öz əməllərinin onların əməllərindən az olduğundan şikayətləndikdə, o onlara: "Mən də sizə bir şey bildirimmi, onu edəsiz, onunla sizi keçənlərə çatasız?" - demiş və hər namazdan sonra otuz üç dəfə "Əlhəmdulilləh", otuz üç dəfə

---

[496] Məndub - beş şəri hökmdən biri olub vacib olmayan əməllərdir.
[497] Nafilə - fərzdən əlavə edilən ibadətlər.
[498] əl-Buxari, 6502; Əbu Hureyrənin rəvayəti.
[499] **Səhihdir:** ət-Tirmizi, 2353-2354; ən-Nəsai, "ət-Təfsir", 2/92; İbn Macə, 4122; Əhməd, 2/296, 343, 451, 513, 519; İbn Hibban, 676; İbn Əbi Şeybə, "əl-Müsənnəf", 13/246; Əbu Nəim, "əl-Hilyə", 5912, 7/91, 99,100, 8/212, 250.

"Subhanallah", otuz üç dəfə "Allahu Əkbər" demələrini bildirmişdir. Varlılar da eşidib bunu etməyə başladılar. Kasıblar yenə Allahın elçisinin yanına gələrək varlıların da bunu etdiyini dedilər. Allahın elçisi: "**Bu, Allahın dilədiyi kimsəyə əta etdiyi lütfüdür"**[500] (əl-Hədid, 21) - buyurmuşdur". Bu hədis, "şükür edən varlının səbir edən kasıbdan üstün olduğuna dəlalət etmirmi"- deyə soruşulsa, belə cavab vermək olar: "Hədis səbir edən kasıbla şükür edən varlıdan hansının daha çox nafilə ibadətlərə sarılarsa, o üstündür deyən üçün bir hüccətdir. Çünki şükür edən varlılar səbir edən kasıblara fərz və nafilə əməllərdə, cihadda, Allah yolunda çəkilən əziyyət və müqəddərata səbirdə eyni oldular. Fəqət varlıların kölə azad etmələri və sədəqə vermələri kimi nafilə ibadətləri çoxalanda kasıblardan üstün olurlar. Əgər səbir edən kasıbların nafilə ibadətləri şükür edən varlıların nafilə ibadətlərindən daha çox olarsa, bu halda kasıblar varlılardan üstün olurlar".

Deyilir ki: "Rəsulullaha dünya xəzinələrinin açarları təklif edildikdə onları qəbul etməyərək demişdir: "Bir gün ac, bir gün tox olaram".[501]

Hişam bin Urva atasından nəqlən rəvayət etmişdir ki, Aişə demişdir: "Allahın elçisi dünyadan köçdü və buğda çörəyini doyunca yemədi.[502] Vəfat edəndə ailəsinə yemək aldığına görə yəhudiyə girov qoyduğü zirehi, qalxanı hələ də onda idi".[503]

İmam Əhmədin rəvayət etdiyinə görə Əbu Hureyrə belə demişdir: "Allahın elçisi demişdir: "Allahım, Məhəmmədin ailəsinə yetəcək qədər ruzi ver".[504]

İmam Əhməd İsmayıl bin Məhəmməddən, o da İbad bin İbaddan, o da Mucəlid bin Səiddən, o da əş-Şəbidən, o da Məsruqdan rəvayət etmişdir ki, Aişə demişdir: "Ənsardan bir qadın yanıma gəldi. Allahın elçisinin döşəyinin ikiyə qatlanmış bir əba olduğunu görmüşdü. Evinə qayıdanda mənə bir yun döşək göndərdi. Allahın elçisi gələndə: Bu nədir? - deyə soruşdu. Mən də: "Ənsardan filan qadın yanıma gəlmişdi, sənin döşəyini görüb bunu mənə göndərdi" - dedim. Allahın elçisi: "Ey Aişə, döşəyi geri qaytar!" - buyurdu. Fəqət mən onu geri göndərmədim, çünki o mənim xoşuma gəlirdi. Nəhayət, Allahın elçisi mənə bunu üç dəfə söylədi və: "Ey Aişə! Bu döşəyi geri

---

[500] əl-Buxari, 843; Müslim, 595.
[501] **Çox zəifdir:** ət-Tirmizi, 2347; Əhməd, 5/254.
[502] Əhməd, "əz-Zühd", səh. 10; bu ləfzlə rəvayət edib. Başqa ləfzlərlə Müslim, 2970 (24); əl-Buxari, 5416 rəvayət edib.
[503] əl-Buxari, 2916; Müslim, 1603.
[504] Əhməd, "Müsnəd", 2/446, "əz-Zühd", səh. 13; İbn Əbi Şeybə, "əl-Müsənnəf", 13/240; Başqa yolla: əl-Buxari, 6460; Müslim, 1055.

qaytar. Allaha and olsun ki, mən istəsəydim Allah-taala qızıl-gümüş dağlarını mənimlə bərabər gəzdirərdi"- buyurdu və mən onu qaytardım".[505]

Allah-taala Öz elçisi üçün ancaq fəzilətli olanını seçmişdir. Əgər Allahın elçisi dünyanı alsaydı, onun hamısını Allahın rizası üçün sərf edərdi və bunun sayəsində onun şükrü bütün aləmlərin şükründən üstün olardı.

Deyilir ki: "Səbir edən kasıblar və şükür edən varlılardan hər biri Allahın elçisinin halını dəlil göstərmişlər."

Nəticə olaraq Allah-taala elçisi üçün hər iki məqamın arasını mükəmməl bir şəkildə birləşdirmişdir. Allahın elçisi şükür edən varlıların və səbir edən kasıbların seyididir. Allahın elçisi yoxsulluğa qarşı heç bir kasıbın göstərməyəcəyi səbri göstərmişdir. Zənginliyə də heç bir varlının etməyəcəyi şükrü etmişdir. Allahın elçisinin həyatını düşünən kəs işin belə olduğunu anlayar. Allahın elçisi səbir ediləcək yerlərdə insanların ən səbirlisi idi, şükür ediləcək yerlərdə insanların ən çox şükür edəni idi. Allah-taala elçisi üçün kamillik mərtəbələrini mükəmməlləşdirib, onu şükür edən varlıların mərtəbələrinin ən yüksəkliyində və səbir edən kasıbların mərtəbələrinin də ən yüksəkliyində yerləşdirib.

**«Səni yoxsul ikən tapıb dövlətli etmədimmi?!»** (əd-Duha, 8) ayəsindəki "a'ilən" kəlməsinin yoxsul mənasını verməsində təfsir alimləri yekdil fikirdədirlər. Adam yoxsullaşanda "alər-rəculu yəilu" deyirlər və bir adamın övladı və əyalı çox olanda "əalər-rəculu yuilu" deyirlər. Allah-taala buyurmuşdur: **«...Bu, ədalətli olmağa daha yaxındır»** (ən-Nisa, 3). Bəzi təfsirçilər bu ayəni "bir zövcə və cariyə ilə evlənməyiniz əhli-əyalınızın çox olmamasına daha yaxındır" kimi təfsir etmişlər. Fəqət birinci təfsir bir çox cəhətlərdən daha yaxşıdır.

Birincisi, lüğətdə "sülasi mücərrəd"[506] fəslindən "alə-yəulu" kəlməsinin övlad və əyalı çox olması mənasında istifadə olunduğu məşhur olmayıb, əlavə fəsildən "əalə-yuilu" şəklində istifadəsi məşhurdur. Sülasi fəslindən "alə-yəulu" kəlməsi zülm və cəfa mənasını verir. Bütün dilçilər belə qeyd etmişlər.

İkincisi, Allah-taala dördə qədər evlənməyi aralarında ədalət şərti ilə mübah etmişdir. Bunların aralarında ədalətsizlikdən qorxduqda biri ilə yaxud sahib olduğu cariyələrlə kifayətlənməsi əmr edilmişdir. Bu ayədəki "ənlə-təulu" kəlməsinin övlad və əyalın çox olmaması mənasında təfsir edilməsi uyğun deyildir.

Üçüncüsü, Allah-taala yetim qadınlarla evləndikdə onlarla ədalətli olmamaqdan qorxduğu zaman onlara zülm və cəfa

[505] Əhməd, "əz-Zühd", səh. 20. Deyirəm: sənədi zəifdir.
[506] Ərəb dilində felin formalarından biri.

edilməməsi üçün hökmü yetim olmayan qadınlarla evlənməyə nəql etmişdir. Allah-taala kişilərin birdən dördə qədər evlənmələrini caiz etmiş, sonra qadınlar arasında ədalətsizlikdən qorxduğunda evlənmə hökmünü bir qadınla və ya çox olduqları üçün aralarında eyni davranması şərt olmayan cariyələrlə kifayətlənməyə nəql etmişdir. Bu ayə ədalətli olmaq şərti ilə yetim və yetim olmayan dörd qadınla evlənmənin caiz olduğunu bildirdiyi kimi, qadınlar arasında ədalətsizlikdən qorxduğunda bir qadınla kifayətlənməsini də bildirir. Bu ayədə övlad və əyalın çox olmasının bir təsiri yoxdur.

Dördüncüsü, əgər övlad və əyalın çox olmasından qorxulsaydı, Allah-taala cariyələrə sahib olmasını və onlarla cinsi yaxınlıqda olmasını təhdidsiz mübah etməzdi. Çünki övlad və əyalın çoxluğu arvad və ya arvadlardan ola bildiyi kimi cariyələrdən də ola bilir. Çünki Uca Allahın dörd qadın arasında ədalətsizlikdən qorxduqda, hökmü sahib olan cariyələrə nəql etməsi onların xadimə olmadığını, onlarla cinsi yaxınlıqda olan cariyələr olduğunu göstərir.

Beşincisi, övlad və əyalın çox olması Allah üçün qorunacaq və xoş olmayan bir iş deyil. Çünki bu ümmətin ən xeyirlisi övlad və əyalı çox olanıdır.

Allahın elçisi demişdir: "Ərinə sevgi ilə bağlı olan və çox uşaq doğan qadınla evlənin. Çünki mən digər ümmətlərin kütlələrinə qarşı sizin çoxluğunuzla öyünürəm".[507]

Allahın elçisi Qiyamət günü digər ümmətlərə qarşı ümmətinin çoxluğu ilə fəxr etməsi üçün çox uşaq doğan qadınla evlənməyi əmr etmişdir. Nəticə olaraq Uca Allah elçisini səbir edən, yoxsul etdikdən sonra şükür edən varlı etmişdir. Buna görə səbir edən yoxsullarla şükür edən varlılardan hər biri Allahın elçisinin halını öz hallarına hüccət edir.

Deyilir ki: Abdur-Rəhman bin Auf şükür edən varlılardan idi. İmam Əhməd "Müsnəd" əsərində Ammarədən, o da Sabitdən Ənəsin belə dediyi rəvayət edilir: "Mən Aişənin evində idim. Aişə evində ikən Mədinədən gələn səsi eşidib soruşdu: Bu nədir? Ona dedilər: "Abdur-Rəhman bin Aufun Şamdan gələn və hər cür əşya gətirən karvanıdır". Ənəs dedi: "Bu karvan yeddi yüz dəvə olub, səsindən Mədinədə inilti duyuldu". Aişə dedi ki, Allahın elçisinin belə dediyini eşitmişəm: "Abdur-Rəhman bin Aufu Cənnətə iməkləyərək girdiyini görmüşəm". Abdur-Rəhman bin Auf bunu eşidib: "Mən əgər edə bilsəm lap ayaq üstə də girərəm " - dedi və dəvələrin hamısını yükləri ilə, yəhərləri ilə, noxtaları ilə Allah yolunda payladı".[508]

---

507 **Səhihdir**: Əbu Davud, 2050; ən-Nəsai, 6/65; əl-Tabərani, "əl-Kəbir", 20/508; əl-Hakim, 2/162; əl-Beyhəqi, 7/81; İbn Hibban, 4056, 4057.
508 Əhməd, 6/1154; İbn əl-Cəuzi, "əl-Mövduat", 2/13.

Deyilir ki: İmam Əhməd demişdir: Bu hədis yalandır, münkərdir. Hədisçilər deyirlər ki, ravilərdən biri olan Ammarə münkər hədisləri rəvayət edir. Əbu Hatim ər-Razi Ammarə bin Zazanın hədisinə ehtiyac yoxdur demişdir.[509]

Əbu əl-Fərəc demişdir ki, Cərrah bin Minhal, Abdur-Rəhman bin Aufa isnad edərək rəvayət ettiyinə görə, Allahın elçisi Abdur-Rəhman bin Aufa: "Ey Aufun oğlu! Sən varlılardansan, sən Cənnətə sürünərək girəcəksən. Odur ki, Rəbbinə borc ver, qoy ayaqlarını açsın? - dedi. Əbu Abdur-Rəhman ən-Nəsai demişdir ki, bu hədis mövdudur, Cərrahın hədisi tərk olunur. Yəhya demişdir ki, Cərrahın hədisi bir şey deyil. İbn Mədini demişdir ki, Cərrahın hədisi yazılmaz. İbn Hibban demişdir ki, Cərrah yalan danışırdı. əd-Dəraqutni demişdir ki, Cərrahın hədisi tərk olunur.

Deyilir ki: Beyhəqinin rəvayət etdiyi hədisə görə Allahın elçisi: "Ey Aufun oğlu! Sən varlılardansan, sən Cənnətə sürünərək girəcəksən. Odur ki, Rəbbinə borc ver, qoy ayaqlarını açsın?"- dedi. O da: "Ey Allahın elçisi, nə borc verim?" - dedi. Allahın elçisi dedi: "Axşamlayana qədər əlində olanları payla. O dedi: "Hamısını, ey Allahın elçisi?" Allahın elçisi: Bəli - dedi. Abdur-Rəhman bin Auf bundan narazı olaraq peyğəmbərin yanından çıxdı. Sonra Cəbrail Allahın elçisinin yanına gələrək: "Ey Allahın elçisi! Aufun oğluna əmr et qonaqlara hörmət etsin, əvvəlcə əhli-əyalından başlamaqla yoxsulları doyursun, dilənçilərə versin. Əgər bunları etsə əlində olan nemətin haqqını vermiş olur"- dedi".[510]

Deyilir ki: Bu hədis batildir, Allahın elçisindən səhih olaraq rəvayət edilməyib. Çünki rəvayətçilərdən biri Xalid bin Yəzid bin Əbu Malikdir. İmam Əhməd demişdir ki, bu hədis bir şey deyildir. İbn Muin demişdir ki, hədis zəifdir. ən-Nəsai demişdir ki, bu hədisə etimad edilməz. əd-Dəraqutni demişdir ki, zəifdir. Yəhya bin Muin demişdir ki, Xalid bin Yəzid atasına görə yalan söyləməyə razı olmadı, lakin əshabələrə görə yalan söyləməyə razı oldu.

Deyilir ki: İmam Əhməd, Həzil ibn Məymunə Mətrah bin Yəziddən, o da Ubeydullah bin Zəhr bin Əli bin Yəziddən, o da əl-Qasimdən, o da Əbu Umamədən demişdir: "Allahın elçisi demişdir ki: "Cənnətə girdim və önümdə bir xışıltı eşitdim, dedim ki, bu nədir?" Dedilər: Bilaldır. Sonra Cənnəti gəzməyə davam etdim, bir də gördüm ki, Cənnət əhlinin çoxu mühacirlərin kasıbları və müsəlmanların uşaqlarıdır. Varlı və qadınlar çox az idi. Dedilər ki, varlılar Cənnətin qapısında hesaba çəkilməkdə və təmizlənməkdədirlər. Qadınlara

[509] İbn əl-Cəuzi, "əl-Mövduat", 2/13.

[510] **Çox zəifdir**: əl-Beyhəqi, "Şuabul-İman", 3064; İbn Adiy, "əl-Kamil", 3/884; ət-Təbərani, "Müsnəd əş-Şammiyin", 2/421-422; Əbu Nəim, "əl-Hilyə", 1/99, 8/334.

gəlincə, onları iki qırmızı, yəni qızıl və ipək saxlamışdır. Sonra Cənnətin səkkiz qapısının birindən çıxdıq. Qapının yanına gəlincə bir tərəzi gətirdilər. Bir tərəfinə məni, digər tərəfinə ümmətimi qoydular, mən ağır gəldim. Sonra Əbu Bəkir gətirildi, bir tərəfinə onu, digər tərəfinə ümmətimi qoydular Əbu Bəkir ağır gəldi. Sonra Ömər gətirildi, bir tərəfinə onu, digər tərəfinə ümmətimi qoydular Ömər ağır gəldi. Ümmətim keçərkən mənə bir-bir göstərildi. Gördüm ki, Abdur-Rəhman bin Auf gecikir. Ümidi kəsildikdən sonra gəldi. Soruşdum ki, ey Ahdur-Rəhman harada qaldın. O dedi: "Anam-atam sənə fəda olsun, ey Allahın elçisi, səni haqq olaraq göndərən Allaha and olsun ki, mən sənin yanına ancaq yaşlandıqdan sonra gələ biləcəyimi zənn etdim"- dedi. Allahın elçisi dedi: "O nədir, nəyə görə?" O dedi: "Malımın çoxluğundan hesaba çəkilib təmizlənməkdən".[511]

Bu hədisin sənədinin araşdırılmasına ehtiyac yoxdur deyilir. Çünki bu hədisi və bundan əvvəlki hədisi Əbul-Fərəc "əl-Mövduat" kitabında mövdu hədislər sırasına daxil etmişdir.

Əbul-Fərəc demişdir ki, Ubeydullah bin Zuhr demişdir ki, Yəhya bir şey deyil və Əli bin Yəzid mətrukdur. İbn Hibban demişdir: Ubeydullah mövdu hədisləri güclü ravilərin adından rəvayət edir. Əgər Əli bin Yəziddən rəvayət edirsə, deməli bu lap müsibətdir. Hədisin sənədində Ubeydullah bin Zuhr, Əli bin Yəzid və əl-Qasim bin Abdurrəhman varsa, onda hədisin mətni ancaq onların uydurduqlarından başqa bir şey deyildir.

Əbul-Fərəc demişdir: "Zahidlik tərəfdarlarının hamısı belə batil hədislərə yapışaraq malın dində irəliləməyə mane olmasını deyərək: "Abdur-Rəhman bin Aufun malına görə Cənnətə sürunərək girməsi malın qınanması (mala nifrət edilməsi) üçün kifayətdir demişlər". Bu hədis səhih deyil. Çünki Cənnətlə müjdələnən Abdur-Rəhman bin Aufun malına görə Cənnətə sürünərək girməsinə malın əngəl olması mümkün deyil. Çünki malı toplamaq mübahdır. Qınanılan mal doğru olmayan cəhətdən qazanılan mal və vacib olan haqqı verilməyən maldır. Abdur-Rəhman bin Auf isə bunlardan uzaqdır.

Təlha üç yüz yük qızıl miras qoymuşdur. Zubeyr və başqa əshabələr də xeyli mal miras qoymuşdu. Bunlar malın pis olduğunu bilsəydilər, şübhəsiz, hamısını əllərindən verərdilər. Bir çox nağılbazlar bu cür hədislərə əsaslanaraq insanları yoxsulluğa təşviq edir və zənginliyi qınayırlar. Allah həqiqi alimlərdən razı olsun ki, səhih hədisləri tanıyırlar, üsul və qaydalarını bilirlər".

Mən deyirəm: Əbul-Fərəc bu hədisi rədd edərkən onu Allah

[511] **Batildir:** Əhməd, 5/259; İbn əl-Cəuzi, "əl-Mövduat", 2/14; ət-Tabərani, 7809.

elçisinin adından uydurulmuş hədislər arasına salmaqla həddi aşmışdır. Əbul-Fərəc, islamı qəbul edənlərin önündə olan və Cənnətlə müjdələnən Abdur-Rəhman bin Aufun Cənnətə öncə girməyinə icazə verilməməsini və Cənnətə iməkləyərək girməsini böyük görmüş və bu vəziyətin Allahın onun üçün hazırlanmış məqamına zidd olacağını sanmışdır. Bu onun səhv başa düşməsidir. Allah ona rəhm etsin.

Yuxarıda verilən bu iki hədis haqqında tənə etməyə yol tapıldığını qəbul etsək belə, Əbu Hureyrənin rəvayət etdiyi bu hədis haqqında nə deyiləcək. Allahın elçisi demişdir: “Müsəlmanların yoxsulları varlılarından yarım gün, yəni beş yüz il öncə cənnətə girəcəklər"[512]. ət-Tirmizi bu hədisə həsəndir, səhihdir demişdir. Müslimin İbn Ömərdən rəvayət etdiyinə görə İbn Ömər Peyğəmbərin belə söylədiyini demişdir: "Qiyamət günü mühacirlərin yoxsulları varlılardan qırx il əvvəl Cənnətə girəcəklər".[513]

"Müsnəd" əsərində İmam Əhməd, Peyğəmbərdən rəvayət edir: "Cənnətə ilk kimin girəcəyini bilirsinizmi? Əshabələr: "Allah və elçisi daha yaxşı bilir" -dedilər. O dedi: "Sıxıntılar içində olan mühacirlərin yöxsullarıdır ki, ödəyə bilmədikləri ehtiyaclar içində ölürlər".[514]

Ət-Tirmizinin rəvayət etdiyinə görə Cabir peyğəmbərdən belə demişdir: "Ümmətimin yoxsulları varlılarından qırx il əvvəl Cənnətə girəcəklər".[515]

Bu və buna oxşar başqa hədislər yoxsul əshabələrin varlılardan öncə Cənnətə girəcəkləri haqqında açıq-aydın və səhihdir. Onlar yoxsulların Cənnətə varlılardan beş yüz il əvvəl, qırx il əvvəl girəcəkləridir. Cənnətə gec girməkləri Cənnətdəki məqamlarına zərər verməz. Varlılar hesabat vermək üçün yoxsullardan sonra Cənnətə girsələr də məqamları onların məqamlarından yüksək ola bilər. Şübhəsiz ki, ədalətli rəhbər hesabat üçün gözlədiləcək. Müsəlmanların işini öhdəsinə almayanlar ondan əvvəl Cənnətə girəcəklər. Onlardan sonra Cənnətə girən ədalətli rəhbərin məqamı yoxsulların məqamından daha yüksək olur. Məqam baxımından insanlardan Allaha ən yaxın olanı ədalətli rəhbərdir. Müslimin "əs-Səhih" əsərində Abdullah bin Amrdan rəvayət olduğuna görə, o peyğəmbərin belə söylədiyini demişdir: "Şübhəsiz ki, ədalətli olanlar Allah dərgahında nurdan olan minbərlər üstündə ər-Rəhmanın

---

512 **Səhihdir:** ət-Tirmizi, 2353-2354; ən-Nəsai, "et-Təfsir", 2/92; İbn Macə, 4122; Əhməd, 2/296, 343, 451, 513, 519; İbn Hibban, 676; İbn Əbi Şeybə, "əl-Müsənnəf”, 13/246; Əbu Nəim, "əl-Hilyə", 5912, 7/91, 99, 100, 8/212, 250.
513 Müslim, 2979 (4/2285).
514 **Səhihdir:** Əhməd, 2/168; Abid bin Həmid, 253; əl-Bəzzar, 3665; ət-Tabərani, "əl-Kəbir", 13/151-152; İbn Hibban, 7421; əI-Hakim, 2/71-72.
515 **Çox zəifdir:** ət-Tirmizi, 2355; Əhməd, 3/324.

(Allahın) sağında olacaqlar. Onun hər iki əli sağdır. Onlar hökmlərində və ailələri ilə ədalətli olan idarəçilərdir".[516]

Ət-Tirmizinin Əbu Səid əl-Xudridən rəvayət etdiyinə görə, o peyğəmbərin belə buyurduğunu demişdir: "Qiyamət günü Allah dərgahında insanların ən sevimlisi və məqam baxımından Allaha ən yaxın olanı ədalətli rəhbərdir. Qiyamət günü Allah dərgahında ən çox məzəmmət olunan və şiddətinin dərəcəsinə görə ən çox əzab olunan zalım rəhbərdir".[517]

Ədalətli rəhbərlə şükür edən varlı, hesab verəcəkləri üçün Cənnətə girmələri gecikir. Fəqət Cənnətə girdikdən sonra onların məqamları əvvəl Cənnətə girənlərin məqamlarından daha yüksək ola bilər. Abdur-Rəhman bin Aufun malının çoxluğuna görə hesab verməsi üçün saxlanılması, sonra Allahın elçisinə və yoldaşlarına qatılması onun mərtəbəsini nöqsanlı etmədiyi kimi, islamın qəbulunda öndə gələnlərdən olmasına və Cənnətlə müjdələnmişlərdən olmasına mane olmaz.

Abdur-Rəhman bin Aufun sürünərək Cənnətə girəcəyinə dair hədis İmam Əhmədin dediyi kimi yalandır, münkərdir. Ən-Nəsainin dediyinə görə hədis mövdudur. Çünki Abdur-Rəhman bin Aufun məqamları, cihadı, Allah yolunda əzəmətli xərcləri, sədəqələri sirat körpüsünü şimşək kimi keçənlərlə bərabər olmasını və ya bir göz qırpımında keçənlərlə bərabər olmasını, yaxud da süvari olaraq keçənlərlə bərabər olmasını təmin edib, sürünərək keçməsinə əngəl olur.

## Fəsil

Allah-taala insanları yaratdığı kimi onların zənginliyini və kasıblığını da yaratmışdır. Allah-taala bəndələrindən hansının daha gözəl əməl edəcək deyə imtahan etmək üçün zənginliklə yoxsulluğu yaratmış, bunları itaət, günah, savab və əzab üçün səbəb etmişdir. Allah-taala buyurur: **«Hər bir kəs** (hər bir canlı) **ölümü dadacaqdır.** (Dözüb-dözməyəcəyinizi, şükür edəcəyinizi, yaxud nankor olacağınızı) **yoxlamaq məqsədilə Biz sizi şər və xeyirlə** (xəstəlik, yoxsulluq, ehtiyac və sağlamlıq, var-dövlət və cah-cəlalla) **sınağa çəkərik. Və siz** (qiyamət günü əməllərinizin əvəzini almaq üçün) **ancaq Bizim hüzurumuza qaytarılacaqsınız!»** (əl-Ənbiya, 35). İbn

[516] Müslim, 1827.
[517] **Zəifdir:** ət-Tirmizi, 1329; Əhməd, 3/22; əl-Beyhəqi, "əs-Sünən əl-Kubra", 10/88, "Şuabul-İman", 7366.

Abbas demişdir: "şər və xeyir" dedikdə qıtlıq və bolluq, zənginlik və yoxsulluq, sağlamlıq və xəstəlik, halal və haram nəzərdə tutulur və hamısı sınaqdır.

İbn Zeyd, "sevdikləriniz və sevmədiklərinizlə sınağa çəkəcəyik ki, görək sevdikləriniz və sevmədiklərinizdə səbir və şükrünüz necə olacaq" kimi təfsir etmişdir. əl-Kəlbi demişdir: "Şər" dedikdə kasıblıq və bəla, "xeyir" dedikdə mal və övlad nəzərdə tutulur. Belə ki, Allah-taala zənginlik və yoxsulluğun bəlaya uğramaq və imtahan olduğunu xəbər verərək: **«İnsana gəldikdə, nə zaman Rəbbin onu imtahana çəkib ehtiram etsə, ona bir nemət versə, o: "Rəbbim mənə ehtiram göstərdi!"- deyər. Amma nə zaman** (Rəbbi) **onu imtahana çəkib ruzisini əskiltsə: "Rəbbim məni alçaltdı** (mənə xor baxdi)**!» - söyləyər»** (əl-Fəcr, 15-16) - buyurmuşdur. Uca Allah burada qulunun ruzisini əskiltməklə, qıtlaşdırmaqla imtahan etdiyi kimi, ona ehtiram göstərmək, nemət vermək və ruzisini artırmaqla da imtahan etdiyini xəbər verir. Çünki kasıblıqla zənginliyin hər ikisi də Allahdan bir-bir sınaqdır. Sonra Uca Allah ruzini bol verilməsinin qul üçün bir hədiyyə olduğunu və ruzinin azaldılmasının qul üçün xor baxılmaq olduğunu iddia edənin iddiasını rədd edərək: **«Xeyr!...»** (əl-Fəcr, 17) - buyurmuşdur. Bu ayənin sözlərini düşünən üçün bu məna anlaşılır: **«Xeyr! İddia edilən kimi deyil. Əksinə Mən nemət verməklə imtahan edirəm və bəla verməklə ehsan edirəm».**

Allah-taala: **«**(Ey insanlar!) **Verdiyimiz nemətlərlə sınamaq üçün sizi yer üzünün varisləri təyin edən, dərəcələrə görə birinizi digərinizdən üstün edən Odur.** (Ya Rəsulum!) **Həqiqətən, sənin Rəbbin** (kafirlərə, müşriklərə, Onun birliyini inkar edənlərə) **tezliklə cəza verən və şübhəsiz ki,** (möminləri) **bağışlayan,** (onlara) **rəhm edəndir!»** (əl-Ənam, 165).

Digər bir ayədə isə: **«Biz yer üzündə olanları onun** (sakinləri) **üçün** (və ya onun özünə məxsus) **bir zinət yaratdıq ki, onlardan hansının daha gözəl əməl sahibi olduğunu yoxlayıb ayırd edək»** (əl-Kəhf, 7) - deyilir. Uca Allah bu ayədə yer üzünü var-dövlət və qeyriləri ilə xor baxılmaq və imtahan üçün bəzəmişdir. Ölüm və həyatı, göyləri və yeri bunun üçün yaratdığını xəbər vermişdir. Allah-taala Quranda xəbər verdiyi kimi insanların hansının daha çox itaət edəcəyini, daha gözəl əməl edəcəyini imtahan etmək üçün yeri, göyləri və bunların arasında olanları, yaratdığını və onlar üçün ömür təqdir etdiyini, yaşamaq üçün qızıl, gümüş, məskənlər, geyim, minik, dənli bitkilər, heyvanlar, qadınlar, uşaqlar, meyvələr kimi varlıqları yer üzünün bəzəyi etmişdir. Allahın yaratdığı şeylərin hamısı haqdır. Yer, göylər və onların arasında nə varsa, hamısı Allahındır. Mülk və səltənət yalnız Allahındır. Bunlar nahaq yerə yaradılmamışdır. Allah-

taala: **«Yoxsa sizi əbəs yerə yaratdığımızı və** (qiyamət günü dirilib haqq-hesab üçün) **hüzurumuza qaytarılmayacağınıza güman edirdiniz?" Həqiqi hökmdar olan Allah ucadır. Ondan başqa heç bir Allah yoxdur. O, kərim olan ərşin Rəbbidir!»** (əl-Muminun, 115-116) - buyurmuşdur.

Allah-taala Özünü şəriki olmaqdan, övladı olmaqdan, qadını olmaqdan, yorulmaqdan, ehtiyacı olmaqdan, yeri va göyləri mühafizə etməyə etinasızlıq etməkdən və s. qüsur və naqislikdən uzaq etdiyi kimi bütün varlıqları da nahaq yerə yaratmaqdan Özünü qüsur və naqislikdən uzaq etmişdir. Heç kim Onun izni olmadan şəfaət edə bilməz. Heç bir şey Allahın elmindən kənarda qala bilməz. Allah qullarını əmrsiz, qadağasız, özbaşına nahaq yerə yaratmamışdır. Qulları Qiyamət günündə Allaha dönəcəklər, yaxşıları mükafatlandıracaq, pisləri cəzalandıracaq. Kafirlər özlərinin batil yolda olduqlarını, peyğəmbərlərə tabe olanların doğru və haqq yolda olduqlarını biləcəklər. Bu qeyd edilənləri kim inkar edərsə, Allahın ilah olduğunu, Rəbb olduğunu, gerçək hökmdar olduğunu inkar etmiş olur. Belə ki, mömin özü ilə Qiyamət haqqında danışan və Qiyaməti inkar edən yoldaşına xitab edərək deyər: **«Onunla söhbət edən** (mömin) **yoldaşa isə belə dedi: "Əvvəlcə səni torpaqdan, sonra bir qətrə sudan** (mənidən) **yaratmış, daha sonra səni adam şəklinə** (insan qiyafəsinə) **salmış Allahı inkarmı edirsən?»** (əl-Kəhf, 37). Mömin, yoldaşının Qiyaməti inkar etməsini Allahı inkar etməsi saymışdır: **«Əgər** (müşriklərə) **təəccüblənirsənsə, əsl təəccübləniləsi onların: "Biz torpaq olduqdan sonra yenidənmi yaradılacağıq?"- söyləməsidir. Onlar Rəbbini inkar edənlərdir. Boyunlarında zəncir olanlar da onlardır. Onlar cəhənnəmlikdirlər, özü də orada əbədi qalacaqlar»** (ər-Rəd, 5). Qiyaməti inkar etmək, Rəbbin qüdrətini, elmini, hikmətini, gerçək hökmranlığını, rübubiyyətini, ilah olmasını inkar etməkdir. Belə ki, peyğəmbərləri inkar etmək, peyğəmbərlərin risalətini inkar etmək, qiyaməti inkar etməkdir. Peyğəmbərləri inkar edən, Qiyaməti inkar edən Allahın rübubiyyətini inkar etmiş olur. Nəticə olaraq Allah-taala zənginliklə yoxsulluğu bəlaya uğramaq və imtahanın minikləri kimi yaratmışdır. Allah-taala malı, var-dövləti sırf mənfəət üçün endirməmişdir. Belə ki, "Müsnəd" əsərində İmam Əhməd bin Hənbəl Peyğəmbərdən rəvayət etdiyinə görə: **"Allah-taala buyurur ki, Mən malı, var-dövləti namaz qılınması üçün, zəkat verilməsi üçün endirdim. Adəm övladının bir vadi dolusu malı olsa, Allahdan ikinci bir vadi dolusu mal istəyər, ikinci vadi dolusu malı olsa, Allahdan üçüncü bir vadi dolusu mal istəyər. Adəm övladının**

**qarnını torpaqdan başqa bir şey doldura bilməz".**[518]

Allah-taala malı heyvanların yeyib-içdiyi kimi yalnız faydalanmaq və ləzzət almaq üçün endirməyib, Öz haqqı olan namazın qılınmasına, bəndələrin haqqı olan zəkatın verilməsinə yardımçı olsun deyə yaratmışdır. Kim Allahın verdiyi mal ilə bu iki haqqı əda etməzsə, torpaq ona daha layiqdir. İnsan Rəbbini, yaradıcısını tanımaq, Ona iman gətirmək, Onu sevmək, Onu zikr etmək üçün yaradılmışdır. İnsanın daxili iman, elm və hikmət üçün yaradılmışdır. Fəqət bir çox avamlar daxillərini Allahın birliyindən, ad və sifətlərindən, əmrlərindən boşaldıb fani olan mal sevgisi ilə doldurmuşlar. Bununla bərabər onların içləri dolmaz, əksinə, ölüb daxillərini torpaq doldurana qədər, hətta özünün və malının yaradılış maddəsi olan torpağa dönənə qədər yoxsulluqları, acgözlükləri və mala olan düşkünlükləri davam edər. İnsanın dünyada və axirətdə kamilliyi, qurtuluşu və səadəti, daxilini iman və elmlə doldurmasına bağlıdır. Əgər mal öz sahibinə fayda verməzsə, əlbəttə, ona zərər verər. Sahibinə fayda verməyən elm, mülk, güc də belədir. Çünki bunlar qayə və məqsədlərə çatmaq üçün vəsitədir. Ona görə xeyir və şər bunlarla edilir. Odur ki, kim malını, mülkünü, elmini və gücünü Allah yolunda istifadə edirsə, bunları qayə və məqsədləri üçün istifadə etdiyinə görə dünyada və axirətdə fayda verir. Bunları keçici fani istək və arzularına nail olmaq və dünya faydalarını əldə etmək yolunda istifadə edirsə, həm dünyada, həm də axirətdə çox böyük ziyana uğramış olur.

İnsanlar dörd qisimdir:

Birincisi, səbəblərdən üz çevirənlər;

İkincisi, səbəblərə tamamilə bağlananlar;

Üçüncüsü, səbəblərlə özlərinə dünya və axirətdə fayda verməyib zərər verəni əldə edənlər. Bu üç qisim xəsarətdədir.

Dördüncü qisim səbəblərlə özlərinə həm dünyada, həm də axirətdə fayda verəcəkləri əldə edənlərdir. Doğru yolda olanlar da bunlardır. Allah-taala buyurur: **«Kim** (axirətdən vaz keçib) **dünyanı və onun bərbəzəyini istəyirsə, Biz ona əməllərinin əvəzini** (sağlamlıq, sərvət, övlad, gözəl yaşayış) **elə orada** (dünyada) **verərik. Onların dünyadakı mükafatları əsla azaldılmaz. Belələrinin axirətdə atəşdən** (cəhənnəm odundan) **başqa heç bir payı yoxdur. Onların dünyada gördükləri işlər puç olar və bütün əməlləri boşa çıxar!»** (Hud, 15-16). Alimlər bu ayənin sadəcə dünyanı və zinətini istəyənlər üçün əməllərinin əvəzinin dünyada verilib, axirətdə onlara atəşdən başqa bir şey verilməyəcəyi mənasını

---

[518] **Səhihdir**: Əhməd, 5/219; ət-Tabərani, "əl-Kəbir", 3300-3301, "əl-Əvsat", 2446.

anladırlar. Fəqət bununla bərabər ayənin mənasında ixtilaf etdilər.

İbn Abbas demişdir: "Kim sadəcə dünyanı istəyirsə, axirətə, savaba, əzaba inanmamış olur". Təfsirçilər deyiblər: "İbn Abbasın sözünə görə bu ayə kafirlər haqqındadır".

Qatadə demişdir: "Kimin düşüncəsi, məqsədi, niyyəti dünya olub, onu istəsə, Allah-taala ona etdiyi yaxşılıqların əvəzini bu dünyada verir, axirətə gedəndə əvəzini almaq üçün bir əməli tapılmaz. Möminə gəlincə yaxşılıqlarının əvəzini dünyada aldığı kimi axirətdə də savab qazanacaqdır". Bəzi təfsirçilər deyiblər: "Bunun kafirlər haqqında olmasının dəlili: **«...Belələrinin axirətdə atəşdən** (cəhənnəm odundan) **başqa heç bir payı yoxdur. Onların dünyada gördükləri işlər puç olar və bütün əməlləri boşa çıxar!»** (Hud, 16) - ayəsidir. Çünki mömin həm dünyanı, həm də axirəti istəyər. Yalnız dünyanı istəyən kəsə gəlincə, o, mömin deyildir".

Əbu Salehin rəvayətində İbn Abbas demişdir: "Bu ayə qiblə əhli haqqında nazil olmuşdur".

Mücahid demişdir: "Onlar riya əhlidirlər".

əd-Dəhhak demişdir: "İman əhlindən təqvasız yaxşı əməl edənin savabı dünyada verilir".

Fərra, Dəhhakın qövlünü seçərək: "Qiblə əhlindən olan kimsə əməli ilə dünya mükafatını istəsə, əskiltmədən əvvəlcədən verilir" - demişdir. Bu qövlə üstünlük verilir. Buna görə ayənin mənası belə olur, əməli ilə sadəcə dünya həyatını və zinətini istəyən kəs mömin deyildir. Çünki günahkar və fasiq kəslər günah etməkdə, fasiqlikdə həddi aşsalar, imanları onları Allah üçün yaxşı əməl etməyə sövq edər və hər nə qədər günah etsələr də, Allahın razılığını qazanmaq üçün saleh əməllər edərlər. Kim əməli ilə Allah rizasını istəməyib ancaq dünyanı və zinətini istəsə, o iman əhlindən olmaz. Müaviyə də bu ayədən bu mənanı anlayıb, Müslimin "əs-Səhih" əsərində Əbu Hureyrədən rəvayət olunan hədis şahiddir. Belə ki, Müslimin rəvayət etdiyinə görə Əbu Hureyrə Allahın elçisinin belə söylədiyini demişdir: "Qiyamət günü atəşin ilk tutuşdurulacağı kəslər üç sinifdir: "Filankəs qaridir, desinlər deyə Quran oxuyan, filankəs comərddir, desinlər deyə mallarını sədəqə verənlərdir, filankəs cəsurdur, desinlər deyə cihadda öldürülən qazidir".[519]

Məxluqatın ən xeyirliləri peyğəmbərlər, siddiqlər, şəhidlər və salehlərdir. Məxluqatın ən şərlisi isə onlardan olmadıqları halda özlərini onlara bənzədənlərdir.

Peyğəmbərlərə oxşamağa cəhd edənlər yalançı olduğu kimi, sidiqlərdən, salehlərdən olmadığı halda onlara bənzəməyə çalışan

---

[519] Müslim, 1905.

kəs də riyakardır.

İbn Əbi əd-Dünya demişdir ki, Məhəmməd bin İdris rəvayət edib ki, Abdul-Həmid İbn Saleh xəbər verib ki, Qəttan bin Hibban Abdul-Varisdən, o da Ənəs bin Malikdən, deyib ki, Allahın elçisi demişdir: "Qiyamət günü ümmətim üç firqəyə ayrılacaq. Birinci firqə, dünya üçün Allaha ibadət edənlərdir. İkinci firqə, riya və özünü göstərmək üçün ibadət edənlərdir. Üçüncü firqə, Allahın Üzü və axirət üçün ibadət edənlərdir. Allah-taala dünya üçün ibadət edənlərə: "İzzətim, Cəlalım və Qüdrətim haqqı üçün mənə ibadət edərkən nəyi qəsd etdiniz?" - buyuracaq. Onlar da: "İzzətinə, Cəlalına, Qüdrətinə and içirik ki, dünyanı qəsd etdik" - deyəcəklər. Allah-taala: "Bunlardan heç birini qəbul etmədim, bunları Cəhənnəmə aparın" - buyuracaq. Allah-taala göstəriş və riya üçün ibadət edənlərə: “İzzətim, Cəlalım və Qüdrətim haqqı üçün mənə ibadət edərkən nəyi qəsd etdiniz?" - buyuracaq. Onlar da: "İzzətinə, Cəlalına, Qüdrətinə and içirik ki, riya və göstərişi qəsd etdik" - deyəcəklər. Allah-taala: "Bunlardan heç birini qəbul etmədim, bunları cəhənnəmə aparın " - buyuracaq. Allah-taala Üzü və axirət üçün ibadət edənlərə: "İzzətim, Cəlalım və Qüdrətim haqqı üçün mənə ibadət edərkən nəyi qəsd etdiniz?" - buyuracaq. Onlar da: "İzzətinə, Cəlalına, Qüdrətinə and içirik ki, Sənin Üzün üçün və axirət üçün ibadət etdik"- deyəcəklər. Allah-taala: "Doğru söylədiniz, bunları Cənnətə aparın"- buyuracaq".[520]

Bu hədisin sənədini araşdırmağa ehtiyac yoxdur. Çünki Quran və Sünnə bunun doğruluğuna şahiddir[521]. Hədisin səhihliyinə bu ayə: **«Kim** (axirətdən vaz keçib) **dünyanı və onun bər-bəzəyini istəyirsə, Biz ona əməllərinin əvəzini** (sağlamlıq, sərvət, övlad, gözəl yaşayış) **elə orada** (dünyada) **verərik...»** (Hud, 15). Əməlləri ilə Allahın rizasını istəməyib, sadəcə dünya üçün əməl edən kəslərin əməllərinin əvəzini Allah dünyada onlara əskiltmədən verəcəkdir. Axirətdə savab alacaqları əməlləri tapılmayacaqdır. Axirətə iman gətirən bir kəs bəşər olaraq böyük günah etsə də, dərhal ondan tövbə edib və bağışlanma diləyərək Allaha dönər.

İbn əl-Ənbər demişdir: "Bu qövlə görə ayə müsəlmanlardan bir qövm haqqındadır ki, onlar axirəti və axirətdə düşəcəkləri yeri düşünmədən dünyalarını doğru yaşasın deyə yaxşı əməl görərlər. Bunların əməllərinin əvəzi özlərinə dünyada tamamilə verilir. Axirətə

---

520 **Zəifdir:** İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 413; əl-Beyhəqi, "Şuabul-İman”, 6808.

521 Şeyx İmam İbn əl-Qeyyim əl-Cəuziyyə (Allah ona rəhmət eləsin!) belə deyib, lakin zəifliyi sübut edən bir neçə məqam var. Bax: Təhqiqatçının orijinalı səh. 272.

getdiklərində onların əməllərinin əvəzi atəşdir. Çünki onlar əməlləriylə Allahın rizasını, savabını və mükafatını istəməməmişlər".

**«...Belələrinin axirətdə atəşdən** (cəhənnəm odundan) **başqa heç bir payı yoxdur...»** (Hud, 16) ayəsi İbn əl-Ənbərinin qövlünə görə: "Əməlləriylə dünyanı istəyən möminlərin əbədi Cəhənnəmdə qalmalarını zəruri edir" - deyənlərə: "Bir kimsə əməli ilə axirətin savabını istəməyib, əksinə niyyəti və məqsədi dünya olursa, şübhə yox ki, Allah-taala imanların mükafatını verdiyi vaxt onun imanını batil edər və onun imanına mükafat verməz. Çünki onun imanının və əməlinin boşa getməsinə **«...Onların dünyada gördükləri işlər puç olar və bütün əməlləri boşa çıxar!»** (Hud, 16) ayəsi dəlalət edir - deyə cavab verilir".

Başqa qisim alimlər də buna belə cavab vermişlər. Bu ayə əməli ilə dünyanı istəyən möminin əbədi Cəhənnəmdə qalmasını zəruri etmir. Ancaq bu ayə beləsinin axirətdə qazandığı şeyin atəş olduğunu və qurtulmağı ümid etdiyi yaxşı əməlin də olmadığını zəruriləşdirir. Əgər bununla bərabər o adam tövhid əhlindən olarsa, böyük günah sahibi olan tövhid əhlinin Cəhənnəmdən çıxdığı vaxt qurtular. Bu, İbn əl-Ənbərinin və başqa alimlərin cavabıdır. Allaha həmd olsun ki, ayədə müşkül yoxdur. Allah-taala əməli ilə sadəcə dünya həyatını və zinətini istəyən kimsənin cəzasının atəş olduğunu və əməlinin boşa getdiyini bildirmişdir. Buna görə Uca Allah o kimsənin qurtulmasına səbəb olacaq əməlini batil edəndən sonra onun özünü qurtaracaq bir şeyi qalmaz. Əgər o kimsənin imanı olub, bu imanla dünyanı və zinətini istəməyib, əksinə, bu imanla Allahı və axirəti istəmiş olsa, bu iman boşa getmiş əmələ aid olmaz. Onu nə qədər Cəhənnəmə girməkdən qurtaracaq əməli boşa getsə də bu imanı onu əbədi atəşdə qalmaqdan qurtarar.

İman iki cürdür. Sahibinin Cəhənnəmə girməsinə mane olan iman. Bu iman sahibini əməllərin Allah rizası üçün edilməsinə təşviq edir. İkincisi, sahibinin əbədi Cəhənnəmdə qalmasına mane olan iman. Bu iman riyakarların imanıdır. Çünki imanı heç olmayan kəs əbədi Cəhənnəmdə qalacaqdır. Bu ayənin hökmü də əzab bildirən digər ayələrin hökmü kimidir. Uca Allah buyurmuşdur: **«Biz axirət qazancını** (savabını) **istəyənin qazancını artırar, dünya mənfəti istəyənə də ondan verərik. Onun axirətdə heç bir payı yoxdur»** (əş-Şura, 20).

Digər ayədə buyurmuşdur: **«Hər kəs fani dünyanı istəsə, dilədiyimiz şəxsə istədiyimiz neməti orada tezliklə verərik. Sonra isə** (axirətdə) **ona Cəhənnəmi məskən edərik. O,** (Cəhənnəmə) **qınanmış,** (Allahın mərhəmətindən) **qovulmuş bir vəziyyətdə daxil olar! Mömin olub axirəti istəyən və onun**

**uğrunda** (can-başla) **çalışanların zəhməti** (Allah dərgahında) **qəbul olunar»** (əl-İsra, 18-19).

Quranın üç yerində qeyd edilmiş bu ayələr bir-birini təsdiq edirlər. Üçü də eyni mənada cəmlənib. Yəni hər kim sadəcə dünyanı istəyib ona görə çalışarsa, axirətdə onun heç bir nəsibi yoxdur. Hər kim axirəti istəyib ona görə çalışarsa, axirət onundur.

Bəs həm dünyanı, həm də axirəti arzu edənin hökmü nədir? Çünki beləsi iki iradənin məsuliyyətini daşıyır. Sual çətin olduğuna görə bəzi təfsir alimləri demişlər: "Ayə kafirlər haqqındadır. Çünki kafir axirət deyil, yalnız dünyanı istəyər". Lakin bu doğru deyil. Ona görə ki, kafirlərdən bəziləri axirət istəyiblər, müsəlmanlardan bəzilərinin isə arzusu yalnız dünya ola bilər. Allah-taala səadəti axirəti istəməkdən asılı etmişdir, bədbəxtliyi isə dünyanı istəməkdən asılı etmişdir. Sadə dünyanı istəyən kəs dünyanı istəmiş olur, axirəti istəyən isə axirəti. Həm dünyanı, həm də axirəti istəyəndə yaxşılıq və pislik, itaət və günah toplanır. Uca Allah peyğəmbərlərdən sonra insanların ən xeyirliləri haqqında: **«...İçərinizdən bəziləri dünyanı, bəziləri isə axirəti istəyirdi...»** (Ali-İmran, 152) - buyurmuşdur. Bu ayə Uhud savaşında Allahın elçisi ilə bərabər olan və aralarında münafiq olmayan əshabələr haqqındadır. Buna görə Abdullah bin Məsud demişdir: "Uhud gününə, hətta bu ayə nazil olana qədər mən Allahın elçisinin əshabələrinin dünyanı istəyəcəklərini ağlıma sığışdırmırdım".[522] Bu ayədə peyğəmbərin əmr etdiyi mühafizə mərkəzindən ayrılanlar və müsəlmanların xeyirliləri nəzərdə tutulur. Fəqət dünyanı istəmək onları da mərkəzi buraxmağa və qənimət əldə etməyə sövq etmişdir. Amma əməli ilə yalnız dünyanı istəyən belə deyil. Dünyanı daima istəmək başqadır, əshabələr kimi dünyanı müvəqqəti istəmək başqa. Allaha, Elçisinə və axirətə iman edənin yaxşı əməlləri ilə axirəti deyil, sadəcə dünyanı istəməsi mümkün deyil. Çünki Allaha və axirətə iman etməsi, qulun əməli ilə Allahın rəhmətini və axirətini istəməsini zəruri edir.

Bir adamın əməli ilə arzu etdiyi sadəcə dünya olarsa, hər nə qədər axirəti Allaha və Rəsuluna imanla birləşdirməyə çalışsa da, bu mümkün deyil. Çünki iman bunlardan fərqlənir. Firon, Səmud və (peyğəmbərimizi görüb onu uşaqları kimi tanıyan) yəhudi kimilərdə bilib təsdiq etmək imanı olduğu halda, Allah-taala onların küfrünə şəhadət vermişdir. Bunlar insanların ən kafirləridir. Buna görə əməli ilə sadəcə dünyanı istəmək bəzən Allahı bilməklə birləşir. Fəqət iman bunlardan başqadır. Çünki iman sahibinin əməli ilə Allahı və axirəti istəməsi lazımdır. Yardımına sığınılacaq yalnız Allahdır.

---

522 **Səhihdir:** İbn Cərir, "ət-Təfsir", 4/85-86; İbn Əbi Hatim, "Təfsir", 1649; ət-Təbərani, "əl-Əvsat", 1399.

Uca Allah zənginlik və yoxsulluğu şükr, səbir, doğruluq, yalan, ixlas və şirk üçün bəlaya uğramaq və imtahan etmişdir. Belə ki, Allah-taala **«...Allahın verdikləri ilə sizi imtahan etməsi üçünür...»** (əl-Ənam, 165) - buyurmuşdur;

Digər ayədə: **«Əlif, Lam, Mim! İnsanlar** (möminlər) **yalnız: «İman gətirdik!» - deməl追rilə onlardan əl çəkilib imtahan olunmayacaqlarınımı sanırlar?** (Xeyr, iman gətirmək şəhadət kəlməsini təkcə dillə demək deyildir. Biz onları yeri gəldikcə malları, övladları və canları ilə sınayacağıq ki, hansının həqiqi, hansının yalançı mömin olduğunu ayırd edib bilək!) **Biz onlardan əvvəlkiləri** (keçmiş ümmətləri) **də imtahana çəkmişdik»** (əl-Ənkəbut, 1-2) - buyurmuşdur.

Başqa bir ayədə: **«Həqiqətən, mal-dövlətiniz və oğul-uşağınız** (sizin üçün) **ancaq bir imtahandır. Ən böyük mükafat** (Cənnət) **isə Allah dərgahındadır!»** (ət-Təğabun, 15) - buyurmuşdur.

Uca Allah dünyanı keçici, aldadıcı bir mənfəət etmiş, axirəti isə cəza və mükafat yurdu etmişdir. O dünyanı insanların sevəcəkləri şeylərlə süsləyib bəzəmişdir: **«Qadınlar, uşaqlar, qızıl-gümüş yığınları, yaxşı cins atlar, mal-qara və əkin yerləri kimi nəfsin istədiyi və arzuladığı şeylər insanlara gözəl göstərilmişdir.** (Lakin bütün) **bunlar dünya həyatının keçici zövqüdür, gözəl dönüş yeri isə Allah yanındadır»** (Ali-İmran, 14).

Uca Allah bu ayə ilə dünyanı süsləyən ləzzətlərlə nemətlərin yeddi şey olduğunü və dünyanı istəyib, onu axirətdən üstün tutanların məqsədinin də bu yeddi şey olduğunu xəbər vermişdir: Qadınlar dünyanın ən böyük zinət və nemətləri olduğu kimi, həm də ən böyük fitnələridir. Uşaqlar kişinin kamilliyi, iftixarı, şərəfi və ləyaqətidir. Qızıl və gümüş cins və növlərinin müxtəlif olmasına rəğmən arzu edilən şeylərin əldə edilməsi üçün vasitədir. Cins atlar sahiblərinin izzəti, iftixarı, düşmənləri təqib etmə və onları ötüb keçmə vasitələridir. Mal-qaraya gəlincə, bunlar minilmək, yeyilmək üçün olduğu kimi, bunlardan geyim, ev əşyaları və digər mənfəətlər də əldə edilir. Əkin yerləri isə insanların və heyvanların qidası üçün, meyvə və bitkilər yetişdirmək üçün sahələrdir.

Allah-taala sonra bunların dünyanın keçici nemətləri və mənfəətləri olduğunu xəbər verərək, qulunu axirət mənfəətlərinə təşviq edib, axirət mənfəətlərinin dünya mənfəətlərindən daha xeyirli və baqi olduğunu bildirmişdir: **«Söylə: "Sizə bunlardan** (dünya zinətlərindən) **daha yaxşısını xəbər verimmi? Allahdan qorxub pis əməllərdən çəkinənlər üçün Rəbbi yanında** (ağacları) **altından çaylar axan cənnətlər vardır ki, orada əbədi qalacaqlar.**

**Onlardan ötrü orada** (hər cür eyibdən) **pak olan zövcələr və** (ən böyük nemət olan) **Allah rizası** (razılığı, hüsn-rəğbəti) **vardır. Allah, həqiqətən, bəndələrini görəndir!»** (Ali-İmran, 15).

Allah-taala axirətin bu mənfəətlərinə kimlərin layiq olduğunu xəbər verərək: **«O bəndələr ki: "Ey Rəbbimiz, biz həqiqətən** (Sənə) **iman gətirmişik, günahlarımızı bağışlayıb bizi cəhənnəm əzabından qoru!» - deyirlər. Onlar** (müsibətlərə) **səbr edən,** (sözlərində və işlərində) **doğru olan,** (Allaha) **itaət edən, mallarından fəqirlərə verən və sübh vaxtı** (Allahdan) **bağışlanmaq diləyənlərdir** (sübh namazına qalxanlardır)**»** (Ali-İmran, 16-17) - bildirmişdir. Allah-taala Özünün müttəqi dostları üçün hazırladığı axirət mənfəətinin dünya mənfəətindən daha xeyirli olduğunu və axirət mənfəətinin də iki növ olub biri faydalanacaqları savab, digəri isə bu savabdan daha böyük olan Öz rizası olduğunu xəbər vermişdir.

Allah-taala bəsirət sahiblərinə dünyanın həqiqətindən, onun bir oyun-oyuncaq olub, nəfs və bədənlərinin onunla əyləndiyindən, oyun-oyuncaqla əylənməyin isə heç bir mahiyyətinin olmadığından, bunların ancaq nəfsləri məşğul edib, vaxtlarını zay etdiyindən, bunlarla ancaq avamlar ömürlərini keçirdiklərindən və dünyanın göz və nəfsləri üçün bir zinət, süs olduğundan, dünyanın göz və nəfsləri sevgi cəhətindən cəlbedici olduğundan, şayət qəlblər dünyanın həqiqətini və verəcəyi sonu bilsəydilər, əlbəttə, dünyaya nifrət edib, dünyadansa axirətə üstünlük verəcəklərindən və dünyaya daimi, xeyirli və baqi olan axirətdən üstünlük verməyəcəklərindən xəbər verərək: **«**(Ey insanlar!) **Bilin ki, dünya həyatı oyun-oyuncaq, bər-bəzək, bir-birinizin qarşısında öyünmək və mal-dövləti, oğul-uşağı çoxaltmaqdan ibarətdir. Bu elə bir yağışa bənzəyir ki, onun yetişdirdiyi bitki** (məhsul) **əkinçilərin xoşuna gələr. Sonra o quruyar və sən onun saralıb-solduğunu, daha sonra çör-çöpə döndüyünü görərsən.** (Dünya malına aldananları) **axirətdə şiddətli əzab,** (dünya malına uymayanları isə) **Allahdan bağışlanma və razılıq gözləyir. Dünya həyatı aldanışdan** (yalandan) **başqa bir şey deyildir»** (əl-Hədid, 20) - buyurmuşdur.

İmam Əhməd demişdir ki, Vaki'i söyləmişdir ki, Məsud Amr bin Murrədən, o da İbrahimdən, o da Alqəmədən, o da Abdullah bin Məsuddan Peyğəmbərin belə dediyini rəvayət etmişdir: "Mənim dünya ilə nə işim var. Mənimiə dünyanın halı bir yaz günündə bir ağacın kölgəsində yatıb, sonra ağacı tərk edib gedən bir yol adamının halı kimidir".[523]

---

[523] **Səhihdir**: ət-Tirmizi, 2377; İbn Macə, 4109; Əhməd, 1/391, 441; "əz-Zühd", 13, 18; Vaki'i, "əz-Zühd", 64; ət-Təyalisi, 277; İbn Əbi Şeybə, 13/217; İbn Sad, "ət-

Ət-Tirmizinin Səhl bin Saddan rəvayət etdiyinə görə Səhl Peyğəmbərin belə söylədiyini demişdir: "Əgər dünya Allah dərgahında milçəyin qanadına bərabər olsaydı, Allah heç bir kafirə bir qurtum su da verməzdi"[524]. ət-Tirmizi hədisə səhihdir demişdir.

Müslimin əs-Səhih əsərində Mustavrid bin Şəddadın Peyğəmbərdən belə rəvayəti verilir: “Axirətin yanında dünya, birinizin ancaq barmağını dənizə saldığı qədərdir. Barmağı ilə dənizdən götürə biləcəyi suyu göz qabağına gətirsin” - deyib şəhadət barmağına işarə etmişdir.[525]

Ət-Tirmizinin Mustavrid bin Şəddaddan etdiyi rəvayətdə deyilir: "Allahın elçisinin olduğu karvanın, ölü bir quzunun yanında durdugu yerdə onlarla birlikdə idim. Allahın elçisi soruşdu: "Hər halda bu quzu leşini qiymətsiz və dəyərsiz olduğu üçün atıblar, elə deyilmi?" Dedilər: "Bəli, ey Allahın elçisi. O dedi: "Bu leş, sahiblərinin nəzərində nə qədər qiymətsizdirsə, dünyada Allah dərgahında daha qiymətsizdir".[526]

Ət-Tirmizi Əbu Hureyrədən Allahın elçisinin belə dediyini rəvayət edir: "Allahı zikr etmək və Onun rizasına uyğun şeyləri öyrədən və ya öyrənən müstəsna olmaqla, dünya və orada olanlar məlundurlar".[527]

İmam Əhməd İsmail bin Ayyəşdan nəql etdiyinə görə İsa peyğəmbər həvarilərinə demişdir: "Mən sizə həqiqəti söyləyirəm. Şübhə yoxdur ki, dünya şirin olursa, axirət acı olur, dünya acı olursa, axirət şirin olur. Allahın əsil qulları dünyanın tam ləzzətini dadmayanlardır. Mən sizə həqiqəti söyləyirəm. Sizin əməl baxımından ən şərliniz dünyanı sevən, onu axirətdən üstün tutan və insanların hamısının onun kimi əməl etməsini istəyəndir".[528]

İmam Əhməd Məkhuldan nəql etdiyinə görə İsa peyğəmbər həvarilərinə demişdir: "Ey həvarilər! Sizdən kim dəniz köpüyü üzərində ev tikə bilər? Onlar dedilər: "Ey Ruhullah! Buna kimin gücü çatar?" İsa peyğəmbər dedi: "Elə isə dünyadan tutub qərargah

Tabaqat", 1/167; əl-Hakim, 4/310; İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 133; Əbu Nəim, “əl-Hilyə", 2/102, 4/234; və s.

[524] **Səhihdir**: ət-Tırmizi, 2320; əl-Beyhəqi, "Şuabul-İman", 10466; İbn Macə, 4110; əl-Hakim, 4/306; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 4027.

[525] Müslim, 2858.

[526] **Həsəndir**: ət-Tirmizi, 2321; İbn Macə, 4111; Əhməd, 4/229; İbn əI-Mübarək, "əz-Zühd", 508; İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 2; ət-Tabərani, "əl-Kəbir", 20/249.

[527] **Səhihdir**: ət-Tirmizi, 2322; İbn Macə, 4112; Əbu Asim, "əz-Zühd", 126; əl-Beyhəqi, "Şuabul-İman", 1708; ət-Tabərani, "əl-Kəbir", 20/249.

[528] Bax: Əhməd, "əz-Zühd", səh. 119; İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 138.

etməyin".[529]

"Əz-Zühd" kitabında İmam Əhməd rəvayət edir ki, İsa peyğəmbər deyərdi: "Mən sizə gerçəyi söyləyirəm. Firdovs Cənnətinə varis olmaq istəyənə quru çörək yeyib su içməsi, itlərlə birgə zibilliklərdə yatması da çoxdur".[530]

"Müsnəd" əsərində o Peyğəmbərin belə dediyini rəvayət edir: "Allah-taala dünyanı Adəm övladının yeməyinə bənzətmişdir. O, yeməyi nə qədər duzlasa və nə qədər ədviyatlasa da, sonunda baxsın ki, nəyə dönür".[531]

---

529 Bax: Əhməd, "əz-Zühd", səh. 118; İbn Əbi əd-Dünya, "

", 138.

530 "əz-Zühd", səh. 76.

531 **Səhihdir:** Abdullah bin Əhməd, "Zəvaid-əl-Müsnəd", 5/136; İbn Hibban, 702 ;

Sonra Allah-taala xəbər verir ki, bizim bəzilərimiz onunla fəxr edirik. O da bəzilərimizin onunla öz yoldaşı üzərində öyünməyini istəyir. Bu da var-dövlət, cah-cəlal, güc-qüvvət, elm və ya zahidliklə öyünmək üçün hər hansı şey istəyən kəsin halıdır.

Fəxr etmə iki cürdür: məzəmmətlənən və təriflənən. Dünya əhlinin öyünmələri məzəmmətlənən, axirətdə fəxr etmələrini istəyənlərin öyünməyi isə təriflənəndir ki, bu da əmr edilmiş münafəsə - rəqabət növündəndir.

Münafəsə - başqasında olan bir kamilliyə və xüsusiyyətə qibtə edib ona çatmaq, oxşamaq və ya daha irəli getmək üçün yarışmaqdır, rəqabətdir. Bəzilərinə görə isə münafəsə bir kimsə ilə qiymətli şeyə görə başqasıyla yarışması və o şeyi başqasının deyil, özünün əldə etməsi üçün səy göstərməsidir. Belə ki, qiymətli bir şeyi başqasının əldə etməsini arzu etməyəndə "nəfəstu aleyhi bişey'i" deyilir.

Tənafüs - təfaul növündən (ərəb dili qramatikasında felin formaları- tərc.) olub yarışan iki nəfərdən hər birinin qiymətli bir şeyi əldə etmək üçün yoldaşını keçməsidir. Münafəsənin həqiqəti qiymətli bir şeyə tam rəğbət etmək və yarışmaqdan ibarətdir.

Sonra Allah-taala xəbər verir ki, öyünmə var-dövlət və övladla olur. Hər adam öz nəslinin çoxalmasını istəyir. Var-dövləti və övladının başqalarına nisbətən çoxluğu onu sevindirir, başqaları tərəfindən var-dövlətinin və oğul-uşağının çoxluğunun söylənməsini də arzu edər. Var-dövlət və oğul-uşaqla öyünmək Allah-taalanın buyurduğu kimi Allah və axirət evindən uzaqlaşdıran səbəblərdəndir: **«**(Ey qafil insanlar!) **Çoxluq** (mal-dövlət, oğul-uşaq və qohum-əqraba çoxluğu) **ilə öyünmək sizi o qədər şirnikləndirdi** (başınızı o qədər qatdı) **ki, hətta** (məzarlarda yatan ölülərinizi sayıb, onların da çoxluğu ilə fəxr elməyiniz üçün) **qəbirləri ziyarət etdiniz.** [Və ya (axirətiniz üçün əsla çalışmadan) ölüb getdiniz (ölənə qədər bu halınızda davam etdiniz)]. **Xeyr!** (Belə yaramaz!). **Siz** (öləndən sonra bu yaramaz əməllərinizin aqibətini) **mütləq biləcəksiniz! Xeyr, xeyr!** (Belə yaramaz). **Siz** (öləndən sonra bu yaramaz əməllərinizin aqibətinı) **mütləq biləcəksiniz!»** (ət-Təkasur, 1-4).

Hər şeydə öyünmə ola bilər. Ona görə Allahdan və axirətdən uzaqlaşdıran hər bir şeylə öyünənə bu ayənin hökmü şamil olunur. İnsanların kimisi mal, kimisi vəzifə, kimisi də elmi ilə öyünür. Elmi, öyünmək və təkəbbürlənmək üçün öyrənən Allah dərgahında var-dövlət və vəzifə ilə öyünməkdən daha qorxuludur. Çünki belə bir alim axirətlə əlaqəli şeyləri dünya üçün istifadə etmişdir. Var-dövlət vəzifə

Əbu Asim, "əz-Zühd", 205; ət-Tabərani, "əl-Kəbir", 531; əl-Beyhəqi, "Şuabul-İman", 5652, 10473; əl-Mərvəzi, "Zəvaid əz-Zühd", 494; Əbu Nəim, "əI-HiIyə", 1/254.

sahibi isə dünya ilə əlaqəli şeyləri dünya üçün edib onunla öyünüb.

Sonra Uca Allah dünyanın sonunu və həqiqətini xəbər verərək dünyanı yağışa bənzətmişdir ki, onun bitirdiyi ot kafirlərin xoşuna gəlir. Mənim qənaətimə görə əl-Hədid surəsinin 20-ci ayəsində "əl-kuffar" deməklə Allahı inkar edən kafirlər nəzərdə tutulur. Çünki Quranın hər yerində bu sifətlə zikr edilən "əl-kuffar" ilə Allahı inkar edən kafirlər nəzərdə tutulur. Şayət ayədəki "əl-kuffar" ilə "əz-zürra" nəzərdə tutulsaydı, əl-Fəth surəsində **«...əkinçiləri heyran qoymuşdur...»** (əl-Fəth, 29) mənasını verən "əz-zürra" zikr edildiyi kimi burada da "əz-zürra" zikr edilərdi. Allah-taala əl-Hədid surəsindəki ayədə Allahı inkar edən kafirləri nəzərdə tutmuşdur. Çünki dünyanı ən çox bəyənən və ancaq dünya üçün çalışan onlardır.

Sonra Allah yağışın bitirdiyi otun aqibətinin saralmaq və qurumaq olduğu kimi dünyanın aqibətinin də belə olduğunu zikr etmişdir. Axirət olunca dünya ya Allahdan şiddətli əzaba və ya bağışlanma, savab, mükafata dönür. Bu haqda Əli bin Əbu Talib demişdir: "Dünya, doğru olan kəslər üçün doğruluq yurdu, onu anlayanlar üçün afiyət yurdu, salamat olanlar üçün nicat yeridir. Allahın peyğəmbərlərinin məscidləri, vəhyin nazil olduğu yer, mələklərin namazgahı, övliyaların ticarət yeri dünyadır. Allahın rəhməti, bağışlaması, rizası, Cənnəti dünyada qazanılır. Buna görə dünyanı kim məzəmmət edər? Dünya, uşaqlarına özünün və ailənin ölüm xəbərini bildirərək bütün bəla və müsibətləri ilə görünərək, Allahın əzabı ilə qorxudub qəzəbindən çəkindirərək, axirətə və Cənnətə sövq etdirmiş və ruhlandırmışdır. Bir çoxları dünyanı pislədilər. Digərləri isə dünyanı tərifləyib onun naz-nemətlərini qəbul etdi. Ey dünyanı məzəmmət edən və ona aldanan kimsə, dünya nə vaxt pislənməsini istədi və dünya sənə nə pislik etdi? Dünya sənin atalarını və analarını bağrına aldığı qəbirləriylə mi səni aldatdı?

Nə qədər var-dövlət miras qoyub gedənləri gördün, nə qədər iflic olanları əllərinlə müalicə etməyə çalışdın, nə qədər xəstəyə şəfa tapması üçün xidmət etdin və onlara həkimlər gətirdin, fəqət sənin bu müalicən, xidmətin və həkim gətirməyin heç bir fayda vermədi. Dünya sənə səndən əvvəl ölənlərin qəbirlərinin yerinin sabah sənin yerin olacağını açıqladı. Bunları gördükdən sonra sən dünyaya necə aldanırsan? Dünya bunlardan ibrət alanlar üçün qurtuluş yurdudur".

Əli sonra qəbirlərə tərəf dönərək dedi: "Ey qürbət əhli! Ey torpaq əhli! Evləriniz məskunlaşdı, var-dövlətiniz bölüşdürüldü, qadınlarınız nikahlandı. Bunlar bizdə olan xəbərlərdir. Haydı sizdə olanlardan bizə xəbər verin". Sonra bizə tərəf dönərək dedi: "Əgər onlara xəbər vermək izni verilsəydi, əlbəttə, sizə ən xeyirli hazırlığın

təqva olduğunu deyərdilər".[532]

Həqiqətən dünya məzəmmət olunmazdır, çünki edilmiş məzəmmət insanların gördükləri işlərə yönəlir. Belə ki, dünya Cənnətə və ya Cəhənnəmə gedən körpüdür. Fəqət dünyaya pis istək və arzular, qəflət, Allahdan və axirətdən üz çevirmək üstün olduqda dünya əhlinə və dünyada olanlara bunlar qalib gəlmişdir. Dünyanın məzəmmətlənməsi bu pisliklərin insanlara qalib gəlməsinə görədir. Dünya axirətin əkin tarlasından başqa bir şey deyil, Cənnətin hazırlığı ondandır. İnsanlar imanı, Allahı bilməyi, Onun məhəbbətini, Onun rizasını dünyada qazanırlar. Cənnət əhlinin cənnətdə əldə edəcəkləri, ən xeyirli yaşayışları dünyada əkdikləri məhsullarıdır. Gözlərin nuru, qəlblərin sevinci, nəfslərin gözəlliyi, ruhların ləzzəti olan Allah dostlarının dünyada olması, dünyanın tərif edilməsinə, üstün olmasına kifayətdir. Dünyada Allahı tanımağa, Onu zikr etməyə, Onu sevməyə, Ona ibadət etməyə, Ona təvəkkül edib Ona tərəf yönəlməyə, Onunla ünsiyyətdə olmağa, Onun yaxınlığı ilə sevinməyə, Ona boyun əyməyə, Ona yalvarışın ləzzətinə, Ona qayıtmağa, hər şeyi buraxıb Allahla məşğul olmağa oxşayan heç bir nemət yoxdur. Allahın Kəlamı, vəhyi, hidayəti dünyadadır. Bunları bəndələrindən istədiyinə bildirir. Buna görə İbn Aqil və digər alimlər demişlər: "Zikr edilən bu nemətlər Cənnətdəki nemətlərdən daha üstündür. Çünki bu dünyadakı nemətlər Allahın qulları üzərindəki haqqıdır. Axirətdəki nemətlər isə qulların öz haqqıdır. Allahın haqqı isə qulların haqqından daha fəzilətlidir. İmanla itaət, mükafatlarından üstündürlər".

Nəticə olaraq iki ayrı aləmdəki nemətlərin birini digərindən üstün etmək doğru deyil. Şayət iki aləmin bir yerdə olması mümkün olsaydı, birini digərindən üstün etmək də mümkün olardı. İman və itaət neməti bu dünyadakı digər nemətlərdən daha üstündür. Cənnətə girmək, Cənnətdə Allahın Cəmalına baxmaq, Allahın Kəlamını eşitmək və Allahın rizasını qazanmaq axirət nemətlərinin ən üstünüdür.

Bunlar bu dünyadakılardan, bunlar isə axirətdəkindən fəzilətlidir. Dünya nemətləri səbəblər olması etibarı ilə üstündür, axirət nemətləri isə qayə və məqsəd olması etibarı ilə üstündür deməksə doğru deyil. Uğur Allahdandır.

Allah-taala dünyanın həqiqətini, məqsədini, sonunu və axirətdə Allahın şiddətli əzabına, yaxud bağışlama və savabına çevriləcəyini açıqlayaraq qullarına xeyirli və əbədi olan şeylər uğrunda yarışmalarını, onlara doğru tələsmələrini və bu xeyirli və əbədi

[532] Bax: İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", səh.147.

şeyləri bədbəxtçiliklə tükənən fani şeylərdən üstün tutmalarını əmr etmişdir. Sonra isə bunun Allahın istədiyinə bəxş etdiyi fəziləti olduğunu xəbər verir. Çünki Allah böyük fəzilət sahibidir. Bu barədə Allah-taala belə buyurur: **«**(Ya Rəsulum! Səndən yoxsulları öz məclisindən govmağı tələb edən təkəbbür sahiblərinə) **bu dünyanı misal çək:** (Bu dünya) **göydən yağdırdığımız yağmura bənzər. Yerdəki bitkilər onunla qarışıb** (onu içib) **yetişər, sonra isə dönüb küləyin sovurduğu quru çör-çöp olar. Allah hər şeyə qadirdır!»** (əl-Kəhf, 45). Sonra Allah-taala mal və övladların dünya həyatının zinəti olduğunu, savabı əbədi olacaq və mükafatı davam edəcək saleh əməllərin və xoş sözlərin isə qulun arzuladığı, savabını umduğu xeyir olduğunu qeyd edərək buyurur: **«Həqiqətən,** (nemətləri, cah-cəlalı ilə fəxr etdiyiniz) **dünya həyatı göydən endirdiyimiz yağmura bənzər ki, onunla yer üzündə insanların və heyvanların yeyəcəyi bitkilər yetişib** (əlvan çiçəklər və müxtəlif meyvələrlə) **bir-birinə qatışar. Nəhayət, yer üzü bəzəklənib süsləndiyi və sakinləri də** (onun məhsulunu, meyvəsini) **yığmağa qadır olduqlarını zənn etdikləri vaxt gecə, yaxud gündüz əmrimiz** (bəlamız) **gələr və Biz onu, dünən üzərində bol məhsul olmamış kimi, biçilmiş bir hala gətirərik. Biz ayələrimizi düşünən bir ümmət üçün belə ətratlı izah edirik!»** (Yunus, 24).

Allah-taala qullarına bu dünyanın bədbəxtçiliklərindən, eybəcərliklərindən xəbər verərək onları dəyişməkdən, haldan-hala düşməkdən, məhv olmaqdan və tükənməkdən salamat olan sülh və əminamanlıq diyarına çağırmışdır. Ədaləti baxımından bu dəvətini bütün qullarına şamil etmiş, fəziləti baxımından isə istədiyinə bu yolda hidayət verərək xüsusiləşdirmişdir.

Allah-taala mal-dövlətin və övladların insanları Ona yaxınlaşdırmayacağını, əksinə təqvanın və insanlar arasındakı davranışın Ona yaxınlaşdıracağını qeyd edir. Allah-taala qullarını mal-dövlət və övladlarının onları Allahın zikrindən yayındırmasından çəkindirmiş və bildirmişdir ki, mal-dövləti və övladları sayəsində Allahın zikrindən yayınan kəs dünyada malı və övladı az olan kəs deyil, həqiqətdə zərər çəkəndir. Allah-taala peyğəmbərinə dünya əhlinin onlara bu dünyada imtahan olaraq verilmiş ləzzət aldıqları nemətlərə göz tikməyi qadağan etmiş və axirətdə onun üçün hazırladığı ruzinin dünya əhlinin dünyada istifadə etdiklərindən daha xeyirli və əbədi olduğunu bildirmişdir. Allah-taala peyğəmbərinə əl-Fatihə surəsini və əzəmətli Quranı bəxş etdiyini xəbər vermişdir. Bu dünya əhlinin dünyada faydalandığı nemətlərdən daha xeyirlisi və daha əfzəlidir. Allah Peyğəmbərə bəxş etdiyi Quranı onun dünya malına göz tikməməsi üçün bir maneə etmişdir. Beləliklə,

Peyğəmbərə dünyada verilən bu bəxşiş və axirətdə onun üçün hazırlanmış ruzi dünya əhlinin bu dünyada bəhrələndiyi nemətlərdən daha xeyirlidir. Elə isə gözlərini dünya malına dikmə!

Əgər bəndə zənginliyin, yoxsulluğun, bəlanın, sağlamlığın Allahdan onun üçün bir imtahan və bəla olduğunu, bununla onun səbri və şükrü imtahana çəkildiyini bilsə, səbrin və şükrün iman üçün bir vasitə olduğunu və imanın yalnız onlar əsasında qurulduğunu dərk edərdi. Hər bir möminin səbirli və şükürlü olması labüddür və bu iki amilin hər biri Öz məqamına görə daha əfzəldir. Yəni səbir, səbir edilməsi lazım olan məqamlarda əfzəldir, şükür isə şükür edilməsi lazım olan yerlərdə üstündür. Bu da onlardan birinin digərindən ayrılmasının lazım gəldiyi zamana görədir. Səbrin şükrün bir hissəsi, şükrün isə səbrin bir hissəsi adlandırılmasına gəlincə, yuxarıda da qeyd olunduğu kimi onların hər biri iki amilin vəhdətindən yaranan bir həqiqətdir. Bu iki amilin birinin digərindən üstün olmasına gəldikdə, bu yalnız onlardan birinin digərindən ayrıldığı zaman ola bilər. Bu da yalnız əqli cəhətdən qəbul olunası bir şeydir. Ağıldan kənarda isə onların birinin digərindən ayrılması yoxdur. Lakin bu tərzdə onlardan biri digərindən ayrıla bilər: qulun bəzən sözlərində, zahiri və batini əməllərində səbri şükrünə qalib gəlib bütün gücünü, nəfsini Allah üçün saxlamağa sərf etdiyi zaman, həmin qulun nəfsində səbirdən qeyrisinə yer tapılmır. Bəzən də qulun sözlərində, zahiri və batini əməllərində şükrü səbrinə qalib gəlir, iradə və əməl gücü nəfsini saxlama gücündən daha qüvvətli olur.

Bu iki hal iki şəxsə bənzəyir. Onlardan biri nəfsinə hakim olub onu pis istəklərdən saxlamağa qadir və müsibətlərə qarşı şikayəti az olandır. Bunun əməli böyükdür. Digəri isə xeyriyyəçilik yolunda çoxlu mal sərf edən və nəfsini yaxşı işlərə təhrik edəndir. Başqa birisinin isə nəfsi səbir gücü baxımından zəifdir.

Nəfsin iki qüvvəsi vardır. Birincisi, səbrin qüvvəti və nəfsin saxlanılmasıdır. İkincisi isə malını sərf etmə, xeyriyyəçiliklə məşğul olma və nəfsi kamilləşdirən əməllərə girişməkdir. Nəfsin kamilliyi, onda bu iki qüvvətin cəmlənməsi ilə ölçülür.

Bu barədə insanlar dörd qrupa bölünürlər. Onların ən yüksəkdə dayananı nəfsində həmin iki qüvvətin birləşdiyidir. Ən aşağı təbəqə isə bu qüvvələrdən uzaq olan təbəqədir. Digər qrupa aid insanlardan kiminin səbir gücü malını sərf etmə gücündən daha kamildir, kiminin də malını sərf etmə gücü səbir gücündən daha mükəmməldir.

Şükür səbirdən üstün tutularsa, bu ya bir məqamın digər məqamdan üstün tutulması, ya da hər iki amilin bir-birindən

ayrılması etibarı ilədir. Şükrün səbirdən üstün olması məsələsinə baxışı kəsmək və bunun tam izahı şükür edən zəngin və səbir edən yoxsul məsələsi ilə əlaqədardır. Gəlin bu barədə xüsusi və hansının daha üstün olmasının açıqlandığı bir fəslə müraciət edək.

# İYİRMİ İKİNCİ BÖLMƏ

## Şükür edən zənginin, yaxud səbir edən yoxsulun üstün olması barədə alimlər arasında fikir ayrılığının olması və bunlardan hansının doğru olması

Bu zəngin və yoxsullar arasında münaqişənin çox olduğu bir məsələdir. Hər iki sinif Qurandan, Sünnədən, əsərlərdən və ibrətamiz misallardan rədd edilməsi mümkün olmayan dəlillər gətirmişlər. Buna görə də düşünən bir insan üçün hər iki icmanın bərabər olması aydın olur. Çünki bayaq da qeyd etdiyimiz kimi hər iki icma rədd edilməsi mümkün olmayan dəlillər gətirmişlər və bu dəlillərin heç biri digəri ilə təzad təşkil etmir. Əksinə, dəlil harada olursa olsun, ona tabe olmaq vacibdir. Məsələ barədə hər iki icma alimləri tərəfindən çoxlu əsərlər yazılmış, məsələnin mahiyyəti və həqiqətinin insanlara açıqlanması fəqihlər, yoxsullar, zənginlər, sufilər, hədis və təfsir alimləri çıxışlar etmiş və İmam Əhməddən nəql olunan iki rəvayəti qeyd etmişlər. Əbulhüseyn həmin iki rəvayəti «Tamam» kitabında qeyd edərək belə demişdir: «Rəvayətlərin ən səhihinə görə səbir edən yoxsul şükür edən zəngindən üstündür. Lakin ikinci rəvayətdə isə şükür edən zənginin üstün olması bildirilir».

İbn Qüteybənin də arasında olduğu bir qrup alim ikinci rəvayəti, Əbu İshaq ibn Şaqilə və Valid Səid isə birinci rəvayəti seçmişlər. Bu barədə Allah-taala buyurur: **«Məhz belələri** (Allah yolunda bütün çətinliklərə, əziyyətlərə) **səbr etdiklərinə görə cənnət guşəsi** (Cənnətdəki yüksək məqamlardan biri) **ilə mükafatlandırılacaq,...»** (əl-Furqan, 75). Ayə barədə Məhəmməd ibn Əli ibn Hüseyn belə deyir: «Onlar dünyadakı yoxsulluqlarına səbir etdikləri üçün cənnət guşəsi ilə mükafatlandırılacaqlar».

Ənəsdən rəvayət olunur ki, Peyğəmbər: "Allahım! Məni yoxsul kimi yaşat, yoxsul kimi öldür və qiyamət günü yoxsulların zümrəsində məhşərə gətir" - deyə dua etdi. Aişə: "Nə üçün ey Allahın elçisi!" — deyə soruşdu. Peyğəmbər də belə cavab verdi: "Çünki onlar Cənnələ zənginlərdən qırx payız [il] əvvəl girəcəklər. Ey Aişə! Xurmanın yarısı olsa belə, yoxsulu boş qaytarma! Ey Aişə! Yoxsulları sev, onlara yaxın ol ki, qiyamət günü də Allah sənə yaxın olsun".[533]

---

[533] **Həsəndir:** ət-Tirmizi, 2352; əl-Beyhəqi, "Sünənul-Kubra", 7/12; "Şuabul-

Mən hesab edirəm ki, bu iki dəlildən heç biri səbir edən yoxsulun şükür edən zəngindən üstün olduğunu göstərmir. Ayəyə gəlincə, oradakı səbir şükür edənin ibadəti yerinə yetirməsində, günahlardan çəkinməsində göstərdiyi səbir, yoxsulluq və digər bəlalara mübtəla olan səbri nəzərdə tutulur. Əgər ayədə təkcə yoxsulluğa səbir nəzərdə tutulsa belə, yenə də bu, səbrin şükürdən üstün olduğunu göstərmir. Çünki Quran səbir edənlərin mükafatını göstərdiyi kimi şükür edənlərin mükafatını da göstərmişdir. Belə ki, bu barədə Allah-taala buyurur: **«..Lakin Allah şükür edənlərə mükafat verər», «Şükür edənləri də, əlbəttə, mükafatlandıracağıq!»** (Ali İmran, 144-145). Bununla Allah-taala rizasının şükürdə olmasını və rizasının Cənnətlə və Cənnətdəkilərlə mükafatlandırılmasından daha böyük olduğunu xəbər verir. Əgər Allah-taala səbir edənləri səbirlərinə görə cənnət guşəsi ilə mükafatlandırıbsa, bu Onun şükür edənləri şükür etdiklərinə görə cənnət guşəsi ilə mükafatlandırmayacağına dəlalət etmir.

Hədisə gəlincə, o iki cəhətdən yoxsulların üstün olması üçün dəlil hesab olunmur. Birincisi, bu hədis isnadına görə dəlil sayılmır. Çünki onu Məhəmməd ibn Sabit əl-Kufi Haris ibn Numəndən rəvayət etmişdir. Səhih hədis toplayanlar Harisin hədisini dəlil saymamışlar. Əksinə, Buxari onun hədisinin münkər olduğunu bildirmişdir. Buna görə də Tirmizi onun bu hədisini nə səhih, nə həsən adlandırmış, nə də bu barədə susmuşdur. Əksinə, hədisin qərib olduğu hökmünü vermişdir. İkincisi isə bu hədis səhih olsa belə, yoxsulların zənginlərdən üstün olmasına dəlalət etmir. Çünki Allahın bəndəsindəki sevdiyi yoxsulluq maddi yoxsulluq deyil, qəlb yoxsulluğudur ki, bu da qəlbin Allah üçün sınması, zəlil olması, mütiliyi və təvazökar olmasıdır. Belə yoxsulluq zənginliyə zidd deyildir və bunun üçün maddi cəhətdən yoxsul olmaq da şərt deyildir. Çünki qəlbin Allah, Onun əzəməti, böyüklüyü, məğrurluğu, ad və sifətləri üçün sınması maddi yoxsulluqdan daha əfzəl və daha ucadır. Həmçinin zənginin itaət edərək, öz xoşu ilə, Allahdan qorxaraq və Onu sevərək böyük günahlar işləməmək üçün göstərdiyi səbir aciz yoxsulun səbrindən daha üstündür. Allah-taala bir çox peyğəmbər və elçilərinə zənginlik və mülk bəxş etmiş, lakin bu zənginlik və mülk onları Allahın qarşısında zəlil olmaqdan uzaqlaşdırmamışdır.

İmam Əhməd Yezid ibn Harundan, o da Cəriridən, o da Əbu Səlildən belə deməsini rəvayət etmişdir: «Davud məscidə daxil olar, göz gəzdirər, İsrail övladlarının ən yoxsul dəstəsi arasında oturar və:

---

İman", 1380; İbn əl-Cəuzi, "əl-Mövduat", 3/141, 142. Deyirəm: sənədi çox zəifdir. əl-Buxari onu münkər adlandırıb.

"Yoxsul yoxsulların arasında olar" - deyərdi»[534]. Halbuki Allah-taala ona peyğəmbərlikdən əlavə mülk, zənginlik və bol ruzi bəxş etmişdir.

Əbulhüseyin demişdir: Əbu Bərəzə əl-Əsləmi Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Müsəlmanların yoxsulları Cənnətə zənginlərindən qırx payız [il] əvvəl girəcəklər və hətta qiyamət günü zəngin müsəlmanlar: "Kaş dünyada yoxsul olardıq" deyə - heyfsilənəcəklər».[535]

Hesab edirəm ki, bu hədis Əbu Hüreyrə, Abdullah ibn Ömər, Cabir ibn Abdullah, Əbu Səid və Ənəs ibn Malik kimi bir qrup səhabənin rəvayəti ilə Peyğəmbərdən nəql olunur[536]. Lakin yoxsulların Cənnətə zənginlərindən əvvəl girmələri onların dərəcələrinin üstün olmasına dəlalət etmir. Əksinə, yoxsulların haqq-hesaba çəkilmələri üçün malları olmadığına görə Cənnətə zənginlərdən tez girmələrinə dəlalət edir. Şübhə yoxdur ki, ədalətli rəhbər, eləcə də şükür edən zəngin haqq-hesaba çəkildiklərinə görə Cənnətə gec girəcəklər. Onların Cənnətə gec daxil olmaları dərəcələrinin yoxsulun dərəcəsindən aşağı olmaları demək deyil. «...hətta qiyamət günü zəngin müsəlmanlar: "Kaş dünyada yoxsul olardıq" deyə heyfsilənəcəklər» cümləsinə gəldikdə, bu ifadə səhih olsa belə, onların dərəcələrinin aşağı düşməsinə dəlalət etmir. Belə ki, ədalətli qazi qiyamət günü bəzi məqamlarda işin ağır olduğunu görüncə: "Kaş iki nəfər arasında bir xurma barəsində belə hökm verməyəydim" - deyərək heyfsilənəcəkdir.

Əbulhüseyn demişdir: İbn Ömərdən rəvayət olunur ki, Peyğəmbər səhabələri arasında ayağa qalxaraq: "İnsanların hansı daha xeyirlidir?" - deyə soruşdu. Səhabələrdən bəziləri: "Canının və malının haqqını verən zəngin insan" - dedilər. Peyğəmbər: "O adam necə də gözəldir. Lakin o deyildir. İnsanların ən xeyirlisi ən az malından sədəqə verən mömin yoxsuldur " — buyurdu.[537]

Bu hədisin isnadı qeyd edilməmişdir ki, onun səhih olub-olmamasına baxılsın. Hədisin hökmü naməlum qaldığı üçün dəlil olaraq götürülmür. Hədis səhih olsa belə, səbir edən yoxsulların üstün olduğunu göstərmir. Çünki bu hədis səbir edən yoxsul və şükür edən zənginlərlə yanaşı ən az malından sədəqə verən yoxsulun üstün

---

[534] "əz-Zühd", səh. 92.

[535] **Çox zəifdir:** əd-Dəyləmi, "Müsnəd əl-Firdovs", 883; əl-Hindi, "Kənzul-əməl". 6/475.

[536] **Səhihdir:** ət-Tirmizi, 2353-2354; ən-Nəsai, "ət-Təfsir", 2/92; İbn Macə, 4122; Əhməd, 2/296, 343, 451, 513, 519; İbn Hibban, 676; İbn Əbi Şeybə, "əl-Müsənnəf", 13/246; Əbu Nəim, "əl-Hilyə", 5912, 7/91, 99, 100, 8/212, 250.

[537] **Hədis mövdudur:** İbn Əbi Yəla, "ət-Tamam", 2/303, sənədini verməyib; əs-Suyuti, "Cəmi'i əs-Sağir", 3/481; əl-Albani, "Daif əl-Cəmi'i əs-Sağir", 2898.

olduğunu ifadə edir. Hədis həmçinin üstünlüyü və onun səbəbini bir araya gətirir. Şübhə yoxdur ki, bu da üç qismin ən əfzəlidir. Yoxsulun sədəqə verdiyi bir dirhəm zənginin sədəqə verdiyi yüz min dirhəmdən daha xeyirlidir. Peyğəmbər: "Bir dirhəm yüz min dirhəmdən irəlidədir" - dedi. Səhabələr: "Ey Allahın elçisi! Necə yəni, bir dirhəm yüz min dirhəmdən irəlidədir?" - deyə soruşdular. Peyğəmbər: "İki dirhəmi olub birini sədəqə verən adam hara, mal-dövləti olub ondan yüz min dirhəm sədəqə verən insan hara!" - deyə cavab verdi.[538] Hədisi Nəsai Səfvan ibn İsadan, o da Acalandan, o da Zeyd ibn Əsləmdən, o da Əbu Hüreyrədən rəvayət etmişdir.

Beyhəqi Sovridən, o da Əbu İshaqdan, o da Harisdən, o da Əlidən belə rəvayət edir: «Üç nəfər Peyğəmbərin hüzuruna gəldi. Onlardan biri: "Mənim yüz uqiyyəm[539] var idi. Ondan onunu sədəqə verdim" - dedi. İkincisi: "Mənim yüz dinarım var idi. Ondan onunu sədəqə verdim" - dedi. Üçüncüsü də; "Mənim on dinarım var idi. Ondan birini sədəqə verdim" - dedi. Peyğəmbər onlara: "Hamınız eyni savab qazanırsınız, çünki üçünüz də malınızın onda birini sədəqə vermisiniz" - buyurdu ".[540]

Əbu Səid ibn Ərabi İbn Əbiləvvamdan, o da Yezid ibn Harundan, o da Əbuləşhabdan, o da Həsəndən belə deməsini rəvayət edir: "Bir kişi Osman ibn Əffana: "Ey var-dövləl sahibləri! Bütün xeyiri apardınız. Sədəqə verir, kölə azad edir, həccə gedir xeyriyyəçilik üçün pullar sərf edirsiniz" - dedi. Osman da ona: "Siz bizə qibtə edirsiniz, biz də sizə qibtə edirik. Allaha and olsun ki, bir kəsin ən az malından xeyriyyəçilik məqsədilə xərclədiyi bir dirhəm zənginin xərclədiyi on min dirhəmdən daha xeyirlidir"- deyə cavab verdi".[541]

Əbu Davud Leysdən, o da Əbu Zubeyrdən, o da Yəhya ibn Cədədən, o da Əbu Hüreyrədən rəvayət etdiyinə görə Əbu Hüreyrə Allahın elçisindən: "Ey Allahın elçisi! Ən yaxşı sədəqə hansıdır?" - deyə soruşdu. O da: "Ən yaxşı sədəqə maddi çətinliklər içində yaşayanın ən az malından verdiyi sədəqədir və öncə öhdəndə olanlardan başla" - deyə cavab verdi.[542]

---

538 **Həsəndir:** ən-Nəsai, 5/95; İbn Xuzeymə, 2443; əl-Hakim, 1/416; əl-Beyhəqi, 4/181; İbn Hibban, 3447.

539 Bir kisə gümüş pul.

540 **Çox zəifdir**: əl-Beyhəqi, "əs-Sünən", 4/182; "Şuabul-İman", 3181; Əhməd, 1/96, 114; Abdurrəzzaq, "əl-Musənnəf", 11/106/20051; əl-Bəzzar, ''əl-Müsnəd", 841.

541 **Zəifdir**: əl-Beyhəqi, "Şuabul-İman", 3182; İbn əl-Mübarək, "əz-Zühd", 770.

542 **Səhihdir**: Əbu Davud, 1677; Əhməd, 2/358; İbn Xuzeymə, 2444, 2451; İbn Hibban, 3346; İbn Əbi əd-Dünya, "əl-İyal", 4; əl-Hakim, 1/414; əl-Beyhəqi, "əs-Sünən", 4/80; "Şuabul-İman", 3180.

Müsnəddə və İbn Hibbanın "Səhih"ində Əbu Zərdən belə rəvayət olunur: "Allah elçisindən: "Ey Allahın elçisi! Ən yaxşı sədəqə hansıdır?" - deyə soruşdum. O da: "Ən yaxşı sədəqə maddi çətinliklər içində yaşayanın verdiyi sədəqədir" - deyə cavab verdi ".[543]

Nəsai Əvzaidən, o da Ubeyd ibn Umeyrdən, o da Abdullah ibn Həbəşidən rəvayət edir ki, Peyğəmbərdən: «Ən yaxşı əməl hansıdır?» - deyə soruşdular. O da: «Şəksiz iman gətirmək, qənimətində xəyanət olmayan cihad və vacibatlarına riayət olunaraq sırf Allah rizası üçün edilən həcc» - deyə cavab verdi. Sonra: «Ən yaxşı namaz hansıdır?» - deyə soruşdular. O da: «Qiyamı uzun olan namaz» - deyə cavab verdi. Sonra: «Ən yaxşı sədəqə hansıdır?» - deyə sonışdular. O da: «Ən yaxşı sədəqə maddi çətinliklər içində yaşayanın ən az malından verdiyi sədəqədir»- deyə cavab verdi. Sonra: «Ən yaxşı hicrət hansıdır?» - deyə soruşdular. O da: «Allahın haram buyurduqları ucbatından edilən hicrətdir» - deyə cavab verdi. Sonra: «Ən yaxşı cihad hansıdır?» - deyə soruşdular. O da: «Qanı axıdılanın, atı öldürülənin cihadı» - deyə cavab verdi.[544]

Bütün bu hədislər maddi çətinliklər içində yaşayan yoxsulun ən az malından verdiyi sədəqənin var-dövlət sahibinin vəziyyətinə təsir etməyəcək dərəcədə çoxluğundan asılı olmayaraq malının bir hissəsindən vermiş olduğu sədəqədən üstün olduğunu göstərir. Çünki əməllərin Allah dərgahında bir-birindən üstün olması onların çoxluğuna və növünə görə deyil, qəlblərdəki niyyətlərə, o əməli etməyə sövq edən amilin qüvvətli olmasına, əməli edənin düzlüyünə, səmimiliyinə və Allahı nəfsindən üstün tutmasına görədir. Allahı nəfsindən üstün tutaraq gündəlik çörəyini sədəqə verənin sədəqəsi hara, zəngin insanın dənizdə bir damcı olaraq verdiyi yüz min dirhəm hara?! Yoxsulun çörəyi tərəzidə zənginin yüz min dinarından ağır gələcəkdir. Yardım diləmək üçün üz tutulan yeganə varlıq Allah-taaladır.

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər İbn Ədinin Süleyman ibn Əbdürrəhmandan, o da Xalid ibn Yeziddən, o da atasından, o da Ətadan, o da Əbu Səid əl-Xudridən rəvayət etdiyi hədisi dəlil gətirirlər. Belə ki, Allahın elçisi: «Allahım! Məni zəngin kimi deyil, yoxsul kimi öldür»[545] - deyə dua etmişdir. Bu hədis səhih

---

543 **Çox zəifdir**: Əhməd, 5/178; əl-Beyhəqi, "Şuabul-İman", 3298; al-Bezzar, "Kəşful-Əstar", 160; əl-Heysəmi, "əl-Məcmuə", 1/160; İbn Hibban, 361; Əbu Nəim, 1/166-168.

544 **Həsəndir**: Əbu Davud, 1325, 1449; ən-Nəsai, 5/58, 8/94; Əhməd, 3/411; Əbu Nəim, "əl-Hilyə", 2/14; əl-Beyhəqi, 3/9, 9/164; İbn əl-Arabi, "əl-Muəccəm", 1188; İbn Əbi Asim, "əl-Cihad", 26.

545 **Çox zəifdir**: İbn Adiy, "əl-Kamil", 3/884; ət-Tabərani, "Müsnəd əş-Şamiyyin",

deyildir. Çünki hədis alimləri Xalid ibn Yezid ibn Əbdürrəhman ibn Malik Dəməşqinin zəif dərəcəli ravi olması və onun hədisinin dəlil götürülməməsi barədə yekdil fikirdədirlər. İmam Əhməd bu ravini ümumiyyətlə qəbul etməmiş, İbn Muin onun zəif olduğunu qeyd etmiş, Yəhya isə onun yalançı adlandırmışdır.

Şeyxülislam İbn Teymiyyədən (Allah ona rəhmət eləsin!) bu məsələ barədə soruşduqda belə cavab vermişdir: «Şükür edən zənginlə səbir edən yoxsulun hansının üstün olması barədə son dövrün bir çox alimləri arasında fikir ayrılığı vardır. Bir qrup alimlər səbir edən yoxsulların üstün olduğunu, digər qrup alimlər isə şükür edən zənginlərin üstüq olduğunu iddia edirlər. Bu barədə İmam Əhməddən iki rəvayət nəql olunur. Səhabələrə və tabiunlara (Allah onların hamısından razı olsun!) gəlincə, onların heç birindən iki sinifdən birinin digərindən üstün olması barədə rəvayət nəql olunmamışdır. Alimlərdən olan üçüncü bir dəstə isə səbir edən yoxsulla şükür edən zənginin birinin digərindən üstünlüyünün yalnız təqvada olması iddiasındadırlar. Onlardan daha imanlı və daha təqvalı olanı elə daha əfzəl olanıdır. Əgər təqva və imanda bərabər olarsa, fəzilətdə də eyni dərəcədə olarlar».

Üçüncü qrup alimlərin bu mövzuda söylədikləri ən səhih fikirdir. Çünki Quran və Sünnənin mətnlərindən də belə məlum olur ki, fəzilət və üstünlük yalnız iman və təqvanın dərəcəsi ilə müəyyənləşir. Belə ki, bu barədə Allah-taala Quranda da buyurur: **«...**(Əleyhinə şahidlik edəcəyiniz şəxs) **istər dövlətli, istər kasıb olsun, hər halda Allah onların hər ikisinə** (sizdən) **daha yaxındır...»** (ən-Nisa, 135). Əvvəlki peyğəmbərlərin arasında elə zənginləri var idi ki, bir çox yoxsul peyğəmbərlərdən daha üstün idi. Həmçinin yoxsul peyğəmbərlər arasında da elələri var idi ki, bir çox zəngin peyğəmbərlərdən daha üstün idi. Kamil insanlar isə hər iki amilə riayət edərlər. Peyğəmbərimiz, Əbu Bəkr və Ömər (Allah onların hər ikisindən razı olsun!) kimi həm şükür, həm də səbir edərlər.

Bəzi insanlar üçün can sağlığı, bəzi insanlar üçün də xəstəlik daha xeyirli olduğu kimi bəzi insanlar üçün yoxsulluq, bəzi insanlar üçün də zənginlik daha faydalıdır. Bəğəvinin və qeyrilərinin Peyğəmbərdən rəvayət etdikləri bir qüdsi hədisdə Allah-taala belə buyurur: **«Qullarımdan bəzilərinə ancaq zənginlik yarayır. Əgər onları yoxsul etsəydim, yoxsulluq onları pozardı. Elə qullarım da**

1615; "əd-Dua", 1426; əl-Hakim, 4/322; əl-Beyhəqi, "Şuabul-İman", 10506. əl-Hakim və əl-Beyhəqinin hədisi səhih sayması ilə əz-Zəhəbi razılaşmışdır. Deyirəm: Onların bunu deməsi təəccüblüdür. Allah ona rəhmət eləsin, xüsusi ilə əz-Zəhəbinin belə deməsi çox təəccüblüdür.

**var ki, ancaq yoxsulluq onlara yarayır. Əgər onları dövlətli etsəydim, var-dövlət onları yoldan çıxarardı. Qullarımdan bəzilərinə ancaq sağlamlıq yarayır. Əgər onları xəstə etsəydim, xəstəlik onları pozardı. Elə qullarım da var ki, ancaq xəstəlik onlara yarayır. Əgər onları sağlam etsəydim, sağlamlıq onları yoldan çıxarardı. Şübhəsiz ki, Mən qullarımı idarə edirəm. Mən onlardan xəbərdaram və onları görürəm»**.[546]

Peyğəmbərdən rəvayət olunan bir səhih hədisdə belə deyilir: «Yoxsul müsəlmanlar Cənnətə zəngin müsəlmanlardan əvvəl girəcəklər».[547]

Başqa bir rəvayətdə isə belə deyilir: «Yoxsullar hər namazdan sonra zikri bildikdə zənginlər bunu eşitdilər və onlar da yoxsulların dediklərini deməyə başladılar. Bir müddətdən sonra yoxsullar yenidən Peyğəmbərin hüzuruna gələrək əhvalatı ona danışdılar. Allahın elçisi də onlara: **"Bu, Allahın dilədiyi kimsəyə əta etdiyi lütfüdür"** (əl-Hədid, 2l) - deyə cavab verdi».[548]

Yoxsullar haqq-hesablarının yüngül olmasına görə Cənnətə zənginlərdən tez daxil olacaqlar. Zənginlər isə haqq-hesablarının uzun çəkdiyinə görə Cənnətə girməkdə gecikəcəklər. Sonra zənginlərdən biri haqq-hesaba çəkilərkən Cənnətə gec daxil olsa belə, savabları yoxsulun savablarından böyük olsa, Cənnətdəki dərəcəsi də yoxsulun dərəcəsindən yüksək olacaqdır. Belə ki, yetmiş min insan Cənnətə haqq-hesabsız daxil olacaqdır. Onlardan biri də Ukkaşə ibn Mihsandır. Hesabla Cənnətə girən bəzi insanların Cənnətdəki dərəcəsi hesabsız Cənnətə girənlərin bəzilərinin dərəcələrindən daha üstün olacaqdır. Lakin hesabsız Cənnətə girənlər hesabın yorğunluğundan və əziyyətindən canlarını qurtarmış olacaqlar. Bu, Quran və Sünnədə qeyd olunan yoxsulluqdur və bu zəkat alması halal olan, yaxud zəkat vacibatı olmayan zənginə ziddir.

Bir çox alimlərin istilahında yoxsulluq zahidlikdən, ibadətdən və gözəl əxlaqdan ibarətdir. Kim bu keyfiyyətlərlə səciyyələnsə, mal sahibi olsa belə, yoxsul adlanır. Bu keyfiyyətlərlə səciyyələnməyənlər isə malları olmasa belə, həmin alimlərə görə yoxsul sayılmırlar. Bu sufilik dini cərəyanının yoxsulluğa verdikləri tərifdir. Bəzi alimlər yoxsulla sufi adı arasında fərq qoydular. Sonra onlardan bəziləri yoxsul adına, bəziləri isə sufi adına üstünlük verdilər. Bu mövzuda nəticə olaraq onu deyə bilərik ki, sonradan yaranmış mənalara baxılmır. Yalnız Quran və Sünnənin gətirdiyi ad və mənalara baxmaq

[546] **Zəifdir:** İbn Əbi əd-Dünya, "əl-Vilayə", 1; əl-Beyhəqi, "əl-Əsma vəs-Sifət", səh.121; Əbu Nəim, "əl-Hilyə", 8/318.
[547] Çıxarışı yuxarıda verildi.
[548] Çıxarışı yuxarıda verildi.

lazımdır. Çünki Allah-taala iman və təqvanı dostlarının vəsfi etmişdir. Kimin bundan nəsibi böyük olarsa, o da üstün olar. Zənginlər də bu məsələdə bərabərdirlər. Ən doğrusunu bilən isə təbii ki, Allah-taaladır.

# İYİRMİ ÜÇÜNCÜ BÖLMƏ

## Səbir edən yoxsulların üstün olmasını iddia edənlərin Quran, Sünnə, əsər və ibrətamiz misallardan dəlilləri

Səbir edən yoxsulların üstün olmasını iddia edənlər deyirlər:

Allah-taala Qurani-Kərimdə zənginliyi və malı bir neçə yöndən qeyd edir.

Birincisi, zənginliyi məzəmmət yönündən. Bu barədə Allah-taala buyurur: **«Xeyr, insan azğınlıq edər, özünün dovlətli olduğunu gördüyü üçün!»** (əl-Ələq, 6-7). Başqa bir ayədə isə belə buyurur: **«Əgər Allah** (bütün) **bəndələrinə bol ruzi versəydi, onlar** (günah etməkdə) **yer üzündə həddi aşardılar»** (əş-Şura, 27). Bir ayədə isə belə deyilir: **«Əgər insanların** (müşriklərin cah-calal içində yaşadıqlarını görüb cahillikləri üzündən küfrdə birləşəcək) **bir tək ümmət olmaq ehtimalı** (təhlükəsi) **olmasaydı, Rəhmanı inkar edənlərin** (axirət əzabını daha da artırmaq məqsədilə) **evlərinin tavanlarını və** (damlarına) **çıxdıqları nərdivanları gümüşdən edərdik. Eləcə də evlərinin qapılarını və söykəndikləri taxtları** (gümüşdən düzəldərdik). **Və** (bunlardan əlavə onları) **qızıl bəzəklər** (içində qərq edərdik, yaxud həmin şeyləri qızıldan düzəldərdik). **Həqiqətən, bütün bunlar fani dünya malıdır. Axirət** (Cənnət) **isə sənin Rəbbinin yanında ancaq Allahdan qorxub pis əməllərdən çəkinənlər üçündur!»** (əz-Zuxruf, 33-35). Bir ayədə isə Allah-taala belə buyurur: **«**(Ya Peyğəmbərim! Münafiqlərin) **nə malları, nə də oğul-uşağı səni təəccübləndirməsin. Allah onlarla ancaq münafiqlərə dünyada əzab vermək, kafir olduqları halda, canlarını almaq istər»** (ət-Tövhə, 55). Allah-taala buyurur: **«**(Bəzi adamların fəxr etdiyi) **mal-dövlət, oğul-uşaq** (oğullar) **bu dünyanın bər-bəzəyidir»** (əl-Kəhv, 46). Allah-taala buyurur: **«Qadınlar, uşaqlar, qızıl-gümüş yığınları, yaxşı cins atlar, mal-qara və əkin yerləri kimi nəfsin istədiyi və arzuladığı şeylər insanlara gözəl göstərilmişdir»** (Ali İmran, 14). Bu ayələrə bənzər ayələr çoxdur.

İkincisi, Allah-taala zənginliklə malı bəla və imtahan kimi qeyd etmişdir. Belə ki, Allah-taala buyurur: **«Həqiqətən, mal-dövlətiniz və oğul-uşağınız** (sizin üçün) **ancaq bir imtahandır»** (ət-Təğabun, 15). Digər bir ayədə belə buyurur: **«Məgər** (kafirlər) **elə zənn**

**edirlər ki, onlara** (dünyada) **verdiyimiz var-dövlət və övladla biz onların yaxşılıqlarına tələsirik? Xeyr, anlamırlar!** (Kafirlərə dünyada istədiklərini verib tədriclə onları əzaba yaxınlaşdırmağımızı, az sonra qəflətən başlarının üstünü alacağımızı düşünmürlər!)**»** (əl-Muminun, 55-56). Allah-taala yoxsulluqla imtahana çəkdiyi kimi zənginliklə də imtahana çəkdiyini xəbər verərək buyurur: **«İnsana gəldikdə, nə zaman Rəbbin onu imtahana çəkib ehtiram etsə, ona bir nemət versə, o: "Rəbbim mənə ehtiram göstərdi!" - deyər»** (əl-Fəcr, 15). Yenə də Allah buyurur: **«Hər bir kəs** (hər bir canlı) **ölümü dadacaqdır.** ( Dözüb-dözməyəcəyinizi, şükür edəcəyinizi, yaxud nankor olacağınızı) **yoxlamaq məqsədilə Biz sizi şər və xeyirlə** (xəstəlik, yoxsulluq, ehtiyac və sağlamlıq, var-dövlət və cah-cəlalla) **imtahana çəkərik»** (əl-Ənbiya, 35).

Üçüncüsü, Allah-taala mal-dövlət və övladın heç birinin Ona yaxınlaşdırmayacağını, ancaq iman və saleh əməlin ona yaxınlaşdıracağını xəbər verərək buyurur: **«Sizi bizə yaxınlaşdıran nə var-dovlətiniz, nə də oğul-uşağınızdır. Yalnız iman gətirib yaxşı işlər görənlərin** (dünyadakı) **əməllərinə görə mükafatları qat-qat** (birə-on) **artıq olacaq və onlar cənnət otaqlarında** (Cənnətin yüksək məqamlarında) **əmin-amanlıq içində yaşayacaqlar»** (Səba, 37).

Dördüncüsü, Allah-taala dünyanı, zənginliyi və malı axirətdə nəsibi olmayanlara ləzzət olaraq verdiyini, axirəti isə yalnız müttəqilərə saxladığını xəbər verərək buyurur: **«**(Kafirlərin) **bəzi zümrələrini sınamaq üçün onlara dünya həyatının zinəti olaraq verdiyimiz mal-dövlətə rəğbət gözü ilə baxma!** (Gözünü dikmə!) **Rəbbinin ruzisi** (bərəkəti) **həm daha xeyirli, həm də daha baqidir** (sürəklidir, əbədidir)**!»** (Taha, 131). Digər bir ayədə isə belə deyilir: **«Kafir olanlar cəhənnəm oduna göstəriləcəkləri** (cəhənnəm odunun üzündən pərdə gölürülüb kafirlərin gözünə görünəcəyi, yaxud cəhənnəm əzabını dadacaqları) **gün** (onlara məzəmmətlə belə deyiləcəkdir): **"Siz dünya həyatınızda** (bütün) **nemətləri görüb daddınız və onlardan ləzzət aldınız** (dünyada sizin üçün gözəl olan hər şeyi xərclədiniz, axirətə bir şey qalmadı)**»** (əl-Əhqaf, 20).

Peyğəmbər Ömərə: «Məgər dünyanın onların, axirətin isə bizim olmasına razı deyilsənmi?!» - deyərək bu mənaya işarə etmişdir.[549]

Beşincisi, Allah-taala naz-nemət içində yaşayanları və sərvət sahiblərini ancaq məzəmmət edərək belə buyurur: **«Onlar bundan əvvəl** (dünyada) **naz-nemət içində idilər»** (əl-Vaqiə, 45). Digər bir ayədə isə belə buyurur: **«Biz bir məmləkəti məhv etmək istədikdə**

---

[549] əl-Buxari, 2468; Müslim, 1479 (34).

(peyğəmbərlərin dili ilə) **onun naz-nemət içində yaşayan başçılarına** (Allaha itaət etməyi, iman gətirməyi) **əmr edərik. Lakin onlar** (Allaha asi olub) **pis-pis işlər törədərlər»** (əl-İsra, 16). Bir ayədə isə belə deyilir: **«**(Mələklər istehza ilə onlara belə dedilər:) **"Qaçmayın, kef çəkdiyiniz yerə, məskənlərinizə qayıdın". Yəqin ki,** (hara getmişdiniz, mal-dövlətiniz, cəh-cəlalınız necə oldu, deyə) **sorğu-sual ediləcəksiniz!»** (əl-Ənbiya, 13).

Altıncısı, Allah-taala mal-dövlət aşiqini məzəmmət edərək belə buyurur: **«Mirası** (halal-haramına) **varmadan yeyirsiniz** (qadınların, uşaqların paylarını vermirsiniz). **Mal-dövləti isə lap çox sevirsiniz»** (əl-Fəcr, 19-20). Bu ayədə Allah-taala onları həm mal-dövləti sevdiklərinə görə danlayır, həm də buna görə eyibləyir.

Yeddincisi, Allah-taala dünyanı və zənginliyi arzulayanı məzəmmət edir, onu istəməyənləri, ona qarşı çıxanları mədh edir və o dövrün ən zəngin insanı haqqında belə buyunır: **«**(Bir gün Qarun) **faxir libas geyib öz zinəti içində qövmünün qarşısına çıxdı. Dünyaya həris olanlar dedilər: "Kaş ki, Qaruna verilən** (dövlət) **bizə də veriləydi. Həqiqətən, o, böyük bəxt** (qismət) **sahibidir!"** (Axirət barəsində) **elm verilmiş kəslər isə belə dedilər: "Vay halınıza! İman gətirib yaxşı əməl edən kimsə üçün Allahın mükafatı** (təmənnasında olduğunuz var-dövlətdən, dəbdəbədən) **daha yaxşıdır. Buna** (bu nemətə) **yalnız səbr edənlər** (Allaha itaət və ibadət etməyi fani dünya malından üslün tutanlar, həyatın çətinliklərinə dözənlər) **qovuşarlar!"»** (əl-Qəsəs, 79-80).

Elm sahibləri xəbər verirlər ki, Allah dərgahında olan mükafat və Cənnət iman gətirib yaxşı əməl edən kimsə üçün daha xeyirlidir. Bu mükafatı istənilən halda yoxsulluğa, dünyaya, dünya arzularına və zənginlərə verilən naz-nemətə qarşı səbirli olan kəslər layiq görülürlər. Allah-taala onların dünya və onun zinətini arzulamadan elm əhli olduqlarına şəhadət vermişdir.

Səkkizinci, Allah-taala fəzilətin hakimiyyət qurmaq üçün ehtiyac duyulan malda olduğunu zənn edənlərin zənnini rədd edərək buyurur: **«**(İsrail övladının) **peyğəmbəri onlara dedi: "Allah Talutu sizə padşah göndərdi". Onlar isə: "Biz hökmdarlığa daha layiq ikən və ona var-dövlət verilmədiyi halda, o, necə bizə padşah ola bilər?» - deyə cavab verdilər.** (Peyğəmbər onlara) **dedi: "Allah sizdən ötrü onu** (bəyənib) **seçmiş, elm və bədəncə** (qüvvəcə) **ona üstünlük vermişdir»** (ət-Bəqərə, 247). Allah-taala onların bu iddiasını rədd edərək üstünlüyün zənn etdikləri kimi malda deyil, elmdə olduğunu xəbər vermiş və buyurmuşdur: **«**(Ya Rəsulum!) **De: "Allahın neməti və mərhəməti ilə - ancaq onunla sevinsinlər. Bu onların yığdıqlarından** (fani dünya malından) **daha xeyirlidir!"»**

(Yunus, 58). Ayədən də göründüyü kimi Allahın fəziləti və rəhməti elm, iman və Qurandır. Onların yığdıqları isə mal-dövlətdir. Belə ki, Allah-taala buyurur: **«**(Ya Rəsulum!) **Məgər sənin Rəbbinin mərhəmətini** (peyğəmbərliyini) **onlarmı paylaşdırırlar?! Dünyada onların dolanacaqlarını** (keçinəcəklərini) **öz aralarında Biz bölüşdürdük. Bir-birlərinə iş gördürsünlər deyə, bəzilərinin dərəcələrini digərlərindən üstün tutduq. Sənin Rəbbinin mərhəməti onların yığdıqlarından** (dünya malından) **daha yaxşıdır!»** (əz-Zuxruf, 32).

Doqquzuncusu, Allah-taala mal-dövlət yığaraq onun çoxluğu ilə öyünməyin insanları axirətdən, ona hazırlıqdan yayındırmasını xəbər verir və onları hədələyərək buyurur: **«**(Ey qafil insanlar!) **Çoxluq** (mal-dövlət, oğul-uşaq və qohum-əqraba çoxluğu) **ilə öyünmək sizi o qədər şirnikləndirdi** (başınızı o qədər qatdı) **ki, hətta** (məzarlarda yatan ölülərinizi sayıb, onların da çoxluğu ilə fəxr etməyiniz üçün) **qəbirləri ziyarət etdiniz.** [Və ya (axirətiniz üçün əsla çalışmadan) ölüb getdiniz (ölənə qədər bu halınızda davam etdiniz)]. **Xeyr!** (Belə yaramaz!). **Siz** (öləndən sonra bu yaramaz əməllərinizin aqibətini) **mütləq biləcəksiniz! Xeyr, xeyr!** (Belə yaramaz). **Siz** (öləndən sonra bu yaramaz əməllərinizin aqibətini) **mütləq biləcəksiniz!»** (ət-Təkasur, 1-4). Allah-taala çoxluq ilə öyünmənin dünya əhlini əcəlləri çatana qədər Allahdan və axirətdən yayındırdığını xəbər verir. Belə ki, Allah Qurani-Kərimdə bildirir ki, onlar qəbirləri ziyarət etdilər, lakin çoxluqla öyünmənin yuxusundan ayılmadılar. Allah-taala ölümü deyil qəbirlərin ziyarəti buyurmuşdur. Çünki insanlar nə dünyada, nə də qəbirlərdə daim qalacaqlar. Onlar qəbirlərdə yolçu kimidirlər. Ora gəlib bir müddət qaldıqdan sonra dünyada olduqları kimi oradan da köçəcəklər. Son qərar tutacaqları yer ya Cənnət, ya da Cəhənnəmdir. Allah-taala ayədə öyünülən şeyin nə olduğunu müəyyən etməmişdir. Çünki pislənilən öyünülən şey deyil, elə öyünmənin özüdür. Belə ki, oyun və əyləncənin səni məşğul etdiyi qeyd edilmiş, lakin bu əyləncənin növünün adı çəkilməmişdir. Yalnız öyünən dedikdə qulun dünya malı, cah-calal, kölə, kəniz, bina tikmə, ağac əkmə, Allahın rizasını tələb etməyən elm, Allaha yaxınlaşdırmayan əməl və bu qəbildən olan, insanı Allahdan və axirətdən yayındıran əməllər nəzərdə tutulur.

Müslim Abdullah ibn Şəxirdən rəvayət etdiyi hədisdə onun belə deməsini rəvayət edir: «Peyğəmbərin yanına gəldim. O ət-Təkasur surəsini oxuyurdu. Peyğəmbər: "Adəm oğlu malım, malım deyir. Məgər malından sədəqə verib apardığından, yeyib tükətdiyindən və

geyib köhnəltdiyindən başqa sənə bir şey qalırmı?!" - buyurdu».[550]

Allah-taala çoxluqla öyünərək Allahdan və axirətdən yayınan kəsi əməlli-başlı hədələmişdir. Belə ki, insan öyündüyü şeyin səpələnmiş toz olduğunu, yəni ona heç bir fayda verməyəcəyini görəcək, öyündüyü dünyanın hiylə və aldadıcı olduğunu görəcək, öyünməsinin aqibətinin onun lehinə deyil, əleyhinə olduğunu hiss edəcəkdir. Özü kimi digərləri ziyan çəkdiyi kimi özü də ziyan çəkəcəkdir. Hesaba daxil etmədiyi şeylər Allah tərəfindən ifşa ediləcəkdir. Onu Allahdan və axirətdən yayındıran öyünməsi əzaba düçar olmasının ən başlıca səbəbi olacaqdır. Öyünməsi onun həlak olması şərtilə bədbəxt olmasına səbəb olacaqdır. Öyünməsinə görə dünyada ucalmayıb əksinə, ən aşağıda olanlarla bərabər olacaqdır. Öyünməsi onu necə də bədbəxt etdi. Dünyadakı zənginliyi ona axirətdə yoxsulluq, xeyiri isə şər gətirdi. Gözündən örtük qalxdığı zaman: "Kaş ölməmiş əbədi həyatım üçün yaxşı bir iş görər, Allaha ibadət edərdim" - deyəcəkdir. Bu barədə Allah-taala buyurur: **«Nəhayət,** (müşriklərdən) **birinin ölümü gəlib çatdığı zaman o belə deyər: "Ey Rəbbim! Məni geri** (dünyaya) **qaytar! Bəlkə,** (indiyə qədər) **zay etdiyim ömrüm müqabilində yaxşı bir iş görüm!** (Yaxud, bu günə qədər tərk etdiyim imana qayıdıb saleh bir əməl edim!) **Xeyr, bu onun dediyi boş** (faydasız) **bir sözdür»** (əl-Muminun, 99-100). Onların dedikləri bu sözə bel bağlamaq olmaz. Bu geri qayıtma istəyi qəbul olunmayan bir istəkdir. Əvvəlcə: "Ey Rəbbim!" - deyə Allahdan yardım diləyəcək, sonra onun Allahın hüzuruna gətirilməsi əmrini almış mələklərə: "Məni geri qaytarın" - deyəcəkdir. Sonra dünyaya geri qayıtmaq istəməsinin səbəbini arxada buraxmış olduğu malı, cah-calalı, səltənəti və gücü üçün yaxşı əməl görəcəyi kimi açıqlamışdır. Lakin ona: "Xeyr, sənin yenidən dünyaya qayıtmağına yol yoxdur. Çünki sən düşünəcək bir insanın düşənəcəyi qədər ömür yaşadın" - deyiləcəkdir.

Yardım diləyən hər kəsə yardım etmək və əldən çıxardığını geri qaytarması üçün möhlət istəyənə möhlət vermək səxavətli və mərhəmətli Allahın şənindən olsa da, Allah-taala bu qafilin geri qayıtmaq arzusunun boş bir söz olduğunu, arxasında heç bir həqiqətin dayanmadığını, ona möhlət verilsə belə, xarakter və təbiətinin saleh iş görməyə razı olmadığını, onun bu sözləri yalnız dildə söylədiyini, yenidən dünyaya qaytarılsa belə, Allahın qadağan etdiyi əməlləri edəcəyini və onun yalançılardan olduğunu xəbər vermişdir. Hakimlərin hakimi olan Allahın hikməti, izzəti, elmi və həmdi istənilən faydasız bir şeyi əta etmeyə razı olmaz. Çünki həmin

[550] Müslim, 2958.

qafil yenidən dünyaya qaytarılsa belə, ikinci halı birinci halının təkrarı olardı. Belə ki, bu barədə Allah-taala Qurani-Kərimdə buyurur: **«**(Ya Rəsulum!) **Gətirilib od üstündə saxlandıqları zaman sən onların: "Kaş ki, biz dünyaya qaytarılıb Rəbbimizin ayələrini yalan hesab etməyəydik və möminlərdən olaydıq!» - demələrini görəydin! Xeyr, əvvəlcə** (ürəklərində) **gizlətdikləri** (küfr, nifaq və çirkin əməllər) **onların qabağına çıxdı. Əgər geri qaytarılsaydılar, yenə də onlar qadağan olunduqları şeyə** (küfr və günaha) **əl qatardılar. Onlar, şübhəsiz ki, yalançıdırlar!»** (əl-Ənam, 27-28).

Bir çox hədis alimləri bu ayənin ətrafında çalışsalar da, ona səhih bir təfsir verə bilmədilər. Onların bu ayə haqqında söylədiklərinə fikir versən, tutarlı bir dəlil tapa bilməzsən. Ayənin mənası isə onların izah etdiyindən daha geniş və daha böyükdür. Təfsirçilər ayədəki düzəliş hissəciyi (idrab) olan بل – in nə məqsədlə işlədildiyini, qabağına çıxacaq şeyin nə olduğunu düzgün anlamamış, bunun əzab olduğunu zənn etmişlər. Lakin bunun ayənin **«Əvvəlcə** (ürəklərində) **gizlətdikləri»** hissəsiylə uyğun olmadığını görüb كانوا köməkçi felini təqdirdə olan xəbər hesab etdilər. Bu zaman onların gizlətdikləri şeyin küfr nifaq və çirkin əməllər olduğu meydana çıxdı. Lakin bu təfsirdə də onlara qarşı kafirlərin öz şirk və küfrlərini gizlətmədikləri, əksinə onu açıq aşkar yaymaları, insanları buna dəvət etmələri və bunun uğrunda müharibələr aparmaları barədə dəlil göstərildi. Təfsirçilər bunun onların əleyhinə bir dəlil olduğunu görüb belə dedilər: «Kafirlər və müşriklər qiyamətin bəzi yerlərində öz şirklərini gizlədib inkar edəcək və: **«Ey Rəbbimiz! Biz müşrik olmamışıq»** (əl-Ənam, 23) - deyəcəklər. Cəhənnəmin qarşısında dayandıqları zaman isə gizlətdikləri küfrün və şirkin cəzası onların qabağına çıxacaqdır». Təfsirçilərdən olan Vahidi demişdir: «Bu təfsir sahibləri heç bir şey etməmişlər. Çünki ayənin mətni, düzəliş hissəciyi (idrab) olan بل - in işlədilməsi məqsədi, onlar yenidən dünyaya qayıtsalar belə, qadağan olunmuş işlər görmələri xəbəri və müşriklərin: "Ey Rəbbimiz! Allaha and olsun ki, biz müşrik olmamışıq" - demələri bu təfsirçilərin söylədiklərinə uyğun gəlmir. Bu barədə düşünün!»

Aralarında Zəccacın da olduğu bir dəstə alimlər isə: «Başçılarının gizlətdikləri qiyamət onlara tabe olanların qabağına çıxacaqdır» - deyə təfsir etmişlər. Lakin bu təfsirinin özünün izaha ehtiyacı vardır. Çünki bu təfsirdəki ağırlıq gizli deyildir.

Mubərrid bu ayəni digər alimlərdən daha düzgün anlayaraq demişdir: «Kafirlərə küfrün zərəri gizli olunca, sanki küfrün özüdə onlar üçün açıq olmamışdır». Bunun mənası belədir: Kafirlərə küfrün aqibətinin zərəri və cəzası gizli olduğu üçün sanki küfrün özü və

həqiqəti də onlar üçün gizli qalmışdır. Onlar əzabı gördükləri zaman isə küfrün həqiqəti və zərəri onların qabağına çıxacaqdır. İnsanların qarşısında küfrlərini və şirklərini elan edərək, oturaq və köçəriləri buna çağıraraq, əməllərinin aqibətindən bixəbər olduqları üçün küfrlərini gizlətmələrini söyləmək çətindir. Belə ki, açıq-aşkar haqsızlıq edən, insanları qətlə yetirən, yer üzündə fəsad törədən kəsin etdiyi əməllərin aqibətindən bixəbər olduğu üçün bu əməlləri gizlətmiş olduğunu demək də doğru olmazdır.

Allah nə demək istədiyini daha yaxşı bilir. Belə ki, ayənin mənası belədir: həmin müşriklər Cəhənnəmin qarşısında dayanıb onu gördükləri və ora daxil olacaqlarını anladıqları zaman dünyaya qaytarılmağı, orada Allaha və ayələrinə iman gətirməyi və elçilərini yalançı çıxarmamağı arzu edəcəklər. Lakin Allah-taala məsələnin heç də belə olmadığını, onların təbiət və xarakterlərində imanın olmadığını, əksinə xarakterlərinin küfr, şirk və yalan olduğunu bildirir. Həmçinin Allah-taala onu da vurğulayır ki, əgər onlar yenidən dünyaya qaytarılsaydılar, əvvəlki hallarından heç bir şeylə fərqlənməzdilər və onlar: "Əgər dünyaya qaytarılsaydıq, iman gətirər və təsdiq edərdik" - demələrində yalançıdırlar. Ayənin məqsədi müəyyənləşsə, düzəliş hissəciyi (idrab) olan بل - in işlədilməsi məqsədi, yəni vaxtilə gizlətdikləri şey onların qabağında dayanmasının mənası, bir az da dəqiqləşdirsək, onları: "Kaş dünyaya qaytarılardıq. Onda Rəbbimizin ayələrini yalanlamazdıq" - söyləmələrinə vadar edən amilin nə olduğu aydınlaşmış olar. Kafirlər dünyada batil əhli olmalarını, elçilərin Allah tərəfindən onlara göndərilən missiyalarında doğru söylədiklərini bilirdilər və buna da tam əmin idilər. Lakin bunu aralarında gizlədir, büruzə vermir, hətta, bunun gizli qalmasını bir-birilərinə tövsiyə edirdilər. Onları dünyaya qayıdıb iman gətirməyi arzu etmələrinə sövq edən amilin peyğəmbərlərin söylədiklərinin doğru olduğunu bilməmələri deyildir. Onlar bunu bilir və gizlədirdilər. Qiyamət günü onların batil üzərində, peyğəmbərlərin isə haqq üzərində olmaları meydana çıxacaq və bunu gizlətdiklərindən sonra əyani şəkildə görəcəklər. Əgər yenidən dünyaya qaytarılsaydılar, nəfsləri onlara iman gətirməyə icazə verməzdi və yenidən küfr edər, peyğəmbərləri və Allahın ayələrini yalanlayardılar. Onlar imanın haqq, şirkin isə batil olduğunu məhz qiyamət günü bildikləri üçün dünyaya qayıtmağı arzulamırdılar. Onlar dözə bilmədikləri əzabı görüncə bunu arzulamağa başladılar. Bu bir növ bir insanın başqa bir insana qarşı olan məhəbbətini gizlətməsinə bənzəyir. Belə ki, bu insan birini sevir, sevgisinin puç olduğunu, ondan imtina etməyin isə doğru addım olduğunu bildiyi halda onunla bərabər gün keçirir. Lakin

himayəsində olduğu şəxsin (vəlisinin) bundan xəbər tutacağı təqdirdə onun cəzalandıracağını ona söyləyirlər. O bunu bildiyi halda buna məhəl qoymur və öz sözündə inad edərək, məhəbbətinin və sevdiyi şəxslə bərabər oturub-durmasının düzgün olduğunu söyləyir. Himayəsində olan şəxs onu yaxalayıb buna görə cəzalandırmaq istədiyi və bu cəzadan tam yəqin olduğu zaman cəzasının bağışlanmasını təmənni edir və onunla bir daha görüşməyəcəyini vəd edir. Lakin qəlbində ona qarşı məhəbbət və onunla yaşamağa istək cəzanı gördükdən, hətta, cəzanı çəkdikdən sonra sevdiyi şəxslə qovuşmağa vadar edir. Cəza tətbiq olunarkan bilərək gizlətdiyi xatası və onu xəbərdarlıq edən şəxsin haqlı olduğu meydana çıxır. Əgər onun cəzası bağışlansaydı, yenə də o qadağan olunmuş işi görərdi.

İdrabın bu mənaya uyğun olduğunu düşün. Bu, kafirlərin: "Əgər yenidən dünyaya qaytarılsaydıq, iman gətirər təsdiq edərdik. Çünki peyğəmbərlərin vaxtilə dediklərinin haqq olması indi bizə məlum oldu" - söyləmələrinə rədd cavabıdır. Yəni onların söylədikləri doğru deyildir. Çünki onlar peyğəmbərlərin dediklərinin haqq olduğunu elə o vaxt da bilirdilər, lakin bunu gizlədirdilər. İndi isə bildiyiniz bir şey ortaya çıxmadı ki, onu özünüzə bəhanə gətirəsiniz. Əksinə, indi vaxtilə sizə məlum olan və gizli saxlanılmasını bir-birinizə tövsiyə etdiyiniz şey sizlərin qabağına çıxdı. Ən doğrusunu bilən isə təbii ki, Allah-taaladır.

Səbir edən yoxsul və şükür edən zəngin məsələsinin daxilində bu ayənin təfsiri haqda uzunçuluğa yol verməyimizi düşünmə. Çünki bu ayənin təfsiri əsas mövzudan daha əhəmiyyətli və daha faydalı ola bilər. Uğur Allahdandır.

Gəlin bu barədə söhbətimizə davam edək. Allah-taala buyurur: **«Xeyr, əgər** (qiyamət günü sizə nə ediləcəyini) **tam yəqinliklə bilsəydiniz** (fani dünya malına uymazdınız) **!»** (ət-Təkəsur, 5). Şərt budaq cümləsi olan bu ayənin baş cümlədən ibarət hissəsi ayədə qeyd olunmasa da, **«..., fani dünya malına uymazdınız»** - mənasını üstü-örtülü şəkildə ifadə edir. Səhihliyinə və sübutuna heç bir şübhə olmayan və bu barədə mübahisə qəbul etməyən tam yəqinliyi (yəqinlik elmi) itirdikdən sonra çoxluqla öyünmə sizi həddən artıq sizə yaxın olan şeylərdən yayındırdı. Əgər tam yəqinliyin həqiqəti qəlblərinizə çatıb ora daxil olsaydı, çoxluqla öyünməz və onun təsirinə düşməzdiniz. Çünki təkcə hər hansı bir şeyin çirkin, aqibətinin isə pis olmasını bilmək onu tərk etmək üçün kifayət deyildir. Əgər kimdəsə tam yəqinlik olarsa, bu yəqinlik o işin tərk edilməsini tələb edər.

Həssan ibn Sabit bu mənada Bədr döyüşünün iştirakçıları haqqında belə söyləmişdir: «Biz də, onlar da ölmək üçün getdik. Əgər

onlar tam yəqinliklə bunu bilsəydilər, ora getməzdilər». **«Xeyr!** (Belə yaramaz!) **Siz** (öləndən sonra bu yaramaz əməllərinizin aqibətini) **mütləq biləcəksiniz! Xeyr, xeyr!** (Belə yaramaz) **Siz** (öləndən sonra bu yaramaz əməllərinizin aqibətini) **mütləq biləcəksiniz!»** (ət-Təkəsur, 3-4). Bəzi təfsir alimləri bu ayənin onların mütləq biləcəklərinə bir təkid olduğunu söyləyirlər. Digər təfsir alimləri isə bunun təkid olmadığını, birinci bilmənin ölüm gəldiyi zaman olduğunu, ikinci bilmənin isə qəbirdə olduğunu bildirirlər. Bu Həsən əl-Bəsrinin və Müqatilin söylədikləridir. Eyni təfsiri Əta İbn Abbasdan rəvayət etmişdir. Bir neçə rəy bu təfsirin səhih olmasını göstərir.

Birincisi, kəlmənin yeni bir məna ifadə etməsi daha əsasdır. Yəni mənanın böyüklüyü və fəsahətə xələl gətirilməməsi ilə yanaşı onu əsas hesab etmək olar.

İkincisi, hər iki bilmə arasında "summə" - ثم - kəlməsinin işlədilməsi iki bilmə arasında vaxt və əhəmiyyət baxımından möhlətin olmasını bildirir.

Üçüncüsü, ikinci rəy həqiqətə uyğundur. Çünki insan öldüyü zaman üzərində olduğu yolun həqiqət ol

duğunu biləcəkdir. Sonra qəbirdə və qəbirdən sonra bunu lap yaxşı anlayacaqdır.

Dördüncüsü, Əli İbn Əbi Talib və digər sələflər ayədən qəbir əzabını anlamışlar. Tirmizi Əbu Kurəybdən, o da Həkkəm ibn Səlim ər-Razidən, o da Amr ibn Qeysdən, o da Həccac ibn Munhəl ibn Ömərdən, o da Zərdən, o da Əlidən: «ət-Təkasur surəsi nazil olana qədər qəbir əzabına şübhə edirdik» - deməsini rəvayət etmişdir.[551] Vahidi deyir: **«"Xeyr!** (Belə yaramaz!). **Siz mütləq biləcəksiniz!"** - yəni qəbirdə».

Beşincisi, ikinci rəy sonrakı **«**(Ey müşriklər! Qiyamət günü) **siz o Cəhənnəmi mütləq görəcəksiniz! Bəli, siz** (Cəhənnəmə vasil olduqdan sonra) **onu mütləq öz gözünüzlə görəcəksiniz!»** (ət-Təkəsur, 6-7) - ayələrə uyğundur. Ayədəki ikinci dəfə görmə birinci dəfə görmədən əlavədir. Çünki birinci dəfə mütləq görmədirsə, ikinci dəfə gözlə görmədir. Birinci görmə əvvəl, ikinci görmə ondan sonra olacaqdır. Sonra Allah-taala surənin sonunda nemətlər barədə sorğu-suala çəkiləcəyini vavul-qəsəm (And vavı), "ləm" və "nunus-səqilə" təkid hərfləri ilə təkidlə xəbər vermişdir. Çünki hər kəs dünyadakı nemətləri halal, yoxsa haram yollamı əldə etməsi barədə sorğu-suala çəkiləcəkdir. Əgər bu sorğu-sualdan canını qurtara bilsə, onda bu

[551] ət-Tirmizi, 3355; ət-Təbərani, "Cəmii əl-Bəyan", 30/183-184; İbn Əbi Hatim, "Təfsir", 4/582-583; ət-Tahavi, "Muşkilə əl-Əsər", 5177. Deyirəm: Tirmizinin dediyi kimi qəribdir.

nemətə görə Allah-taalaya şükür edib-etməməsi, bu nemətləri Allaha ibadətdə sərf edib-etməməsi barədə soruşulacaqdır. Birinci sorğu-sual bu neməti necə əldə etməsi, ikinci sorğu-sual isə onu hara sərf etməsi barədədir.

Tirmizi Əta İbn Əbi Rəbahdan, o da İbn Ömərdən Peyğəmbərin belə deməsini rəvayət etmişdir: «Qiyamət günü Rəbbinin hüzurunda beş şeydən sorğu-suala çəkilmədikcə Adəm oğlunun ayaqları qatlanmaz. Bunlar ömrünü nədə tükətməsi, cavanlığını nədə çürütməsi, malını haradan qazanıb hara xərcləməsi və bildiyinə necə əməl etməsi barədədir»[552].

Tirmizinin Əbu Bərzədən rəvayət etdiyi bir hədisdə isə Allahın elçisi belə buyurur: «Qiyamət günü ömrünü nədə tükətməsi, bildiyinə necə əməl etməsi və malını haradan qazanıb hara xərcləməsi barədə sorğu-suala çəkilmədikcə Adəm oğlunun ayaqları qatlanmaz»[553]. Tirmizi bu hədisin səhih olduğunu bildirmişdir. Bir hədisdə isə Tirmizi Əbu Hüreyrədən Allah elçisinin belə deməsini rəvayət edir: «Qiyamət günü qulun nemətləri barədə ilk soruşulacağı şey belə olacaqdır: "Məgər biz sənə can sağlığı vermədikmi, səni soyuq su ilə içizdirmədikmi?"»[554].

Yenə də Tirmizi Zubeyr ibn Əvvamdan belə rəvayət edir: **«Sonra da həmin gün** (Allahın dünyada sizə əta etdiyi) **nemətlər barəsində mütləq sorğu-sual olunacaqsınız!»** (ət-Təkəsur, 8) ayəsi nazil olduğu zaman Zubeyr: "Ey Allahın elçisi! Biz hansı nemətlər haqqında sorğu-sual olunacayıq? Axı bizim var-yox iki qara nemətimiz: xurmamız və suyumuz vardır" - deyə Peyğəmbərdən soruşdu. Peyğəmbər də: "Bilin ki, bu mütləq olacaqdır" - deyə cavab verdi.[555] Tirmizi hədisin həsən olduğunu söyləyir.

Tirmizinin Əbu Hüreyrədən nəql etdiyi buna bənzər rəvayətdə səhabələr: «Axı bizim var-yox iki qara nemətimiz var. Düşmən hazır, qılınclarımız isə boynumuzdadır» - dedilər. Peyğəmbər də: «Bu mütləq olacaqdır» - dedi.[556]

---

552 **Çox zəifdir**: ət-Tirmizi, 2416; əl-Bəzzar, "Müsnəd", (4/266/1435 - "əl-Bəhrul-Zəxxar"); Əbu Yəla, "Müsnəd", 9/178/5271; ət-Tabərani, "əl-Kəbir", 10/8/9772; "əs-Sağir", 648; İbn Adiy, "əl-Kamil", 2/763-764; əl-Beyhəqi, "Şuabul-İman", 2/286/1784, "əz-Zühd", 711.

553 **Zəifdir:** ət-Tirmizi, 2417; ər-Rəvyani; "Müsnəd", 2/337/1313; əd-Dərami, 1/144/537, "Əxlaq əl-Uləmə", 115; Əbu Yəla, "Müsnəd", 13/428/3434; əl-Beyhəqi, "əl-Mədxəl", 494.

554 **Səhihdir:** ət-Tirmizi, 3358; Abdullah bin Əhməd, "Zəvaid-əz-Zühd", səh. 31; İbn Hibban, 7364, əl-Hakim, 4/138; İbn Cərir, "Təfsir", 30/288; əl-Beyhəqi, "Şuabul-İman", 4287; ət-Tabərani, "əl-Əvsat", 62; əl-Bəğəvi, 14/311; və s.

555 **Həsəndir:** ət-Tirmizi, 3356; İbn Macə, 4158.

556 **Həsəndir:** ət-Tirmizi, 3357.

Peyğəmbərin «Bu mütləq olacaqdır» - deməsində nəzərdə tutulan ya nemətlərin qarşıda səhabələr üçün təzələnməsidir, ya da bu nemətlər barədə sorğu-sualın mütləq olmasıdır. Çünki bu, su və xurma da olsa, nemətdən hesab olunur. Digər bir səhih hədis də xurma ilə su barəsində sorğu-sual olunacağına dəlalət edir. Belə ki, hədisdə səhabələr Peyğəmbərlə birlikdə yaş xurma və ət yeyib, soyuq su içdikləri zaman Peyğəmbər onlara: «Bu barəsində qiyamət günü sorğu-sual olunacağınız nemətdir» - demişdir.[557] Bu sorğu-sual həmin nemət barədə şükür edib-etməməsi və onun haqqını verib-verməməsi barəsindədir.

Tirmizi Ənəsdən Peyğəmbərin belə deməsini rəvayət edir: «Qiyamət günü qul qoyun balası kimi gətiriləcək, Allahın hüzurunda dayandırılacaqdır. Allah-taala ondan: "Sənə əta etdim, səni mal-dövlət, cah-calal sahibi etdim və sənə nemətlər bəxş etdim. Bəs sən nə etdin?" - deyə soruşacaqdır. Qul da Allaha: "Ey Rəbbim! Onları topladım, yetişdirdim, əvvəlkindən də daha bol halda buraxıb gəldim. Məni yenidən dünyaya qaytar, onları Sənin yolunda xərcləyim" - deyə cavab verəcəkdir. Allah: "Onda Mənim yolumda etdiklərini göstər" - deyə əmr edəcəkdir. Qulun isə bu barədə heç bir iş görmədiyi məlum olacaq və onu Cəhənnəmə aparacaqlar»[558].

Tirmizinin Əbu Səid və Əbu Hüreyrədən Allah elçisinin belə deməsi rəvayət olunur: «Qiyamət günü qul gətiriləcək, Allah-taala ona belə deyəcəkdir: "Məgər sənə qulaq, göz, mal-dövlət və övlad vermədimmi? Mal-qara və tarlanı sənin ixtiyarına vermədimmi? Səni başçı və sərbəst insan etmədimmi? Bu günündə mənimlə görüşəcəyini heç düşündünmü?". Qul: Xeyr - deyə cavab verəcəkdir. Allah-taala ona: "Sən Məni unutduğun kimi bu gün də Mən səni unuduram" - deyəcəkdir»[559]. Tirmizi hədisin səhih olduğunu qeyd etmişdir.

Bir qrup təfsir alimləri iddia edirlər ki, bu xitab kafirlərə aiddir və onlar nemətlər barədə sorğu-sual olunacaqlar. Bu iddia Həsən əl-Bəsridən və Müqatildən nəql olunur. Vahidi də bu iddianı dəstəkləyir və Əbu Bəkrin hədisini dəlil gətirir. Belə ki, haqqında danışdığımız ayə nazil olarkən Allahın elçisi Əbu Bəkrə belə dedi: «Əbu Heysəm ibn Təhiyyənin evində səninlə birgə yediyimiz arpa çörəyi, ət, dəyməmiş xurma və içdiyimiz şirin su haqda fikrin nədir? Bunların barəsində soruşulacağımız nemətlərdən olmasından bizə görə qorxursanmı?» Sonra Allahın elçisi: «Bu sorğu-sual kafirlər

[557] Müslim, 2038.
[558] **Zəifdir:** ət-Tirmizi, 2427. Deyirəm: Tirmizinin dediyi kimi zəifdir.
[559] **Səhihdir:** ət-Tirmizi, 2428. Deyirəm: Tirmizinin dediyi kimi səhihdir.

üçündür»[560] - deyib bu ayəni oxudu: **«Biz heç nankordan başqasına cəzamı verərik?»** (əs-Səba, 17).

Vahidi belə deyir: «Ayənin görünüşü bu sözün doğru olduğunu göstərir. Çünki surə bütünlüklə müşriklərə xitab və onları təhdiddir. Məna da bu sözün doğruluğuna şahidlik edir. Belə ki, kafirlər Allaha şərik qoşub, Ondan qeyrisinə ibadət etdikləri üçün onlara verilən nemətin haqqını ödəmədilər. Ona görə də onlar məzəmmət olaraq, onlara verilmiş nemətlərdə boyunlarına düşən vacibi verib-verməmələri, nemətin haqqını zay edib-etməmələri barədə sorğu-suala çəkilməyə layiqdirlər. Sonra neməti verənin təkliyinə şükür etməyi tərk etdikləri üçün əzaba düçar olacaqlar». Bu Müqatilin söylədiklərinin mənasındadır, eyni zamanda da Həsən əl-Bəsrinin sözüdür. Çünki o da nemətlərdən yalnız Cəhənnəm əhlinin soruşulacağını demişdir.

Nə ləfzdə, nə səhih sünnədə, nə də əqli dəlillərdə bu xitabın kafirlərə aid olmasını tələb edən elə bir dəlil yoxdur. Əksinə, ləfzin görünüşü, sünnənin açıqlığı, müraciətin çoxluqla öyünərək Allahı və axirəti unudan hər kəsə aid olduğuna dəlalət edir. Müraciətin çoxluqla öyünənin bəzilərinə aid olmasının heç bir aspekti yoxdur. Buna Peyğəmbərin bu surəni oxuyarkən: «Adəm oğlu malım, malım deyir. Məgər yeyib tükətdiyindən və geyib köhnəltdiyindən başqa sənə bir şey qalırmı?!»[561] - deməsi də dəlalət edir. Hədis "Səhih Müslim"də rəvayət olunur. Çoxluqla öyünən həm müsəlman, həm də kafir ola bilər.

Həmçinin yuxarıda qeyd etdiyimiz hədislər, səhabələrin Peyğəmbərə sualı, onların bu xitabın ümumi olmasını anlamaları və: «Ey Allahın elçisi! Biz hansı nemətlər haqqında sorğu sual olunacayıq? Axı bizim var-yox iki qara nemətimiz, xurmamız və suyumuz vardır» - deməlri müraciətin ümumi olmasına dəlalət edir. Əgər xitab ümumi olmasaydı Peyğəmbər bunu səhabələrə açıqlayar və: «Bu sorğu-sualın sizə aidiyyatı yoxdur. Bu kafirlərə aiddir» - deyərdi. Səhabələr xitabın ümumi olmasını anlamışlar. Səhih hədislər də ümumiliyi göstərir. Peyğəmbər də ona nazil olan Qurandan səhabələrin xitabın ümumi olması kimi başa düşmələrini təsdiq etmişdir.[562]

Xitabın yalnız kafirlərə xas olmasını iddia edənlərin Əbu Bəkrin hədisini dəlil gətirmələrinə gəlincə, bu hədis səhih deyildir. Bu mövzuda səhih hədis həmin hədisin batil olmasını göstərir. Biz həmin

---

[560] əl-Vahidinin əsərində belə hədis görmədim. əs-Suyuti, "əd-Dərul-Mənsur", 8/618. Deyirəm: sənədi çox zəifdir, növbəti səhifədə veriləcəkdir.
[561] Müslim, 2958.
[562] 560-cı qeydə bax.

səhih hədisi olduğu kimi qeyd edirik. "Səhih Müslim"də Əbu Hüreyrədən belə rəvayət olunur: «Bir gün, yaxud bir gecə Allahın elçisi bayıra çıxdı. Birdən Əbu Bəkr və Ömərlə qarşılaşdı. Onlardan: "Bu vaxtda evdən çıxmağınızın səbəbi nədir?" - deyə soruşdu. Onlar da: "Aclıq, ey Allahın elçisi!" - deyə cavab verdilər. Peyğəmbər: "And olsun canım əlində olana ki, mən də sizin çıxdığınız səbəb ucbatından çıxmışam. Durun!" - dedi. Onlar da durdular və Peyğəmbərlə bir yerdə bir ənsarın evinə gəldilər. Kişi evdə yox idi. Zövcəsi Peyğəmbəri görüncə: "Salam, xoş gəlmisiniz" - dedi. Allahın elçisi ondan: "Filankəs haradadır?" - deyə soruşdu. Qadın da: "Bizə şirin su gətirməyə gedib" - deyə cavab verdi. Ənsar gəlib Allah elçisini və onun yoldaşlarını gördükdə: "Allaha həmd olsun! Bu gün məndən daha alicənab qonaq sahibi yoxdur" - dedi. Sonra çıxıb içində həm kal, həm quru, həm də sulu xurmalar olan bir xurma salxımı gətirdi. "Bundan nuş edin" - deyib bıçağı götürdü. Allahın elçisi ona: "Nəbadə sağmal qoyuna toxunasan!" - dedi. Lakin ev sahibi onlar üçün qoyunu kəsdi. Onlar qoyundan və həmin salxımdan yedilər, içdilər. Yeyib-içib doyduqdan sonra Allahın elçisi Əbu Bəkr və Öməro: "And olsun canım əlində olana ki, qiyamət günü bu nemətə görə soruşulacaqsınız. Sizi evlərinizdən aclıq çıxardı, bu nemət sizə qismət olmayınca da evlərinizə qayıtmadınızl" - dedi»[563].

Bu səhih hədis müraciətin təkçə kafirlərə deyil, hər kəsə aid olduğuna dəlalət edir. Həqiqət də bu xitabın təkcə kafirlərə aid olmamasını göstərir. Çünki çoxluqla öyünmənin əksər müsəlmanları Allahdan və axirətdən yayındırması həqiqətdir. Quranın xitabı ona çatan hər kəsə şamil olunur. Bu xitabın əhatə dairəsinə daxil olan ilk insanlar Allah elçisinin müasirləri olubsa, ondan sonra gələn nəsillər də bu xitabın əhatə dairəsinə daxil olmuş hesab olunurlar. Bu dinin zərurəti sayəsində məlumdur. Bu barədə mübahisə aparanın sözü sonrakı alimlər tərəfindən qəbul olunmur. Bu gün biz, bizdən öncəkilər və sonrakılar bu ayənin hökmü altına daxildirlər. **«Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi»** (əl-Bəqərə, 183). Dindən məlum olan zərurətlə səhabələrin bu ayənin hökmü altına daxil olduğu kimi bu ayəyə bənzər bütün ayələrin hökmü altına daxildirlər. **«**(Ey qafil insanlar!) **Çoxluq** (mal-dövlət, oğul-uşaq və qohum-əqraba çoxluğu) **ilə öyünmək sizi o qədər şirnikləndirdi** (başınızı o qədər qatdı) **ki,...»** (ət-Təkəsur, 1) ayəsində xitab bu sifətlə səciyyələnən hər kəsə şamil olunur. İnsanlar çoxluqla öyünmədə, Allahı və axirəti unutmaqda yalnız Allahın saya biləcəyi miqdarda dərəcəyə

[563] Müslim, 2038.

bölünürlər.

Əgər: «Möminləri çoxluqla öyünmək axirətdən yayındırmaz. Buna görə də onlar çoxluqla öyunənlərin təhdidinə daxil deyillər» — iddiası səslənsə, buna belə cavab verilir: «Bu xitabın yalnız kafirlərə aid olmasını iddia edənlərin fikridir. Onlar bu xitabın ümumi olmasını mümkün hesab etmirlər. Onlar kafirlərin təhdidə daha layiq olduğunu görüb xitabı onlara xas etmişlər». Buna cavab olaraq deyə bilərik ki, bu xitab insana insan olunduğu üçün şamil olunur. Çünki Quranın yoluna görə insan insan olduğu üçün məzəmmət olunur. Bu barədə Allah-taala buyurur: **«İnsan** (hər şeydə) **tələskəndir** (gördüyü işin aqibətini düşünməyə hövsələsi çatmaz)**»** (əl-İsra, 11), **«İnsan** (nə qədər varlı olsa da, təbiəti etibarilə) **xəsisdir!»** (əl-İsra, 100), **«İnsan öz Rəbbinə qarşı çox nankordur»** (əl-Adiyat, 6), **«Ona insan yükləndi. Həqiqətən, o çox zalım, çox cahildir.** (İnsan bu ağır əmanəti götürməklə özünə zülm etdi və cahilliyi üzündən onun çətinliyini, ağır nəticəsini bilmədi)**»** (əl-Əhzab, 72), **«Həqiqətən, insan çox nankordur»** (əl-Həcc, 66). Buna bənzər ayələr çoxdur. İnsan faydalı elm və saleh əməldən olan hər bir xeyrdən uzaqdır. Yalnız Allah-taala ona bu elmi və əməli əta edərək onu kamilləşdirir. İnsanın təbiətində bunlar yox idi. Əksinə, insanın təbiətində yalnız elmə zidd olan avamçılıq, ədalətə zidd olan haqsızlıq vardır. İnsanda olan hər bir elm, ədalət və xeyir ona təbiətindən deyil, Rəbbindəndir. Eləcə də, çoxluqla öyünmənin ona axirəti unutdurması onun təbiətindən irəli gələn xarakteridir. İnsan bundan yalnız Allahın onu təmizləməsi, axirəti sevdirməsi və axirəti dünya ilə öyünməkdən üstün tutdurması sayəsində xilas ola bilər. Əgər Allah ona bu nemətləri versə, o xilas olacaq. Əks halda dünya malının çoxluğu ilə öyünərək axirəti unutması qaçılmazdır.

Xitabın yalnız kafirlərə xas olduğunu iddia edənlərə cavab olaraq deyilir ki, axirətdə adı çəkilən təhdidi bilməkdə hər kəs ortaq olacaqdır. Bu, dünyada bilməyən hər kəsin axirətdə mütləq biləcəyi bir işdir. **«Xeyr!** (Belə yaramaz!). **Siz** (öləndən sonra bu yaramaz əməllərinizin aqibətini) **mütləq biləcəksiniz!»** (ət-Təkəsur, 3) ayəsi Cəhənnəmə daxil olmağı tələb etmirsə, orada əbədi qalmaqdan danışmaq belə olmaz. Həmçinin Cəhənnəmi görmək də onu görən hər kəsin ora daxil olmasını tələb etmir. Çünki qiyamət günü dayananların hamısı Cəhənnəmi əyani şəkildə görəcəklər. Uca və Ulu Allah istər mömin olsun, istər kafir, istər günahsız olsun, istərsə də günahkar, hər bir kəsin Cəhənnəmi görəcəyinə and içmişdir. Bu surədə xitabın ümumi olmasını inkar edən elə bir dəlil yoxdur. Nemətlərdən yalnız Cəhənnəm əhlinin sorğu-suala çəkiləcəyi barədə Həsən əl-Bəsridən nəql olunan rəvayət qətiyyən doğru deyildir. Ya

onun əleyhinədir, ya da ondandır. Açıq səhih hədislər Həsən əl-Bəsrinin iddiasını rədd edir. Uğur Allahdandır.

Şənin böyüklüyü, təhdidinin şiddətliyi, axirətdən yayındırmasının xəbərdarlığı və mənasının əksər insanlara uyğun olması ilə yanaşı bu kimi surənin əvvəldən axıra kimi yalnız kafirlərə xas olduğunu inkar etməsi gizli deyildir və bu həmin surəyə də yaraşmaz. Bunu başa düşmək üçün mərfu hədislər ətrafında düşünmək kifayət edər. Ən doğrusunu bilən isə təbii ki, Allah-taaladır.

Bütün həyatı boyu, hətta ölənə kimi çoxluqla öyünmənin başını qatdığı, çoxluqla öyünmə yuxusundan ayılmayan, əksinə çoxluqla öyünmənin qəlbini yatızdırdığı və yalnız bu yuxudan ölülər ordusuna qovuşduğu zaman ayılan kəsə şiddətli bir məzəmmətin olması barədə düşün! Bununla insanların əksəriyyətinin halı arasında uyğunluğa fikir versən, onda xitabın ümumi olmasını görmüş olarsan. Allah-taalanın məzəmməti və təhdidi öyünülən şeylə deyil, məhz öyünmə ilə əlaqələndirmişdir ki, dünyaya aid öyünmənin hər çeşidi bura daxil olsun. Bu barədə düşün. Öyünmə qarşılıqlı olduğu üçün çoxluqla öyünən hər kəs öyündüyü şeyin sayının rəqibinin öyündüyü şeyin sayından çox olduğunu istəyir. Onları buna sövq edən izzət və şərəfin çox olana aid olmasıdır. Onlardan belə deyənlər də var: «Mənim malımın sayı onlarınkından sayca çox deyildir. Çünki izzət və hörmət malı çox olana aiddir». Öyünmədən çoxlu var-dövlətə sahib olmağın heç kəsə zərəri yoxdur. Belə ki, bir qrup səhabələrin də çoxlu mal-dövləti var idi və onlar buna görə bir-biriləri ilə öyünmədikləri üçün mal-dövlətlərinin də onlara ziyanı yox idi. Dünya malı və cah-calalı ilə öyünən kəs bu öyünməsinin sayəsində axirət əhlinin öyünməsindən məhrum olar. Şərəfli, ülvi, yüksək zəhmət sabibi olan insanlar faydası davamlı, sayəsində kamilləşdikləri, təmizləndikləri və zəfərə çatdıqları işlərdə bir-biriləri ilə öyünərlər. Onlardan heç biri bu yarışmada rəqibinin ondan üstün olmasını istəməz, bunda onunla rəqabət aparar və yarışar. Budur qulun səadətə qovuşmasına aparan öyünmə! Bunun əksi isə dünya əhlinin dünya mallarında bir-biriləri qarşısında öyünməsidir. Bu öyünmə insana Allahı, axirəti unutdurar və onu azlığa, yoxsulluğa və məhrumiyyətə aparar. Axirət səadətinin səbəbləri ilə yarışmaq Allahı və Onunla qovuşmanı davamlı yada salaraq aparılan yarışdır. Bu yarışmanın aqibəti isə davamlı və tükənməyən çoxluqdur. Bu yarış iştirakçısı qeyrisini özündən söz, əməl və elm cəhətdən üstün olduğunu gördükdə narahatçılıq keçirər. Bu xeyir xislətlərinin birində başqasının özündən daha üstün olduğunu görüb onun dərəcəsinə çatmaqdan aciz qaldığı zaman bacardığı digər bir xeyirli işdə onu ötməyə çalışar.

Bu cür yarışma qınanılan və onun ixlası üçün zərərli deyildir. Əksinə, bu yarış həqiqi və xeyir yarışdır. Bu Aus və Xəzrəc qəbilələrinin Allah elçisinin qarşısında onun rizasını qazanmaq, ona yardım etmək üçün bir-biriləri ilə yarışmalarına bənzəyir. Həmçinin Ömər ilə Əbu Bəkrin yarışması da bu tip yarışmalardandır. Belə ki, Ömər yarışlarda Əbu Bəkrin onu keçdiyini görüncə: «Allaha and olsun ki, mən bir daha səninlə heç bir şeydə yarışa girməyəcəyəm» - demişdir.[564]

## Fəsil

Bu mövzuda كلا inkar ədatının necə də yerində işlədilməsinə fikir ver! Çünki bu ədat onların çoxluqla öyünməsinə maneəni, izzətin, kamilliyin çoxluqla öyünməkdə olmasına ümid edənlərin ümidlərinin puç olmasını və həm qadağanı, həm də inkarı özündə ehtiva edir. Allah-taala onlara çoxluqla öyünmələrinin aqibətini mütləq biləcəklərini, axirəti onlara unutduran dünya malı ilə öyünənlərin diyarının hara olacağını mütləq görəcəklərini və öyündükləri mal-dövlətlərini haradan alıb hara xərclədikləri barədə mütləq sorğu-suala çəkiləcəklərini xəbər vermişdir.

ət-Təkasur surəsi son dərəcə qısalığı, sözlərinin rəvanlığı, nəzminin gözəlliyi ilə yanaşı böyük faydalı, nəsihətamiz, dünyadan sapındıran, axirətə təşviq edən bir surədir. Ulu Allah bu surə vasitəsi ilə haqqı söyləmiş, elçisi Məhəmməd isə vəhy yolu ilə onu təbliğ etmişdir.

## Fəsil

Düşün, gör necə Allah-taala hər bir insanı sonda çatacağı yerdə əbədi sakin deyil, ziyarət etmişdir. İnsanlar qəbirlərdə bir müddət saxlanıldıqdan sonra oradan da bərqərar diyarına gedəcəklər. İnsanlar son çatacaqları yerdə, yəni qəbirlərdə necə ziyarətçi kimi olmaya bilərlər?! Axı onlar bu dünyada ziyarət yerinə, oradan da əbədi qərar tutulan yerə gedən yolçulardır. Buradan da insanların üç mərhələdə keçdikləri məlum olur. Dünyada yolçulardır, bu səfərin sonu qəbirlərdir. Qəbirlərdən sonra isə əbədi qərar diyarıdır.

## Fəsil

[564] Əbu Davud, 1678; Əhməd, 1/25-26; əd-Darami, 1/391-392.

Yenidən əvvəlki diskussiyamıza qayıdaq. Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər bildirirlər ki, Allah-taala dostlarını dünyadan qorumuş, onları şərəfləndirmək, dünyanın pisliklərindən təmizləmək və onun alçaqlıqlarından uzaq tutmaq üçün dünyanı onlara rəva bilməmişdir. Həmçinin Allah dünyanı onlara məzəmmət etmiş və dünyanın Öz dərgahında qədir-qiymətsiz olduğunu xəbər vermişdir. Dünya malının fitnə, yer üzündə azğınçılıq və fəsadın səbəbi olduğunu, çoxluqla öyünmənin axirəti unutdurmasını və dünya malının aldadıcı bir mülk olmasını Allah-taala dostlarına bildirmiş, onu sevib axirətdən üstün tutanları məzəmmət etmiş, dünyanı, onun zinətini və tarlasını istəyənlərin axirət nəsibindən məhrum olacaqlarını, zənginliyin hörmət və məhəbbət deyil, fitnə və bəla olduğunu, dünya əhlinə dünya malını bəxş etməyin onların xeyir işlərdə yarışmalarına kömək üçün olmadığını, dünya malının Allaha yaxınlaşdıran bir vəsilə olmadığını vurğulamışdır. İnsanların dalbadal küfrə uğraması olmasaydı, kafirlərə islədiklərindən də artıq mal-dövlət verəcəyini, hətta evlərinin tavanlarını, qapılarını, nərdivanlarını, çarpayılarını gümüşdən edəcəyini, dünyanı axirətdə nəsibləri olmayan düşmənləri və ağıldan zəif olanlar üçün bəzədiyini xəbər vermişdir.

Elçisinə dünyaya və dünya əhlinin ləzzət aldıqları şeylərə göz tikməyi qadağan etmiş, dünyadakı yaxşılıqları aparanları və onlardan ləzzət alanları məzəmmət edərək peyğəmbərinə belə demişdir: **«**(Ya Rəsulum!) **Qoy** (kafirlər) **hələ** (istədikləri kimi) **yeyib içsinlər,** (dünyadan) **ləzzət alsınlar, arzuları-ümidləri başlarını qatsın.** (Düçar olacaqları müsibəti) **sonra biləcəklər!»** (əl-Hicr, 3). Bu ayədə Allah-taalanın dostlarını dünyadan ləzzət almaqdan, dünyada acgözlükdən çəkindirməsinin bir təsəllisi vardır. Həmçinin ayədə dünya malının verildiyi adamın azmaması, nəfsinin cilovunu istəklərinin əlinə verməməsi, dünya malından kef-damaq üçün istifadə etməməsi üçün bir tərbiyə və ibrət vardır. Allah-taala dünyanı sevərək onunla fəxr edib öyünənləri, fəzilətin və hörmətin mal-dövlətdə olmasını zənn edənləri məzəmmət etmiş, onları yalanlamış və həqiqətin onların dediyi və xəyal etdiyi kimi olmadığını bildirmişdir. Dünyanı qullarına tanıtmış, ağıl sahiblərini dünyada zahidliyə, ona inanmamağa və meyl göstərməməyə çağıran misallarla vəsf etmişdir. Allah-taala dünyanın surətini, həqiqətini aşağıdakı misalla qullarının qəlbində yerləşdirmişdir. «Dünya göydən düşən yağışa bənzər ki, yerin bitkiləri bu yağışla bir-birinə qarışıb yetişər. Yer özü bəzənib müxtəlif növ bitkilərlə süsləndiyi zaman Allahın əmri ilə bəla gələr, həmin süslənmə dönüb küləyin sovurduğu quru

çör-çöp olar və yer sanki heç vaxt üzərində heç bir şey olmamış bir hala gələr».

Allah-taala dünyanın faniliyindən, sürətlə keçməsindən, qulun axirəti gördüyü zaman dünyada sanki günün bir saatını, yaxud bir gün, yaxud da günün bir hissəsini qaldığını düşünəcəyini xəbər vermiş, qullarına dünyaya aldanmağı qadağan etmiş, əyləncənin, oyunun, bər-bəzəyin, fəxr etmənin, öyünmənin, mal-dövlətin aldadıcı, axirətə keçid və təcili olub əbədi olmadığını bildirmişdir. Allah heç vaxt dünya aşiqini müsbət hal kimi qeyd etməmiş, əksinə onu həmişə məzəmmət etmişdir. Bildirmişdir ki, dünya aşiqi Allahın istəyinə müxalifdir və Allah bir şeyi istəyir, dünya aşiqi isə onun əksini diləyir. Bununla da o, öz istəyi ilə Allahın istəyinə qarşı çıxır. Bu onun Allahdan uzaq olması üçün kifayətdir. Allah-taala Cəhənnəm əhli haqqında xəbər verərək onların Cəhənnəmə dünyaya aldandıqlarına və onu arzuladıqlarına görə girəcəklərini bildirir.

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, bütün bunlar insanları dünyada zahidliyə çağırır, eyni zamanda da imkan daxilində bu dünyadan aza qane olmağa təşviq edir. Allah-taala qullarının ən sevimlisi və ən hörmətlisi olan qulu və elçisi Məhəmmədə dünya xəzinələrinin açarlarını ərz etdisə də, o bunu istəmədi və seçmədi. Əgər onu üstün tutub istəsəydi belə, şübhəsiz ki, gordüklərinə qarşı ən çox şükür edən insan olardı və qəti şəkildə də onun hamısını Allah rizası üçün Onun yolunda sərf edərdi. Lakin o dünyada aza qane oldu və yaşayışının ağırlığına səbir etdi.

İmam Əhməd İsmayıl ibn Məhəmməddən, o da İbn Ubaddan, o da Mucalid ibn Səiddən, o da Şəbidən, o da Məsruqdan, o da Aişədən belə deməsini rəvayət etmişdir: «Ənsarlardan olan bir qadın mənim yanıma gəldi, Allah elçisinin döşəyinin iki qat əbadan ibarət olduğunu görüncə evinə qayıtdı və mənə içi yun olan döşək göndərdi. Sonra Allahın elçisi yanıma gəldi. "Bu nədir?" — deyə soruşdu. Mən də: "Ənsarlardan olan filan qadın yanıma gəlmişdi. Sənin döşəyini görüb bunu mənə göndərdi" - deyə cavab verdim. Peyğəmbər: "Onu geri göndər" - dedi. Mən isə onu geri göndərmədim. Çünki o döşəyin evimdə olması xoşuma gəlirdi. Peyğəmbər bu sozü üç dəfə təkrarladıqdan sonra: "Ey Aişə! Onu geri qaytar. Allaha and olsun ki, əgər istəsəm, Allah-taala mənimlə yanaşı qızıl və gümüş dağları gəzdirərdi" — buyurdu»[565].

Allah elçisinə dünya xəzinələrinin açarları təklif olundu, lakin onları qəbul etməyib: «Xeyr, ey Allahım! Bir gün ac, bir gün tox oluram. Acdığım zaman Sənə yalvarır və Səni zikr edirəm. Tox

[565] Çıxarışı yuxarıda verilib.

olduğum vaxt isə Sənə həmd və şükürlər edirəm»[566] - demiş və Allahdan ailəsinin ruzisini kifayət qədər etməsini diləmişdir.

Buxari və Müslim Əbu Hüreyrədən Allah elçisinin belə dua etməsini rəvayət etmişlər: «Allahım! Məhəmmədin ailəsinin ruzisini yetəcək qədər ver».[567]

Yenə də Buxari və Müslim Əbu Hüreyrədən belə deməsini rəvayət etmişlər: «Əbu Hüreyrənin canı əlində olan Allaha and olsun ki, dünyadan köçənədək Allahın peyğəmbəri və onun ailəsi üç gün dalbadal buğda çörəyindən doyaraq yeməmişlər».[568]

Buxari Ənəsdən belə deməsini rəvayət etmişdir: «Mən Allah elçisinin Allahına qovuşanadək nə yumşaq çörək, nə də qoyun kababını gördüyünü bilmirəm».[569]

Yenə Buxari Əbu Hüreyrədən belə deməsini rəvayət etmişdir: «Allahın elçisi arpa çörəyindən doymadan dünyadan getdi».[570]

Yenə də Buxari və Müslim Aişədən belə deməsini rəvayət etmişlər: «Məhəmmədin ailəsi Mədinəyə gələndən ölənə kimi dalbadal üç gecə buğda yeməyindən doya-doya yeməmişdir».[571]

Müslim Ömərdən belə deməsini rəvayət etmişdir: «Mən Allah elçisinin bir gün ərzində mədəsini doyurması üçün köhnə quru xurma belə tapa bilmədiyinin şahidi olmuşam».[572]

Əhməd və Tirmizi İbn Abbasdan (Allah ondan və atasından razı olsun!) bele deməsini rəvayət etmişdir: «Allahın elçisi və ailəsi şam yeməyi tapa bilməyib üç gecə dalbadal ac yatarlardı. Çox vaxt yedikləri isə arpa çörəyi idi».[573] Tirmizi hədisin həsən səhih olduğunu deyir.

Yenə Tirmizi Əbu Ümamədən belə deməsini rəvayət etmişdir: «Allah elçisinin süfrəsindən arpa çörəyi artıq qalmazdı».[574]

İmam Əhməddən rəvayət olunur ki, Aişə: «Məhəmmədi haqla göndərən Allaha and olsun ki, uca və böyük Allah ona peyğəmbərlik verəndən canını alana qədər nə ələk görmüş, nə də ələnmiş undan bişirilmiş çörəh yemişdir» — dedi. Urva: «Mən Aişədən: "Bəs arpanı necə yeyirdiniz?" - deyə soruşdum. O: "Uff deyirdik (Yəni qabığı təmizləmək üçün arpaya üfürürdü). Havaya sovrulan sovrulurdu,

---

566 Çıxarışı yuxarıda verilib.
567 Çıxarışı yuxarıda verilib.
568 əl-Buxari, 5414; Müslim, 2947.
569 əl-Buxari, 5421.
570 əl-Buxari, 5414.
571 əl-Buxari, 5416; Müslim, 2970.
572 Müslim, 2978.
573 **Həsəndir:** ət-Tirmizi, 2360; İbn Macə, 3347; Əhməd, 1/255.
574 **Səhihdir:** ət-Tirmizi, 2359; Əhməd, 1/253, 260, 267; İbn Sad, "ət-Tabaqatul-Kubra", 1/401.

qalanını isə xəmir yoğururduq" — deyə cavab verdi».[575]

Buxari Ənəsdən onun belə deməsini rəvayət etmişdir: «Allahın elçisi arpaya zirehini girov qoymuşdur. Mən onun: "Məhəmməd ailəsi nə bir saa[576] ilə sabahladı, nə də axşamladı" - deməsini eşitdim. Dogrudan da Məhəmməd ailəsi doqquz ev idi».[577]

Haris "Müsnəd"ində Əbu Üsamədən, o da Ənəsdən rəvayət edir ki, Fatimə Peyğəmbərə bir tikə çörək gətirdi. Peyğəmbər də öz növbəsində: «Ey Fatimə! Bu bir tikə çörək nədir?» - deyə soruşdu. Falimə də: «Bir qoğal bişirdim. Ürəyim dayanmadı, bir parçasını da sənə gətirdim» - deyə cavab verdi. Peyğəmbər ona: «Bil ki, bu, üç gündən bəri atanın ağzına girən ilk yeməkdir» - dedi.[578]

İmam Əhməd Vəkidən, o da Abdulvahid ibn Əyməndən, o da atasından, o da Cabirdən belə deməsini rəvayət etmişdir: «Allahın elçisi səhabələri ilə birlikdə xəndək qazarkən onları möhkəm yorğunluq basmış, hətta Peyğəmbər aclıqdan qarnına daş bağlamışdı».[579]

Əbu Hatim ibn Hibban özünün "Təqasim" adlı kitabında bu hədisi qəti şəkildə rədd etmiş və onu qəbul etməməsini: «Məhəmməd Mustafa Allahı yanında bundan da daha hörmətli bir quldur» - deyə izah etmişdir.

Bu Əbu Hatimin yalnış fikirlərindəndir. Bu hədisdə Peyğembərin Allah dərgahındakı dərəcəsini naqis gətirə biləcək bir şey yoxdur. Əksinə, bu hədis Peyğəmbərin Allah yanındakı dərəcəsinin daha yüksək olmasının ifadəsidir və ondan sonra gələn xəlifələr, hökmdarlar və digərləri üçün bir ibrətdir. Sanki Əbu Hatim Peyğəmbərin yaşayışı barədə gələn digər hədislərə fikir verməmişdir. Məgər bu hədis Allah elçisinin doğru olmasının ən böyük şahidlərindən deyilmi?! Əgər Peyğəmbər özünün və Allahın düşmənlərinin dediyi kimi mülk və dünyanı istəyən hökmdar olsaydı, onda Allah elçisinin yaşayışı onların yaşayışı, həyatı da onların həyatı kimi olardı. Peyğəmbər vəfat edərkən onun zirehi bir yəhudinin yanında ailəsi üçün götürdüyü yeməyə girov qalmışdı. Allah-taala ona ərəb ölkələrinin fəthlərini nəsib etdiyinə və onun hüzuruna qənimət və vergilər gətirildiyinə baxmayaraq, ölərkən özündən sonra miras olaraq nə bir dinar, nə bir dirhəm, nə bir qoyun, nə bir dəvə, nə bir

---

[575] **Zəifdir:** Əhməd, 6/71; əl-Heysəmi, "əl-Mucəmmə", 10/312.

[576] "saa"- həcmi 2,0-2.5 kq buğda və s. kimi qida məhsulu tutan ölçü qabıdır.

[577] əl-Buxari, 2508

[578] **Zəifdir:** əl-Beyhəqi "Şuabul-İman", 7/315/10430.

[579] **Səhihdir:** Əhməd, 3/3014 əl-Beyhəqi, "Dəlail ən-Nubuvvə", 3/422; Əbu Yəla, "əl-Müsnəd", 8/2004; əl-Heysəmi, "Məcmuə əz-Zəvaid", 10/314; əl-Albani, "əs-Səhih", 1615.

kölə, nə də bir kəniz buraxmışdır.

İmam Əhməd Hüseyn ibn Məhəmməd ibn Mütrifdən, o da Əbu Hazimdən, o da Urvadan belə deməsini rəvayət etmişdir: «Mən Aişənin: "Üstümüzdən aylar keçərdi, Allah elçisinin əhli beytin evlərinin heç birində od qalanmazdı" — deməsini eşitdim. Mən: "Ay xalal Bəs siz nə ilə dolanırdınız?" - deyə soruşdum. Aişə də: «İki qaralarla, yəni xurma və su ilə» - deyə cavab verdi».[580]

Əbu Hüreyrənin Əbu Heysəm ibn Təyyhən haqqında rəvayət etdiyi hədisdə də yuxarıda qeyd edildi ki, Allahın elçisi evdən çıxdı, birdən Əbu Bəkr və Öməri gördü. Onlardan: "Bu vaxtda evdən çıxmağınızın səbəbi nədir?" - deyə soruşdu. Onlar da: "Aclıq, ey Allahın elçisi!" - deyə cavab verdilər. Peyğəmbər: "And olsun canım əlində olana ki, mən də sizin çıxdığınız səbəb ucbatından çıxmışam"- dedi.

Əhməd Məsruqdan onun belə deməsini rəvayət etmişdir: «Aişənin yanına girdim. Məni yeməyə qonaq etdi və: "Yeməkdən doyunca yeyə bilmirəm. Ağlamaq istədikdə ağlayıram" - dedi. "Niyə" - deyə soruşdum. Aişə: "Allah elçisinin dünyadan köçərkən düşdüyü halı xatırlayıram. Allaha and olsun ki, Allahın elçisi ölənə kimi bir gündə iki dəfə buğda çörəyindən doyunca yeyə bilməmişdi" — deyə cavab verdi».[581]

İmam Əhmədin Aişədən rəvayət etdiyi başqa bir hədisdə isə Aişə belə buyurur: «Allahın elçisi ölənə kimi iki gün dalbadal arpa çörəyindən doyunca yeyə bilməmişdi».[582] Hər iki hədis səhihdir.

Yenə də İmam Əhməd Aişədən belə deməsini rəvayət edir: «Məhəmmədin ailəsi Uca və böyük Allaha qovuşanadək üç gün yağlı çörəkdən doya-doya yeməmişdir».[583]

Buxari və Müslim Əbu Hüreyrədən onun belə deməsini rəvayət etmişlər: «Allahın elçisi və ailəsi dünyadan köçənə qədər üç gün dalbadal buğda çörəyindən doyunca yeyə bilməmişdir».[584]

Tirmizi İbn Abbasdan (Allah ondan və atasından razı olsun!) belə deməsini rəvayət etmişdir: «Peyğəmbər və ailəsi şam yeməyi tapa bilməyib gecələr ac yatarlardı. Çox vaxt yedikləri isə arpa çörəyi idi».[585]

Yenə də Tirmizi Ənəsdən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Allah rizası üçün heç kəsin qorxudulmağı şəkildə

---

[580] **Səhihdir:** Əhməd, 6/71; əl-Beyhəqi, "Şuabul-İman", 10424.
[581] **Zəifdir:** ət-Tirmizi, 2356; İbn Əbi əd-Dünya, "əl-Cu'u", 5.
[582] Müslim, 2970(22).
[583] əl-Buxari, 6687.
[584] əl-Buxari, 5414; Müslim, 2947. Ləfz Müslimindir.
[585] Çıxarışı yuxarıda verilib.

qorxuduldum, Allah rizası üçün heç kəsin əziyyət görmədiyi tərzdə əziyyət gördüm. Otuz gün nə mənim, nə də Bilalın qoltuğunun altında saxladığı az miqdar yeməkdən başqa canlının yeyə biləcəyi yemək yox idi»[586]. Hər iki hədis səhihdir.

Yenə də Tirmizi Ənəs ibn Malikdən Əbu Təlhanın belə deməsini rəvayət etmişdir: «Aclıqdan Allah elçisinə şikayət etdik. Hamımız qarnımızdan bir-bir daşı qaldırdıq, Allahın elçisi qarnından iki daş qaldırdı» .[587]

Yenə də Tirmizi Əlqamədən, o da Abdullah ibn Məsuddan belə deməsini rəvayət etmişdir: «Allahın elçisi həsirin üzərində yatmışdı. Yuxudan durdu. Böyründə həsirin izi qalmışdı. Biz: "Ey Allahın elçisi! Bəlkə sənin üçün yataq açaq?" - dedik. O da öz növbəsində: "Mənim dünya ilə nə işim var. Mən bu dünyada ağac altında kölgələndikdən sonra durub gedən bir yolçu kimiyəm " - deyə cavab verdi»[588]. Hədis səhihdir.

Yenə də Tirmizi Əlidən belə deməsini rəvayət etmişdir: «Bir qış günü Allahın elçisinin evindən çıxdım. İylənmiş bir dəri götürüb ortasını kəsdim və boynuma keçirdim, xurma yarpağı ilə belimi bağladım. Yaman bərk acmışdım. Əgər Allah elçisinin evində yemək olsaydı, yeyərdim. Yemək axtarmağa çıxdım. Bu arada çarxlı su quyusundan su çıxarıb heyvanlarını sulayan bir yəhudinin yanından keçdim. Divardakı dəlikdən ona baxdım. Heyvanların sahibi: "Ey Bədəvi! Quyudan çəkəcəyin hər vedrəyə qarşılıq bir xurmaya razısanmı?" - dedi. Mən də razı olduğumu bildirdim və: "Qapını aç içəri girim" - dedim. Qapını açdı və mən içəri daxil oldum. Vedrəsini mənə verdi. Hər dəfə vedrəni çıxartdıqca mənə bir xurma verirdi. Nəhayət ovcum doldu. "Bu mənə bəsdir" – deyib vedrəsini özünə qaytardım. Xurmaları yedim, udum-udum su içdim, sonra məscidə gəldim. Allah elçisini orada tapdım».[589]

Səd İbn Əbi Vəqqasdan belə deməsi rəvayət olunur: «Allah elçisi ilə birlikdə döyüşərkən tikanlı çaqqal gavalısı və Səmur adlı ağacdan başqa yeməyə heç bir şeyimiz yox idi».[590] Hədis səhihdir.

Peyğəmbər hərdən gecələr namaz qılarkən əynindəki yun paltarın bir hissəsi onun, bir hissəsi də Aişənin üzərində olardı[591]. Həsən əl-Bəsri bu paltarın qiymətinin altı-yeddi dirhəm olduğunu

[586] Çıxarışı yuxarıda verilib. Orijinalına 82-ci səhifəsinə bax, qeyd 43.
[587] **Zəif münkərdir:** ət-Tirmizi, 2371; əl-Beyhəqi, "Şuabul-İman", 10428.
[588] Çıxarışı yuxarıda verilib.
[589] **Zəifdir**: ət-Tirmizi, 2473.
[590] əl-Buxari, 6453; Müslim, 2966.
[591] **Həsəndir**: ət-Tabərani, "əl-Əvsat", 5695; əl-Heysəmi. "Məcmuə əz-Zəvaid", 2/50.

söyləyir.

Əhməd Əbu Səiddən, o da Əbu Zəiddən, o da Ətadan, o da atasından, o da Əlidən belə deməsini rəvayət etmişdir: «Allahın elçisi Fatiməyə cehiz olaraq bir qalın paltar, bir tuluq[592] və bir də içi lif olan aşılanmış dəridən hazırlanmış yastıq vermişdi».

Yenə də Əhməd Bəhz ibn Əsəddən, o da Süleyman ibn Muğirədən, o da Hümeyddən, o da Əbu Burdədən belə deməsi rəvayət olunur: «Aişənin yanına gəldim. O bizə Yəməndə hazırlanmış qalın izar və bundan hazırlanmış muləbbədə[593] adlı bir paltar göstərdi və: "Allahın elçisi bu iki paltarın içində can verdi" - dedi».[594]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, əgər şükürlə qoşa gələn zənginlik səbirlə qoşa gələn yoxsulluqdan üstün olsaydı, Allahın elçisi ona dünya təklif olunarkən onu seçər və Rəbbi ona elmin artırılmasını diləməyi əmr etdiyi kimi, ondan zənginliyi də diləməyi əmr edərdi. Allahın elçisi Allahın onun üçün seçmiş olduğundan qeyrisini seçmədi və Allah da elçisi üçün ən ustün olanını seçdi. Belə ki, Allahın elçisi məxluqatın ən üslünü və ən kamilidir. Allahın elçisi ən yaxşı ruzinin qula çatacaq qədər olanı, onu zərərli olana möhtac etməyəni və onu azdırıb Allahdan və axirətdən yayındırmayanı olduğunu xəbər vermişdir.

İmam Əhməd İbn Mehdidən, o da Həmmamdan, o da Qətadadan, o da Xəlid əl-Asridən, o da Əbu Dərdadan Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Hər dəfə günəş doğarkən onun hər iki tərəfində iki mələk göndərilir. Bu iki mələk: "Ey insanlar! Rəbbinizə doğru gəlin! Həqiqətən, az və yetəcək qədər ruzi çox və baş qatan ruzidən daha xeyirlidir" - deyə səslənərək səslərini cin və insanlardan başqa bütün yer üzündəkilərə eşitdirirlər. Hər dəfə də gün batarkən onun hər iki tərəfində iki mələk göndərilir. Bu iki mələk: "Allahım! Xeyir yolunda xərcləyənin malının əvəzini ver. Xərcləməyənin isə malını tələf et" - deyə dua edərək dualarını cin və insanlardan başqa bütün yer üzündəkilərə eşitdirirlər».[595]

İmam Əhməd Vəkidən, o da Üsamə ibn Zeyddən, o da Məhəmməd ibn Əbdürrəhmandan, o da Əbu Ləbibədən, o da Səd ibn Malikdən Allahın elçisinin belə deməsini rəvayət etmişdir: «Ən yaxşı ruzi kifayət qədər olandır və ən yaxşı zikr gizli edilləndir».[596]

Bu hədisdə qəlb ruzisi ilə bədən ruzisinin, dünya ruzisi ilə

---

[592] Dəridən hazırlanmış qab.

[593] Keçədən hazırlanmış çiyin örtüyü.

[594] Əhməd, 6/32, 131; Başqa yolla əl-Buxari, 5818; Müslim, 2080.

[595] **Səhihdir:** Əhməd, 5/197; "əz-Zühd", səh.19; əl-Hakim, 2/444-445; İbn Hibban, 476 və s.

[596] **Zəifdir:** Əhməd. 1/172, 178, 180; "əz-Zühd", səh. 10; İbn Hibban 809.

axirət ruzisinin birləşdirilməsi, hər iki ruzinin ən yaxşısının kifayət qədər olması xəbər verilmişdir. Zikrin kifayət qədər olması onun gizli edilməsidir. Əgər zikir gizli deyil, uca səslə edilərsə, zikr edənin riyakarlıq və bununla qafil insanlar yanında təkəbbürlü olması təhlükəsi yaranır. Həmçinin bədən ruzisi də kifayət qədərdən artıq olarsa, onun sahibinin yolunu azması və çoxluqla öyünmə təhlükəsi meydana gəlir. Buna diqqətlə fikir ver! Belə ki, Allahın elçisi zənginə deyil, dünya malından aza qane olana qibtə etmişdir.

İmam Əhməd Vəkidən, o da Əli ibn Salehdən, o da Əbu Muhlibdən, o da Ubeydullah ibn Zöhrdən, o da Əli ibn Yeziddən, o da Qasımdan, o da Əbu Ümamədən Allahın elçisinin belə deməsini rəvayət etmişdir: «Həqiqətən, Mənim dərgahımda dostlarımın qibtə olunmağa ən çox layiq olanı az külfətlisi, namazdan payını götürmüş, Allaha ən yaxşı ibadət edən, insanlar arasında barmaqla göstərilən yox, tanınmamış olan, ölümü tez, irsi və arxasından ağlayanı az olan mömindir».[597] Abdullah ibn Əhməd demişdir: «Mən atamdan onun irsin nə olduğunu soruşdum. O da miras olduğunu bildirdi».

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, Allah-taalanın mömin qulunu dünyadan qoruması ona olan sevgisindən və hörmətindən irəli gəlir.

İmam Əhməd Əbu Səiddən, o da Süleyman ibn Bilaldan, o da Amr İbn Əbi Amrdan, o da Asim ibn Amr ibn Qətadədən, o da Mahmud ibn Ləbiddən, Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Siz xəstələrinizi vəziyyətlərinin ağırlaşmasından qorxaraq yemək-içməkdən qoruduğunuz kimi Uca və ulu Allah da sevdiyi mömin qulunu dünyadan qoruyur».[598]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, Allah-taala tərəfindən insana verilən dünya malı Allahın ona sevgisi və hörməti deyil, istidracdır.[599]

İmam Əhməd ibn Qeylandan, o da Rüşd ibn Səddən, o da Hərmələ ibn Hirman Səcibidən, o da Uqba ibn Müslimdən, o da Uqba ibn Amirdən rəvayət edir ki, Peyğəmbər: «Böyük günahlar edən qula Allahın dünya malından verməsini gördüyün zaman bunun Allahın ona olan sevgisi deyil, istidrac olduğunu bil!» - dedi, sonra isə: **«**(Kafirlərə) **edilmiş xəbərdarlığı unutduqları zaman** (küfrlərini daha da artırmaq məqsədilə) **hər şeyin** (bütün nemətlərin)

[597] **Çox zəifdir:** ət-Tirmizi, 2347; Əhməd, əl-Müsnəd, 5/252-255; "əz-Zühd", səh. 11; ət-Təyalisi, 2/42; ət-Tabərani, 7829, 7860; əl-Hakim, 4/123; və s.
[598] **Səhihdir**: ət-Tirmizi, 2036; Əhməd, "əz-Zühd", səh. 17; əl-Hakim, 4/207, 209; İbn Hibban, 669.
[599] Tədriclə həlaka yaxınlaşdırma.

**qapılarını onların üzünə açdıq»** (əl-Ənam, 44) ayəsini oxudu[600].

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, Allah-taala dünyanın dərgahında dəyərsiz olduğuna görə əksər dostlarını yə sevdiyi insanları ondan uzaq tutmuşdur.

İmam Əhməd Müaviyədən, o da Əmaşdan, o da Səlim ibn Əbi Cəddən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Ümmətimdən elə insanlar var ki, gəlib sizlərdən birinin qapısını döyüb dinar istəsə, verməzsiniz, fils[601] istəsə, yenə verməzsiniz. Əgər Allah-taaladan Cənnəti istəsə, mütləq Allah Cənnəti ona verər. Allahdan dünyanı istəsə, Allah onu verməz. Allahın dünyanı ona verməməsi onun Allah yanında qiymətsiz olduğundan deyildir. Bu pal-paltarı köhnə və nüfuzsuz bir insandır. Əgər bu insan hər hansı bir şey üzərinə Allaha and içərsə, Allah-taala onun andını mütləq həyata keçirər» .[602]

Bu hədis həmin insanın Allah yanında qiymətsiz olduğuna görə yox, dünyanın Allah yanında qiymətsiz olduğuna görə Allahın dünyanı ona verməməsinə dəlalət edir. Buna görə də Allah-taala ona dünyadan daha üstün və daha böyük olanını vermişdir. Allah-taala dünyanı həm sevdiyinə, həm də sevmədiyinə vermiş, axirəti isə yalnız sevdiyi qullarına verəcəkdir. Peyğəmbər xəbər vermişdir ki, insanların dərəcə baxımından ona yaxın olanı dünya malından azına qane olanıdır.

İmam Əhməd Yezid ibn Harundan, o da Məhəmməd ibn Amrdan, o da Arak ibn Malikdən rəvayət edir ki, Əbu Zər belə demişdir: «Mən qiyamət günü dərəcə baxımından Allah elçisinə sizdən daha yaxın olacağam. Çünki mən onun: "Qiyamət günü mənə ən yaxın olanınız dünyadan mənim onu qoyub gəldiyim halda köçəndir"[603] - deməsini eşitmişəm. Allaha and olsun ki, aranızda məndən başqa elə bir adam tapılmaz ki, dünya malından hansısa bir şeydən sallanmasın».

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, Peyğəmbər yaşayışı kifayət qədər olana qibtə etmiş və onun zəfərə qovuşacağını xəbər vermişdir.

İmam Əhməd Abdullah ibn Yeziddən, o da Heyvadan, o da Əbu

---

600 **Səhihdir**: Əhməd, 4/245; "əz-Zühd", səh. 12; əl-Tabərani, "əl-Kəbir", 913; "əl-Əvsat", 9472; İbn Əbi əd-Dünya, "əş-Şukur", 32; əl-Beyhəqi, "Şuabul-İman", 4220; əl-"Əsma vəs-Sifət", 1021; İbn Cərir, "ət-Təfsir", 7/195; və s.

601 Pul vahidi.

602 **Zəifdir**: Əhməd, "əz-Zühd", səh. 18; İbn Əbi əd-Dünya, "ət-Tavadi", 7548; əl-Beyhəqi, "Şuabul-İman", 10447; əl-Heysəmi, "Məcmuə əz-Zəvaid", 10/264.

603 **Zəifdir**: Əhməd, 5/165; "əz-Zühd", səh. 183-184; Əbu Nəim, "Hilyətul-Övliya", 1/161; əl-Beyhəqi, "Şuabul-İman", 10405; və s.

Hanidən, o da Əbu Əli əl-Cənubidən, o da Fədalə ibn Ubeyddən Allah elçisinin belə deməsini eşitmişdir: «Müsəlman olub yetəcək qədər yaşayışı olan və buna qane olan insan necə də xoşbəxtdir».[604]

Müslim Abdullah ibn Ömərdən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Müsəlman olub yetəcək qədər ruzisi olan və Allahın verdiyinə qənaət edən kəs nicat tapmışdır».[605]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, əgər yoxsulluqda yüngül haqq-hesabdan başqa bir şey olmasaydı, bu da yoxsulluğun zənginlikdən üstün olmasına kifayət edərdi.

Abdullah ibn İmam Əhməd Bəyan ibn Həkəmdən, o da Məhəmməd ibn Hatəmdən, o da Buşr ibn Harisdən, o da İsa ibn Yunisdən, o da Hişamdan, o da Həsən əl-Bəsridən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Üç şey vardır ki, qul onlara görə haqq-hesaba çəkilməz. Birincisi, kölgələnəcəyi daxmaya görə, ikincisi, belini tuta biləcəyi qədər çörəyə görə, üçüncüsü də övrətini örtəcək paltara görə».[606]

İmam Əhməd Səyyardan, o da Cəfərdən, o da Leysdən, o da Əbu Osmandan belə deməsini rəvayət etmişdir: «Müsəlmanlar Cucini fəth etdikləri zaman orada gəzirdilər. Oradakı yemək yığınları insana dağları xatırladırdı. Bu arada bir nəfər Salman əl-Farisinin yanıyla gəzərək: "Ey Əbu Abdullah! Gör Allah bizə nə fəthlər nəsib edib, gör Allah bizə nələr verib!" - dedi. Salman da ona: "Gördüklərindən sənin xoşuna gələn nədir? Gördüyün hər bir dənəyə görə haqq-hesab vardır" — deyə cavab verdi».[607]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, Peyğəmbər səhabələrinə yoxsulluq və ehtiyac içində yaşadıqları günlərin zənginlik və bolluq günlərindən daha xeyirli olmasına şəhadət vermişdir.

İmam Əhməd Abdussaməd Əbul-Əşhəbdən, o da Həsəndən rəvayət etmişdir ki, Allah peyğəmbəri: «Ey Suffə camaatı! Necəsiniz?» - deyə soruşdu. Onlar da: «Yaxşıyıq» - deyə cavab verdilər. Peyğəmbər: «Bu günmü yaxşısınız, yoxsa yeməklərdən, libaslardan biri gəlib o biri getdiyi, evlərinizi Kəbə örtüsü kimi örtdüyünüz günmü?» - deyə soruşdu. Onlar da: «Ey Allahın peyğəmbəri! O gün yaxşı olarıq. Ulu və uca Allah bizə verər, biz də şükür edərik» - deyə

---

[604] **Səhihdir**: Əhməd, 6/19; "əz-Zühd", səh. 14; ət-Tirmizi, 2349; İbn Mübarək, "əz-Zühd", 553; İbn Hibban, 705; ət-Tabərani, "əl-Kəbir", 18/256/786; əl-Hakim, 1/34-35, 4/122 və s.

[605] **Səhihdir:** Əhməd, 2/168, 172-173; "əz-Zühd", səh. 14; Müslim, 1054.

[606] **Zəifdir:** Abdullah bin Əhməd, "Zəvaid əz-Zühd", səh. 18; əl-Beyhəqi, "Şuabul-İman", 10367.

[607] **Zəif sənədlə:** əl-Beyhəqi, "Şuabul-İman'", 10654.

cavab verdilər. Peyğəınbər öz növbəsində: «Əksinə, bu gün daha yaxşısınız» - dedi»[608]. Bu hədis onların yoxsul olub səbir etdikləri vaxtda zəngin olub şükür etdikləri vaxtdan daha yaxşı olduqlarını açıq-aşkar göstərir.

Abdullah ibn Əhməd İbn Zərdən, o da Həfs İbn Qiyasdan, o da Davud İbn Əbi Hinddən, o da Əbu Hərb İbn Əbil-Əsvaddan, o da Təlha əl-Bəsridən belə deməsini rəvayət edir: «Mədinəyə gəlmişdim. Mənim orada tanışım yox idi. Həmin vaxt bir müdd[609] xurma iki nəfər arasında bölünürdü. Allahın elçisi bizə namaz qıldırdıqdan sonra arxasından bir nəfər uca səslə dilləndi: "Ey Allahın elçisi! Xurma qarnımızı yandırdı. Ayaqyoluna ehtiyacımız qalmadı". Peyğəmbər Allaha həmd-səna etdikdən sonra: "Allaha and olsun ki, əgər sizlər üçün ət, çörək tapsaydım, sizi onlarla yedizdirərdim. Vaxt gələcək qarşınıza yeməklərdən, libaslardan biri gəlib biri gedəcəkdir. Evlərinizi Kəbə örtüsü kimi örtəcəksiniz" - dedi. Səhabələr: "Ey Allahın elçisi! Biz bu gün, yoxsa həmin vaxtmı daha yaxşıyıq?" - deyə soruşdular. Peyğəmbər də: "Əksinə, bu gün siz o gündən daha yaxşısınız. Bəli, bu gün siz o gündən daha yaxşısınız. O gün siz bir-birinizin boynunu vuracaqsınız" - deyə cavab verdi».[610]

İmam Əhməd Abdulvahhabdan, o da Səiddən, o da Qətadədən rəvayət edir ki, Allahın peyğəmbəri Suffə camaatının yanına gəldi. Ravi əvvəlki hədisə bənzər hədisi danışdı.[611]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, zənginlik və mal-dövlətdə fitnədən başqa bir şey yoxdur. Zəngin olub dinində onun təsiri altına düşməkdən salamat olan insanlar az-az tapılar. Allah-taala buyurmuşdur: **«Həqiqətən, mal-dövlətiniz və oğul-uşağınız** (sizin üçün) **ancaq bir imtahandır»** (ət-Təğabun, 15).

Tirmizi Kəb ibn İyaddan rəvayət etdiyinə görə o, Allah elçisinin belə deməsini eşitmişdir: «Hər ümmətin bir fitnəsi vardır. Mənim ümmətimin fitnəsi də mal-dövlətdir»[612]. Tirmizi hədisi həsən-səhih adlandırmışdır.

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, mal-dövlət insanı Cəhənnəmə, yoxsulluq isə Cənnətə aparır.

---

608 Əhməd, "əz-Zühd", səh. 48; Başqa sənədlə Qətadə rəvayət etmişdir. Hər ikisi zəifdir.
609 Çəki vahidi, təxminən 832 q.
610 **Səhihdir**: Abdullah bin Əhməd, "Zəvaid əz-Zühd", səh. 33-34; Əhməd, 3/487; İbn Hibban, 6684; ət-Təbərani, "əl-Kəbir", 8160; Əbu Nəim, "Hilyətul-Övliya", 1/374-375; əl-Bəzzar, 3673; əl-Hakim, 4/548.
611 Əhməd, "əz-Zühd", səh. 48.
612 **Səhihdir**: ət-Tirmizi, 2336; ən-Nəsai, "əl-Kəbir", 8/309; Əhməd, 4/160; əl-Buxari, "ət-Tarix əl-kəbir", 7/222; İbn Hibban, 2470; ət-Təbərani, "əl-Kəbir", 17/161/404; əl-Beyhəqi, "Şuabul-İman", 10209.

İmam Əhməd Yeziddən, o da Əbul-Əşhəbdən, o da Kəb ibn Sourun azad olmuş köləsi olan Səid ibn Əyməndən belə deməsini rəvayət etmişdir: «Bir gün Allahın elçisi səhabələri ilə söhbət edərkən yoxsul bir kişi gəlib zəngin birinin yanında əyləşdi. Zəngin sanki paltarını ondan yıgdı. Bunu görən Allahın elçisi: "Ey filankəs! Zənginliyinin ona, onun yoxsulluğunun isə sənə keçməsindənmi qorxdun?" - dedi. Zəngin adam: "Ey Allahın elçisi! Zənginlik pis şeydirmi?" - deyə soruşdu. Peyğəmbər: "Bəli, sənin dövlətli olmağın səni Cəhənnəmə, onun yoxsulluğu isə onu Cənnətə çağırır" - deyə cavab verdi. Həmin adam: "Məni bundan nə qurtara bilər?" - deyə sorüşdu. Peyğəmbər: "O yoxsula kömək etməyin " - dedi. Kişi: "Yardım edərəm" - dedi. Yoxsul: "Onun yardımı mənə lazım deyil" - dedi. Peyğəmbər: "Onda qardaşın üçün bağışlanma dilə, dua et!" - buyurdu».[613]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, bəndə şükür ilə zənginliyin haqqını verə bilməz.

Tirmizi "Cami" əsərində Osman ibn Əffandan Peyğəmbərin belə deməsini rəvayət etmişdir: «Adəm oğlunun bu xislətlərdən, yaşadığı evdən, övrət yerini örtdüyü paltardan, yağsız çörəkdən və sudan başqasında haqqı yoxdur».[614] Tirmizi hədisi həsən-səhih adlandırmışdır.

Müslim Əbu Ümamədən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Ey Adəm oğlu! Artıq malını sərf elməyin sənin üçün xeyir, etməməyin isə şərdir. Kifayət qədər mala sahib olduğun üçün qınanmazsan. Öhdəndə olandan başqa.Yuxarıda dayanan əl, aşağıda dayanan əldən daha yaxşıdır»[615].

Yenə də Müslim Əbu Nədradan, o da Əbu Səid əl-Xudridən belə deməsini rəvayət etmişdir: «Bir dəfə Allah elçisi birlikdə səfərdə idik. Dəvə belində bir kişi gəlib sağına-soluna boylandı. Allahın elçisi: "Artıq minik heyvanı olanlar olmayanlara, artıq azuqəsi olanlar da olmayanlara versin" - buyurdu». Sonra Allahın elçisi malın bir neçə növünü sadaladı. Artıq qalan malda heç kəsin haqqı olmadığını zənn etdik.[616]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, bu, şükür edən zənginin artıq qalan bütün malını sərf etməsi ilə üstün olmasının nəzəriyyəsidir. Artıq qalan malı ilə mənfəət əldə

---

613 **Zəifdir**: Əhməd, "əz-Zühd", səh. 49.

614 **Zəif münkərdir**: ət-Tirmizi, 2341; Əhməd, 1/62; ət-Təyalisi, 83; Əbu Nəim, “əl-Hilyə", 1/61; əl-Hakim, 4/312; əl-Bəzzar, "Müsnəd", 414; əl-Beyhəqi, "Şuabul-İman", 6179, 10367; ət-Tabərani, "əl-Kəbir", 147; və s.

615 Müslim, 1036.

616 Müslim, 1728.

edib boynuna düşən vacibatını ödəyən və bir qədər də müstəhəb əməllər edən şükür edən zənginə gəlincə, o, yoxsul halı ilə Allahdan razı olub səbir edən yoxsuldan necə üstün ola bilər?! Allahın elçisi şükür edənlərin öndərləri olan səhabələrinə onlar üçün yoxsulluqdan deyil, zənginlikdən qorxduğunu and içmişdir.

Buxari və Müslimin Bədr döyüşünün qazilərindən olan Amr ibn Aufdan rəvayət edirlər ki, Allahın elçisi Əbu Übeydə ibn əl-Cərrahı cizyə[617] vergisini toplamaq üçün Bəhreynə göndərmişdi. Allahın elçisi Bəhreyn əhalisi ilə sülh bağlamış və onlara Əla ibn Hədramini əmir təyin etmişdi. Əbu Übeydə Bəhreyndən malla qayıtdı. Ənsarlar Əbu Übeydənin gəlişini eşidib sübh namazını Allah elçisi ilə birlikdə qılmağa gəldilər. Allahın elçisi namazı qılıb qurtardıqdan sonra arxaya döndü və ənsarlar onun ətrafına toplaşdılar. Allahın elçisi onları belə gördükdə gülümsədi və buyurdu: «Zənnimcə Əbu Übeydənin Bəhreyndən malla qayıtdığını eşitmisiniz». Səhabələr də: «Bəli, ey Allahın elçisi!» - deyə cavab verdilər. Peyğəmbər isə belə dedi: «Sevinin və sizi sevindirəcək şeylərə ümid bəsləyin. Allaha and olsun ki, sizin üçün qorxduğum kasıbçılıq deyildir. Lakin sizdən əvvəlki ümmətlərin önündə dünya qapıları açıldığı və bir-biriləri ilə rəqabət apardığı üçün onları həlak etdiyi kimi sizi də həlak etməsindən qorxuram»[618]

İmam Əhməd Ruhdan, o da Hişamdan, o da Həsən əl-Basridən belə rəvayət edir ki, Əbu Sələbə əl-Xuşanidən: «Ey Məhəmmədin əshabəsi! Vəd etmiş olduğunuz dünyanız haradadır?» - deyə soruşuldu. O da: «Burada olan olmayanı müjdələsin! Ondan başqa ibadətə layiq haqq məbud olmayan Allaha and olsun ki, alovun böyük odunu yediyi kimi dünya da imanı yeməkdədir» - deyə cavab verdi.[619]

İmam Əhməd Yeziddən, o da Hişam ibn Həssandan Həsənin belə dediyini eşitmişdir: «Allaha and olsun ki, əgər Allah bir insana dünyanı bəxş edərsə və həmin insan bunda onun üçün bir hiylə olduğundan qorxmazsa, deməli onun elmi kəm, düşüncəsi isə zəifdir. Həmçinin əgər Allah bir bəndəsinə dünyanı verməzsə və bəndə bunda özü üçün bir xeyir olduğunu zənn etməzsə, onda onun da elmi kəm, düşüncəsi isə zəifdir».[620]

Deyilənə görə bir dəfə Həzrəti Peyğəmbərin yanından bir yoxsul və bir zəngin kişi keçdi. Peyğəmbər yoxsul kişi barəsində belə buyurdu: «Bu [yoxsul kişi] bunun [zəngin kişi] kimi dünya dolusu

---

617 Müsəlman dövlətində yaşayan qeyri-müsəlmanların islam dinini qəbul etmədikləri təqdirdə islam dövlətinə ödədikləri can vergisi.
618 əl-Buxari, 6425; Müslim, 296.
619 Sənədi zəifdir.
620 Əhməd, "əz-Zühd", səh. 48.

insanlardan daha xeyirlidir».

Buxari «əs-Səhih»ində Səhl ibn Səddən belə rəvayət edir: "Bir dəfə bir kişi Allah elçisinin yanından keçdi. Bu zaman Peyğəmbər: «Bunun haqda nə deyə bilərsən?» - deyə soruşdu. Səhabələr də: «Bu bir qadına elçi getsə, evləndirilməyə, birisi haqda vəsadət qaldırsa, vəsadəti təmin edilməyə və öz sözünü dedikdə dinlənilməyə layiq insandır» - deyə cavab verdilər. Sonra Allahın elçisi sükuta qərq oldu. Bu zaman yoxsul müsəlmanlardan biri onun yanından ötüb keçdikdə Allahın elçisi: «Bəs bunun barəsində fikriniz nədir?» - deyə sualını təkrarladı. Səhabələr də öz növbələrində belə cavab verdilər: «Bu kişi bir qadına elçi getsə, evləndirilməyə, birisi haqda vəsadət qaldırsa, vəsadəti təmin edilməyə və öz sözünü dedikdə dinlənilməyə layiq insan deyil». Səhabələrin sözlərinin qarşısında Allahın elçisi belə buyurdu: «Bu [yoxsul kişi] bunun [zəngin] kimi dünya dolusu insanlardan daha xeyirlidir».[621]

Allahın elçisi vaxtilə zəngin insanları müjdələmədiyi şeylərlə səbirli yoxsulları müjdələmişdir.

Tirmizi Fədalə ibn Ubeyddən rəvayət edir ki, Allahın elçisi camaatla birgə namaz qılarkən Suffə əhli[622] arasında aclıqdan yıxılıb düşənlər olurdu. Hətta bədəvi ərəblər [bunu görüb]: "onlar dəlidir" - deyirdilər. Allahın elçisi isə namazı bitirdikdən sonra onların yanına gəlib: «Allah dərgahında sizi nələrin gözlədiyini bilsəydiniz, daha yoxsul və daha çox möhtac olmağı istərdiniz».[623]

Fədalə deyir ki, mən həmin günü Allahın elçisi ilə birlikdə idim və o yoxsulları zənginlərdən öncə Cənnətə girməklə müjdələdi.

Bu əvvəl daxil olma müddəti haqqında rəvayətlər çeşidlidir. Müslimin «Səhih»indəki rəvayətə görə Əbu Əbdürrəhman belə deyir: «Abdullah ibn Amr ibn əl-Asın yanına üç nəfər gəldi. Bu zaman mən də onun yanında idim. Onlar: "Ey Əbu Məhəmməd! And olsun Allaha ki, biz heç nəyə qadir deyilik. Nə xərcliyə, nə heyvana, nə də mala" - deyə şikayətləndilər. Abdullah da onlara belə cavab verdi: "Nə istəyirsiniz? İstəsəniz bizə müraciət edin, biz də sizə Allahın sizi sevindirəcəyi şeyləri verək. İstəsəniz vəziyyətinizi sultana xatırladarıq. Ya da istəsəniz səbir edin. Çünki mən Allah elçisinin: "Həqiqətən, yoxsul mühacirlər qiyamət günü Cənnətə zənginlərdən qırx payız [il] əvvəl girəcəklər" - deməsini eşitmişəm". [Bundan

621 əl-Buxari, 5091.

622 Evsiz-eşiksiz, yoxsul mühacirlərdir ki, Mədinə məscidində kölgəli yerlərdə özlərinə sığınacaq tapıb məskunlaşmışlar.

623 **Səhihdir:** ət-Tirmizi, 2368; Əhməd, 6/17; İbn Hibban, 724; Əbu Nəim, 2/185; ət-Təbərani, “əl-Kəbir", 18/798-800; əl-Beyhəqi, "Şuabul-İman", 100441.

sonra] gələnlər: "Onda səbir edərik, heç nə istəmərik" - dedilər”.[624]

İmam Əhməd Affandan, o da Həmad ibn Sələmədən, o da Əbu Hüreyrədən rəvayət edərək bildirir ki, Allah elçisi belə buyurmuşdur: «Yoxsul müsəlmanlar Cənnətə zəngin müsəlmanlardan yarım gün əvvəl girəcəklər. Bu da beş yüz ilə bərabərdir».[625] Tirmizi hədisi həsən-səhih adlandırmışdır.

Tirmizi Əbu Səiddən Allah elçisinin belə deməsini rəvayət edir: «Yoxsul mühacirlər Cənnətə zəngin mühacirlərdən beş yüz il əvvəl girəcəklər»[626]. Hədis həsəndir.

Yenə də Tirmizinin Cabir ibn Abdullahdan nəql etdiyi rəvayətə görə Allahın elçisi belə buyurur: «Ümmətimin kasıbları Cənnətə zənginlərindən qırx payız [il] əvvəl girəcəkdir».[627] Bu hədis də həsəndir. Qeyd etmək lazımdır ki, bu hədis Abdullah ibn Amrın hədisi və Tirmizinin Ənəsdən rəvayət etdiyi «Həqiqətən, kasıblar Cənnətə zənginlərdən qırx payız [il] əvvəl girəcəklər»[628] - hədisi ilə uyğunluq təşkil edir.

Cabir, Ənəs və Abdullah ibn Amr üçlüyü bu müddətin qırx il, Əbu Hüreyrə və Əbu Səid cütlüyü isə beş yüz il olması barədə yekdil rəydədirlər. Bu hədislər arasında ziddiyyət yoxdur. Çünki Cənnətə gec və tez daxil olma yoxsulluq və zənginlik nöqteyi-nəzərindən dərəcələnir. Belə ki, yoxsullardan kimisi qırx il əvvəl, kimisi isə beş yüz əvvəl Cənnətə daxil olacaqdır. Hətta yoxsulların Cənnətə əvvəl girmələri bu miqdarla məhdudlaşmayıb artan və azalan kəmiyyət arasındadır.

Əbu Davud «Sünən»ində Əbu Hüreyrədən Peyğəmbərin: «Ümmətdən Cənnətə ilk olaraq daxil olan Əbu Bəkr əs-Siddiqdir»[629] - deməsini rəvayət etmişdir. Məlumdur ki, Əbu Bəkrlə onun yoxsul mühacir qardaşları arasındakı Cənnətə əvvəl daxil olma müddəti bir o qədər də uzun sürməz. Lakin bu müddət Əbu Bəkrlə Cənnətə ən son daxil olan arasında ən uzun müddət hesab olunur.

İmam Əhməd «Müsnəd»ində Abdullah ibn Ömərdən rəvayət edir ki, Həzrət Peyğəmbər səhabələrindən: «Cənnətə ilk olaraq kimin daxil olacağını bilirsinizmi?» - deyə soruşdu. Onlar da öz növbələrində: «Allah və elçisi daha yaxşı bilir» - deyə cavab verdilər. Peyğəmbər buyurdu: «Cənnətə ilk daxil olanlar sıxıntı və əziyyətlərin məngənəsi altında olan yoxsul mühacirlərdir ki, onlardan biri yerinə

[624] Yuxarıda verildi.
[625] Yuxarıda verildi.
[626] **Həsəndir:** ət-Tirmizi, 2351; Əbu Davud, 3666; Əhməd, 3/63; Əbu Yəla, 1151.
[627] Yuxarıda verildi.
[628] **Zəifdir:** ət-Tirmizi, 2352.
[629] **Zəifdir:** Əbu Davud, 4652.

yetirə bilmədiyi ehtiyacı ürəyində qala-qala ölür. Mələklər: "Ey Rəbbimiz! Biz Sənin mələklərinik, Sənin gözətçilərinik, göylərinin sakiniyik. Onları bizdən əvvəl Cənnələ buraxma!" - deyə Allaha yalvararlar. Allah-taala da onlara belə cavab verdi: "Qullarım mənə heç bir şeyi şərik qoşmurlar. Sıxıntı onlara elə sarılıb ki, hətta onlardan biri yerinə yetirə bilmədiyi ehtiyacı ürəyində qala-qala ölür". Həmin vaxt mələklər hər bir qapıdan onların yanına girəcək və: "Səbir etdiyiniz üçün sizlərə salam olsun! [Dünya] diyarının sonu [Cənnət] necə də gözəldir!" - deyəcəklər».[630]

İmam Əhməd Hüseyn ibn Məhəmməddən, o da Duveyddən, o da Müslim ibn Bəşirdən, o da İkrimadan, o da İbn Abbasın dilindən (Allah ondan və atasından razı olsun!) Allah elçisinin belə deməsini rəvayət etmişdir: «İki mömin Cənnətin qapısının ağzında görüşürlər. Onlardan biri dünyada olarkən zəngin, digəri isə yoxsul imiş. Yoxsul Cənnətə buraxılır. Zəngin isə Allahın saxlanılmasını istədiyi qədər saxlanılır, sonra isə Cənnətə buraxılır. Cənnətdə kasıbla rastlaşır. Kasıb ona: "Ay qardaş, səni nə saxladı? Allaha and olsun ki, sən saxlanıldıqda sənə görə [yaman] qorxdum?!" - deyir. Zəngin isə: "Ay qardaş, mən səndən sonra yaman pis həbs edildim. Sənə qovuşanadək məndən elə tər axdı ki, turş bir şeylə qidalanmış min dəvə o tərdən içsəydi, onlara şirin su kimi gələrdi" - deyə cavab verdi».[631]

Təbərani «Muəccəmə»də Məhəmməd ibn Abdullah əl-Hədrəmi və Əli ibn Səid ər-Razidən, onlar da Əli ibn Bəhramdan, o da Abdulməlik İbn Əbi Kərimədən, o da əs-Sövridən, o da Məhəmməd ibn Zeyddən, o da Əbu Hazimdən, o da Əbu Hüreyrədən Allah elçisinin belə deməsini rəvayət edir: «Yoxsul möminlər Cənnətə zəngin möminlərdən yarım gün əvvəl girəcəklər. Bu da beş yüz ilə bərabərdir». Bu zaman bir nəfər: «Ey Allahın elçisi! Mən də onların arasındayammı ?» - deyə dilləndi. Peyğəmbər ondan: «Səhər yeməyi yedikdə şam yeməyinə gəlirsənmi və şam etdikdə yanında səhər yeməyin qalırmı?» - deyə soruşdu. Kişi: «Bəli» - deyə cavab verdi. Peyğəmbər: «Sən onlardan deyilsən» - dedi. Başqa birisi ayağa qalxıb: «Ey Allahın elçisi! Bəs mən necə, onlardanammı?» - deyə soruşdu. Peyğəmbər ona: «Buna söylədiyimi eşitdinmi?» - dedi. Kişi: «Bəli, amma mən onun kimi deyiləm» - deyə cavab verdi. Allahın elçisi: «Əynindəki paltarından başqa yüngül bir paltarın varmı?» - deyə soruşdu. Kişi: «Bəli» - deyə cavab verdikdə, Peyğəmbər: «Sən də onlardan deyilsən» - buyurdu. Başqa birisi ayağa durub: «Ey Allahın elçisi! Görəsən, mən onlardanammı?» - deyə soruşdu, Peyğəmbər ona

---

[630] Yuxarıda verildi.
[631] **Zəifdir:** Əhməd, 1/304; "əz-Zühd", səh. 473.

da: «Səndən əvvəl bu ikisinə söylədiklərimi eşitdinmi?» - dedi, kişi: «Bəli» - deyə cavab verdi. Peyğəmbər: «Hər dəfə borc almaq islədikdə ala bilirsənmi?» - deyə soruşdu, kişi: «Bəli» - deyə cavab verdi. Allahın elçisi ona da: «Sən də onlardan deyilsən» - cavabını verdi. Sonra bir qeyrisi ayağa qalxaraq: «Bəs mən necə, onlardanammı, ey Allahın elçisi?» - deyə soruşdu, Peyğəmbər ona da: «Səndən əvvəlkilərə söylədiklərimi eşitdinmi?» - dedi, kişi: «Bəli» - deyə cavab verdi. Peyğəmbər ondan: «Qazana bilirsənmi?» - deyə soruşdu, kişi: «Bəli» - deyə cavab verdi. Allahın elçisi ona da: «Sən də onlardan deyilsən» - cavabını təkrarladı. Sonra beşincisi ayağa qalxaraq: «Ey Allahın elçisi! Görəsən, mən də onlardanammı?» - deyə soruşdu, Peyğəmbər ona da: «Səndən əvvəlkilərə söylədiklərimi eşitdinmi?» - dedi. Kişi: «Bəli» - deyə cavab verdikdə, Peyğəmbər ondan: «Gecə yatanda və səhər oyananda Rəbbindən razı qalırsanmı?» - deyə soruşdu. Kişi: «Bəli» - deyə cavab verdi. Nəhayət Allahın elçisi bu kişiyə: «Bəli, sən onlardansan» - cavabını verdi. Sonra Peyğəmbər belə buyurdu: «Həqiqətən, Cənnətdə möminlərin ağaları səhər yeməyini yedikdə şam yeməyini tapa bilməyənlər, şam etdikdə isə yanlarında səhər yeməyi qalmayanlar, borc almaq istədikləri zaman ala bilməyənlər, əynində bir qat lazımi paltarından başqa geyimi olmayanlar, yaşayışını təmin edə bilməyənlər və Allahdan razı halda axşamlayıb, razı halda da sabahlayanlardır: **"Allaha və Peyğəmbərə itaət edənlər** [axirətdə] **Allahın nemətlər verdiyi nəbilər** [peyğəmbərlərj, **siddiqlər** [tamamilə doğru danışanlar, etiqadı dürüst, peyğəmbərləri hamıdan əvvəl təsdiq edən şəxslər], **şəhidlər və salehlərlə** [yaxud əməl sahibləriylə] **bir yerdə olacaqlar. Onlar necə də gözəl yoldaşlardır!".**[632] Təbəraninin söylədiyinə görə bu hədis Sufyan əs-Sourinin Məhəmməd ibn Zeyddən rəvayət etdiyi qərib hədisdir. Məhəmməd ibn Zeyd yalnız Abdulməlikin köləsi olduğu üçün ona "əl-Abdi" də deyirdilər.

Mən isə deyirəm ki, bu Məhəmməd əl-Abdidir. Hədis alimlərindən bəziləri onu etibarlı, bəziləri isə zəif hesab etmişlər. Daraqutni isə hədisin güclü olmadiğını qeyd edir. Əbu Hatimə görə isə ravi etibarlı sayıla bilər. İbn Hibban adı çəkilən ravini siqa dərəcəli ravilər arasında qeyd edir. Tirmizi və İbn Macə isə Məhəmməd ibn Zeyddən hədis rəvayət etmişlər. Bu təbəqədə şamlı Məhəmməd ibn Zeyd Əbu Sələmə ibn Əbdürrəhmandan hədis rəvayət edir. Lakin o mətruk hesab olunur. Biz də bunun Məhəmməd ibn Zeyd olmasından ehtiyat edirik. Əs-Souri onun nəsəbini qeyd

[632] **Zəifdir**: Deyirəm: ət-Təbəraninin "Muəccəm" əsərində görmədim, lakin Əbu Nəimin "Hilyətul-Övliya", (7/99-100) əsərində ət-Təbəranin yolu ilə zəif sənədlə rəvayət olunub.

etməmişdir. Sadəcə olaraq ona əl-Abdi deyirlər. Ən doğrusunu bilən isə təbii ki, Allah-taaladır.

İmam Əhməd İsmail ibn İbrahimdən, o da Hişam Dəstvaidən, o da Yəhya İbn Əbi Kəsirdən, o da Amir Əqilidən, o da atasından, o da Əbu Hüreyrədən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Mənə ilk Cənnətə və ilk Cəhənnəmə girəcək üç sinif göstərildi. Cənnətə girəcək üç sinif şəhidlər, dünyada kölə olmaları onları Rəbblərinin ilaətindən yayındırmayan kölələr və iffətli (özünü haramçılıqdan və dilənçilikdən qoruyan) və külfət sahibi olan yoxsullardır. Cəhənnəmə girəcək üç sinif isə zülmkar rəhbərlər, mal-dövlət sahibi olub bunda Allahın haqqını ödəməyən zənginlər və təkəbbürlü yoxsullardır».[633] Tirmizi isə Cənnətə ilk daxil olacaq üç sinfi rəvayət etmişdir.

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, yoxsulların fəzilətli olmaları haqqında Cənnət əhlinin əksəriyyətini kasıblar, Cəhənnəm əhlinin isə əksəriyyətini zənginlərin təşkil etdiyini göstərən rəvayətlər kifayət qədərdir.

İmam Əhməd Abdullah ibn Məhəmməd İbn Əbi Şeybədən, o da Şərikdən, o da Əbu İshaqdan, o da Saib ibn Malikdən, o da Abdullah ibn Ömərdən (Allah ondan və atasından razı olsun!) Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Mənə Cənnət göstərildi, əhlinin əksəriyyətini yoxsulların təşkil etdiyini gördüm. Mənə Cəhənnəm göstərildi, onun da əhlinin əksəriyyətini zəngin və qadınların təşkil etdiyinin şahidi oldum».[634]

Buxari «əs-Səhih»də Əbu Rəcadan belə rəvayət edir: «İmran ibn Husayn Allah elçisinin hüzurundan həyat yoldaşının yanına gəldi. Həyat yoldaşı ona: "Peyğəmbərdən eşitdiklərini bizə də danış" - dedi. O da bildirdi ki, eşitdiyi bir şey yoxdur. Qadın ondan əl çəkmədi [yaxud onu əsəbləşdirdi]. İmran da arvadına Allah elçisinin: "Cənnətə baxdım, əhlinin əksəriyyətinin qadınlar olduğunu gördürn, Cəhənnəmə baxdım, ora da əhlinin çoxusunun qadınlar olduğunun şahidi oldum"- deməsini eşitdim" - dedi».[635]

Buxari və Müslim Üsamə ibn Zeyddən nəql etdikləri rəvayətə görə Allahın elçisi buyurmuşdur: «Cənnətin qapısı ağzında dayandım. Gördüm ki, bura daxil olanların əksəriyyəti kasıblardır. Sonra Cəhənnəmin qapısı ağzında dayandım. Burada da ora girənlərin

---

633 **Zəifdir**: Əhməd, 2/425, 479; ət-Təyalisi, 2567; əI-Hakim, 1/387; İbn Xuzeymə, 2249; əl-Beyhəqi, "əs-Sünən", 4/82; "Şuabul-İman", 8610: ət-Tirmizi, 1642; İbn Hibban, 4312.
634 **Zəifdir:** Əhməd, 2/173.
635 əl-Buxari, 3241. İmranın qadını qeyd olunmayıb.

əksəriyyətinin qadınlar oldugunu gördüm».[636]

Müslim isə İbn Abbasdan onun belə deməsini rəvayət etmişdir. «Peyğəmbərə Cəhənnəm göstərilib, əhlinin əksəriyyətinin qadınlar olduğunu görüb. Peyğəmbərə Cənnət göstərilib, əhlinin əksəriyyətinin yoxsullar olduğunu görüb».[637]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, yoxsulluğun üstün olması barədə qiyamət günü hər bir zənginin kasıb olmağı arzulaması barədə rəvayətlər kifayət qədərdir. İmam Əhməd Abdullah ibn Nəmirdən, o da İsmayıl ibn Xaliddən, o da Nufeydən Ənəs ibn Malikdən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «İstər zəngin istərsə də kasıb olsun, qiyamət günü elə bir adam olmayacaq ki: "Kaşki dünyada mənə [bolluca] mal verilməyəydi" - deməsin».[638] Buxarinin söylədiyinə görə Nufey haqda ixtilaf vardır və bu da onun haqqında söylənənlərin ən layiqlisidir.

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, Allahın elçisi bir neçə hədisdə yoxsulların fəzilətli və üstün olmasını vurğulayır. Bunlardan yuxarıda qeyd etdiyimiz Səhl ibn Sədin hədisini misal göstərmək olar.

İmam Əhməd Əbu Müaviyədən, o da Əmaşdan, o da Zeyd ibn Vəhdən, o da Əbu Zərdən rəvayət etmişdir ki, Allahın elçisi ona: «Ey Əbu Zər! Başını qaldır, məsciddə görəcəyin ən yüksək təbəqəli adama bax» - buyurdu. Əbu Zər deyir ki, mən də başımı qaldırdıqda əynində hüllə (iki parçalı paltar) olan və oturan bir kişini gördüm. Budur - dedim. Sonra Peyğəmbər: «Ey Əbu Zər! İndi isə başını qaldır, məsciddə görəcəyin ən aşağı təbəqəli adama bax» - dedi. Mən də başımı qaldırıb baxanda əynində köhnə-kürüş paltarı olan zəif bir kişi gördüm və budur - dedim. Allahın elçisi belə buyurdu: «And olsun canım əlində olana ki, bu [əynində köhnə-kürüş paltarı olan] qiyamət günü Allah yanında bunun [əynində bahalı paltar olan adam] kimi dünya dolusu insanlardan daha əfzəldir».[639]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, bu məsələdə bizim aramızı ayıracaq və xəstəliyimizə şəfa verəcək şey, qiyamət günü kasıbın mükafat və dərəcəsinin Allah tərəfindən artıqlaması ilə verilməsidir. Zəngin şükür edən olsa belə, zənginliyi sayəsində dünyada ən halal yolla nail olduqları qiyamət günü ona verilən savabından sayılacaqdır. Dünyada kafidən artığın azı, axirətdə

---

[636] əl-Buxari, 5196; Müslim, 2736.
[637] Müslim, 2737.
[638] **Hədis mövdudur**: İbn Macə, 4140; Əhməd, 3/117, 167.
[639] **Səhihdir**: Əhməd, 5/157, 171; "əz-Zühd", səh. 36; Vaki'i, "əz-Zühd", 144; İbn Hibban, 681; əl-Bəzzar, 3629, 3630; Əbu Nəim, "əl-Hilyə", 8/115; ət-Təbərani, "əl-Əvsat", 5862; İbn Əbi Şeybə, 13/222 və s.

bir çox şeyi azaldacaqdır.

Müslim Abdullah ibn Ömərdən Allah elçisinin belə deməsini rəvayət edir: «Allah yolunda döyüşərək qənimət əldə edən elə bir qoşun dəstəsi yoxdur ki, axirət savabının üçdəikisini bəri başdan almasınlar. Özlərinə isə üçdəbiri qalır. Qəniməti almazlarsa, savabları onlara tam olaraq veriləcək».[640]

Buxari və Müslim Xəbbab ibn Ərətdən belə deməsini rəvayət edir: «Biz Allah rizasını qazanmaq məqsədilə Allah elçisi ilə birlikdə hicrət etdik. Savabımız artıq Allahın öhdəsindədir. Aramızdan bu savabdan heç bir loxma yeyə bilmədən dünyasını dəyişənlər oldu. Onlardan biri də Musab ibn Umeyrdir. Ühüd döyüşü günü həlak oldu. Öləndə bir əbası var idi ki, onunla başını örtsək, ayağı açıq qalardı, ayağını örtsək, başı görsənərdi. Allahın elçisi bizə onun başını örtməyi, ayaqlarının üstünə isə "İzxir" deyilən ətirli bitkidən qoymağı tapşırdı. Yoldaşlarımızdan meyvəsi yetişən və onu dərənlər də var idi».[641]

Buxari və Müslim Qeys İbn Əbi Hazimdən belə deməsini rəvayət edir: «Bir dəfə Xəbbab xəstələndiyi zaman ona baş çəkməyə getdik. Xəbbab (qarnını) yeddi yerindən dağlamışdı. Bizə: "Bizdən əvvəlki dostlarımız getdilər. Dünya onların (axirət savabından) heç bir şeyi əksiltə bilməmişdi..." - dedi».[642] Qeys İbn Əbi Hazim hədisi axıra qədər danışdı.

Səid ibn Mənsur Müaviyədən, o da Əmaşdan, o da Mücahiddən, o da İbn Ömərdən (Allah ondan və atasından razı olsun!) belə deməsini rəvayət edir: «Bir qula dünya malından nə isə bir şey verilsə və o buna görə səxavətli olsa belə, onun Allah dərgahındakı dərəcəsindən əksilmiş olar».

Buxari İbrahim ibn Əbdürrəhman ibn Aufdan onun belə deməsini rəvayət edir: «Əbdürrəhman oruc olduğu zaman ona yemək gətirdilər. Belə dedi: "Musab ibn Umeyr həlak oldu, O məndən daha xeyirli idi. Əbası ilə kəfənlədilər. Elə bir paltar idi ki, başını örtsən ayaqları, ayaqlarını örtsən isə başı açıq qalırdı. Həmzə şəhid oldu. O da məndən xeyirli idi. Onu kəfənləyərkən əbasından başqa bir şey tapılmamışdı. Sonra isə dünya nemətlərinin qapısı üzümüzə açıldı [və ya dünyadan bizə verilən verildi]. Dünya həyatından yaxşılarımızın bizə tez verilməsindən [axirətə qalmamasından] qorxuram". [Bu sözləri söylədikdən sonra] ağlamaga başladı və hətta, iftar belə etmədi».[643]

---

[640] Müslim, 1906. Abdullah bin Amr bin əl-Asın rəvayəti.
[641] əl-Buxari, 1276; Müslim, 940.
[642] əl-Buxari, 5672; Müslim, 2681.
[643] əl-Buxari, 4045.

Əbu Səid ibn əl-Ərəbi belə deyir: «Bu sözləri təkcə Əbdürrəhman ibn Aufla Xəbbab demir. Bu sözləri Allah elçisinin ən böyük səhabələri də söyləmişdir. Onlar Allahın bəxş etdiyi dünya nemətlərini istəməz, əksinə ondan qorxardılar. Çünki onlar Allahın Peyğəmbəri üçün seçdiyinin daha əfzəl və zənginliyin isə onlar üçün nöqsan olduğunu bilirdilər. Bu böyük səhabələrdən Əbu Bəkr, Ömər, Osman, Əli, Əbu Ubeydə, Əmmar ibn Yasir, Salman, Abdullah ibn Məsud, möminlərin anası Aişə, Əbu Haşim ibn Utbə və adlarını çəkə bilmədiyimiz neçə-neçə səhabəni (Allah onların hamısından razı olsun!) misal göstərmək olar».

Əbu Bəkrdən söz düşmüşkən bu yerdə onun haqda bir əhvalatı qeyd etmək lap yerinə düşərdi. İbn Əbi Dünya Əbdürrəhman ibn Əbban ət-Taidən, o da Abdussaməd ibn Abdulvarisdən, o da Abdulvahid ibn Zeyddən, o da Süleymandan, o da Mürrədən, o da Zeyd ibn Ərqamdan belə deməsini rəvayət edir: «Əbu Bəkr əs-Siddiqlə bir yerdə idik. Əbu Bəkr içki istədi. Ona su və bal gətirdilər. İçkini ağzına yaxınlaşdırdığı zaman ağlamağa başladı. Elə ağladı ki, yanındakıları da ağlatdı. Hamı sussa da, o susmadı. Sonra təkrar ağlamağa başladı. Yoldaşları onun istədiyini verə bilmədiklərini düşündülər. Sonra gözlərini sildi. Yoldaşları: "Ey Allah elçisinin xəlifəsi! Səni ağladan nə idi?" - deyə soruşdular. Belə cavab verdi: "Allah elçisi ilə birlikdə idim. Gördüm ki, özünü nədənsə qorumağa çalışır. Lakin mən onun yanında heç kəsi görmədim. Dedim: "Ey Allahın elçisi! Özünü kimdən qoruyursan?" Belə cavab verdi: "Bu dünya mənə göründü. Ona: "Gözümə görünmə" - dedim. Sonra yenidən qayıdıb: "Sən məndən qurtuldunsa, səndən sonra gələnlər məndən qurtula bilməyəcəklər " - dedi "».[644]

Leys İbn Səddən, o da Saleh ibn Kisandan, o da Həmid ibn Əbdürrəhman ibn Aufdan, o da atasından nəql edir ki, Əbu Bəkr tutulduğu ölüm xəstəliyi zamanı belə dedi: «Mən sizin xəlifəniz təyin edildim. Halbuki, sizin ən xeyirliniz deyiləm. Hamınız xəlifə olmaq üçün əsəbləşmişdiniz. Mən dünya malının yaxınlaşdığını görürəm. Lakin siz ipəkdən yataq, yastıq və pərdələr tikənədək yaxınlaşmayacaqsınız. Tikan üzərində yatmaqdan ağrı hiss etdiyiniz kimi yun üzərində yatmaqdan da ağrı hiss edəcəksiniz. İnsanları ilk azdıranlar siz olacaqsınız. Onları sağa-sola böləcəksiniz. Mən bu yolda azmadım. Çünki yol ya qaranlıq, ya da aydınlıqdır. Allaha and olsun ki, sizlərdən birini gətirib hədsiz[645] olaraq başını vursalar, bu

[644] **zəifdir**: İbn Əbi əd-Dünya, “Zəmmud-Dünya”, 11; əl-Beyhəqi, "Şuabul-İman", 10518; əl-Hakim, 4/309; Əbu Nəim, "əl-Hilyə", 1/30.
[645] Şəriətin müəyyən etdiyi cəza üsulu.

onun üçün dünyaya dalmaqdan daha xeyirlidir».[646]

Məhəmməd ibn Əta ibn Xəbbab Əbu Bəkrlə birgə keçirdiyi günlərini xatırlayaraq belə deyir: «Əbu Bəkrin yanında əyləşmişdim. Bir quş gördü və: "Sən necə də xoşbəxtsən ey uçan quş. Bu ağacdan yeyir, ordan da peyin buraxırsan. Sonra heç nə olmur və sənə heç bir haqq-hesab yoxdur. Ey uçan quş! Sənin yerində olmaq istərdim." - dedi. Mən isə təəccüblə ona: "Bu sözləri görəsən sənmi, Allah elçisinin siddiqimi söyləyir?!" - dedim».[647]

Ömər haqqında isə belə bir hədisi misal göstərmək olar. Belə ki, Sasani hökmdarı Xosrovun xəzinələrini ona gətirdikdə ağlamağa başladı. Bunu görən Əbdürrəhman ibn Auf: «Ey möminlərin əmiri! Niyə ağlayırsan? Axı bu gün şükr, sevinc və fərəh günüdür» - dedi. Ömər isə belə cavab verdi: «Dünya malı verilən elə bir xalq yoxdur ki, Allah-taala onların arasına ədavət və nifrət salmasın!»[648].

Əbu Sinan əd-Duəli bir dəfə Ömərin yanına girmişdi. Ömərin yanında mühacirlərdən bir neçə nəfər var idi. Ömər İraq qalasından gətirilmiş çantanı gətirmək üçün adam göndərdi. Çanta gətirildi. Orada bir üzük var idi. Uşaqlarından biri üzüyü götürüb ağzına qoydu. Ömər üzüyü uşağın ağzından götürdükdən sonra ağlamağa başladı. Ətrafındakılar ona: «Nə üçün ağlayırsan? Allah-taala sənə fəth nəsib etdi, gözlərini qürrələndirdi» - dedilər. Ömər isə: «Mən Allah elçisinin: "Üzünə dünya malının qapıları açılan elə bir kəs tapılmaz ki, Allah-taala onların arasına qiyamətədək ədavət və nifrət salmasın!" — deməsini eşitmişəm, bundan qorxuram» - deyə cavab verdi.[649]

Əbu Səid deyir ki, kitabda öz əlimlə Əbu Davuddan gələn aşağıdakı hədisi tapdım: Məhəmməd ibn Ubeyddən, o da Həmmaddan, o da Yunisdən, o da Həsəndən rəvayət edir ki, Sasani şahı Xosrovun xəz papağı Ömər ibn əl-Xəttabın hüzuruna gətirildi. Ömərin ətrafındakılarının arasında Suraqə ibn Malik də var idi. Ömər Xosrovun bilərziklərini ona tulladı. O bilərzikləri qollarına taxdı və bilərziklər çiyinlərinə qədər çatdı. Ömər bilərzikləri Suraqənin əlində gördükdə: «Allaha həmd olsun ki, Xosrovun bilərzikləri Bənu-Mudlic qəbiləsindən bir bədəvinin - Suraqə ibn Malik ibn Cəşəmin qollarındadır» - dedi. Sonra isə belə dedi: «Allahım! Sən bilirsən ki, Elçin ona mal verilməsini və onu Sənin yolunda və Sənin bəndələrinə xərcləməyi istərdi. Lakin Sən onu qorumaq və onu seçdiyin üçün mal-

---

646 ət-Təbərani, "əl-Kəbir", 1/62/43; Əbu Nəim, "Hilyətul-Övliya", 1/34; əl-Heysəmi, "Məcmuə əz-Zəvaid", 5/203; sənədi zəifdir.

647 İbn əl-Mübarək, "əz-Zühd", 240; əl-Beyhəqi, "Şuabul-İman", 3/76-77.

648 Abdullah bin Əhməd, "Zəvaid əz-Zühd", səh. 143.

649 **Zəifdir:** Əhməd, 1/16; Əbu Yələ, "əl-Müsnəd əl-Kəbir", 1971.

dövləti ondan uzaq tutdun. Allahım! Bu malın Sənin tərəfindən Ömərə bir hiylə olmasından Sənə sığınıram!» Daha sonra Ömər bu ayəni oxudu: **«Məgər** [kafirlər] **elə zənn edirlər ki, onlara** [dünyada] **verdiyimiz var-dövlət və övladla biz onların yaxşılıqlarına tələsirik? Xeyr, anlamırlar!** [Kafirlərə dünyada istədiklərini verib tədriclə onları əzaba yaxınlaşdırmağımızı, az sonra qəflətən başlarının üstünü alacağımızı düşünmürlər!]**»** - (əl-Muminun, 55-56).[650]

Bütün bunlardan aydın olur ki, dünya nemətlərinin artıqlaması ilə verilməsi axirətdə veriləcək nemətlərin bir qisminin dünyada verilməsi və bununla da axirət nemətlərinin azaldılmasıdır. Aburrəzzaq Memardan, o da Zuhridən, o da Əbu Səğirədən, o da Cabir ibn Abdullahdan (Allah ondan və atasından razı olsun!) belə deməsini rəvayət etmişdir: «Ühüd döyüşü günü Peyğəmbər şəhid olanların başının üstündə dayanaraq: "Mən bunlara şahidəm. Onları qanları üzərində dəfn edin"- deyə göstəriş verdi».[651]

Memar Həsəndən nəql etdiyi rəvayətə görə Peyğəmbər buyurmuşdur: «Onlar artıq getdilər, Mən şəhadət verirəm ki, onlar savablarından heç bir şey dadmadılar. Siz isə savablarınızdan dadmısınız. Məndən sonra nələr edəcəyinizi də bilmirəm».[652]

İbn əl-Mubarək Cərir ibn Hazimdən, o da Həsəndən belə nəql edir: Allahın elçisi səhabələri ilə birlikdə Bəqi qəbirstanlığına gəlib: «Əssələmu aleykum yə əhləd-diyar! Əgər siz sizlərdən sonra onlardan Allahın sizi xilas etdiyini bilmiş olsaydınız» - dedi. Sonra üzünü səhabələrə tutaraq: «Onlar sizlərdən xeyirlidir» - dedi. Səhabələr: «Ey Allahın elçisi! Onlar bizim qardaşlarımızdır. Onlar müsəlman olduqları kimi biz də müsəlman olduq. Onlar hicrət etdikləri kimi biz də hicrət etdik. Onlar cihad etdikləri kimi biz də cihad etdik. Onların əcəlləri çatdı və onlar getdilər. Bizim isə əcəlimiz çatmadı. Onları bizdən xeyirli edən nədir?» - deyə soruşdular. Peyğəmbər isə belə cavab verdi: «Onlar dünyadan mükafatlarından heç bir şey dadmadan getdilər. Onlar getdilər və mən buna şəhadət verirəm. Siz isə mükafatlarınızdan dadmısınız. Məndən sonra nələr edəcəyinizi də bilmirəm». Səhabələr Allah elçisinin bu sözlərini eşitdikdən sonra düşündülər və bundan faydalanaraq: «Biz onlardan sonra dünyadan bizə verilənlərə görə sorğu-suala çəkiləcəyik. Dünyada bizə verilənlər axirətdəki mükafatlarımızdan çıxılacaqdır» - dedilər. Ən yaxşısından yedilər, yararlı yerə xərclədilər və artığını

---

[650] əl-Beyhəqi, "Dəlail ən Nubuvvə", 2/325.

[651] **Səhihdir:** Abdurrəzzaq, 3/540/1633, 5/272/9580; Əhməd, 5/431; əl-Beyhəqi, 4/11; əl-Buxari, 1343.

[652] **Zəifdir:** Abdurrəzzaq, 3/541/6634, 5/273/9581.

verdilər.[653]

Abdullah ibn Əhməd deyir ki, bu hədisi atama danışdım. Belə ki, Əsvəd ibn Amirdən, o da İsraildən, o da Suveyrdən, o da Mücahiddən İbn Ömərin belə deməsini rəvayət etmişdir: «Dünya malı verilən elə biri yoxdur ki, axirətdə onun dərəcəsi azalmasın».[654]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, zənginlərin böyükləri yoxsulluqda imtahana çəkilib səbir edənlər və zənginlikdə imtahana çəkilib səbir edənlərdir. Bunu söyləyənlər Əbdürrəhman və digərləridir. Bu fikir Musab ibn Sədin atasının dilindən rəvayət etdiyi aşağıdakı hədisə uyğundur. Belə ki, Allahın elçisi hədisdə buyurur: «Mən sizin üçün yoxsulluq imtahanından çox zənginlik imtahanından qorxuram, Siz yoxsulluqla imtahana çəkildiniz, səbir etdiniz. Dünya şirin bir yaşıllıqdır».[655]

Deyirlər ki, burada iki doğru hökm vardır ki, bununla da kimin üstün olduğu aydınlaşır:

Birincisi, Dünyada zəngin olanlar axirətdə yoxsul olanlardır. Buna da kifayət qədər dəlil göstərildi.

İkinci, Buxari və Müslim Əbu Zərdən belə deməsini rəvayət edirlər: «Bir gecə bayıra çıxarkən Allah elçisinin tək, yanında heç kəs olmadan gəzdiyini gördüm. Düşündüm ki, heç kəsin onunla gəzib-dolaşmasını istəmir. Buna görə də ayın kölgəsində gəzməyə başladım. Birdən ətrafına baxdıqda məni gördü: "O kimdir?" - deyə səsləndi. Mən də: "Əbu Zərdir. Allah məni sənin yolunda fəda etsin " - deyə dilləndim. O: "Ey Əbu Zər, bura gəl" - deyə məni yanına çağırdı. Onunla bir müddət gəzib-dolaşdıq. Sonra Peyğəmbər: "Allahın bəxş etdiyi var-dövləti sağına, soluna, önünə, arxasına sovuraraq xeyirxah işlər görənlər istisna olmaqla, bu dünyada zəngin olanlar axirətdə yoxsul olacaqlar"- buyurdu».[656]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, əgər zənginlik yoxsulluqdan üstün olsaydı, Allah-taala Öz Elçisini bu dünyada zahidliyə, dünya malından imtina etməyə təşviq etməz, dünya malına həris olanları və onu istəyənləri məzəmmət etməzdi. Əksinə, gərək onda onu bəndəni kamilləşdirən elm və əməl kimi fəzilətlərin qazanılmasına təşviq etdiyi kimi dünyaya, dünyanı qazanmağa, dünya malını artırmağa da təşviq edərdi. Allahın dünyada zahidliyə və dünya malından ehtiyacı qədər əldə etməyə təşviq etməsi dünyada zahidlərin və dünya malından aza qane

---

653 **Zəifdir:** İbn əl-Mübarək, "əz-Zühd", 498.

654 Yuxarıda verildi.

655 **Zəifdir:** əl-Bəzzar, "əl-Bəhrul-Zəxxar", 1168; Əbu Yəla, "Müsnəd", 780; Əbu Nəim, "əl-Hilyə", 1/93; əl-Beyhəqi, "Şuabul-İman", 10308.

656 əl-Buxari, 6443; Müslim, 94 (33).

olanların üstün və fəzilətli olmasına dəlalət edir.

Peyğəmbər hədislərinin birində xəbər verir ki, əgər dünya Allah yanında ağcaqanadın qanadına bərabər olsaydı, onda heç bir kafirə bu dünyadan bir qurtum su da verməzdi.[657]

Peyğəmbərin sözlərinə görə ölmüş quzunun leşi sahibi üçün nə qədər dəyərsizdirsə, dünya Allah üçün ondan da dəyərsizdir.[658]

Həmçinin Allahın elçisi buyurur: «Dünya mənfəəti axirət mənfəəti yanında bir kəsin barmağını dənizə salıb çıxardığı zaman barmağına bulaşan su qədərdir».[659]

«Allahı zikr etmək, Onun rizasına uyğun hərəkət etmək, alim və tələbə olmaq istisna olmaqla dünya da dünya malı da lənətlənmişdir».[660]

«Dünya möminlər üçün zindan, kafirlər üçün isə Cənnətdir».[661]

Allahın elçisi bəndəyə bu dünyada qərib bir insan, yaxud da yolçu kimi yaşamasını, özünü qəbir əhlindən hesab etməsini, sabahladığı zaman axşamı, axşamladığı zaman isə sabahı gözləməməsini əmr etmişdir.[662]

Allahın elçisi dünyada sevilən şeyləri götürməyi qadağan etmiş, dinar və dirhəmin qulunu lənətləyib bəd dua etmişdir.[663]

Həmçinin Peyğəmbər dünyanın yaşıl və şirin olduğunu, yəni yaşıllığı ilə gözləri, şirinliyi ilə isə qəlbləri çəkəcəyini xəbər vermiş, qadınlardan çəkinməyi və həzər etməyi əmr etdiyi kimi dünyadan da çəkinməyi və həzər etməyi əmr etmişdir.[664]

Həmçinin o bildirmişdir ki, dünya malına, vəzifəyə, şan-şöhrətə həris bir insanın dinə vurduğu zərər bir qoyun ağılına[665] hücum çəkmiş iki ac canavarın vurduğu zərərə və ya ondan da böyüyünə bərabərdir.[666]

Peyğəmbər digər bir hədisində özünü bu dünyada qızmar bir yay günündə bir ağacın altında kölgələnib, sonra isə durub oranı tərk edən yolçuya bənzədir.[667]

Allah elçisinin özünü bu cür vəsf etməsi həqiqətdə bütün dünya

---

657 Yuxarıda verildi.
658 Yuxarıda verildi.
659 Yuxarıda verildi.
660 Yuxarıda verildi.
661 Yuxarıda verildi.
662 əl-Buxari, 6416.
663 Aşağıda veriləcək.
664 Müslim, 2742.
665 İçərisində mal-qara və qoyun saxlamaq üçün ətrafı tikan və ya ağac ilə hasarlanmış üstüaçıq yer.
666 **Səhihdir**: ət-Tirmizi 2376; Əhməd, 3/456.
667 Yuxarıda verildi.

sakinlərinin halının vəsfidir. Lakin dünyada insanların bu halını Peyğəmbər görmüş, dünya əhli isə bunu görməkdə kor olmuşlar. Bir dəfə Peyğəmbər uçuq komalarını təmir edən adamların yanından ötüb keçərkən: «Düşünürəm ki, əcəl bundan sürətlidir» - demişdir.[668]

Allahın elçisi onun qapısından asılan pərdənin gətirilməsini əmr etmiş, pərdə gətirildikdə: «Bu mənə dünyanı xatırladır» - demişdir.[669] Peyğəmbər insanlara məskunlaşacağı evlərindən, övrətlərini örtəcək paltarlarından, bellərini dikəldəcək yeyəcəklərindən başqa heç bir şeyə haqları çatmadığını bildirmişdir.[670]

Peyğəmbər digər bir hədisində isə buyurur ki, cənazəni qəbrədək onun ailəsi, malı və əməlləri müşayiət edir. Ailəsi və malı qayıdır, əməlləri isə onunla qalır.[671]

Həmçinin Peyğəmbər Allahın malından haqsız olaraq nəfsinin istəyinə uyanı qiyamət günü Cəhənnəm atəşinin gözləyəcəyini xəbərdarlıq etmişdir.[672]

Allahın elçisi səhabələri üçün kasıbçılıqdan deyil, dünyadan, orada dünya uğrunda rəqabət aparmalarından və dünyanın onları əyləndirməsindən qorxduğuna and içmişdir.[673]

Allahın elçisi Adəm övladı üçün yeyib tükətdiyindən, geyib köhnəltdiyindən və sədəqə verib [axirət üçün artırdığından] başqa malı olmadığını bildirmişdir.[674]

Peyğəmbər: «Adəm övladına bu dünyadan belini dikəldəcək bir neçə loxma kifayətdir. Əgər bununla kifayətlənməsə, mədəsinin bir üçdəbirini yeməyi, digər üçdəbirini içəcəyi, sonuncu üçdəbirini isə nəfəsi üçün ayırsın»[675] - demişdir. Bu hədisdə qəlbin, bədənin, dinin və dünyanın sağlamlığı üçün bir irşad, yol göstərmə vardır.

Allahın elçisi qulun zənginliyi onun malının çox olmasında yox, qəlbinin geniş olmasında olduğunu bildirir.[676]

Allahın elçisi Allahdan onun üçün bu dünyada ona kifayət edəcək qədər ruzi diləmişdir.[677]

Allahın elçisi İslamı qəbul etdikdən sonra kifayət qədər ruzi

---

[668] **Səhihdir**: Əbu Davud, 5235, 5236; ət-Tirmizi, 2235, İbn Macə, 4160; Əhməd, 2/161; İbn Hibban, 2997; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 4030.
[669] Müslim, 2107 (88); ət-Tirmizi, 2468. Ləfz ət-Tirmizinindir.
[670] Yuxarıda verildi.
[671] Aşağıda veriləcək.
[672] Buxari, 3118.
[673] Yuxarıda verildi.
[674] Yuxarıda verildi.
[675] **Səhihdir:** "Camii əl-Ulum vəl-Hukum", səh. 611-612.
[676] əl-Buxari, 6446; Müslim, 1051.
[677] Yuxarıda verildi.

verilmiş adama qibtə etmişdir.[678]

Peyğəmbər Allahın fikri-zikri dünya olan kəsin yoxsulluğunu qarşısına məqsəd qoyacağını, onun işlərini alt-üst edəcəyini və ona əzəldən yazılmışlardan əlavə heç nəyin verilməyəcəyini bildirmişdir.[679]

Allah-taala elçisinə Məkkə vadisini onun üçün qızıl etməyi təklif etdi, Peyğəmbər isə belə cavab verdi: «Xeyr, ey Allahım! Bir gün tox, bir gün ac oluram. Acdığım zaman Sənə yalvarır və Səni zikr edirəm. Tox olduğum vaxt isə Sənə həmd və şükürlər edirəm».[680]

Peyğəmbər insanlara: «Kim ailəsindən arxayın, canı sağlam və yanında gündəlik azuqəsi olduğu halda sabahlasa, sanki dünya ona verilmişdir» - deyə xəbər vermişdir.[681]

Allahın elçisi qulun ehtiyacından artığını [Allah yolunda] xərcləməsinin onun üçün xeyir, xərcləməyi saxlamasının isə onun üçün şər olduğunu və kifayət qədər malı olduğuna görə qınanılmayacağını bildirmişdir.[682]

Allahın elçisi ümmətinə dünyada özlərindən yuxarı təbəqədə olanlara baxmağı qadağan etmiş və dünyada özlərindən aşağı təbəqədə yaşayanlara nəzər salmağı əmr etmişdir.[683]

Allahın elçisi dünyada yalnız bəlaların, fitnələrin, müsibətlərin qalacağını xəbər vermişdir. Peyğəmbər dünyanı belə vəsf etmişdir: «Dünya Adəm övladının ayaqyolunda ifraz etdiyi nəcasətə bənzəyir. Onun əvvəli xoş və ləzzətli olsa da, sonu budur [nəcasətdir]».[684]

Həmçinin Allahın elçisi Allahın [mömin] qullarının bu dünyada nemətlə mükafatlandırılmış olmadıqlarını, onların önündə Cənnət olduğu üçün bunun əvəzində dünyanın nemətləri ilə razılaşmadıqlarını xəbər vermişdir.

Allahın elçisi buyurmuşdur: «Bu ümmətin əvvəli zahidlik, iman və təqva sayəsində nicat tapacaq, sonu isə xəsislik və tamahkarlıq ucbatından həlak olacaqdır».[685]

Allahın elçisi həmişə belə deyərdi: «Allahım! Axirət həyatından başqa həyat yoxdur».[686]

---

[678] Yuxarıda verildi.
[679] **Səhihdir:** İbn Macə, 4105; Əhməd, 5/183; və s.
[680] Yuxarıda verildi.
[681] **Həsəndir:** "Şərh riyadus-Salihin", 1/570/511.
[682] Yuxarıda verildi.
[683] Yuxarıda verildi.
[684] Yuxarıda verildi.
[685] **Həsəndir:** ət-Tabərani, "əl-Əvsat", 7/332/7650; İbn Əbi əd-Dünya, "əl-Yəqin", 3.
[686] **Səhihdir:** İbn Xuzeymə, 4/260/2831; əl-Hakim, 1/465; əl-Beyhəqi, 5/45; ət-Tabərani, "əl-Əvsat", 5419; əl-Heysəmi, "Məcmuə əz-Zəvaid", 3/223; əl-Albani,

Allahın elçisi xəbər vermişdir ki, Allah-taala bir qulunu sevdiyi zaman insan xəstəsini yemək-içməkdən qoruduğu kimi O da onu dünyadan qoruyar.[687]

Osman ibn Məzun öldüyü zaman Peyğəmbər onun yanına gəldi, əyilib onu öpərək: «Ay Osman, Allah sənə rəhmət eləsin! Nə sən dünyadan götürdün, nə də dünya səndən» - deyib bu hala qiptə etdi.[688]

Allahın elçisi deyərdi ki, dünyada zahid olmaq qəlbə və bədənə rahatlıq gətirər. Ona rəğbət bəsləmək isə qəm-qüssəni daha da artırar.[689]

Həmçinin Allahın elçisi deyərdi ki, kim bütün qəm-qüssələri bir qəm-qüssə etsə, Allah-taala onun digər qəm-qüssələrinə bəs edər. Kimin də dünya işlərində qəm-qüssəsi müxtəlif olsa, hansı vadidə həlak olursa olsun, Allah ona məhəl qoymaz.[690]

Allahın elçisi buyurur: «Qiyamət günü dünyada ən çox ağgün görmüş, kef çəkmiş insanı gətirəcəklər. Allah-taala onu bircə dəfə Cəhənnəm atəşinə salıb çıxarmağı əmr edəcək, sonra isə onu salıb çıxartdıqdan sonra Allahın hüzuruna gətirəcəklər. Allah ondan: «Ey Adəm oğlu! Sən həyatında ağgün gördünmü, gözlərin qürrələndimi, şadlıq yaşadınmı?» - deyə soruşacaqdır. O da: «And olsun Sənin izzətinə ki, görmədim» - deyə cavab verəcəkdir. Allah-taala onu yenidən Cəhənnəmə qaytarmağı əmr edəcəkdir. Sonra dünyada ən çox əzab-əziyyətlər çəkmiş, müsibətlərə düçar olmuş adamı gətirəcəklər. Uca və ulu Allah onu bircə dəfə Cənnətə salıb çıxarmağı əmr edəcək, sonra isə onu Allahın hüzuruna gətirəcəklər. Allah ondan: «Ey Adəm oğlu! Sən həyatında heç istəmədiyin əzab-əziyyətlər gördünmü?» - deyə soruşacaqdır. O da: «And olsun Sənin izzətinə ki, görmədim» - deyə cavab verəcəkdir».[691]

İmam Əhmədin zahidlik fəslində Musanın qurtuluşu haqqında İsmayıl ibn Abdulkərim ibn Muqildən, o da Abdussaməd ibn Muqildən, o da Vəhb ibn Munəbbihdən belə rəvayət etmişdir: «Allah-taala Musa ilə Harunu Fironun yanına göndərdikdə onlara belə demişdi: "Onun zinəti və ləzzət aldığı şeylər sizi təəccübləndirməsin, gözlərinizi buna dikməyin. Çünki bunlar dünya həyatının cah-calalı və azmış insanların zinətidir. Mən istəsəm sizi Fironu aciz qoyacağı zinətlə bəzəyərdim. Lakin mən dünyanın bu nemətlərini sizə vermək

"əs-Səhih", 5/180-181.

687 Yuxarıda verildi.

688 **Zəifdir:** Əhməd, "əz-Zühd", səh. 17; Əbu Nəim, "əl-Hilyə", 1/105.

689 **Zəifdir:** İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 131.

690 **Həsəndir:** İbn Macə, 257, 4106; əl-Albani, "Səhih əl-Cami'i əs-Sağir", 6189.

691 Müslim, 2807. Ənəsin rəvayəti.

istəmirəm və onu sizdən uzaq edirəm. Övliyalarım üçün də hələ qədimdən bunu seçdim. Mən onları bu dünyanın nemətlərindən və ağgünündən rəhmdil bir çobanın öz qoyunlarını təhlükəli bir otlaqdan qoruduğu kimi qoruyuram. Mərhəmətli bir çobanın dəvələrini təhlükəli otlaqlarda otarmaqdan uzaq tutduğu kimi Mən də dostlarımı dünya nemətlərindən uzaq tuturam. Bu onların Mənim yanımda dəyərsiz olduqları üçün deyildir. Əksinə, bunu axirətdə Mənim səxavətimdən öz paylarını tam almaları, dünyanın və nəfslərinin onları azdırmamaları üçün belə edirəm. Bilin ki, dünyada qullarım Mənim üçün zahidlikdən daha böyük bir zinətlə zinətlənməmişdir. Bu, müttəqilərin zinətidir. Onların əynində sükunət və mütilik libası olacaqdır ki, onlar bununla tanınacaqlar. Simaları səcdə izlərindən üzlərindədir. Onlar həqiqətən də mənim dostlarımdır. Onlarla qarşılaşdığın zaman qanadlarını onların ayağı altına sər, qəlb və dilinlə onlara qarşı mülayim davran"».[692]

İmam Əhməd Avn ibn Cabirdən, o da Məhəmməd ibn Davuddan, o da atasından, o da Vəhbdən belə rəvayət edir: «Həvarilər İsaya: "Qorxuları və üzüntüləri olmayan Allahın dostları kimlərdir?" - deyə soruşdular. İsa isə belə cavab verdi: "İnsanlar dünyanın zahirinə baxdığı zaman onlar batininə baxanlardır. Övliyalar, onları öldürməkdən qorxduqları dünya malını öldürənlərdir. Övliyalar, onları tərk edəcəyini bildikləri dünyanı tərk edənlərdir. Dünya malından çox azına qane olmuşlar. Onların yalnız fikri-zikri dünya malından əl çəkmək olmuşdur. Dünyadan əldə etdiklərinə sevinməyib üzülmüşlər. Dünyaya nail olmaq üçün onlara qarşı çıxanları inkar etmişlər. Dünyada haqsız olaraq yüksələnləri alçaltmışlar. Dünya onlar üçün köhnəlsə də, onu yeniləşdirməmişlər, dünya aralarında xarab olsa da, onu təmir etməmişlər. Dünya onların qəlblərində ölü olsa da, onu diriltməmişlər, əksinə, onu daha da darmadağın edib yerində axirətlərini ucaltmışlar. Dünyanı satıb onun yerinə əbədi olanı almışlar. Dünyanı tərk etdiklərinə gorə sevinmişlər. Dünya əhlinin yerə sərilmiş və işkəncəyə məruz qaldığını görüb daim Allahı zikr etmiş və həyatın zikrini öldürmüşlər. Çünki onlar Allahı və Onun zikrini sevirlər. Allahın zikri ilə üzləri parlayıb və nur saçmışlar. Onlar üçün heyranqoyucu xəbər olduğu kimi onların yanında da heyranedici xəbər vardır. Allahın kitabı onlarla, onlar da Allahın kitabıyla dirçəlmişlər. Allahın kitabı onlarla, onlar da Allahın kitabıyla danışmışlar. Kitab onların sayəsində öyrənilmiş, onlar da Kitabla hərəkət etmişlər. Nail olduqlarını Allahdan görmüşlər. Allahın rəhmətinə bel bağlayarkən əzabından da

[692] Əhməd, "əz-Zühd", səh. 79-83.

arxayın olmamışlar. Allahın əzabından çəkinərkən mərhəmətindən də əllərini üzməmişlər"».[693]

Ruh Süleyman ibn Muğirədən, o da Sabitdən belə rəvayət edir: «Məryəm oğlu İsaya: "Ey Allahın elçisi! Bəlkə ehtiyacınız üçün minəcək bir ulaq götürəsiniz" - dedilər. Belə cavab verdi: "Mən Allahı sevirəm. Onun üçün də Allah mənə başımı qatacaq bir şey verməz".[694] Sonra İsa belə buyurdu: "Xəzinələrinizi Allah yolunda sədəqə verin! Çünki insanın qəlbi xəzinəsinin yanındadır.[695] Dünya malının artıqlığından çəkinin! Çünki dünya malının artıqlığı Allah yanında əzabdır[696]. Ey İsrail övladları! Evlərinizi qonaq evləri kimi edin. Bu dünyada sizlər üçün mənzil yoxdur. Çünki siz yolçusunuz". İsa üzünü həvarilərə tutub: "Ey həvarilər! Sizlərdən hansı dəniz dalğası üzərində ev tikə bilər?" - deyə soruşdu. Onlar da: "Ey Allahın ruhu! Bunu kim bacara bilər?!" - deyə təəccüblə cavab verdilər[697]. İsa belə dedi: "Dünyadan həzər edin! Onu qərar tutmaq üçün götürməyin! Firdous cənnətinə düşmək istəyənin buğda çörəyi yeməsi, şirin su içməsi, itlərlə bərabər zibilliklərdə yatması belə çoxdur"».[698]

Əhməd Bəhzdən, o da Əmaşdan, o da Xeysəmdən belə rəvayət etmişdir: «İsa şiddətlə dedi: "Zəngin Cənnətə girməz. Dünyanın şirinliyi axirətin, axirətin şirinliyi isə dünyanın acısıdır.[699] Ey İsrail oğulları! Dünyaya məhəl qoymayın ki, sizin qarşınızda alçaq olsun. Dünyaya alçaq nəzərlə baxın ki, axirət sizin üçün hörmətli olsun. Dünyaya hörmət etməyin ki, axirət sizin yanınızda alçaq olsun! Dünya hörmətə layiq deyildir və o hər fitnəyə və itkiyə səsləyir"».

İshaq ibn Hani ona verilən suallara belə cavab verdi: «Mən Əbu Abdullahın evindən çıxarkan o, Həsənin belə dediyini söylədi: "Dünyaya alçaq gözlə baxın. Allaha and olsun ki, dünyanın ən xoşbəxt anı ona alçaq gözlə baxıldığı zamandır. Allaha and olsun ki, günəşin doğub-batmasına əhəmiyyət vermirəm". Əbu Abdullah mənə: "Ay İshaq, dünya uca və böyük Allah dərgahında nə qədər alçaqdır. Onun azı faydalı, çoxu isə faydalı deyildir" - dedi».[700]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, dünya sevgisinin bütün xataların başı və özəyi olması barədə sələfdən mütəvatir rəvayət vardır. Bu rəvayət mərfu isnadla gəlsə də,

---

[693] Əhməd, "əz-Zühd", səh. 78.
[694] Əhməd, "əz-Zühd", səh. 73.
[695] Əhməd, "əz-Zühd", səh. 74.
[696] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 215; İbn əl-Mübarək, "əz-Zühd", 848.
[697] Yuxarıda verildi.
[698] Yuxarıda verildi.
[699] Yuxarıda verildi.
[700] İbn Həni, "Məsəil", 2/180-181.

hədis olması isbat edilməmişdir. Lakin bu fikir İsadan rəvayət olunur.

Abdullah ibn Əhməd Ubeydullah ibn Ömərdən, o da Muaz ibn Hişamdan, o da atasından, o da Bədil ibn Meysərdən, o da Cəfər ibn Xərfaşdan Məryəm oğlu İsanın belə deməsini rəvayət edir: «Xataların başı dünya sevgisidir. Qadınlar şeytanın tələsi, şərab isə bütün şərin toplayıcısıdır».[701]

İmam Əhməd Ömər ibn Səid Əbu Davuddan, o da Sufyandan belə rəvayət edir: «Məryəm oğlu İsa: "Dünya sevgisi hər bir xatanın özəyidir. Malda çoxlu dərdlər vardır" - dedi. Ondan: "Malın xəstəliyi nədir?"- deyə soruşduqda: "Mal sahibi lovğalıqdan və təkəbbürlükdən salamat ola bilmir" - deyə cavab verdi. Yanındakılar: "Əgər bunlardan salamat olsa, onda necə?" - dedikdə: "Başın mala qarışması onu uca və böyük Allahın zikrindən yayındırar"- deyə cavab verdi».[702]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, dünya sevgisinin xataların özəyi olması təcrübədən və müşahidədən məlumdur. Çünki dünya sevgisi aşkar və gizli günaha çağırır. Xüsusilə də, elə günahlar vardır ki, onların işlənməsi dünya sevgisindən irəli gəlir. Dünya sevgisi aşiqini elə sərxoş edər ki, aşiqi həmin günahları və pislikləri etməkdən, onlardan uzaqlaşmaqdan yaxasını qurtara bilmir. Dünya sevgisi aşiqini ilk öncə şübhələrə salır, sonra pisliklərə bulaşdırır, daha sonra isə haram işlər görməyə vadar edir. Çox vaxt isə onu küfrə gətirib çıxarır. Hətta peyğəmbərlərini təkzib edən bütün ümmətləri küfrə və məhvə sürükləyən dünya sevgisi oldu. Allahın elçiləri onlara şirki və dünyanı qazandıqları böyük günahları qadağan etdikdə dünya sevgisi onları peyğəmbərlərə müxalif olmağa və onların söylədiklərini təkzib etməyə təhrik etdi. Yer üzərindəki hər bir günahın özəyi dünya sevgisidir. Hələ qədimdə Adəmlə Həvvanın etdiyi günahları unutma! Unutma ki, onları buna sövq edən dünyada əbədilik sevgisidir. İblisin günahını unutma! Unutma ki, onu da buna vadar edən sevgisi dünya sevgisindən də pis olan ağalıq sevgisi idi. Ağalıq sevgisi ucbatından Firon, Həman, onların qoşunları, Əbu Cəhl, ətrafındakılar və yəhudilər kafir olmadılarmı?! Cəhənnəmi öz əhli ilə dolduran məhz dünya və ağalıq sevgisidir. Dünyada zahid və vəzifə hərisi olmamaq Cənnəti öz əhli ilə dolduracaqdır. Dünya sevgisinin sərxoşluğu şərabın sərxoşluğundan olduqca pisdir. Dünya sevgisindən sərxoş olanlar isə bundan yalnız qəbrin zülmətində oyanacaqlar. Əgər bu dünyada onun gözlərindən pərdələr qalxsaydı, bu sərxoşluqda nələrin olduğunu və bunun şərab sərxoşluğundan nə qədər ağır

[701] Abdullah bin Əhməd, "Zəvaid əz-Zühd", səh. 117.
[702] Əhməd, "əz-Zühd", səh. 117.

olduğunu mütləq bilərdi. Dünya ağılları ən böyük sehirlə sehirləyər.[703]

İmam Əhməd Səyyardan, o da Cəfərdən, o da Malik ibn Dinardan belə deməsini rəvayət edir: «Sehrbazdan qorxun, sehrbazdan qorxun. Çünki o, alimlərin qəlblərini sehr edir».

Yəhya ibn Muaz ər-Razi belə deyir: «Dünya şeytanın şərabıdır. Kim ondan sərxoş olsa, yalnız ölülər ordusu və xəsarətə uğramışlar arasında olduqda peşman olaraq ayılacaqdır».

Dünya sevgisi ən azı Allahı sevməkdən və Onu zikr etməkdən yayındırır. İnsanın malı onu Allahın zikrindən yayındırarsa, o xəsarətə uğrayanlardandır. Əgər insanın qəlbi onu Allahın zikrindən uzaqlaşdırarsa, şeytan həmin qəlbdə özünə yer tapıb onu istədiyi istiqamətə dəyişər və şeytan şəri gözəl bildiyi üçün ona bəzi yaxşı əməlləri görməyə razılıq verməklə ona bu dünyada yaxşı işlər gördüyünü göstərər. Lakin insanın qəlbi dünyanın qulu olmuşdur. Axı bir kimsənin qəlbi dünya malının qulu olduğu bir halda, o necə yaxşı işlər görə bilər?! Allahın elçisi belələrini lənətləmiş və bəd dualar oxumuş və belə demişdir: «Dinar və dirhəmin quluna lənət olsun!»[704]. Bir rəvayətdə isə belə buyurur: «Dinar və dirhəmin qulu həlak olsun! Versən razı qalar, verməsən qəzəblənər».[705]

Bu Allahın elçisi tərəfindən dünyanın köləliyi barədə gələn açıqlamadır. Dünya bütünlüklə Peyğəmbərə təklif edilmişdir. Lakin Peyğəmbər onu iki əli ilə sinəsindən vurub geri itələmişdir. Sonra səhabələrə gəlmiş, onlardan qəbul olunmasını istəsə də, səhabələr bir Peyğəmbərin yolu ilə getmiş və onu özlərindən uzaqlaşdırmışlar. Lakin bunlar azdır. Bir qismi isə dünyadan: «Səndə nə var?» - deyə soruşmuşlar. O da: «Halal, şübhə, məkruh və haram» - deyə cavab vermişdir. Onlar: «Bizə halalını gətir. Başqalarına ehtiyacımız yoxdur» - deyib halalını götürmüşlər. Sonra dünya səhabələrdən sonra gələnlərin qarşısına çıxıb onu qəbul etmələrini istəmişdir. Onlar da halalını istəsələr də, bunu ala bilməmişlər. Sonra məkruhunu və şübhələrini istəmiş və onu da almışlar. Sonra dünya onlardan sonra gələnlərin qarşısına çıxıb onu qəbul etmələrini istəmişdir. Onlar dünyadan məkruh və şubhələrini istəmiş, dünya isə: «Onu sizdən əvvəlkilər götürdü» - deyə cavab vermişdir. Onlar da: «Onda haramını gətir» - demiş və onu götürmüşlər. Onlardan sonra gələnlər dünyadan haramı istəmişlər, dünya isə onlara: «Haram zalımların əlindədir. Zalımlar haramı sizlərin üzərində özlərinə əsir

---

[703] Əhməd, "əz-Zühd", səh. 387.

[704] **Zəifdir:** ət-Tirmizi, 2375; Əbu Hureyrənin rəvayətidir. ət-Tirmizi həsən və qərib desə də mən deyirəm ki, sənədi zəifdir.

[705] əl-Buxari, 2886, 6435, Əbu Hureyrənin rəvayəti.

etdilər» - deyə cavab vermişdir. Onlar da necə olursa olsun, harama nail olmaq üçün yollar axtarmağa başlamışlar. Günah əhlindən olan bir əlini uzadıb haramdan nə isə götürmək istəyərkən ondan daha çox günah sahibi və daha güclü bir nəfər onu qabaqlamışdır. Dünyada bütün insanlar qonaqdırlar. Onların əllərində olanlar isə borcdur. İbn Məsudun dili ilə desək: «Bu dünyada yaşayan hər kəs qonaq, malı isə əmanətdir. Qonaq gedər, əmanət isə sahibinə qaytarılar».[706]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, dünya sevgisi bütün günahların başı olub bir neçə aspektdən dinə xələl gətirir.

**Birincisi,** ondan ibarətdir ki, dünyaya məhəbbət dünyanı uca tutmağı tələb edir. Bu da Allah dərgahında mənfur əməldir və Allahın təhqir etdiyi bir şeyin şanı uca tutulması ən böyük günahlardandır.

**İkincisi,** odur ki, Allah-taala dünyada Onun üçün olanlar istisna olmaqla dünyanı lənətləmiş və ona nifrət etmişdir. Kim Allahın lənətlədiyi bir şeyi sevmiş olsa, fitnəyə və Allahın nifrət və qəzəbinə düçar olmuş olar.

**Üçüncüsü,** isə ondan ibarətdir ki, bir kimsə dünyanı sevmiş olsa, onu özü üçün başlıca məqsəd edir, Allah-taalanın Ona və axirətə qovuşması üçün verdiyi vəsilələri dünya uğrunda özünə vəsilə edər.

Burada iki məsələ vardır. Birincisi vəsilənin qarşıya məqsəd olaraq qoyulmasıdır. İkincisi isə axirət üçün nəzərdə tutulmuş əməlləri dünya üçün vəsilə etməkdir. Bu da hər cəhətdən günah və son dərəcə yanlış bir hərəkətdir.

**«Kim** [axirətdən vaz keçib] **dünyanı və onun bərbəzəyini istəyirsə, Biz ona əməllərinin əvəzini** [sağlamlıq, sərvət, övlad, gözəl yaşayış] **elə orada** [dünyada] **verərik. Onların dünyadakı mükafatları əsla azaldılmaz.** [Dünyada yaxşı işlər görüb etiqadı olmayan şəxsə axirətdə dünyəvi əməlləri heç bir fayda verməz. Çünki Allah ona dünyadakı yaxşı əməllərinin əvəzini elə dünyanın özündə verər]. **Belələrini axirətdə atəşdən** [cəhənnəm odundan] **başqa heç bir payı yoxdur. Onların dünyada gördükləri işlər puç olar və bütün əməlləri boşa çıxar!»** (Hud, 15, 16);

**«Hər kəs fani dünyanı istəsə, dilədiyimiz şəxsə istədiyimiz neməti orada tezliklə verərik. Sonra isə** [axirətdə] **ona Cəhənnəmi məskən edərik. O,** [Cəhənnəmə] **qınanmış,** [Allahın mərhəmətindən] **qovulmuş bir vəziyyətdə daxil olar!»** (əl-İsra,18);

**«Biz axirət qazancını** [savabını] **istəyənin qazancını artırar, dünya mənfəəti istəyənə də ondan verərik. Onun axirətdə heç bir payı yoxdur»** (əş-Şura, 20).

---

[706] əl-Beyhəqi, "Şuabul-İman", 7/376/10644.

Bu ayələrin üçü də bir-birinə bənzəyir və bir mənaya dəlalət edir. Belə ki, kim əməli ilə dünya və onun zinətini Allahı və axirəti istəmədən dilərsə, ona dilədiyi veriləcək. Bu onun nəsibidir və bundan başqa onun nəsibi yoxdur.

Allah elçisindən nəql olunan bir çox hədislər vardır ki, bu ayə ilə uyğunluq təşkil edir və bu ayəni daha da açıqlayır. Bu barədə Əbu Hüreyrənin rəvayət etdiyi bir hədisdə belə deyilir: «Qiyamət günü Cəhənnəm atəşi üç sinif insanlarla alışdırılacaqdır. Bunlar əməlləri ilə dünya və dünya malını istəyən döyüşçülər, sədəqə verənlər və qarilərdir[707]». Hədisi Müslim rəvayət etmişdir.[708]

Nəsai Əbu Ümamədən belə rəvayət edir: «Bir kişi Allah elçisinin hüzuruna gəlib: "Ey Allahın elçisi! Mükafat və ad-san uğrunda döyüşən bir insan üçün (axirətdə mükafat olaraq) nə vardır?" - soruşdu. Allahın elçisi də: "Onun üçün heç bir şey yoxdur" - deyə cavab verdi. Kişi sualını üç dəfə təkrarladı, hər dəfəsində də Allah elçisindən: "Onun üçün heç bir şey yoxdur" - cavabını aldı. Sonra Peyğəmbər: "Həqiqətən, Allah-taala yalnız ixlasla və onun rizası üçün edilən əməlləri qəbul edər" - buyurdu»[709]. Hədisdə qeyd olunan bu döyüşçü mükafat əldə etmək və ad qazanmaq uğrunda döyüşdüyünə görə əməli Allah rizası üçün olmamışdır. Buna görə də onun mükafatı və əməli puç olmuşdur.

İmam Əhməd Əbu Hüreyrədən rəvayət edir ki, bir kişi Allah elçisinin hüzuruna gəlib: «Ey Allahın elçisi! Biri Allah yolunda döyüşmək istəyir, eyni zamanda bununla dünyanı da umur» - dedi. Allahın elçisi də ona: «Onun üçün heç bir savab yoxdur» - dedi. Bu cavab insanlara çox ağır təsir bağışladı və onlar həmin adama: «Sualı bir də təkrar et, ola bilsin ki, Peyğəmbər sualı başa düşməyib» - dedilər. O da: «Ey Allahın elçisi! Biri Allah yolunda döyüşmək istəyir, eyni zamanda bununla dünyanı da umur» - deyə sualı ikinci dəfə təkrarladı. Allahın elçisi yenə də: «Onun üçün heç bir savab yoxdur» - dedi. Kişi sualı üçüncü dəfə təkrarladıqda Allahın elçisi eyniylə yenə də: «Onun üçün heç bir savab yoxdur» - dedi».[710]

İmam Əhməd və Nəsai Ubadə ibn Samitdən Allah elçisinin belə deməsini rəvayət edirlər: «Kim Allah yolunda yalnız bir iqal[711]

---

707 Quran oxuyan.

708 Təhqiqi yuxarıda verilmişdir.

709 **Həsəndir:** ən-Nəsai, 6/35; Hafiz əl-İraqi "əl-Muğni"də (4/328) həsən demişdir. Hafiz İbn Həcər əl-Əsqalani, "Fəth əl-Bari", 6/35; əl-Albani, "əs-Səhih", 52.

710 **Həsəndir:** Əbu Davud, 2516; Əhməd, 2/290, 366; İbn Hibban, 4637; əl-Hakim, 2/85; əl-Beyhəqi, 9/169.

711 Heyvanların bağlanıldığı ip.

qazanmaq niyyəti ilə döyüşsə, ona ancaq niyyət etdiyi şey veriləcəkdir».[712]

"Müsnəd" və "Sünən"də Yəla ibn Münəbbihdən belə deməsi rəvayət olunur: «Allahın elçisi məni qoşunun tərkibində göyüşə göndərərdi. Bir dəfə məni yenə bu tərkibdə döyüşə çağırdı. Qatır minmiş bir kişi var idi. Ona: "Peyğəmbər məni döyüşə göndərir, sən mənim yerimə get" - dedim. O da: "Bunun üçün mənə (qənimətindən) üç dinar təyin etməlisən" - dedi. Mən də təyin etdim. Döyüşdən qayıtdıqda əhvalatı Allah elçisinə danışdım. Peyğəmbər də: "Onun üçün bu döyüşdə dünya və axirət mükafatı olaraq üç dinardan başqa heçnə yoxdur" - dedi».[713]

Əbu Davudun rəvayət etdiyinə görə Abdullah ibn Ömər belə demişdir: «Ey Allahın elçisi! Mənə cihad və savaşdan xəbər ver?» Allahın elçisi də: «Ey Ahdullah! Səbir edərək və savabını umaraq döyüşsən, Allah-taala səni səbir edən və savabını uman bir insan kimi dirildəcək. Riyakarlıq və gəlir üçün döyüşsən, Allah səni riyakar və var-dövlət hərisi kimi dirildəcək. Ey Abdullah ibn Ömər! Hansı vəziyyətdə döyüşsən və ya öldürülsən, Allah-taala səni həmin vəziyyətdə də dirildəcəkdir».[714]

İmam Əhməd və Əbu Davud Əbu Eyyubdan Allah elçisinin belə deməsini rəvayət edir: «Sizə bir çox şəhərlər fəth ediləcək və ora çoxlu hərbi dəstələr göndəriləcəkdir. Aranızdan bir nəfər bu qoşunda getmək istəməyəcək və yoldaşları arasından çıxıb qaçacaqdır. Sonra özünü qəbilələrə göstərib: "Kim məni bu qoşunda öz yerinə muzdlu əsgər tutar?" - deyəcəkdir. Eşidin! Bu muzdlu sonda damla qanınadək muzdludur».[715]

Görün dünya sevgisi bu mücahidi savabdan necə məhrum etdi, onun əməlini necə heç etdi və necə onu Cəhənnəmə ilk daxil olanlardan etdi.

**Dördüncüsü,** dünya sevgisi bəndə ilə axirətdə ona faydası toxunacaq əməl arasına girib öz sevgisi ilə bəndəni o əməllərdən yayındırar. Bu məsələdə insanlar müxtəlif pillələrdə dayanırlar. Dünya sevgisi bir çox insanları imandan və dini ayinlərə riayət etməkdən sapındırır. Bəzi insanlar dünya sevgisi ucbatından Allahın onlara və bütün məxluqatına fərz buyurduğu vacibatlardan yayınar,

---

[712] **Həsəndir:** ən-Nəsai, 6/24; Əhməd, 5/315, 320; Abdullah bin Əhməd, "Zəvaid əl-Müsnəd", 5/329; əd-Darami, 2/208; İbn Hibban, 4638; İbn Əbi Asim, "əl-Cihad", 260; əl-Hakim, 2/109; əl-Beyhəqi, 2/331.

[713] **Səhihdir:** Əhməd, 4/223; ət-Tabərani, "əl-Kəbir", 18/65/146, 22/213/667; əl-Hakim, 2/109; əl-Beyhəqi, 9/29.

[714] **Zəifdir:** Əbu Davud, 2519.

[715] **Zəifdir:** Əbu Davud, 25254; Əhməd, 5/413; əl-Beyhəqi, 9/27.

onları nə gizli nə də aşkar yerinə yetirməzlər. Dünya sevgisi bəzi insanları isə bir çox vacibatlardan uzaqlaşdırmışdır. Dünya sevgisi bir çox insanları onun əldə edilməsinə zidd olan vacibatları yerinə yetirməkdən uzaq edir. Dünya sevgisi bir çoxlarını vacibatları vaxtında və layiqli şəkildə yerinə yetirməkdən yayındırır və onları bu vacibatların vaxtı və ya düzgünlüyündə azdırır. Dünya sevgisi bir çox insanları vacibatları yerinə yetirərkən qəlbən Allaha olan mütilikdən və qəlbin Allah üçün boşaldılmasından yayındırır. Qəlb Allah üçün boş olmadığından insan ibadəti daxilən Allaha bağlanaraq yox, zahirən yerinə yetirir. Onda bu insan hara, dünya aşiqləri hara! Dünya aşiqləri arasında Allaha daxilən deyil, zahirən ibadət edənlərə belə, nadir hallarda rast gəlmək olar. Dünya sevgisinin ən aşağı dərəcəsi bəndəni səadətdən məhrum etməsidir. Bu səadət isə qəlbin Allah sevgisi, dilin isə Allahın zikri üçün boşaldılıb bunların Allah üçün birləşdirilməsidir. Dünya eşqi axirətə, axirət sevgisi isə mütləq dünyaya zərər vurur. Belə ki, mərfu isnadla rəvayət olunun bir hədisdə belə deyilir: «Kim dünyasını sevsə, axirətinə, kim də axirətini sevsə, dünyasına zərər vurmuş olar. Bu halda əbədini fanidən üstün tutun».[716]

**Beşincisi,** dünya sevgisi bəndə üçün ən böyük bəladır. Tirmizi Ənəs ibn Malikdən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Kimin ən böyük dərdi axirət olsa, Allah onun qəlbini geniş edər, işlərinin alt-üst olmasının qarşısını alar və dünya zəlil bir halda onun ayağına gələr. Kimin də ən böyük dərdi dünya olsa, Allah-taala onun yoxsulluğunu qarşısına məqsəd qoyar, onun həyatını alt-üst edər və dünyadan yalnız ona əvvəlcədən müəyyən olunmuş şeylər verilər».[717]

**Altıncısı,** insanlar ən şiddətli əzaba dünya sevgisinə görə və üç yerdə düçar olacaqlar. Birincisi, bu dünyada onu əldə etdiyinə, əldə edərkən göstərdiyi səyə və bunun uğrunda insanlarla apardığı münaqişəyə görədir. İkincisi, qəbir evində dünya kimi bir fürsəti əldən qaçırdığına və bunun üçün çəkdiyi peşmançılığa görədir. Heç vaxt qovuşması mümkün olmayan bir şəkildə onunla sevdiyinin arası qarışmış və sevdiyinin əvəzini heç bir şey verməmişdir. Budur qəbir evindəki insanların ən şiddətli əzabı! Ən zəhərli ilanın və əqrəbin insan bədənini zəhərləməsi kimi dərd, qəm, hüzn, həsrət də insanın ruhunu zəhərləyir.

İmam Əhməd İsmayıl ibn Abdulkərimdən, o da Abdussaməd ibn Muqildən Vəhb ibn Münəbbihdən rəvayət edir ki, Buxtunnəsrin

---

[716] **Zəifdir:** Əhməd, 4/412; İbn Hibban, 709; əl-Hakim, 4/308, 319; əl-Beyhəqi, "Şuabul-İman, 10337, "əs-Sünən əl-Kubra", 3/370, "əz-Zühd əl-Kəbir", səh. 102-103; "əl-Ədəb", 1132; əl-Bəğəvi, "Şərh əs-Sünnə", 4038.
[717] **Səhihdir:** İbn Macə, 4105; Əhməd, 5/183.

əsir aldığı Hezekiel uzun bir hədisin sonunda belə deyir: «Fərat çayının kənarında yatırdım. Bir mələk gəlib başımdan tutaraq məni yerin dərinliyinə gətirdi. Orada döyüş gedirdi. Bir də gördüm ki, orada quşların və vəhşi heyvanların ətini və oynaqlarını parçaladığı on min ölü var. Allah-taala mənə: "İnsanlar öldükdə və ya öldürüldükdə Məndən və qüdrətimdən qaçıb canlarını qurtaracaqlarını iddia edərək düşünürlər. Onları səslə!" - dedi. Mən də onları çağırdım, Bir də gördüm ki, hər sümük ayrıldığı oynağına doğru gedir. İnsan öz dostunu oynağından ayrılmış sümüyün oynağını tanıdığı kimi tanıya bilməz. Nəhayət sümüklər bir-birinə birləşdi. Sonra üzərində ət bitdi. Sonra ətin üzərində damarlar bitdi, daha sonra dəri yayıldı. Mən bütün bunlara tamaşa edirdim. Sonra Allah mənə: "İndi isə onların ruhlarını çağır" - deyə əmr etdi. Mən də ruhları çağırdım. Bir də gördüm ki, ayrılmış olan hər bir ruh öz cəsədinə doğru qaçır. Onlar dirilib oturduqda: "Siz harada idiniz?" - deyə soruşdum. Onlar da bele cavab verdilər: "Biz ölüb dünyadan ayrıldığımız zaman bir mələk gəlib: "Əməllərinizə gəlin, savablarınızı alın. Bizim sizin, sizdən əvvəlkilərin və sizdən sonrakıların haqqında yolumuz belədir" — dedi, sonra bizim əməllərimizə baxdıqda bizim bütlərə ibadət etdiyimizi gördü. Qurdları üstümüzə buraxdı. Ruhlarımız ağrı hiss etməyə başladı. Sonra canımıza dərd saldı cəsədlərimiz əzab çəkməyə başladı. Sən bizi çağırana kimi bu əzabı çəkirdik"»[718]

Dünya aşiqi rahatlıq tapa bilmir. «Bütlərə ibadət edirdik» - cümləsindən aydın olur ki, pula və bütə ibadət eyni hökm altındadır. Dinarın da dirhəmin də qulu həlak olsun! Peyğəmbərimiz belə demişdir.

Bütün bunlardan məlum olur ki, dünya aşiqi həm qəbir evində, həm Rəbbi ilə görüşəcəyi gün əzab çəkəcəkdir. Bu barədə Allah-taala Quranda belə buyurur: **«**[Ya Peyğəmbərim! Münafiqlərin] **nə malları, nə də oğul-uşağı səni təəccübləndirməsin. Allah onlarla ancaq münafiqlərə dünyada əzab vermək, kafir olduqları halda, canlarını almaq istər»** (ət-Tövbə, 55).

Sələfdən bəziləri deyirlər ki, Allah-taala onlara dünya malını yığdıqlarına görə əzab verər, onu sevdiklərinə görə və onda Allahın haqqını vermədikləri üçün kafir olaraq canları çıxar.

**Yeddinci,** Dünyanı axirətdən üstün tutaraq onun aşiqinə çevrilən insan məxluqatın ən səfeh və ağılsızlarından hesab olunur. Çünki bu qəbildən olan insanlar həqiqəti qoyub xəyalı, oyanışı qoyub yuxunu, davamlı neməti qoyub müvəqqəti kölgəni və əbədi həyatı

---

[718] Əhməd, "əz-Zühd", səh. 104.

qoyub fani dünyanı götürmüşlər. Onlar bolluq içində olan əbədi bir həyatı yuxu, yaxud da müvəqqəti kölgəyə bənzər bir həyata satırlar. Ağıllı insan bu cür şeylərə aldanmaz. Bir dəfə bir bədəvi ərəb bir yerə qonaq gəlir. Həmin yerin camaatı onu yedizdirib içizdirirlər. Sonra bədəvi bir yerdə çadır qurub onun kölgəsi altında yatır. Günəşin başına vurmasından oyanmış və belə demişdir: «Ən böyük dərdi dünya olan, sözsüz ki, aldadıcı iplə ondan yapışmışdır».

Bəzi sələflər aşağıdakı bu beyti misal çəkərdilər: «Ey fani dünya ləzzətlərinə düşkün olanlar, müvəqqəti kölgəyə aldanmaq yalnız və yalnız axmaqlıqdır».

Yunus ibn Abduləla belə deyir: «Mən dünyanı yuxusunda xoşuna gələn və gəlməyən şeylər görən və bu zaman birdən ayılan adama bənzədirəm».[719]

İbn Əbi Dünya Əbu Əli ət-Taidən, o da Əbdürrəhman əl-Buxaridən, o da Leysdən belə rəvayət etmişdir: «Məryəm oğlu İsa dünyanı üzərində hər cür zinət olan qoca qarı surətində gördü. Ondan: "Neçə dəfə ərə getmisən?" deyə soruşdu, o da: "Saysız dərəcədə" - deyə cavab verdi. İsa: "Onların hamısı öldü, yoxsa səni boşadılar?" - deyə soruşdu. Qarı: "Hamısını mən öldürmüşəm" - deyə cavab verdi. İsa: "Sənin qalan ərlərin necə də bədbəxtdirlər. Axı necə onlar sənin bir-bir öldürdüyün keçmiş ərlərindən ibrat almır və səndən həzər etmirlər"- dedi».[720]

Şer parçası:

Lüti-üryan və ac olmalarına baxmayaraq dünyadan bezməyən bədbəxt insanları görürəm. Sevilən dünyanı bir anda dağılan yay buluduna oxşadıram.

Dünyaya ən çox bənzəyən kölgədir. Onu mövcud bir həqiqət hesab edirsən. Lakin o dağılmaqda və yığılmaqdadır. Onu təqib etsən, çatarsan, lakin ona qoşula bilməzsən. Dünyaya ən çox bənzəyən şeylərdən biri də ilğımdır. Susamış insan onu su hesab edir. Ona yaxınlaşdıqda isə heç bir şey tapa bilmir. Onun yanında Allahı rast gəlir, Allah da onun hesabını verir. Həqiqətən, Allah haqq-hesabı tez görəndir. Həmçinin dünyaya ən çox bənzəyən şeylərdən biri də yuxudur ki, insan yuxuda istədiyi və istəmədiyi şeylər görür, ayıldıqda isə bunların heç birinin həqiqət olmadığını anlayır. Dünyaya ən çox bənzəyən şeylərdən biri də qoca, kifir, ərlərinə qarşı qəddar, ərə getmək üçün hər bir zinətlə bəzənmiş və bütün eybəcərliklərini örtmüş qadındır. Yalnız onun xarici görünüşünə aldanıb onunla evlənmək istəyənə: «Mənim mehrim yalnız axirəti nəqd olaraq verməndir. Biz bir kişinin iki arvadıyıq, bir araya

[719] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 249.
[720] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 27.

gəlməyimizə izn yoxdur və ikimiz bir kimsəyə mübah deyilik». Onunla evlənmək istəyənlər dünyaya üstünlük verər və: «Sevgilisinə qovuşmaq istəyənə günah yoxdur» - deyərlər. Başındakı şalı və əynindəki tumanı açıldığı zaman onun bütün eybəcərlikləri üzə çıxar. Kimisi onu tez boşayıb rahatlayar, kimisi də onunla qalmağa üstünlük verər. Zifaf gecəsi qurtarmamış bağırtı və qışqırıq səsləri eşidilər.

Allaha and olsun ki, artıq dünyanın müəzzini bütün insanları məğlubiyyətə çağırıbdır. Dünya üçün çalışanlar və dünya üçün müsəlmanlıq edənlər səhər-axşam, gecə-gündüz onu ovlamaq üçün dalınca düşərlər. Onların hər bir qol-qanadı sınmış vəziyyətdə qayıdarkən dünyanın toruna düşərlər. Dünya da onları qəssaba təslim edər.

İbn Əbi Dünya Məhəmməd ibn Əli ibn Şəqiqdən, o da İbrahim ibn əl-Əşasdan, o da Fudeyl ibn İyaddan İbn Abbasın (Allah ondan və atasından razı olsun!) belə deməsini rəvayət edir: «Qiyamət günü dünya ağ-qara saçlı, göygöz, iri və qaba dişli, eybəcər bir qarı surətində məxluqatın qarşısına gətiriləcəkdir. İnsanlara: "Bunu tanıyırsınızmı?" - deyə müraciət ecədəcəklər. Onlar da qətiyyətlə: "Bunu tanımaqdan Allaha sığınırıq" - deyəcəklər. Onlara: "Bu, uğrunda bir-birinizlə münaqişə etdiyiniz, qohumluq əlaqələrini kəsdiyiniz, bir-birinizə həsəd apardığınız, nifrət bəslədiyiniz və bir-birinizə qarşı hiylə işlətdiyiniz dünyadır" - deyiləcəkdir. Sonra isə o, Cəhənnəmə atılacaqdır. Bu zaman o: "Ya Rəbb! Mənim tabe olanlar, mənim tərəfdarlarım hardadır?"- qışqıracaqdır, Uca və Böyük Allah da: "Ona tabe olanlar və onun tərəfdarlarını da onun yanına göndərin" - deyə əmr edəcəkdir» .[721]

İbn Əbi Dünya İshaq ibn İsmayıldan, o da Ruh ibn İbadədən, o da Aufdan, o da Əbuləladan belə rəvayət edir: «Yuxumda çox qoca, üzərində dünyanın hər cür zinəti olan bir qarı gördüm. İnsanlar onu dövrəyə alıb təəccüblə tamaşa edirdilər. Mən də gəldim, insanların heyrətlə ona baxmasına və onun ətrafında toplanmasına təəccüb etdim. Qarıdan: "Vay sənin halına! Sən kimsən?" - dedim. O da mənə: "Məni tanımadınmı?" - dedi. "Xeyr, tanımadım" - deyə cavab verdim. "Mən dünyayam" - dedi. "Sənin şərindən Allaha sığınıram" - dedim. O da: "Əgər mənim şərimdən qorunmaq istəyirsənsə, dirhəmə nifrət et" - dedi».[722]

İbn Əbi Dünya İbrahim ibn Səid əl-Cövhəridən, o da Sufyan ibn Uyeynədən Əbu Bəkr ibn Əyyaşın ona belə deməsini rəvayət edir: «Yuxumda dünyanı, çirkin və ağsaçlı bir qarı surətində gördüm.

[721] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 123. Deyirəm: sənədi qırıqdır.
[722] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 128; Əhməd, "əz-Zühd", səh. 312; Əbu Nəim, "əl-Hilyə", 2/243-244. Deyirəm: **səhihdir**.

Əllərini bir-birinə vururdu. Onun arxasınca insanlar gedir, əl çalır və rəqs edirlər. Düz qabağıma gəldikdə üzünü mənə tutub: "Sənə də qalib gələ bilsəm, bunların başına açdıqlarımı sənin də başına açardım " - dedi. Sonra Əbu Bəkr ağladı».[723]

Məhəmməd ibn Əli İbrahim ibn əl-Əşasdan, o da Fudayldan belə rəvayət edir: «Eşitdiyimə görə bir nəfər yuxusunda yolun ortasında oturan, üzərində hər cür dəbdəbə və zinət olan bir qadın görüb. Qadın yanından ötüb keçən hər kəsi yaralayırmış. Arxasını döndərdiyi vaxt insanların gözündə gözəl görünür, qabağını döndərdikdə isə ağsaç, göygöz, koruş çirkin bir qarı şəklinə düşürdü. Adam: "Səndən Allaha sığınıram" - demiş, o da; "Xeyr, neçə ki, dirhəmə nifrət etmirsən, Allah səni qorumaz"- demişdir. Adam: "Sən kimsən" - deyə soruşduqda o: "Mən dünyayam " - demişdir».[724]

Əli dünyanı vəsf edərkən belə demişdir: «Dünya elə bir evdir ki, orada yaşayan qocalar, xəstə olan peşman olar, yoxsul olan üzülər, zəngin olan imtahana çəkilər. Mal-dövlətinin halalın hesabını verəcək, haramına görə isə Cəhənnəm əzabı görəcəkdir».[725]

İbn Məsud demişdir: «Dünya yurdsuzun yuvası, malı olmayanın isə malıdır. Onu isə toplayan yalnız ağılsızdır».[726]

İbn Əbi Dünya qeyd edir ki, Həsən əl-Bəsri Ömər ibn Abdüləzizə belə bir məzmunda məktub yazmışdır:

«Beləliklə, şübhəsiz ki, dünya qalmaq yeri deyil, köçmə diyarıdır. Adəm bura cəza üçün endirilmişdir. Ey möminlərin əmiri! Ondan həzər et! Ondan azuqə almaq onu tərk etmək deməkdir. Dünyadakı zənginlik yoxsulluqdur. O hər bir halda öldürəndir. Dünya onu əzizləyəni zəlil edər, dünya malını yığanı isə yoxsul edər. Dünya bir zəhər kimidir. Onu tanımayan yeyər və nəticədə həlak olar. Sən dünyada yarasını müalicə etmək üçün ağrının uzun sürməsindən qorxaraq, dava-dərmanı az istifadə edən və bəlanın uzunmüddətli olmasından qorxaraq dava-dərmanın ağrısına dözən insan kimi ol! Yalançı, hiyləgər dünyadan özünü qoru! Bu elə bir dünyadır ki, öz hiylələri ilə bəzənmiş, yalanları ilə özünə cəlb etmişdir. Dünya boyalı, cilvəli bir gəlinə bənzər. Gözlər ona tamaşa edər, qəlblər ona valeh olar, insanlar onun aşiqi olar. O isə bütün aşiqlərinin qatilidir. Gələcək keçmişdən ibrət almaz, heç kəs heç kəsi danlamaz. Arif insana dünya barədə xəbər verildikdə Allahı zikr edər. Dünya aşiqləri

---

[723] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 29-30; Əbu Nəim, "əl-Hilyə", 8/304. Deyirəm: **səhihdir**.

[724] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 124.

[725] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 18.

[726] Əhməd, “əz-Zühd”, səh. 200; əl-Beyhəqi, “Şuabul-İman”, 7/375/10637; İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 16. Deyirəm: **zəifdir**.

öz istədiyində qalib gələr, aldanar, yolunu azar, qayıdış yerini unudar, başı o qədər dünya işlərinə qarışar ki, bir ayaqları sürüşdükdə, peşmançılığı artar, həsrəti böyüyər, ölüm sancıları və əzabı onun başının üstünü kəsər. Həsrət və hüzn içində dünyadan köçər. İstədiyini tapa bilməz. Canını yorğunluqdan qurtara bilməz, azuqəsiz halda çıxar və yorğan-döşəksiz gedər. Ey möminlərin əmiri! Özünü dünyadan qoru! Neçə ki, dünyadasan, əsirsən, onun olmaqdan çəkin! Dünya sahibləri nə zaman sevinib arxayın olurlarsa, dünya onları yenidən kədərə qərq edir. Ondan bəhrələnən ziyan görür. Onun ağgününə bəla ilə çatmaq olar. Dünyada əbədilik onun tükənməsi kimidir. Sevinci hüznü ilə qarışıqdır. Dünyadan gedən gəlməz. Gələnin də nə olduğunu bilmirsən ki, onu gozləyəsən. Onun rahatlığı yalan, ümidləri puç, saflığı bulanıq və yaşayışı hüzndür. Əgər dünyanı yaradan Allah onun haqqında xəbərlər verməsəydi, bu barədə misallar çəkməsəydi belə, dünya yatmışı oyadar, qafili isə tənbeh edərdi. Lakin hər şeydən uca və böyük Allah ondan sapındırmış və bu barədə nəsihətlər vermişdir. Hər şeydən uca və böyük Allah yanında onun heç bir qiyməti, çəkisi yoxdur və Allah yaradandan bəri ona heç vaxt baxmamışdır. Dünya bütün açar və xəzinələri ilə Allah yanında bir ağcaqanad qanadı boyda belə əskildilmədən Peyğəmbərimizə təklif edilmişdisə də, Peyğəmbərimiz onu qəbul etməmişdi. Çünki o, yaradıcı olan Allahın nifrət etdiyi bir şeyi sevmək istəməmiş, yaxud hökmdarının qoyduğunu qaldırmaq istəməmişdi. Allah-taala saleh bəndələrini seçərək dünyanı onlardan uzaq tutdu, düşmənlərini aldatmaq məqsədilə də dünyanı onların ayaqları altına döşədi. Dünya malına aldanmış olanlar dünyaya qadir olduqlarını zənn edir bunun onlar üçün bir bəxşiş olduğunu düşünürlər, halbuki, Məhəmmədin aclıqdan qarnına daş bağladığını unutdular».[727]

Həsən əl-Bəsri yenə belə buyurur: «Ey Adəm övladı! Qəlbini dünyaya bağlama! Əks halda bağlı bir şərə bağlamış olarsan. Dünyanın iplərini kəs, qapılarını bağla. Ey Adəm oğlu! Dünya malından səni çatdıracaq yerədək götürmək sənə kifayətdir». O həmçinin demişdir: «Dünya ona hörmət edənləri ağaclardan asaraq çarmıxa çəkmişdir. Dünyaya alçaq gözlə baxın. Çünki dünyanın ən xoşbəxt anı ona alçaq gözlə baxıldığı zamandır. Heyhat! Heyhat! Dünya getdi, əməllər boyunlardan asılı qaldı».[728]

İsa demişdir: «Dünyanı özünüzə Rəbb etməyin, yoxsa o sizi özünə kölə edər. Dünyanı ötüb keçin, lakin onu təmir etməyin. Xəbəriniz olsun ki, hər bir günahın özəyi dünya sevgisidir. Şəhvət öz sahibinə uzun bir hüzn miras qoyar. Dünya bir bəndənin qəlbində

[727] Bax: "Hilyətul-Övliya", 2/134-142.
[728] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 405, 479.

məskən salsa, orada üç şeyin birləşməsinə səbəb olar: qayğısı bitməyən məşğuliyyətə, zənginlik zirvəsinə çata bilməyən kasıbçılığa və sonsuz ümidlərə. Dünya həm istəyən, həm də istənilən bir varlıqdır. Axirəti istəyən dünyadakı ruzisini bol edənəcən dünya tərəfindən axtarılır. Dünyanı istəyən isə ölüm gəlib onun boğazından yapışana kimi axirət tərəfindən axtarılır. Ey həvarilərl Dünya əhlinin dünyanın salamat olması ilə dinlərindən az bir şeyə qane olduqları kimi siz də dinimizin salamat olması ilə dünya nemətindən azına qane olun!».[729]

İbn Əbi Dünya Harun ibn Abdullahdan, o da Səyyardan, o da Cəfərdən, o da Malik ibn Dinardan Əbu Hüreyrənin belə deməsini rəvayət etmişdir: «Dünya Allah-taalanın yaratdığı gündən, tükədəcəyi günə kimi göylə yer arasında saxlanılmışdır. Rəbbinə: "Ey Rəbbim! Niyə mənə nifrət edirsən?" - deyə səslənər. Rəbbi də ona: "Sus, ey boş olan, sus!" - deyə cavab verər».[730]

Fudayl isə belə deyir: «Qiyamət günü dünya özünün zinəti və parıltısı ilə lovğalana-lovğalana gələcək və: "Ya Rəbbi! Məni ən yaxşı bəndələrin üçün diyar et!" - deyəcəkdir. Allah-taala isə ona: "Mən səni onlara rəva bilmərəm. Çünki sən heçnəsən. Elə isə səpələnmiş toz ol!” — deyə cavab vermişdir».[731]

## Fəsil
## Dünyanın həqiqətini açıqlayan misallar

### Birinci misal

Qulun üç halı vardır. Birincisi, qulun mövcudiyyətindən öncəki halıdır ki, o halda heç nə olmamışdır, ikincisi, öldüyü andan sonu olmayan əbədi halıdır. Onun ruhu bədəndən çıxdıqdan sonra ya Cənnətdə, ya da Cəhənnəmdədir. Sonra ruhu bədəninə qaytarılır. Əməllərindən asılı olaraq iki əbədi dünyanın birində qalacaqdır. Bu iki hal arasında mövcud olan üçüncü hal mövcudiyyəti ilə ölümü arasında olan orta haldır ki, bu da onun yaşadığı həyatıdır. Dünyada yaşayacağı günə baxsın və əvvəlki iki halla müqayisə etsin, onda dünyadakı ömrünün bir göz qırpımından da az olduğunu bilər. Kim dünyaya bu gözlə baxsa, ona etibar etməz və günlərinin sıxıntılı, dar, geniş və rifah içində keçməsinə bir o qədər də məhəl qoymaz. Buna görə də Allahın elçisi nə kərpici kərpic, nə də qamışı qamış üstə

[729] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 31, 35.
[730] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 360. Deyirəm: sənədi zəifdir.
[731] İbn Əbi əd-Dünya. "Zəmmud-Dünya", 125.

qoymuş və belə buyurmuşdur: «Mən hara, dünya hara. Mənimlə dünyanın halı bir ağacın kölgəsində oturub bir az istirahət eldikdən sonra durub gedən yolçunun halı kimidir».[732] Bir rəvayətdə isə belə dediyi bildirilir: «Dünyanın axirət yanında çəkisi sizlərdən birinin əlini dənizə salıb çıxarması kimidir. Qoy barmağında gələn dəniz suyuna baxsın!».[733]

İsa da buna işarə edərək: «Dünya körpüdür. Ondan keçin, lakin onu təmir etməyin» - demişdir. Bu olduqca düzgün bir misaldır. Həqiqətən, dünya həyatı axirətə bir körpüdür. Beşik körpünün əvvəli, qəbir isə sonudur. İnsanlardan kimisi bu körpünün yarısını, kimisi üçdəikisini, kimisi də bir addım qalmışa qədər qəflət yuxusunda qət edir. Lakin istənilən halda onun bu körpüdən keçməsi qaçılmazdır. Kim bu körpünü məcburi keçərkən dayanıb onun üzərində bina tikər və onu müxtəlif növ zinət və dəbdəbə ilə bəzərsə, bu onun son dərəcə avam və axmaq olmasından irəli gəlir.

**İkinci misal**

Qəlbə daxil olan dünya nemətlərinin dadı mədəyə girən yeməklərin dadına bənzər. Yeməklərin ləzzəti mədəni keçdikdən sonra insan bunlardan necə iyrənirsə, bəndə ölərkən də qəlbinə girmiş dünya ləzzətlərindən o cür iyrənməyə və nifrət etməyə başlayır. Yeməklər nə qədər ləzzətli, nə qədər yağlı, nə qədər şirin olursa onun qayıdışı da bir o qədər iyrənc olur. Həmçinin nəfsdəki arzu olunan şey nə qədər ləzzətli olursa, ölərkən də onlardan çəkilən əziyyət bir o qədər şiddətli və ağır olur. Belə ki, insan sevdiyini itirmək kimi bir faciə ilə üzləşdiyi zaman onu sevdiyi qədər də acı çəkər.

İmam Əhmədin rəvayətinə görə Peyğəmbər Dəhhak ibn Sufyandan: «Duzlu və şirin yemək yedikdən sonra üzərindən su və süd içən sən deyılsənmi?» - deyə soruşdu. O da: «Bəli» - deyə cavab verdi. Peyğəmbər: «Onlar hara gedir?» - deyə soruşdu. O da: «Bildiyin yerə qədər» - deyə cavab verdi. Sonra Allahın elçisi belə buyurdu: «Hər şeydən uca və böyük Allah dünyanı Adəm övladının yediyi yeməyin getdiyi yerə bənzədir».[734]

Sələflərdən biri öz dostlarına: «Gəlin gedək sizə dünyanı göstərim» - demiş və onları zibilxanaya apararaq: «Meyvələrinizə, toyuqlarınıza, balınıza və yağınıza baxın» - buyurmuşdur.

---

732 Yuxarıda verildi.
733 Yuxarıda verildi.
734 **Həsəndir:** Əhməd, 3/452; İbn Əbi əd-Dünya, "əl-Cu'u", 106/164; ət-Tabərani, "əl-Kəbir", 8138.

**Üçüncü misal**

Dünya nemətlərinə başları qarışıb axirətdən uzaqlaşdıqlarından peşmançılıq çəkənlərin halı gəmiyə minən bir dəstə sərnişinin halına bənzəyir. Belə ki, gəmi bir adaya çatdıqda kapitan onlara təbii ehtiyaclarını ödəmələri üçün göstəriş verir, onları gecikməmələri barədə xəbərdarlıq edir və əks halda gəminin onları buraxıb getməsi ilə qorxudur. Sərnişinlər də hərəsi adanın bir tərəfinə dağılır. Onlardan bəziləri təbii ehtiyacını ödəyib tələsik gəmiyə qayıdır, gəmidə yerlər boş olduğundan istəyinə uyğun ən geniş və ən yumşaq yerdə əyləşir. Bəziləri isə adada qalıb oranın çəmənliklərinə, heyrətamiz gözəlliklərinə baxır, quşların nəğmələrini dinləyir. Adadakı daşların və qayalıqların gözəlliyi onları mat qoyur. Sonra gəminin tez gedəcəyini xatırlayıb dərhal gəmiyə gəlirlər. Lakin gəmidəki yerlər tutulduğundan onlar dar bir yerə çəkilib orada əyləşmək məcburiyyətində qalırlar. Sərnişinlərdən bəziləri isə adanın gözəl daşları, bahalı çiçəkləri ilə yüklənib gəmiyə qayıdarlar. Lakin gəmidəki bütün yerlər dolduğu üçün çox çətinliklə dar bir yerdə qalarlar. Əşyalarını isə nə atmağa əlləri gəlir, nə də qoymağa bir yer tapa bilirlər. Boyunlarında daşımağa məcbur olurlar. Onları götürməyə peşman olurlar, lakin son peşmançılıq fayda verməz. Sonra çiçəklər solmağa, öz təravətini itirməyə başlayır. İyindən isə əziyyət çəkirlər. Bəzi sərnişinlər isə həmin piyalədən içib gəmini unudur və ondan xeyli uzaqlaşarlar. Hətta, gəminin kapitanı gəmi yola düşərkən onları səsləsə belə, onların başı əyləncəyə qarışdığı üçün kapitanın səsinə səs vermirlər. Gah adanın meyvəsindən yeyir, gah onun təravətli çiçəklərini iyləyir, gah da ağacların gözəlliyinə dalırlar. Onlar bu cür əylənərkən vəhşi bir heyvan onların üzərinə hücum çəkər. Ondan qaçarkən tikana ilişib paltarlarını çırar və lüt qalarlar. Tikan onların bədənini yaralayar. Vəhşi heyvanın dəhşətli səsi onların canına vəlvələ salar. Sonra onlardan bəzisi gəmiyə çatsalar da, yer tapa bilmədikləri üçün sahildə ölər, bəziləri vəhşi heyvanlara yem olar, bəziləri isə oralarda həlak olanadək başlarını götürüb gəzərlər. Bəli, dünya əhli də belədir. Onların da başı dünyanın nəqd olan nemətlərinə qarışdığından haradan gəlib hara getdiklərini unudurlar. Ağıllı insanı daşların və quru bitkilərin aldatması necə də pisdir. Bütün bunlar onun başını qatıb əbədi nicatdan uzaqlaşdırar.

**Dördüncü misal**

Bu misal dünyaya aldanan və axirətə imanları zəif olanlar haqqındadır. Beləliklə, İbn Əbi Dünya İshaq ibn İsmayıldan, o da Ruh ibn İbadədən, o da Hişam ibn Həssandan, o də Həsəndən rəvayət edir

ki, Allahın elçisi səhabələrinə: «Mənim, sizin və dünyanın halı tozlu bir çöldə yol gedən insanların halına bənzəyir. Onlar nə qədər yol qət etdiklərini bilmədən azuqələri tükənər, miniyə həsrət qalarlar. Çölün ortasında azuqəsiz və miniksiz qalarlar. Öləcəklərinə isə tam əmindirlər. Bunlar bu vəziyyətdə olarkən qarşılarına gözəl libasda başından su damlayan bir nəfər çıxır. Onlar bu insanın yaxın bir kənddən gəldiyini düşünürlər. Adam onlara yaxınlaşdıqda: "Bu nə vəziyyətdir, siz düşmüsünüz?" - deyə soruşur. Onlar da: "Gördüyün kimi pis vəziyyətdəyik" — deyə cavab verirlər. Adam: "Əgər sizi şirin suyu və yaşıl bağları olan bir yerə aparsam, mənə nə vəd edərsiniz?" - deyir, onlar da: "Sənin əmrinə asi olmarıq" - deyə cavab verirlər. Adam: "Bu barədə Allaha əhd edərsinizmi?" - deyə soruşur. Onlar da heç bir şeydə ona asi olmamaq barədə Allaha əhd edirlər. Adam onları suyun və yaşıl çəmənliklərin olduğu bir yerə gətirir və burada Allahın istədiyi qədər qalırlar. Bir gün adam: "Camaat! Getməliyik" - deyə onlara müraciət edir. Onlar da: "Haraya?" - deyə soruşurlar. Adam: "Suyu sizin suyunuz, bağları isə sizin bağlarınız kimi olmayan bir yerə" - deyə cavab verir. Dəstənin əksəriyyəti: "And olsun Allaha ki, biz buranı tapana kimi ümidimizi kəsmişdik. Bundan da yaxşı yaşayış axı bizim nəyimizə lazımdır?!" - demişdir. Dəstənin az bir hissəsi isə: "Bəs siz bu kişiyə asi olmamaq barədə Allaha əhdi-peyman etdiniz? Bu kişi birinci vədində sizə sadiq qaldı. Allaha and olsun ki, bu vədinə də sadiq qalacaqdır" - dedilər. Onun ardınca gedənlər rahatlıq tapdılar, geridə qalanlan isə düşmənləri qabaqladı, yarısı əsir düşdü, yarısı da həlak oldu».[735]

**Beşinci misal**

Allahın elçisi dünyanı və dünya əhlini ağacın kölgəsinə bənzətmişdir. İnsan isə bu dünyada Allaha doğru gedən bir müsafirdir. Bu müsafir qızmar bir yay günündə ağacın altında kölgələnib, sonra isə durub oranı tərk edir. Bu misalın gözəlliyi və reallığa nə qədər uyğun olduğu barəsində dərindən fikirləş. Çünki dünya yaşıllığında ağaca, sürətli keçməsində və yavaş-yavaş yığılmasında isə kölgəyə bənzəyir. Qul öz Rəbbinə doğru bir yolçudur. Yolçu qızmar bir yay günündə ağaca rast gəldikdə onun altında ev tikməsi və orada qərar tutması yaxşı olmaz. Əksinə, ehtiyacı olan qədər ağacın altında kölgələnər, bunu uzatdığı təqdirdə isə yoldaşlarından geri qalmış olar.

**Altıncı misal**

[735] **Zəifdir**: İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 88.

Allahın elçisi dünyanı dənizə salınan barmağa bənzətmişdir. Belə ki, barmaqla gələn dəniz suyu dünyaya, dənizin sonsuzluğu və böyüklüyü isə axirətə bənzədilir. Bu da ən gözəl misallardandır. Çünki dünya müddəti nə qədər çox olsa da, tükənən və fanidir. Axirət isə əbədi və tükənməzdir. Məhdud bir şeyin qeyri-məhdud bir şeylə müqayisəsi mümkün deyil. Əgər göylərlə yerin xardal dənəsi ilə dolu olması fərz edilsə və hər min ildən bir bir quş gəlib həmin xardal dənələrindən birini götürsə, xardal dənələri tükənəcək, lakin axirət tükənməyəcək. Misalda dünyanın axirətlə müqayisəsi bir xardal dənəsinin digər xardal dənələri ilə müqayisəsi deməkdir. Bu baxımdan da əgər dəniz mürəkkəb olsa, ona daha yeddi dəniz qatılsa, yer üzərindəki ağacların hamısı qələm olub Allahın kəlamlarını yazsa, dənizlər və ağaclar tükənəcək, lakin Allah kəlamları tükənməyəcəkdir. Çünki Allah kəlamlarının nə əvvəli, nə də sonu vardır. Dənizlərin və qələmlərin isə sonu vardır.

İmam Əhməd və başqaları belə deyirlər: «Allah-taala istədiyi vaxt danışmaqdadır. Onun müqəddəs kamilliyi danışmaq keyfiyyətini də özündə ehtiva edir. Çünki danışan danışmayandan daha mükəmməldir. O da Allahdır ki, danışmaqdan nə yorular, nə də ki, bezər. O, məxluqatını kəlamları ilə yaradar, kəlamları ilə də idarə edər. Bu Onun mülkinin rübubiyyətinin, ilahlığının həqiqətidir. O, Allahdır, hər şeyin sahibidir və yeganə ibadətə layiq haqq məbuddur. Nəticə olaraq onu demək olar ki, dünya axirət nəfəslərindən bir nəfəs, axirət saatlarından bir saatdır».

### Yeddinci misal

Buxari və Müslimin Əbu Səid əl-Xudridən rəvayət etdikləri hədisdə deyilir: «Allahın elçisi ayağa durdu, insanlara xütbə oxuyaraq belə dedi: «Xeyr vallah! Sizin üçün qorxduğum şey yalnız Allahın sizlərə verəcəyi dünya zinətləridir». Bir nəfər ayağa qalxıb: «Ey Allahın elçisi! Heç xeyir də şəri gətirərmi?» - dedi. Allahın elçisi bir az susduqdan sonra: "Sən necə dedin?" - deyə soruşdu. Həmin adam: «Ey Allahın elçisi! Heç xeyir də şəri gətirərmi?» - deyə sualını bir daha təkrarladı. Peyğərnbər buyurdu: «Xeyir yalnız xeyir gətirər. Dərədə bitən ot ya köpmədən öldürər, ya da öldürməyə yaxınlaşdırar. Yalnız yaşıllıqla qidalanan heyvanlar qarınları dolanacan yeyərlər. Qarınları dolduqdan sonra günəşə tərəf dayanar, təbii ehtiyaclarını ödəyər, gövşəyər və sonra yenidən qayıdıb ot yeyərlər. Kim haqqı çatdığı bir malı götürərsə, bu onun üçün bərəkətli olar. Haqsız yerə bir mala sahib olan isə yeyib doymayan

heyvan kimidir».[736]

Peyğəmbər səhabələri üçün dünyadan qorxduğunu bildirmiş, dünyanı çiçək adlandıraraq onu təravətli iyinə, gözəl görünüşünə və tez solduğuna görə çiçəyə bənzətmişdir. Lakin çiçəklərdən sonra daha yaxşı və əbədi meyvələr vardır.

Allah elçisinin «Dərədə bitən ot ya köpmədən öldürər, ya da öldürməyə yaxınlaşdırar...» - ifadəsinə gəldikdə, bu dünyadan, ona dalmaqdan və ondan razı qalmaqdan çəkindirməni özündə əhatə edən ən gözəl misaldır. Beləliklə, dərənin otunu gözü doyanacan yeyən heyvan, çox güman ki, köpmədən həlak olur. Köpmə isə heyvanın qarnının ya çox yeməsindən, ya da xəstəlikdən olur. Bu hal insanlarda da baş verir. Haris ibn Məzin ibn Amr ibn Təmim səfərdə olarkən bu xəstəliyə tutulmuş və elə bundan da ölmüşdür.

Əs-Səlmi deyir: «İnsanın var-dövlətə hərisliyi onu həlak edər, onu həlak etməsə də, buna yaxınlaşdırar».

Peyğəmbərin «...öldürməyə yaxınlaşdırar» ifadəsi göstərir ki, bir çox var-dövlət sahibinin həlak olmasına onların var-dövləti səbəb oldu. Onlar başqalarının ehtiyacı olduğu malları acgözlüklə toplayır, başqaları da öz haqlarını ya onları öldürməklə, ya da ölümə yaxınlaşdıraraq zəlil və məğlub etməklə alırlar.

«Yalnız yaşıllıqla qidalanan heyvanlar...» ifadəsi. Bu dünyadan yalnız öz ehtiyaclarını alanlar üçün gözəl bir misaldır. Otla qidalanan qoyun da belədir. Qarnı dolana qədər yeyərlər.

«Qarınları dolduqdan sonra günəşə tərəf dayanar, təbii ehtiyaclarını ödəyər...» cümləsində toxunulması faydalı olan üç məsələ vardır.

Birincisi, heyvan otlaqdan ehtiyacı qədər qidalanıb onu tərk etdikdən sonra günəşə tərəf oturar yediyini həzm edər.

İkincisi, otlaqda ona zərər verəcək otdan üz döndərib günəş şüalarından faydalanır. Çünki günəşin hərarəti ilə onun yediyi qarnında bişər və ifraz olunar.

Üçüncüsü isə, heyvan otlaqda otladığını hər iki yolla ifraz edərək rahatlıq tapar. Əgər otladığı onun qarnında qalsaydı, sözsüz ki, onu öldürərdi.

Beləliklə, hər bir var-dövlət yığanın bu qoyun kimi etməsi onun xeyrinədir.

Hədisin əvvəli dünya malına həris olanlar barəsindədir. Burada onlar tamahkarlığın ölənə, yaxud ölümə yaxın bir müddətə qədər yeməyə sövq etdiyi heyvanlara bənzədilir. Tamahkarlıq ya həlak edir, ya da həlaka yaxınlaşdırır. Dərənin ətrafında otun və dənli bitkilərin

[736] əl-Buxari, 6427; Müslim, 1052.

bir çox növü bitir. Heyvan da bundan qarnı şişənə qədər yeyir və sonunda bağırsaqlarına və mədəsinə ağırlıq çökür və heyvan ölür. Dünya malının haramından yığan da belədir. Yığdığı malı ya saxlar, ya da gərəksiz yerə sərf edər. Hədisin sonu isə yaşıllıqdan qidalanan heyvanın öz yediyindən bəhrələnməsinə misaldır. Acgözlük və hərislik onu bacardığından artıq yeməyə sövq edə bilmir. Əksinə, ehtiyacı qədər qida qəbul edib günəşdən faydalanmaq üçün ona tərəf dayanar. Peyğəmbər heyvanın hər iki yolla ifrazatını misal göstərməkdə məqsədi insanın var-dövlətindən düzgün yerlərə sərf etməsinə, ondan zəkat və sədəqə verməsinə işarədir. Çünki var-dövlətin saxlanılması insana zərərdir. İnsan mal-dövlətindən ehtiyacı olan qədər götürdükdən sonra heyvan yediyini ifraz etməklə ölümdən xilas olduğu kimi insan da var-dövlət yığmağın və onu saxlamağın müsibətindən xilas olmalıdır.

Bu hədisdə insanın ölümünə səbəb olacaq qədər yeməsinin və tamamilə yeməkdən imtina edib aclıqdan ölməsinin haram olmasına və orta səviyyədə yeməyin halal olmasına işarə vardır. Həmçinin bu hədis mal-dövlət sahibinin qəlbinin və bədəninin sağlığını qorumasını, var-dövlətini xeyirli işlərə sərf etməsinin ona fayda verəcəyini, əks halda isə bunun zərərini çəkəcəyini xəbər verir.

### Səkkizinci misal

Amr ibn Şüeyb atasından, o da Süleyman ibn Yəssardan, o da Meymunədən rəvayət etdiyinə görə Allahın elçisi Amr ibn əl-Asa belə demişdir: «Dünya şirin bir yaşıllıqdır. Kim bu dünyada Allahdan qorxarsa, o saleh bəndədir. Əks halda isə yeyib doymayan heyvana bənzər. Bu mövzuda insanlar arasında fərq biri şərqdə doğan, digəri isə qərbdə batan ulduz kimidir».[737]

Allahın elçisi «Dünya yaşıllıqdır» - deməklə gözlərin onu gözəl görəcəyini, «Dünya şirindir» - deməklə isə ürəklərin onu duyacağını bildirmişdir. Dünya bu yaşıllığı və şirinliyi ilə əhli üçün zinətləndirilmiş və onlara sevdirilmişdir. Çünki dünya əhli «Biz dünyanın övladlarıyıq, ondan yaradılmışıq. Sən ondansan, o sevilən bir şeydir» - dediyi kimi torpaqdan yaradılmış və torpaqda da qalacaqdır.

İnsanlar bu dünyada iki qismə bölünür. Birincisi, saleh və Allahdan qorxan müttəqi insanlar. Bu insanların təqvalı və saleh olması onların dünyaya dalmalarının, dünya malına həris tamah salmalarının, onun haramından götürmələrinin və gərəksiz yerə sərf etmələrinin qarşısını alır. İkincisi isə saleh və müttəqi olmayanlardır.

[737] **Zəifdir**: Əbu Yəla, "Müsnəd", 7099; ət-Təbərani, "əl-Kəbir", 24/20/78.

Bu insanların məqsədi, istəyi, gücü yalnız dünya malına sahib olmaqdır. Belə olduqda isə onlarla yeyib doymayan heyvan arasında heç bir fərq olmur. Bu ən gözəl misallardandır. Yeməkdə məqsəd nəfsi deyil, səhhəti və gücü qorumaqdır. Bu da ehtiyaca görə müəyyənləşdirilir. Ancaq sırf yeyib-içməyi qarşısına məqsəd qoyan insan yeyər, lakin doymaz. Elə buna görə də İmam Əhməd: «Onun azı faydalı, çoxu isə faydalı deyildir» - demişdir. Həmçinin o, saleh və müttəqi olanlarla, acgöz və tamahkar insanlar arasındakı fərq haqqında da xəbər vermiş və bildirmişdir ki, bu iki sinif insanlar arasındakı fərq biri qərbdə batan, digəri isə şərqdə doğan ulduzlar arasındakı fərq kimidir.

**Doqquzuncu misal**

Mustəvrid ibn Şəddaddan belə rəvayət olunur: «Mən Allah elçisi ilə birlikdə ölmüş quzunun başına toplaşmış camaatla birlikdə idim. Allahın elçisi üzünü camaata tutub: "Sizcə bu quzunu sahibləri üçün dəyərsiz olduğuna görəmi tullayıblar" - deyə soruşdu. Camaat da: "Bəli, ey Allahın elçisi! Onun dəyərinin öldüyünə görə tullayıblar" - deyə cavab verdi. Allahın elçisi: "Məhəmmədin canı əlində olana and olsun ki, bu quzunun leşi sahibi üçün nə qədər dəyərsizdirsə, dünya Allah üçün ondan da dəyərsizdir" - buyurdu»[738] Tirmizi bu hədisi həsən-səhih adlandırmışdır.

İmam Əhmədin Müsnədində bu hədisdə Allahın elçisi belə deyir: «And olsun canım əlində olana ki, ölmüş quzunun leşi sahibi üçün nə qədər dəyərsizdirsə, dünya Allah üçün ondan da dəyərsizdir». Allahın elçisi sadiq and içərək təkidlə bu sözləri bildirdi. Əgər dünya kimi bir varlıq Allah yanında ölmüş quzunun leşinin sahibi üçün dəyərsiz olmasından da alçaq və dəyərsizdirsə, onda dünya aşiqləri Allah yanında ölmüş quzudan da dəyərsizdir. Leşin quzu olması sahibi üçün böyük qoyunun leşi olmasından daha dəyərsizdir. Çünki ola bilər sahibi qoyunun yunundan istifadə edib və onun dərisini aşılasın. Lakin kiçik quzunun leşi isə son dərəcə dəyərsizdir. Yardım diləmək üçün üz tutulan yeganə varlıq Allah-taaladır.

**Onuncu misal**

Dünya insanların ev-eşiklərinə, yurd-yuvalarına getməsi üçün sahilə qədər qət edilməsi labüd olan bir dənizə bənzər. Bu dənizi isə yalnız qurtuluş gəmisi ilə qət etmək olar. Bunun üçün də Allah-taala xalqlara qurtuluş gəmilərini necə əldə etmələrini bildirmək üçün

[738] Yuxarıda verilmişdir.

elçilər göndərdi. Peyğəmbərlər insanlara qurtuluş gəmiləri hazırlamalarını və ona minmələrini əmr etdi. Qurtuluş gəmisi Allah elçilərinə itaət, yalnız Allaha ibadət, əməllərin ixlasla və Allah üçün olması, Axirəti istəyərək qolları çırmalayıb onun üçün çalışmaqdır. Dənizə girib üzərək məqsədlərinə çata bilməyəcəklərini bilənlər dənizə girməkdən imtina etdilər və qalxıb gəmiyə mindilər. Beləliklə də onlar öz məqsədlərinə çatmağa müvəffəq oldular. Axmaqlar isə gəmini, onun alətlərini hazırlamaq, gəmiyə minmək çətin göründüyündən: «Biz dənizi keçəcəyik. Əgər bunu bacarmasaq üzərək keçərik» - dedilər. Onlar dünya əhli idilər. Dənizə girdilər. Batacaqlarını görüb üzməyə başladılar. Lakin sonunda dənizdə qərq oldular. Gəmiyə minənlər isə Nuhla gedənlərin qurtuluşu kimi qurtuldular. Nuhun gəmisinə minməkdən imtina edib yeri seçənlər isə yeri su basdığı zaman suda qərq oldular. Dünya əhlinin halını göstərən bu misal haqqında dərindən düşünsən, necə də reallığa uyğun olduğunu görmüş olarsan. Çünki bu misal dünya, axirət, qədər və əmr üçün çəkilmişdir. Qədər dəniz, onun haqqında əmr isə gəmidir. Yalnız ona minən nicat tapar.

**On birinci misal**

Dünya içi balla dolu bir qaba bənzər. Milçəklər onu görüb bala doğru gələr, bəziləri qabın kənarında oturub ehtiyacı qədər yeyər, sonra isə uçub gedər. Bəziləri isə tamahkarlığının qurbanı olub özünü qabın ortasına atar, bir az tədarük gördükdən sonra qabın ortasında bala bataraq həlak olarlar.

**On ikinci misal**

Dünya yer üzünə səpələnmiş dənələrə bənzər. Bu dənələrdən bəziləri tələnin içinə, bəziləri isə onun həndəvərinə səpələnmişdir. Quşlar bunu görüb gələr, onlardan bir qismi tələnin kənarındakı dənələrlə kifayətlənib özünü tələnin ortasına atmaz. Eytihacı qədər götürdükdən sonra uçub gedər. Onlardan bəziləri isə tamahkarlıqlarına aldanıb tələnin ortasındakı dənələri götürmək üçün oraya hücum çəkər dənəni tam yeməmiş tələ onu tutar və fəryad edər.

**On üçüncü misal**

Dünya böyük alov qalamış bir insana bənzər. Belə ki, kəpənəklər və pərvanələr alovun işığını görüb özlərini onun içinə atarlar. Alovun nə olduğunu bilənlər isə onu uzaqdan seyr edib qızınarlar. Peyğəmbər bu misala eyni ilə öz hədisində işarə etmişdir. Belə ki, Malik ibn İsmayıl Həfs ibn Humeyddən, o da İkrimədən, o da

Abbasdan (Allah ondan və atasından razı olsun!), o da Ömərdən Peyğəmbərin belə deməsini rəvayət etmişdir: «Mən alovdan qorumaq üçün ətəklərinizdən tuturam. Halbuki siz kəpənək və pərvanələrin özlərini alova atdıqları kimi atmaq istəyirsiniz. Az qala sizin ətəkləriniz əlimdən çıxsın»[739]. Bir rəvayətdə isə belə deyilir: «Mənim halım alov yandıran bir insanın halına bənzəyir. Elə ki, ətrafındakılara işıq saçdı, pərvanələr və kəpənəklər özlərinə alovun içinə atırlar. Mən isə alovdan qorumaq üçün sizin ətəklərinizdən tutmuşam. Siz isə mənə qalib gələrək özünüzü alovun içinə atmağa çalışırsınız».[740]

Bu misal özünü dünyaya tullayan dünya əhlinin halı ilə üst-üstə düşür. Peyğəmbərlər onları axirət üçün çalışmağa çağırdıqları zaman onlar kəpənəklərin özlərini alovun içinə atdığı kimi dünyaya atarlar.

**On dordüncü misal**

Dünyanın halı malları və ailəsi ilə səfərə çıxan bir qövmün halına bənzər. Bu qövm dərəsi, suyu və meyvələri çox olan vadinin yanından keçdikləri zaman oraya enib çadırlarını qurur və orada evlər və qəsrlər tikirlər. Elə bu arada onların yanından nəsihətləri, dürüstlüyü və etibarlılığı ilə tanınmış bir adam keçərək: «Mən bu vadinin arxasında sizi hədəfə götürmüş ordunu bu iki gözlərimlə gördüm. Mənim arxamca gəlin, sizi başqa yolla aparım ki, ondan xilas olasınız. Qövmün az hissəsi onu təqib edir, o isə: "Ey camaat! Qurtuluşa gəlin! Qurtuluşa gəlin!" - deyərək onları səsləyirdi. Ona itaət edənlər ailələrinə, mallarına və qəbilələrinə xilas olmağı qışqırırlar. Qövmün qalan hissəsi isə: "Yaşayışımız, mallarımız, evlərimiz burda olduğu halda və burada məskunlaşdığımız halda bu vadini necə qoyub gedə bilərik?!" - deyirlər. Adam onlara: "Hər biriniz yüngül əşyalarınızı götürməklə canını qurtarsın. Əks təqdirdə, özü əsir düşəcək, malı isə qarət olunacaqdır" - deyir. Bütün bu çağırışlara baxmayaraq, mal-dövlət sahiblərinə və qövmün qəbilə başçılarına buradan köçmək, içində yaşadıqları nemətdən, rifahdan və rahatlıqdan ayrılmaq ağır göründü. Axmaqlar isə burada qalanlara baxıb: "Onların var-dövləti bizimkindən çox, ailələri isə bizimkindən böyükdür. Onlara nə müsibət üz versə, bizə də verər" - deyirlər. Beləliklə, qövmün az hissəsi həmin adamla gedir və qurtuluşa çatırlar. Düşmənlər səhərisi gün tezdən vadinin sakinlərinə hücum çəkir, onları öldürür, var-dövlətlərini isə qarət edirlər».

---

[739] **Həsəndir**: əl-Bəzzar, "əl-Bəhruz-Zəxxar", 204; Yaqub bin Şeybə, "Müsnədu Amr", səh. 74; Əbu Yəla əl-Mosuli, "əl-Müsnədul-Kəbir", 486; əl-Heysəmi, "Məcmuə əz-Zəvaid", 3/85.

[740] əl-Buxari, 6483; Müslim, 2284. Əbu Hureyrənin rəvayəti.

Peyğəmbər bu misala Buxari və Müslimin Əbu Bürdədən, o da Əbu Musadan rəvayət etdiyi hədisində eyni ilə belə işarə etmişdir: «Mənim və Allahın mənimlə göndərdiyinin halı qövmünün yanına gəlib: "Ay camaat! Mən ordunu gözlərimlə gördüm. Mən dürüst xəbərdarlıq edənəm. Qurtuluşa gəlin! Qurtuluşa gəlin!" - deyən insanın halına bənzər. Qövmünün də bir hissəsi ona tabe olub gecə yola çıxar və yavaş-yavaş gedərək xilas olarlar. Onlardan bir qismi isə həmin adamı yalançı sayıb yerlərindən tərpənməzlər. Düşmənlər isə səhər tezdən hücuma keçərək onları öldürər, var-dövlətlərini isə qarət edərlər. Mənə itaət edib gətirdiyimə tabe olanın halı ilə mənə asi olub Haqdan gətirdiyimi təkzib edənlərin halı belədir».[741]

**On beşinci misal**

Bir kişi ev hazırlayar, onun içini bəzəyər, içərisini lazımi məişət əşyaları ilə təmin edər və insanları evinə qonaq çağırar. Hər bir qonağı yumşaq döşəyin üzərində əyləşdirər. Hər bir qonağa qızıldan olan qabda ət gətirər. Qonaqların süfrəsinə bahalı qablarda ehtiyacları olan hər bir şey qoyar. Qonaqlara ev sahibinin xidmətçiləri qulluq edərlər. Ağıllı insan bunların ev yiyəsinin malı, mülkü və kölələri olduğunu bilir və evdə olduğu müddətdə qablardan və ziyafətdən istifadə edir. Qəlbini belə şeylərə bağlamır, heç ürəyində də bu qabların onun olmasını fikirləşmir. Bir qonağın ev sahibinə qarşı necə davranmaq lazımdırsa, eləcə də davranar. Onun əyləşdirdiyi yerdə əyləşər, qabağına qoyulanı yeyər və ev sahibini tanıdığını, onun necə qonaqpərvər və səxavətli olduğunu bilməklə kifayətlənib əlavə başqa bir şey soruşmaz. Hörmətlə evə daxil olar, orada hörmətlə davranar və hörmətlə də bu evi tərk edər ki, ev sahibi onu məzəmmət etməsin. Axmaq insana gəldikdə, o bu evin sakini olmasını, buradakı qab-qacağı öz evinə aparmağı və orada istədiyi kimi istifadə etməyi ürəyindən keçirər. Məclisdə özünə bir yer seçər, bu qab-qacaqları həmin yerə qoyub gizlədər və hər dəfə də ev sahibi ona hər hansı bir əşya təqdim etsə, ürəyində bu əşyanın özünə məxsus olmasını arzular. Ev sahibi onun nə etdiyini görər, lakin qonaqpərvərliyi onu evdən qovmasına mane olar. Bu axmaq isə əşyalara və evə sahib olduğunu zənn etdiyi, evdən və əşyalardan həqiqi ev sahibi kimi istifadə etdiyi və oranı öz evi saydığı zaman ev sahibi qulluqçularını göndərib onu amansızcasına evdən qovdurur, üzərində olan hər şeyi əlindən alır ve adam heç bir qab-qacağa sahib ola bilmir. Əksinə, ev sahibinin qəzəbini qazanır, onun adamları və xidmətçiləri yanında rüsvay olaraq evdən qovulur.

[741] əl-Buxari, 7283; Müslim, 2283.

Ağıllı insanlar bu misal ətrafında layiqincə düşünsünlər. Çünki bu həqiqətə tam uyğundur. Yardım diləmək üçün üz tutulan yeganə varlıq Allah-taaladır.

Abdullah ibn Məsud belə demişdir: «Bu dünyada yaşayan hər kəs qonaq, malı isə əmanətdir. Qonaq gedər, əmanət isə sahibinə qaytarılar».[742]

Buxari və Müslim Ənəs ibn Malikin belə deməsini rəvayət edirlər: «Əbu Təlhanın Ümm Süleymdən olan bir oğlu ölmüşdü. Ümm Süleym yaxınlarına: "Heç kəs mən söyləməmiş Əbu Təlhaya oğlunun öldüyünü söyləməsin " - demişdir. Əbu Təlha gələndə ona şam yeməyi gətirmiş, əri yeyib-içdikdən sonra onun üçün həmişəkindən daha gözəl görünməyə çalışmış, bəzənib-düzənmiş və əri də onunla cinsi əlaqədə olmuşdur. Ümm Süleym ərinin doyduğunu və cinsi əlaqəni bitirdiyini görüb: "Ey Əbu Təlha! Əgər bir camaat bir ev əhlinə əmanət olaraq nə isə verib sonra da onu geri istəsə, ev əhli onu qaytarmaya bilərmi?" - deyə soruşmuş, Əbu Təlha isə ona: "Xeyr" - deyə cavab vermişdir. Bu zaman Ümm Süleym ərinə: "Onda oğlunun ölümünə səbir edərək savabını istə " - deyərək oğlunun ölüm xəbərini vermişdir. Bunu eşidən Əbu Təlha əsəbləşmiş və: "Nə üçün sən məni çirkli bir vəziyyətdə buraxdıqdan sonra oğlumun öldüyünü dedin?" - demişdir. O, evdən çıxıb Allah elçisinin hüzuruna gəlmiş və əhvalatı ona nağıl etmişdir, Allahın elçisi isə: "Allah sizin gecənizi bərəkətli etsin!" - deyə dua etmişdir».[743] Ənəs bunu deyib hədisi axıra qədər söylədi.

### On altıncı misal

Bir dəstə camaat səhrada yol gedirlər. Birdən susuzluq onları bürüyür. Bir dənizin sahilinə gəlirlər. Dənizin suyu çox acı və çox duzlu olur. Bərk susadıqlarından acılığı və duzluluğu hiss etmədən sudan içirlər. Hər dəfə su içdikcə də yanğıları daha da artır. Nəhayət bağırsaqları partlayır və susuzluqdan ölürlər. Aralarında olan ağıllı insanlar suyun duzlu və acı olduğunu və onu içdikcə də susuzluğu daha da artırdığını bildikləri üçün dənizdən xeyli aralandıqdan sonra şirin sulu bir əraziyə rast gəlirlər. Orada quyu qazırlar. Quyudan şirin su qaynayır. Ondan içirlər, xəmir yoğururlar və yemək bişirirlər. Sonra isə dənizin kənarında qalan qardaşlarını şirin suya səsləyirlər. Dənizin kənarındakılarından kimisi onlara istehza edər, kimisi düşdüyü halına razı olar. Çağırışa cavab verənlər çox az olar.

Bu misalın eynisini İsa çəkərək belə deyir: «Dünyanı istəyən dənizdən su içən insana bənzər. Hər dəfə su içdikcə yanqısı daha da

---

[742] Yuxarıda verilmişdir.

[743] əl-Buxari, 1301; Müslim, 2144. Ləfz Müslimindir.

artar və nəhayət [çox su içdikdən dəniz suyu bağırsaqlarına dolaraq] onu öldürər».[744]

**On yeddinci misal**

İnsan, onun malı, əməli və tayfası üç qardaşı olan adam kimidir. Həmin adam mütləq uzun bir səfərə çıxmalıdır. Qardaşlarının üçünü də yanına çağırıb deyir: «Gördüyünüz kimi mənim uzun bir səfərə çıxmağımın vaxtı gəlib çatdı. İndi sizlərə əvvəlkindən daha çox ehtiyacım var». Qardaşlarından biri: «Mənim səninlə olan qardaşlığım bura qədərdir. Bundan sonra sənin qardaşın və dostun deyiləm. Məndən bu qədər» - deyir. Qardaşı ona: «Sənin mənə heç bir köməyin dəyməyib» - deyir və üzünü o biri qardaşına tutaraq: «Sən necə, mənə kömək edə bilərsənmi?» - deyə soruşur. Qardaşı: «Bu günə qədər sənin qardaşın və dostun idim. Səfər tədarükünü görüb səni miniyinə mindirənədək səninləyəm. Lakin ondan sonra sənin dostun sayılmıram» - deyə cavab verir. Kişi: «Mənim sənin səfərdə məni müşaiyət etmənə ehtiyacım var» - deyir. Qardaşı da: «Bu mümkün deyil» - deyə etiraz edir. Kişi o qardaşına da: «Sənin də mənə heç bir xeyirin yox imiş» - deyir və üzünü üçüncü qardaşına tutub: «Sən necə, mənə kömək edə bilərsənmi?» - deyə soruşur. Qardaşı isə belə cavab verir: «Mən sənin sağlığında, xəstələndiyin zaman, dostun olmuşam. İndi də sənin dostunam. Miniyinə minənə kimi də, səfərdə də səninləyəm. Sən getsən, mən də gedərəm, otursan, mən də oturaram. Getdiyin ölkəyə çatdığın zaman da səninləyəm və heç vaxt səndən ayrılmaram». Kişi ona belə dedi: «Dostlarım arasında sən mənim ən dəyərsizi idin. Həmişə onları səndən üstün tutardım. Kaşki sənin haqqını əvvəldən biləydim və səni onlardan üstün tutardım».

Bu üç qardaşın birincisi adamın mal-dövləti, ikincisi qohum əqrabası və tayfası, üçüncüsü isə əməlidir. Bu misalın eynisi Peyğəmbərdən mərfu isnadla rəvayət olunsa da, hədis olması isbat edilməmişdir. Həmin rəvayəti Əbu Cəfər Uqeyli «Kitəbud-duafa» adlı əsərində İbn Şihabdan, o da Urvadan, o da Aişədən nəql etmişdir. İbn Museyyib isə onu Aişədən mərfu isnadla rəvayət etmişdir. Bu misal hədisin mənası ilə səhihdir və həqiqətə uyğundur.[745]

**On səkkizinci misal**

---

[744] İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 342.

[745] Bu misala uyğun mənalı hadis Sünnədə var və onu Ənəs rəvayət edib: Peyğəmbər deyib: "Ölünü üç şey müşayət edər: ailəsi, malı və əməli. Bunlardan ikisi qayıdar, biri onunla qalar. Ailəsi və malı qayıdar, əməli onunla qatar". əl-Buxari, 6514; Müslim, 2960; İbn Hibban, 3107.

Bu ən yaxşı misallardandır. Belə ki, bir şah insanların içində kef çəkməsi üçün çox görülməmiş və eşidilməmiş geniş və çox gözəl bir saray tikdirir. Saraya gələn yolun ortasında hər cür zinətlə bəzədilmiş və ən gözəl geyimlər geymiş bir qadın əyləşdirir. Yoldan keçənlər onun yanından ötürlər. Qadının da əlinin altında bir neçə köməkçisi və xidmətçisi olur. Qadının və köməkçilərinin əlinə bu yoldan ötüb şahın sarayına gedənlərə vermək üçün azuqə verilir. Şah qadını köməkçiləri ilə birlikdə hüzuruna çağıraraq ona belə əmr edir: «Yoldan ötənlərdən kim sənə baxmayıb səndən mənim yanıma gəlmək üçün kifayət qədər azuqə istərsə, ona qulluq et və azuqə ver. Ona mənim yanıma gəlməsində mane olma. Əksinə, ona yanıma gəlməsi üçün lazımi qədər köməklik et. Kim də gözlərini sənə dikib səninlə qalmağa razı olsa, səni məndən üstün tutsa və sənə qovuşmaq istəsə, onu ən pis əzabla cəzalandır, ən dəyərsiz şeyi ona verib yanında işlət. Onu vəhşi heyvanın qaçdığı kimi arxandan qaçırt. Kim də səndən yemək istərsə, ona az bir şey verərək hiylə qur, sonra verdiyini geri al və onu tamamilə soyub talan et. Sonra xidmətçilərini və əlaltılarını onun üstünə burax. O sənə nə qədər çox məhəbbət və hörmət göstərsə, sən də ona bir o qədər nifrət et, ona qarşı alçaqcasına davran və təhqirlər et ki, peşman olaraq canı çıxsın».

Dünyanı istəyənlərlə axirəti istəyənlərin halını göstərən bu misal haqda dərindən fikirləş. Yardım diləmək üçün üz tutulan yeganə varlıq Allah-taaladır. Bu misal Allahdan nəql olunan qüdsi bir hədisdən götürülmüşdür. Hədisdə Allah-taala dünyaya: «Ey Dünya! Xidmət et və sənə xidmət edənləri özünə xidmət etdir» - deyə əmr edir.[746]

### On doqquzuncu misal

Bir hökmdar havası saf, suyu bol olan bir yerdə gözəl bir şəhər saldırır. Bu şəhərə su kanalları çəkdirir, ağaclar əkdirir. Əlaltılarına: «Şəhərdəki ən gözəl yerlər uğrunda qaçaraq yarışın. Tez çatanlara ən yaxşı yerlər veriləcəkdir. Geridə qalanları isə camaat köçərək şəhərə girəcək və onların mənzillərini götürüb orada yerləşəcəklər. Beləliklə, arxada qalanlar həsrət çəkənlərdən olacaqdır» - deyir. Sonra hökmdar onlara yarış meydanı tikdirir. Meydanda uzun kölgəsi olan böyük bir ağac əkdirir. Ağacın altından isə arx çəkdirir. Bu ağacın üzərində hər növ meyvə və gözəl nəğməli quşlar olur. Hökmdar insanlara belə deyir: «Bu ağaca və onun kölgəsinə aldanmayın. Tezliklə bu ağac kökündən qopardılacaq, kölgəsi yox olacaq, meyvələri tükənəcək və quşları öləcəkdir. Lakin hökmdarın

---

[746] **Hədis mövdudur**: “Təzkirət əl-Mövduat", səh. 175.

şəhərinə gəldikdə, ağacları, meyvələri əbədi, kölgələri uzun, nemətləri isə daimidir. O şəhərdə görülməyən, eşidilməyən, heç kəsin ağlına gəlməyən şeylər vardır». İnsanlar bu şəhərin adını eşidən kimi onu axtarmaq məqsədilə yola düşərlər. Bədənlərinə yorğunluq çökdüyü, susuzluq onları bürüdüyü zaman tezliklə kökündən kəsiləcəyi gözlənilən ağacın yanından ötdülər və onun altında əyləşib kölgəsi ilə kölgələnməyə, şirin meyvələrindən dadmağa və quşların gözəl nəğmələrini dinləməyə başladılar. Onlara: «Siz özünüzü qorumaq və yarışa görə atlarınıza təlim keçmək üçün onun altında yığışdınız. Atlara minmək üçün hazırlanın və hazır vəziyyətdə dayanın. Boru çalındığı zaman yarış üçün cıdır meydanına çatın» - deyildi. Onların əksəriyyəti bu çağırışa narazılıq edərək: «Biz bu cür kölgəlikləri, su bulaqlarını, yetişmiş meyvələri, belə bir rahatlığı necə qoyub gedə bilərik. Bu istidə, bu yorğunluqla və bu toz-torpaqda bağırsaqların parçalandığı susuz çöllərdə bu uzaq səfəri necə qət edib yarış meydanına atıla bilərik. Axı biz nəqdi necə uzaq müddətə təyin olunmuş bir nisyəyə sata bilərik. Gördüklərimizi qoyub görmədiklərimizə necə qaça bilərik. Əldəki nəqd bir şey birisi gün vəd olunan bir şeydən daha xeyirlidir. Gördüyünü götür, eşitdiyini burax, biz bu günün övladlarıyıq. Bu hal-hazırda olan yaşayışın nə zaman çatacağımızı bilmədiyimiz uzaq ölkədə olan yaşayış üçün niyə tərk edək» dedilər. Hər min nəfərdən bir nəfər ayağa qalxaraq belə dedi: «And olsun Allaha ki, bizim bu dayandığımız yer kəsilməsi, meyvələrinin tükənməsi, quşlarının ölməsi yaxın olan ağacın tükənən kölgəsidir. Davamlı kölgə, əbədi xoşbəxt həyat uğrunda olan bir yarışı əldən buraxmarıq. Onu tərk edənlər yalnız acizlərin acizidir. Kölgəliyin altında istirahət edən bir yolçuya orada çadırını qurub isti və soyuğun əziyyətinə məruz qalmasından qorxaraq oranı özünə məskən etməsi yaraşmaz. Bunu ancaq ən səfeh insan edər. Elə isə yarışa tələsin, yarışa tələsin!»

Yarışa qatılanlar: «Ölümün hökmü dünyada keçərlidir. Bu dünya daim qərar tutulası bir diyar deyildir. Tədarükünüzü tez edin. Çünki ömrünüz də səfərlərdən bir səfərdir. Yarış atlarını qaçırdın və tələsin ki, onlar geri alınacaqlar. Axı onlar əmanətdir. Ozünüz bu dünyada səfərdə ola-ola müvəqqəti kölgəliyin altında qərar tutmayın. Kim bu dünyada yaxşı yaşamaq istərsə, ümidini sonu olan bir yerə bağlamış olur. Həyatların ən yaxşısı bu dünyadan ayrıldıqdan sonra yarış əhlinin yurdundakı ən yaxşı diyardır» - deyib yarış meydanına atılarlar. Yoldaşlarının azlığından qorxmaz və niyyətlərin belində gedərlər. Gedərkən onları heç kəs qınamaz. Geridə qalanlar ağacın kölgəsində yatırlar. Allaha and olsun ki, çox keçmədən ağacın budaqları solmağa, yarpaqları tökülməyə meyvələri kəsilməyə,

bulaqları çəkilməyə başlayır, sonra ağac kökündən kəsilir. Ağacın altında qalanlar isə səmum küləyinin istisindən çevrilirlər. Kölgəsində yaşadıqları həyatın arxada qalmasının həsrətini çəkirlər. Ağacı yandırırlar, onun ətrafındakılar isə od tutub alışar. Atəş onun altında oturanları bürüyər, heç kəs də atəşdən qaça bilməz. Onlar: «Bizimlə birlikdə ağacın altında kölgələnib sonra isə çıxıb geden atlılar hanı» - deyə fəryad edərlər. Onlara: «Başınızı qaldırın, onların yerini görərsiniz» - deyilir. Başlarını qaldırıb baxarkən uzaqdan onların hökmdarın şəhərindəki saraylarda olduqlarını, sarayın otaqlarında müxtəlif növ ləzzətlərdən həzz aldıqlarını gördükləri zaman onlarla birlikdə ola bilmədikləri üçün peşmançılıqları iki qat artır və elə bu zaman özləri ilə istədiklərinin arası kəsilir. Onlara: «Arxada qalanların cəzası budur» - deyilir. Bu barədə Allah-taala belə buyurur: **«Biz** [bunları haram buyurmaqla] **onlara zülm etmədik. Onlar** [günah işlər görməklə] **özləri özlərinə zülm edirdilər.** [Buna görə də Allah bir çox nemətləri onlara haram buyurdu]**»** (ən-Nəhl, 118).

**İyirminci misal**

Peyğəmbər dünyanı ikiyə bölünüb sonda isə bir iplikdən asılı qalan paltara bənzədir. Bu paltar iplikdən çox da asılı qala bilməz. İbn Əbi Dünya Fadl ibn Cəfərdən, o da Vəhb ibn Hiyaddan, o da Yəhya ibn Səid Qəttandan, o da Əbu Səid Xələf ibn Həbibdən, o da Ənəs ibn Malikdən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Bu dünya əvvəldən axıra kimi ikiyə bölünüb sonra isə bir iplikdən asılı qalan paltara bənzər. Bu iplik də az qala qırılacaqdır».[747]

Bu misalın daha geniş şərhini bilmək istəsən, İmam Əhmədin "Müsnəd"ində Əbu Nazradan, o da Əbu Səiddən rəvayət etdiyi hədisə bax. Beləliklə, Əbu Səid deyir: «Bir dəfə Allahın elçisi əsr namazını bizə günorta qıldırdı. Sonra ayağa durub xütbə oxumağa başladı. Qiyamətdən öncə nə varsa, hamısını xəbər verdi. Bunları yadında saxlayan saxladı, unudan unutdu. Camaat başını qaldırıb günəşə baxırdılar ki, görsünlər heç batmadığı yer qalıbmı. Elə bu zaman Allahın elçisi: "Eşidin! Dünyanın keçirdiyi vaxtla müqayisədə qalan vaxtı, sizin bu gününüzün keçən vaxtı ilə müqayisədə qalan vaxtı qədərdir" - buyurdu».[748]

Hafs ibn Qiyasdan, o da Leysdən, o da Muğirə ibn Həkimdən, o da ibn Ömərdən belə deməsini rəvayət edir: «Allahın elçisi bizim yanımıza çıxdıqda günəş şuaları xurma budaqlarının üzərinə

---

[747] **Zəifdir**: İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 221; "Qasrul-əməl", 122; əl-Beyhəqi, "Şuabul-İman", 10240; əl-Albani, 1970; Əbu Nəim, "əl-Hilyə", 8/131.
[748] **Həsəndir**: Əhməd, 3/19, 61; ət-Tirmizi, 2191.

düşürdü. Peyğəmbər: "Dünyanın qalan ömrü bu günümüzün keçirdiyi vaxtla müqayisədə qalan vaxtı qədərdir" - buyurdu».[749]

İbn Əbi Dünya İbrahim ibn Səddən, o da Musa İbn Xələfdən, o da Qətadədən, o da Ənəsdən belə rəvayət edir: «Allahın elçisi gün batan vaxt xütbə oxuyaraq: "Dünyanın keçirdiyi vaxtla müqayisədə qalan vaxtı sizin bu gününüzün keçən vaxtı ilə müqayisədə qalan vaxtı qədərdir" - buyurdu».[750]

Dünya bütünlüklə bir gün kimidir. Allahın elçisi o günün axırında gün batmamışdan az öncə göndərilmişdi. Cabir və Əbu Hüreyrə rəvayət edirlər ki, Peyğəmbər şəhadət və orta barmaqlarını birləşdirib: «Mən və qiyamət belə göndərildik» - dedi.[751]

Sələflərdən biri belə deyir: «Səbir edin! Çünki dünyanın günləri azdır. Siz dayanan bir karvansınız. Sizlərdən biri çağrıldığı zaman az qala arxasına belə baxmadan çağırışa cavab verir. Mən sizin özünüzün öləcəyinizi xəbər verdim. Ölüm qaçılmaz bir həbsdir. Allah isə pusqudadır. Həqiqətən, ruhlar Vaqiə surəsinin axırında deyildiyi kimi çıxır».

### İyirmi birinci misal

Dünya su ilə dolu böyük bir hovuza bənzər. İnsanlar və heyvanlar su içmək üçün bura gələrlər. Bu hovuza gələnlərin sayının çox olmasından hovuzda su azalmış və nəhayət insanların hovuza girməsi və heyvanların ifraz etmələri sayəsində hovuzun dibində bulanıq su qalmışdır. Müslim Utba ibn Qəzvandan rəvayət edir ki, Xalid ibn Ömər əl-Ədəvi onlara xütbə oxudu və xütbəsində belə dedi: «Dünya keçici olduğunu xəbər vermiş və sürətlə keçib getmişdir. Dünyadan isə sahibinin saxlamağa çalışdığı su qabında qalan saxlantı kimi bir şey qaldı. Siz bu dünyadan zaval olmayan bir yerə köçəcəksiniz. Elə isə ən saleh əməllərlə köçün».[752]

Abdullah ibn Məsud belə deyir: «Allah-taala dünyanı bütünlüklə az etmişdir. Dünyadan isə ancaq azın azı qalır. Dünyanın qalan ömrü saf suyu içilib bulanıq suyu qalan gölə bənzər».[753]

### İyirmi ikinci misal

Bir xalq bir müddət bir şəhərdə yaşayır. Həmin şəhərdə çoxlu hadisələr və bəlalar olur. Şəhərin yolları dağılmış vəziyyətdə olur.

---

[749] **Səhihdir**: İbn Əbi əd-Dünya. "Qasrul-əməl", 120; əl-İraqi, "əl-Muğni", 4/459, həsən sənədlə; Mən deyirəm: sənəd zəifdir. Əhməd, 2/133; Əhməd Şakir, 6173.
[750] **Həsəndir**: İbn Əbi əd-Dünya, "Qasır əl-əməl", 121; İbn Cərir, "Tarix", 1/6.
[751] əl-Buxari, 6505, Əbu Hureyrənin hədisi; Müslim, 867, Cabirin hədisi.
[752] Müslim, 2967.
[753] əl-Buxari, 2964.

Tez-tez ora yağı düşmənin qoşunları hücum çəkir. Bunu görən hökmdar müsibət və xəstəliyin girə bilməyəcəyi bir yerdə ikinci şəhəri saldırır. Birincini isə xaraba qoymaq istəyir. Oranın sakinlərinin yanına elçi göndərib bildirir ki, üç gündən sonra hamı şəhəri tərk etsin və heç kəs geri qalmasın. Əhaliyə birinci şəhərdə çəkisi yüngül, qiyməti isə baha olan ən gözəl, ən faydalı, hökmdar üçün yararlı olan ləl-cəvahiratları, qızıl və gümüşləri onun ikinci şəhərinə daşımalarını əmr edir. Hökmdar onlara bələdçilər və yük daşıma alətləri göndərir. Onların gəlişi münasibəti ilə yol çəkdirir və göstəricilər basdırır. Onların bir-birinə təsir edərək ikinci şəhərə getmələri üçün dalbadal elçilər göndərir. Lakin onlar dəstələrə ayrılırlar. Çox az insanlar bilirlər ki, onlar bu şəhərdə uzun müddət qala bilməzlər. Buna görə də onlar bu şəhərdə faydalı əşyaları götürüb hökmdarın ikinci şəhərinə apara bilmədikləri təqdirdə, fürsəti əldən buraxmış olacaqlarına və bir daha belə bir fursəti ələ keçirə bilməyəcəklərinə tam yəqin idilər. Ona görə də onlar vaxt fürsətini dəyərli əşyaları qoyub dəyərsizlərə sərf etməyin zərərli olduğunu görüb birinci şəhərdə hökmdar üçün ən sevimli və ən faydalı əşyaların hansı olduğunu müəyyənləşdirməyə başladılar. Müəyyənləşdirdikdən sonra daha başqa şeyə baxmayıb işə başladılar. Onların hər biri hökmdarın hüzuruna böyük bir cəvahiratla getməsi hökmdar üçün dəmir, dəmir pul və digər ağır əşyalarla getməkdən daha hörmətli olduğunu görüb nə qədər kiçik belə olsa, hökmdarın yanında ən qiymətli və onun üçün ən sevimli əşyanı əldə etməyi qarşısına məqsəd qoydu. Digər bir dəstə isə yükü ağır olan əşyaları hazırlamağa başladılar. Yüklərinin çoxluğuna görə bir-biriləri ilə rəqabət aparırdılar. Bu dəstə də bir neçə qismə bölünür. Onlardan bəzilərinin yükü pul, bəzilərininki isə özlərinə layiq digər əşyalar idi. Lakin onların məqsədləri yükləri hazırlayıb başqa şəhərə köçmək idi. Digər bir dəstə isə birinci şəhərdəki qəsrləri təmir etməyə üz tutdular. Başları qəsrlərin bəzədilməsinə, kef-damağa qarışdı. İkinci şəhərə köçüb getmək istəyənlərə qarşı müharibə elan edib: «Əgər bizimlə şəhərin yenidən qurulmasında, onun vətən seçilməsində və birgə yaşayışda bizə qoşulmasanız, sizə bizim mallarımızdan hər hansı bir şey götürməyə və buradan başqa yerə köçmənizə imkan verməyəcəyik» - dedilər. Beləliklə, onlar müharibəyə başladılar. Köçüb getmək istəyənlərlə döyüşdülər. Onların mallarını yeməyə, ailələrinə hücum çəkməyə çalışdılar. Onlardan yalnız hökmdarın birinci şəhəri tərk edib ikinci şəhərə getmələrini əmr etdiyi zaman onun dəvətini qəbul etdikləri üçün intiqam alırdılar. Dördüncü bir dəstə isə gəzib-dolaşır, istirahət edir və: «Şəhərin yenidən qurulmasında özümüzə əziyyət vermirik, nə də şəhərdən köçüb

gedirik. Köçmək istəyənlərə isə nə mane oluruq, nə də kömək edirik» - deyirdilər. Həmin şəhərdə hökmdarın içində hərəmxanası olan qəsri var idi. Qəsr hasarla əhatəyə alınmış və gözətçilərlə mühafizə olunurdu. Gözətçilər şəhər əhalisinin ona yaxınlaşmağının qarşısını alırdılar. Orada olanlar qəsri nə qədər dövrə vurdularsa da, içəri daxil olmaq üçün qapını tapa bilmədilər. Hasarı dağıdıb içəri girdilər. Hərəmxananı dağıtdılar. Oradan hökmdarın qəzəbinə səbəb olacaq və ona ağır gələcək əşyalarını götürdülər. Bununla kifayətlənməyib başqalarını da hərəmxananı dağıtmağa və hökmdarın əşyalarını götürməyə çağırırdılar. Belə bir vaxtda boru çalındı, onların hamısı bir yerə toplandı, heç kəs arxada qala bilmədi. O dəstələrin hər biri mövcud vəziyyətində həbs edilib hökmdarın hüzuruna gətirildi və hökmdar onları bir-bir sorğu-suala çəkdi. Onlar birinci şəhərdən gətirdikləri malları hökmdara ərz etdilər. Hökmdar ona yarayan malları aldı, yararsızları isə sahiblərinin üzünə çırpdı. Hərəmxanasını dağıdanları isə əməllərinin müqabilində cəzalandırdı. Günahkarlar dağıtdıqları qəsri təmir etmək, onun hərəmxanasını qorumaq və bu tacirlərin həmin şəhərdən gətirdikləri mallardan gətirmək üçün yenidən birinci şəhərə qayıtmaq üçün izn istədilər. Lakin hökmdar: «Heyhat! Artıq o şəhər elə xarabazarlığa çevrilmişdir ki, bir daha təmiri mümkün deyil. Ondan sonra isə əbədi viran qoyulması mümkün olmayan bir şəhər vardır» - dedi.

**İyirmi üçüncü misal**

Dünya yuxuya bənzər. Dünyada yaşamaq yuxudur, ölüm isə oyanmaqdır. Dünya tarlaya bənzər. Orada işləmək toxum əkməkdir. Biçin isə qiyamət günüdür. Dünya iki qapılı evə bənzər. İnsanlar bir qapısından girər, digər qapısından isə çıxarlar. Dünya yumşaq və özəl rəngli bir ilana bənzər. Sancması ilə öldürər. Dünya ləziz dadlı, xoş iyli zəhərli yeməyə bənzər. Kim ondan ehtiyacı qədər qidalansa, şəfa tapar, bundan artığını yeyəni isə öldürər. Dünya mədədəki yeməyə bənzər. Əzalar ondan ehtiyacı qədər qidalanar. Artığının isə bağırsaqlarda saxlanılması ya öldürər, ya da əziyyət verər. Peyğəmbərin də yaşıllıq yeyən heyvan hədisində[754] qeyd etdiyi kimi insan onu ifraz etmədikcə rahatlıq tapmaz. Dünya ən kifir qadına bənzər ki, gözlərindən başqa bütün bədəni örtük altında olar. Gözləriylə insanları fitnəyə salaraq evinə dəvət edər. İnsanlar da onun dəvətini qəbul edib evinə getdikdə qadın onlar üçün görünüşünü açar vu onları bıçaqları ilə kəsərək quyuya atar. Köhnə və təzə aşiqlərinin hamısının başına bu oyunu açar.

[754] Yuxarıda verilmişdir.

Qəribədir ki, dünyanın təzə aşiqləri gözü çıxmış qardaşlarının başına gələn müsibət və bəlaları görə-görə onların öldükləri yerə tez çatmaq uğrunda bir-biriləri ilə yarışarlar. Bu barədə Allah-taala Qurani-Kərimdə belə buyurur: **«Siz özlərinə zülm edənlərin yurdlarında da sakin oldunuz, onların başına nələr gətirdiyimiz də sizə bəlli oldu. Üstəlik sizin üçün** [ibrətamiz] **məsəllər də çəkdik»** (İbrahim, 45).

Dünya haqqında Allah-taalanın Öz kitabında çəkdiyi misallar kifayətdir və onlar dünya həqiqətlərinə tam uyğundur.

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, dünyanın iç üzü belə olduqda ondan aza qane olmaq və dünyada zahid kimi yaşamaq dünya malını yığmaqdan və ona rəğbət bəsləməkdən daha xeyirlidir. Onların sözlərinə görə dünyaya rəğbətlə Allaha və əbədi axirət dünyasına rəğbət bir yerdə cəmlənə bilməz, bu hər iki rəğbət bir yerdə bərabər yaşaya da bilməz. Mütləq onlardan biri digərini qovacaq və məskənə sahib olacaqdır. Allah elçisinin qızı ilə Allah düşməninin qızı bir kişinin kəbini altında həmişəlik toplana bilməzlər. Yenə də səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, Allah elçisinə dünyanın xəzinələrinin açarları ərz olunduqda onlardan imtina etməsi dəlil üçün kifayətdir. Təbii ki, əgər Allahın elçisi onları götürsəydi, bununla o, məxluqat arasında Allaha ən çox şükür edən bəndə olardı və bu onun Allah dərgahındakı dərəcəsinə heç bir mənfi təsir etməzdi. Lakin Peyğəmbər bütün bunlara baxmayaraq, bir gün ac, bir gün tox yaşamağı seçdi.[755] Hətta dünyasını dəyişərkən zireh paltarı ailəsinə yemək aldığı üçün girov olaraq saxlanılmışdı.[756]

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər Allah elçisinin ölümündən sonra insanları 4 qismə bölürlər. Birinci qisim Əbu Bəkr əs-Siddiq və onun yolunun davamçılarıdır ki, nə onlar dünyanı sevmişlər, nə də dünya onları. İkinci qisim Ömər ibn əl-Xəttab və onun getdiyi yolun yolçularıdır ki, dünya onları istəsə də, onlar dünyanı istəməmişlər. Üçüncü qismə aid olan Bənu Umeyyə qəbiləsinin xəlifələri və onların yolu ilə gedənlərdir. Onlar da dünyanı, dünya da onları istəmişdir. Bunlar arasında yalnız Ömər ibn Abdüləziz istisna olunur. Çünki dünya onu istəsə də, o dünyanı istəməmişdir. Dördüncü qismin insanları isə dünyanı istəyənlər, lakin dünya tərəfindən istənilməyən Allahın yoxsul insanlarıdır ki, Allah dünyanı onların qəlbinə yerləşdirmiş və dünya malını yığmaqla onları imtahana çəkmişdir. Heç kəsə sirr deyildir ki, bu siniflərin arasında ən xeyirlisi birinci qisimdə özlərinə yer alan insanlar hesab

---

755 Yuxarıda verilmişdir.

756 Yuxarıda verilmişdir.

olunur. İkinci qisim də fəzilətlidir. Çünki onlar da dünyanı istəmədikləri üçün birinci qismə qoşulmuşlar.

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər deyirlər ki, bir nəfər Allah elçisinin hüzuruna gələrək: «Ey Allahın elçisi! Mənə elə bir əməl göstər ki, onu etdiyim zaman həm Allah, həm də insanlar məni sevsin». Allahın elçisi isə belə dedi: «Dünyada zahid ol ki, Allah səni sevsin. İnsanların səni sevməsi üçün isə onların malına göz tikmə»[757]. Əgər zənginlik əfzəl olsaydı, onda Allahın elçisi ona zəngin olmağı məsləhət görərdi. Allah-taala kafirlərlə vuruşmağı qanuniləşdirmiş, lakin dünyadan təcrid olduqlarına və tərkidünyalıqlarına görə rahiblərlə vuruşmağı qadağan etmişdi. Rahiblərin Allahın, Onun peyğəmbərlərinin və dininin düşmənləri olmasına baxmayaraq onlara qarşı müharibə olunmaması və onların üzərinə cizyə vergisinin qoyulmaması qanunu uzun müddətdir ki, qalmaqdadır. Elə buradan məlum olur ki, tərkidünyalığın Allah yanında özünəməxsus yeri vardır. Həmçinin yoxsulların üstün olmasının hikməti onların cəzasının zənginlərlə müqayisədə daha yüngül olmasıdır. Belə ki, evli adamın zina etməsinin kəffarəsi ölənə kimi daşqalaqdırsa, subay adamın zina etməsinin kəffarəsi isə şallaq və sürgündür. Buna görə də yoxsulun savabı zənginin savabından daha böyük olur. Yoxsulluğun hər bir ağrı-acısını və zəlilliyini dadmış, qəlbi qırıq, məşəqqət və ağırlıqların məngənəsi altında olan kasıb insanla zənginliyin izzət və ləzzətini dadan və birbaşa onun şirin nemətlərindən ləzzət alan zəngin insan Allah dərgahında necə bir ola bilər. Yoxsullar yoxsulluğun hər bir ağrı-acısına Allahın onları hifz etməsi ilə dözür və buna səbir edərək Allahdan razı qalırlar. Mücahidlərin məşəqqətinin mükafatı hara, rahat və təhlükəsiz yerdə oturub Allaha ibadət edənlərin mükafatı hara!

İki hal necə bərabər ola bilər?! Biri ilə Cənnət, digəri ilə isə Cəhənnəm əhatə olunmuşdur. Nəfsin istədiklərinin əsası mal-dövlətdir, məşəqqətlərin əsası isə yoxsulluqdur. Yoxsul miskinliyin, aclığın, çılpaqlığın və ehtiyacların ağrı-acısından xilas ola bilməz. Bu ağrıların hər biri onun qarşısında duran pisliklərin kəffarəsidir. Bunların hər biri kasıbın yaxşılıq edərək əldə etdiyi savabın üzərinə gəlir, onlar zənginlərin saleh əməllərinə ortaq olurlar, kəffarələrin çoxluğu ilə zənginlərdən fərqlənirlər. Lakin mal xərcləməkdə, sədəqə verməkdə, insanların mənfəətinə xidmət etməkdə onlardan geri qalırlar. Lakin kasıbların bu işdə də zənginlərə qoşulması onların mükafatı qədər savab qazanmaları üçün yollar vardır. Belə ki, Allah-taala onların niyyətindən bilir ki, əgər onlara da zənginlərə verilən

[757] **Zəifdir**: "Səhih əl-Əzkar va daifə", 1250/267.

mal-dövlət verilsəydi, onlar da zənginlərin etdiklərini edərdi. Əgər yoxsul səmimi qəlbdən: «Mənim də var-dövlətim olsaydı, onların etdiyi yaxşı əməlləri mən də edərdim» - deyərsə, niyyətinə görə zənginlərin qazandıqları savaba bərabər savab qazanarlar. Belə ki, Peyğəmbər bunu İmam Əhmədin və Tirmizinin Əbu Kəbşə əl-Ənmaridən rəvayət etdiyi hədisdə[758] vurğulamışdır. Dünya yoxsul üçün zindandır. Çünki yoxsul dünya nemətlərindən və onları dadmaqdan məhrumdur. Lakin zəngin isə bu zindandan xilas olmuşdur. Peyğəmbər hədislərinin birində: «Dünya möminlər üçün zindan, kafirlər üçün isə cənnətdir»[759] - deyərək bu fikri bir daha təsdiqləmişdir. Zəngin nəfsini zənginliyin çağırdığı şeylərdən və azğınlıqlardan qorumayıb özünü şəhvətlər meydanına atsa, dünya onun üçün cənnət olar. O fəzilətə yoxsulluğun zindanında həbs olunan kasıba oxşadığı zaman nail ola bilər.

Allah-taala və Elçisi mükafatları dünyada verilən insanları məzəmmət etmişlər. Çünki bu mükafatlar ya axirət mükafatlarının əvəzidir, ya da axirət mükafatlarından çıxılır. Kim dünya nemətlərdən məhrum edilibsə, axirət nemətləri ona tam olaraq veriləcəkdir. Allahın elçisinə badam sıyığı gətirildiyi zaman: «Bu naz-nemət sevənlərin həyatıdır»[760] - deyə onu içməkdən imtina etmişdir.

Həsən əl-Bəsridən soruşublar: «İki nəfər vardır ki, bunlardan biri tərkidünyadır. Digəri isə onu qazanıb sədəqə verir. Bunlardan hansı üstündür?». O da: «Tərkidünya mənim üçün daha üstündür» - deyə cavab verir.

Hələ Həsən əl-Bəsridən öncə bu məsələ ilə bağlı İsadan qızıl küpənin yanından keçən, biri ona tərəf belə baxmayan, digəri isə onu götürüb sədəqə paylayan iki adamın hansının üstün olması haqqında soruşublar. O da: «Ona tərəf baxmayan» - deyə cavab verir.

Allah elçisinin də qızıl əşyanın yanından keçərək ona tərəf belə baxmaması yoxsulluğun üstün olmasına sübutdur. Əgər Peyğəmbər onu götürmüş olsaydı belə, Allah yolunda xərcləyərdi.

Dini yaxşı bilən yoxsul zənginin zənginliyi sayəsində nail olduğuna o, niyyəti və sözü ilə nail olar, onun savabına bərabər savab qazana bilər və belə olan halda zəngindən beş yüz il əvvəl Cənnətə girməklə, yoxsulluğun ağrı-acısına dözdüyü üçün mükafata layiq görülməklə üstün olduğu kimi mal-dövləti olmadığı üçün haqq-hesaba çəkilməməklə də ondan üstün olar.

İmam Əhməd İbadə ibn Müslimdən, o da Yunis ibn Xəbbabdan,

---

[758] **Səhihdir:** Əhməd, 4/230, 231; ət-Tirmizi, 2325; İbn Macə, 4228.
[759] Müslim, 2956.
[760] **Zəifdir:** "Zəvaid əz-Zühd", 200; Əhməd, "əz-Zühd", 6; İbn Sad, "ət-Tabaqatul-Kubra", 1/395.

o da Əbu əl-Buhturi ət-Taidən, o da Əbu Kəbşədən Allah elçisinin belə deməsini rəvayət edir: «Üç şey vardır ki, üzərinə barəsində and içirəm. Sizə elə bir şey danışacağam ki, onu yadınızda saxlayın. And içdiyim üç şey isə bunlardır: birincisi, sədəqə qulun malını azaltmaz. İkincisi, barəsində əməlli-başlı haqsızlıq olunan və buna səbir edən elə bir qul yoxdur ki, uca və böyük Allah bununla onun izzətini artırmasın. Üçüncüsü isə dilənçilik qapısını açan elə bir bəndə tapılmaz ki, Allah-taala onun üzünə yoxsulluq qapısını açmasın. Sizə söyləyəcəyim şeyə gəldikdə, onu yadınızda yaxşı-yaxşı saxlayın. Dünya ancaq dörd sinif insan üçündür. Birinci Allahın mal və elm bəxş etdiyi bəndədir ki, o buna görə Rəbbindən qorxar, qohum-əqrabasına əl tutar və Allahın ona verdiyində haqqı olduğunu unutmaz. Bu Allah dərgahında ən üstün dərəcədir. İkinci Allahın elm verib mal verməmədiyi insandır ki: "Əgər Allah mənə də mal versəydi, mən də filankəs etdiyi [yaxşı işi] görərdim" - deyər və bununla da həmin şəxslə savabı bərabər olar. Üçüncü Allahın mal verib elm verməmədiyi quldur ki, onu nəfsinin istəklərinə uyğun sərf edər, ona verilən sərvətə görə Rəbbindən qorxmaz, qohumlarına əl tutmaz, malında Allahın haqqını tanımaz. Bu da Allah dərgahında ən pis dərəcədir. Dördüncü isə Allahın nə mal, nə də elm verdiyi bəndədir ki: "Əgər Allah mənə də mal versəydi, mən də filankəs etdiyi [nalayiq hərəkətləri] edərdim" - deyər və bununla da niyyətinin müqabilində həmin şəxslə günahı bərabər olar».

Beləliklə zəngin yaxşı əməllərilə üstün tutularaq yoxsula çatmış, yoxsul isə səmimi niyyəti ilə savabda zənginə çatmışdır. Zəngin malını düzgün xərcləməyin yolunu bilməzsə, saleh əməldən geri qalmış olur, kasıb isə pis niyyəti ilə yüksək savabdan məhrum olur, hələ üstəlik niyyətinə görə də işləmədiyi pis əməllərin günahını qazanır. Deməli yaxşı əməldən geri qaldığı üçün zənginə var-dövləli fayda verməz, gözəl niyyətinə görə kasıba yoxsulluğun zərəri olmaz və həm də pis niyyətinə o bu yoxsulluqdan heç bir xeyir görə bilməz.

Səbir edən yoxsulların üstün olduğunu iddia edənlər mövzu haqqında bütün bu açıqlamaların yetərli, sağlam və iki sinif arasında hökmlü olduğunu bildirmişlər.

Müvəffəqiyyət Allahdandır.

# İYİRMİ DÖRDÜNCÜ BÖLMƏ

## Şükür edən zənginlərin üstün olmasını iddia edənlərin Quran, Sünnə, əsər və ibrətamiz misallardan dəlilləri

Şükür edən zənginlərin üstün olduğunu iddia edənlər səbir edən yoxsulların üstün olduğunu iddia edənlərə xitabən deyirlər: «Siz bizə hər cür sübut təqdim etdiniz. Biz sizdə bu dəlillərdən də çox dəlil olmasını bilirik. Lakin siz uzunçuluğa yol vermədən və ixtisarlar etmədən orta mövqe tutdunuz və elə zənn etdiniz ki, bu dəlillər şükür edən zənginlərin deyil, səbir edən yoxsulların üstün olması barədə hökm verir. Bizi verdiyiniz məhkəməyə biz də sizi verəcəyik. Malınızı ərz etdiyiniz kəsə biz də ərz edəcəyik. Özümüzün və sizin dəlillərinizi heç vaxt yalnış çəkməyən ağıl və şəriət tərəzisinə qoyacağıq. O zaman bizə də, sizə də kimin əfzəl olduğu bəlli olacaqdır. Lakin siz aranızdan özünü sədaqətli və səbir edən yoxsullara oxşadan, onların geyimini geyinən, əsl həqiqətdə isə dünyaya olduqca həris, insanların ən xəsisi, kasıbçılıqdan və səbirdən uzaq olan, daxilən dünyaya həris olub zahirən özünü yoxsul göstərən, Rəbbindən qafil olan, nəfsinə uyan, axirəti barəsində qüsurları olan, süni olaraq yoxsul qiyafəsində görünməyə çalışan zənginləri, istəyərək deyil məcburən yoxsulluğa səbir edən, Allahı və axirəti istədiyi üçün deyil, iflas olduğu üçün tərkidünyalığa qapılan, yoxsulluğundan dili və halı Allaha şikayət edən, verdikdə razı olan, vermədikdə isə qəzəblənən, dünyadan ötrü burnunun ucu göynəyən, ən kasıb insan olmasına və dünyanın onu istəməməsinə baxmayaraq, dünyaya hamıdan çox rəğbət göstərən yoxsulları bizim aramızdan çıxarın. Biz də öz aramızdan çeşidli var-dövlət növlərini yığan və günbəgün onu artıran, malından bərk-bərk yapışaraq ona sahib olan, malı artdığı zaman sevinən, qəlbi malının quluna çevrilən, dünyanı əldə etmək üçün dəridən qabıqdan çıxan, xeyriyyəçilik üçün maddi yardım etməsini istədikdə bir az verən, başqasını öz nəfsindən üstün tutmağa çağırıldıqda qaçan zənginləri çıxardaq. Hər iki sinifdən səmimi qəlbdən şükür edən və səbir edən qardaşlarımız imanları və halları ilə Allah və axirət uğrunda yarışdıqları kimi əməlləri və malları ilə də bu məqsədlə yarışa durarlar. Qəlbləri gecə-gündüz Allah üçün döyünər. Məqsədləri isə Ona doğru yarışmaqdır. Zənginlər kasıbların yanına keçər,

yoxsulların saleh əməldə onları ötdüyünü gördükdə, qollarını çırmalayıb onlara çatmağa can atarlar. Kasıblar da zənginlərə baxar, zənginlərin mallarını Allah yolunda xeyirxah məqsədlərə xərcləməklə onları ötdüyünü görüb onlar kimi, bəlkə onlardan da çox yaxşı əməl etmək, xoş söz söyləmək, səbir etmək və tərkidünyalığa qapılmaqla onlara çatmağa çalışarlar. Budur bizim səbir edən yoxsullarla, şükür edən zənginlərin birinin digərindən üstün olması barədə fikir ayrılığına düşən qardaşlarımız. Yuxarıda qeyd etdiyimiz yalançı zənginlərlə və yalançı yoxsullara gəlincə, onların hər biri əzab çəkərkən digərinin özündən aşağıda və ya daha aşağıda olduğunu görür. Yardım diləmək üçün üz tutulan yeganə varlıq Allah-taaladır».

Allah-taala Öz müqəddəs kitabında saleh əməlləri mədh etmiş və onun sahiblərini tərifləmişdir. Zəkat vermək, xeyriyyəçilik etmək, malla Allah yolunda cihad etmək, döyüşçüləri silah-sursatla təchiz etmək, ehtiyacı olan insanlara əl tutmaq, kölələr azad etmək və aclıq zamanı qida ilə təmin etmək yalnız zənginlik sayəsində həyata keçirilir. Yoxsulun səbri hara, ölmə məhkum olmuş yoxsula kömək edib onun yoxsulluğuna yardım əlini uzadan zəngin hara?! Yoxsulun səbri hara, malı ilə Allahın dininin qələbə çalmasına, Onun kəlməsinin ucalmasına və düşmənlərinin məhvinə kömək edən zəngin hara?! Əbu Zərin yoxsulluğa səbir etməsi hara, Allah yolunda əzaba məruz qalanları satın alıb azad edən, malını İslamın zəfər çalması uğrunda xərcləyən Əbu Bəkr əs-Siddiqin şükrü hara?! Belə ki, Əbu Bəkr haqda Peyğəmbər belə buyurur: «Əbu Bəkrin malının mənə xeyiri dəydiyi kimi heç kəsin malının mənə xeyiri dəyməmişdi».[761]

Suffə əhlinin[762] səbri hara, Osman ibn Əffanın böyük məbləğdə Allah yolunda pullar xərclədiyi hara?! Allahın elçisi onun malının bir qismi haqqında: «Bu gündən sonra Osman nə də etsə, ona zərər yoxdur» - dedi, sonra belə buyurdu: «Allah sənin gizli və aşkar, görünən və görünməz günahlarını bağışlasın, ay Osman!».[763]

Əgər siz Quran ayələrinə diqqətlə nəzər salsanız, mallarını Allah yolunda xərcləyənlərin səbir edən yoxsullardan qat-qat artıq təriflənməsini görmüş olarsınız. Həmçinin Allahın elçisi də üstdəki əlin altdakı əldən xeyirli olmasına[764] şəhadət vermiş və üstdəki əli

---

761 **Səhihdir**: İbn Macə, 94; ən-Nəsai, "əl-Kəbir", 5/37; Əhməd, 7439; İbn Əbi Şeybə 12/6-7; İbn Hibban, 6858.

762 Evsiz-eşiksiz, yoxsul mühacirlərdir ki, Mədinə məscidində kölgəli yerlərdə özlərinə sığınacaq tapıb məskunlaşmışlar.

763 **Səhihdir:** ət-Tirmizi, 3701; Əhməd, 5/63; İbn Əbi Asim, "əs-Sünnə", 1279, "əl-Cihad", 82; Abdullah bin Əhməd, "Zevaid-əl-Müsnəd", 5/63; "Fadail əs-Sahabə", 738; ət-Tabərani, "əl-Əvsat", 9226; əl-Hakim, 5/205; əl-Beyhəqi, "Dəlail ən-Nubuvvə", 5/205; Əbu Nəim, "əl-Hilyə", 1/95 və s.

764 əl-Buxari, 1429; Müslim, 1033.

verən əl kimi, altdakı əli isə dilənən əl kimi izah etmişdir. Allah-taala elçisinə nemətlərini sadalayaraq onu yoxsulluqdan sonra zəngin etmişdir. Zənginlik Allahın onu sonradan saldığı haldır. Yoxsulluq isə Peyğəmbərin içindən çıxarıldığı halıdır. Allah-taala onu həmişə bir şeydən daha xeyirli olan bir şeyə çəkərdi[765]. Bu barədə Allah-taala belə buyurur: **«Şübhəsiz ki, axirət sənin üçün dünyadan daha xeyirlidir!»** (əd-Duha, 4). Burada hər iki hal da nəzərdə tutulur. Yəni Allah-taala elçisinin hər bir halının əvvəlki halından daha xeyirli olmasını bildirir. Sonrakı ayədə isə belə deyilir: **«Həqiqətən, Rəbbin sənə** [qiyamət günü ən uca şəfaət məqamı, Cənnətdə tükənməz nemətlər] **bəxş edəcək və sən** [Ondan] **razı qalacaqsan!»** (əd-Duha, 5). Bu ayədə Allahın Peyğəmbərinə bəxş edəcəyi şeylərə həm dünyadakı, həm də axirətdəki nemətlər daxildir.

Şükür edən zənginlərin üstün olduğunu iddia edənlər zənginliklə şükrün fəzilət və rəhmət olmasını bildirir və bu ayəni dəlil gətirirlər: **«**[Ey möminlər!] **Nə əhli-kitabdan olan kafirlər, nə də müşriklər sizə Rəbbiniz tərəfindən heç bir xeyir göndərilməsini istəməzlər. Halbuki Allah Öz mərhəmətini istədiyi kimsəyə məxsus** [bəxş] **edər. Allah böyük mərhəmət sahibidir!»** (əl-Bəqərə, 105).

Yenə də şükür edən zənginlərin üstün olduğunu iddia edənlər qeyd edirlər ki, səbir edən yoxsulların ibadət etmələrinin bir səbəbi də onların sədəqə və xeyirxah əməllərlə yoxsullara əl tutmaları və ibadətlərinə kömək etmələridir. Həmçinin onların iddialarına zənginlərin xeyriyyəçilik məqsədilə mallarını sərf etmələrinin mükafatı ilə yanaşı yoxsulların savabından bol bir hissə də onlara düşür. Belə ki, «Səhih İbn Xüzeymə»də Salman Farisi Peyğəmbərdən belə rəvayət edərək deyir: «Allahın elçisi ramazan ayını yada salaraq buyurdu: "Kim bu ayda bir orucluya iftar verərsə, onun günahları bağışlanar və boynunu Cəhənnəmdən azad etmiş olar. Ona oruclu olanın savabından çıxılmamaq şərti itə savabı qədər savab verilər"»[766]. Şükür edən zəngin həm öz orucunun savabı ilə, həm də iftar verdiyi yoxsulun savabına bərabər bir savabla mükafatlandırılmışdır. Şükür edən zənginin sədəqəsinin üstünlüyündən başqa bir şeyi olmasaydı, əməllər bir-biriləri ilə öyündüyü zaman sədəqə özünü o əməllərdən üstün tutmazdı.

Beləliklə, Nadr ibn Şəmildən, o da Qurrədən, o da Səid ibn əl-

---

[765] Allah taala buyurmuşdur: «Səni yoxsul ikən tapıb dövlətli etmədimmi?!» (əd-Duha, 8).

[766] **Zəifdir:** İbn Xuzeymə, 1887; əl-Məhəməli, "Əməliyyə", 293; İbn Əbi əd-Dünya, "Fadail Ramadan", 69/41; əl-Beyhəqi, "Fədail əl-Əvqat", 37-38; əl-Albani, "əd-Daif", 871.

Museyyibdən, o da Ömər ibn əl-Xəttabdan belə deməsini rəvayət edir: «Əməllər bir-birinin qarşısında öyündüyü zaman sədəqə: "Mən sizin ən əfzəlinizəm" - demişdir». Sədəqə qul ilə Cəhənnəm arasında qoruyucudur. Onu səmimi qəlbdən və gizli şəkildə verən isə bunun sayəsində qiyamət günü Ərşin kölgəsində kölgələnəcəkdir.

Amr ibn Haris və Yezid İbn Əbi Həbib Əbulxeyrdən, o da Uqbə ibn Amirdən Allahın elçisinin belə deməsini rəvayət edir: «Sədəqə qəbir əhlinin qəbirlərinin hərarətini söndürür və mömin qiyamət günü öz sədəqəsinin kölgəsində kölgələnəcəkdir».[767]

Yezid İbn Əbi Həbib Əbulxeyrdən, o da Uqbə ibn Amirdən Allahın elçisinin belə deməsini rəvayət edir: «Hər kəs insanlar arasında hökm verilənə qədər öz sədəqəsinin kölgəsi altında olacaqdır».[768] Yezid söyləyirdi ki, Əbulxeyr hər gün ona heç olmazsa bir kətə və ya bir soğan gətirərdi.

Muazdan rəvayət olunan bir hədisdə o, Peyğəmbərin belə deməsini söyləyir: «Su odu söndürdüyü kimi sədəqə də günahı söndürür [yuyur]».[769]

Beyhəqi Əbu Yusuf əl-Qazidən, o da Muxtar ibn Fulfuldan, o da Ənəsdən Allah elçisinin belə deməsini rəvayət edir: «Tələsin, sədəqə verin! Çünki bəla sədəqənin üstündən addaya bilməz».[770]

Buxari və Müslimin Əbu Hüreyrədən rəvayət etdikləri hədisə görə Əbu Hüreyrə Peyğəmbərin belə deməsini rəvayət edir: «Əgər bəndə halal qazancından xurma dənəsi boyda bir şeyi sədəqə verərsə - Allah halaldan qeyrisini qəbul etməz - Allah onu andı ilə götürüb uca dağ boyda olana kimi sizin dayçanızı və ya süddən kəsilmiş körpənizi böyütdüyünüz kimi böyüdər»[771].

Beyhəqinin rəvayətində isə belə deyilir: «...hətta xurma və ya loxma Uhud dağından da böyük olur».[772]

Məhəmməd ibn əl-Munkədir isə belə deyir: «Bağışlanmanı qazanma səbəblərindən biri də ac müsəlmanın yedizdirilməsidir»[773].

---

767 **Zəifdir:** ət-Təbərani, "əl-Kəbir", 17/248/788; əl-Heysəmi, "Məcmuə az-Zəvaid", 3/110; əl-Albani, "Daif əl-Cəmi'i əs-Sağir", 1488.

768 **Səhihdir:** Əhməd, 4/147; Əbu Yəla, 1766; ət-Təbərani, "əl-Kəbir", 17/244/771; İbn Hibban, 3310; İbn Xuzeymə, 2431; İbn əl-Mübarək, "əz-Zühd", 645; əl-Hakim, 1/416; əl-Beyhəqi, 4/177; Əbu Nəim, "əl-Hilyə", 8/181 və s.

769 Muazın söylədiyi uzun hədisin bir parçasıdır: ət-Tirmizi, 2616; İbn Macə, 3973; ən-Nəsai, "əl-Kəbir", 6/428; və s. İbn Rəcəb, "Cəmi'i əl-ulum vəl-hukum"da (29) zəifdir deyib. Suyuti, "Səhih əl-Əzkar və daifə"də (1012/773) yolun səhihliyini deyib.

770 **Çox zəifdir**: əl-Beyhəqi, "Sünən əl-Kubra", 4/189; "Şuabul-İman", 13083.

771 əl-Buxari, 7430; Müslim, 1014.

772 **Səhihdir**: əl-Beyhəqi. "Şuabul-İman", 1032; İbn Xuzeymə, "ət-Tövhid", 1/148.

773 əl-Beyhəqi, "Şuabul-İman", 6/541; Əbu Nəim, "əl-Hilyə", 7/90.

Bu əsər başqa yolla Peyğəmbərin adından, yəni mərfu isnadla rəvayət olunur.

Əgər Allah-taala susuzluqdan yanan bir itə su verəni bağışlayarsa[774], onda susuz müsəlmana su verəni, qarnı ac müsəlmanı doyuzduranı və lüt müsəlmanı geydirəni necə bağışlamaya bilər?! Allah elçisi bu barədə buyurur: «Yarım xurma ilə də olsa, Cəhənnəmdən qorunun! Kim də bunu tapmasa, onda heç olmazsa, xoş bir sözlə Cəhənnəmdən qorunsun».[775] Sədəqə verməyə imkanı çatmayanlar üçün xoş söz sədəqəni əvəz edir. Sədəqə verməkdən, xeyriyyəçilik etməkdən ləzzət alır və bu iki qəlbi sevindirir və daha da qüvvətləndirir. Allah-taala sədəqə verən qullarının qəlbinə məhəbbət toxumları səpər, yoxsullar isə onlar üçün dualar oxuyar, təriflər edərlər. Yoxsulların yoxsulluğa səbir etmələrinə görə qazandıqları savablardan çıxılmamaq şərti ilə Allah-taala sədəqə verənlərə mükafat verməklə onları sevindirər. Bəli, həqiqətən, səbir üçün böyük mükafat vardır. Lakin bu əcr Allah dərgahında bir çox dərəcələrdən ibarətdir.

Sədəqə, yaxşılıq, xeyriyyəçilik Allahın vəsfidir. Allahın ən çox sevdiyi qulları isə bu vəsflə səciyyələnənlərdir. Bu barədə Peyğəmbər belə buyurur: «Məxluqat Allahın əyalıdır [yedirib içirməsi Onun öhdəliyindədir]. Allahın ən çox sevdiyi qulu isə əyalına ən çox faydası toxunandır».[776]

Allah-taala həqiqi mənada xoşbəxt insan siniflərini qeyd edir, ilk olaraq sədəqə verənlərdən başlayaraq belə buyurur: **«Şübhəsiz ki, sədəqə verən kişi və qadınlar, Allah yolunda gözəl** [könül xoşluğu ilə] **borc verənlər üçün** [əməllərinin savabı] **qat-qat artırılacaqdır. Onları həm də cox qiymətli bir mükafat** [Cənnət] **gözləyir! Allaha və peyğəmbərinə iman gətirənlər - məhz onlar öz Rəbbi dərgahında olan siddiqlər** [özündə-sözündə doğru olanlar] **və şəhidlərdir. Onların** [qiyamət günü] **öz mükafatları və** [qıl körpüsü üstündə onlara yol göstərəcək] **öz nurları vardır. Kafir olub ayələrimizi yalan sayanlara gəldikdə isə, onlar cəhənnəmlikdirlər»** (əl-Hədid, 18-19). Bunlar önlərində sədəqə verən kişi və qadınların dayandığı xöşbəx insanlar sinfinin təbəqələridir.

Sədəqə verməkdə Allahdan başqa heç kəsin saya bilmədiyi fayda və mənfəət vardır. Belə ki, sədəqə pislik qapılarını bağlayır, bəlanın qarşısını alır və zalımın haqsızlığını dəf edir. İbrahim ən-Nəxi

[774] əl-Buxari, 6009; Müslim, 2244.
[775] əl-Buxari, 6563; Müslim, 1016 (68).
[776] **Çox zəifdir**: İbn Əbi əd-Dünya, "Qada əl-Həvaic", 24; Əbu Yəla, 3315, 3370, 3478; əl-Bəzzar, 1949; əl-Beyhəqi, "Şuabul-İman", 7447; əl-Haris, "Müsnəd", 62.

buyurur ki, şükür edən zənginlərin üstün olduğunu iddia edənlər hesab edirlər ki, sədəqə məzlum insandan bəlaları dəf edər, günahları yuyar, malı hifz edər, ruzi gətirər, qəlbi sevindirər, xəsislik Allah yaninda pis zənn olduğu kimi sədəqə də Allaha inamı və gözəl zənni vacib edər, şeytanı zəlil edər, nəfsi təmizləyər, qula Allahın və məxluqatın sevgisini bəxş edər, xəsislik insanın bütün yaxşı əməllərini ört-basdır etdiyi kimi sədəqə də qulun hər bir eybini ört-basdır edər, ömrünü uzadar, insanların sədəqə verənə dualar etmələrinə və onu sevmələrinə gətirib çıxarar. Sədəqə sahibini qəbir əzabından qoruyar, qiyamət günü onun üzərində kölgə olar, Allah dərgahında onun üçün şəfaət edər, dünya və axirət şiddətlərini onun üçün yüngülləşdirər, insanı asiliyə deyil, digər yaxşı əməllərə çağırar. Sədəqənin fayda və mənfəətləri hələ bunlardan da qat-qat artıqdır.

Əgər kimə isə xeyiri dəymək, yaxşılıq etmək yalnız Allahın sifətidirsə, Öz sifətinə uyğun olaraq və onun əlamətləri ilə səciyyələnənləri sevər. Belə ki, Allah-laala alimi, səxavətli insanı, həya sahibini və başqalarının eybini ört-basdır edəni sevər. Güclü mömin zəif mömindən Allah üçün daha sevimlidir. Həmçinin Allah-taala ədaləti, bağışlamağı, mərhəməti olanı, şükür edəni, yaxşılığı və əliaçıq olanı sevər. Zənginlik və əliaçıqlıq Allahın sifəti olduğu üçün O, əliaçıq zəngini sevər. Mal sərf etməklə edilən çoxsaylı faydalı əməllərin fəziləti haqda həmin əməl sahibinin mükafatı öz etdiyi əməlin növündən olacağını demək kifayət edər. Yəni kim bir mömini geydirsə, Allah da ona cənnət libaslarından geydirəcəkdir. Kim bir acı doydursa, Allah da onu cənnət meyvəsi ilə doyuduracaqdır. Kim bir susuzu içizdirsə, Allah da onu cənnət şərabı ilə içizdirəcəkdir. Kim bir köləni azad etsə, Allah da o kölənin hər bir əzasının qarşılığında onun əzasını, hətta, cinsi orqanına qarşı cinsi orqanını Cəhənnəm odundan xilas edər. Kim çətinliyə düşən birinin işini asanlaşdırarsa, Allah da dünya və axirətdə onun işini asanlaşdırar. Kim bir müsəlmanın dərdini yüngülləşdirsə, Allah da ona qiyamət gününün dərdlərindən birini yüngülləşdirər. Bəndə qardaşına kömək etdikcə, Allah da o bəndənin köməyində olar.

Şükür edən zənginlərin üstün olduğunu iddia edənlər deyirlər: «Biz yoxsulluğa səbir etmənin fəzilətini inkar etmirik, lakin biz hara, yoxsulluğa səbir etməyin fəziləti hara?! Allah-taala hər şey üçün bir ölçü qoymuşdur.

Allahın elçisi yedirən şükür edəni, səbir edən oruclunun dərəcəsinə qaldırıb[777]. Məlumdur ki, şükür edənin şükrü başqasına yaxşılıq etməklə olduğu üçün onun dərəcəsi bir daha artır. Şükür

[777] Yuxarıda verilmişdir.

səbrin əksinə olaraq sonsuzluğa kimi artır. Səbrin isə dayanacağı bir məhdudiyyət vardır. Bu, məsələ barəsində müstəqil bir dəlildir və şükür edənin razı olandan, razı olanın isə səbir edəndən üstün olduğunu izah edir. Belə ki, şükür edən razı qalandan, o da səbir edəndən üstündürsə, onda şükür edən səbir edəndən iki qat əfzəldir.

Buxari və Müslim Zühridən, o da Səlimdən, o da atasından Allah elçisinin belə deməsini rəvayət edir: «İki kəsə həsəd aparmaq olar. Birincisi, Allahın öyrətdiyi Quranla gecə-gündüz hərəkət edən insana, ikincisi isə Allahın bəxş etdiyi mal-dövləti gecə gündüz xərcləyən insana».[778]

Peyğəmbər bununla xərclənilən zənginliyin əməl olunan Quranla eyni dərəcə olduğunu bildirir. Əbu Kəbşə əl-Ənmarinin hədisində də açıqlandı ki, əgər mal-dövlət sahibi malını ağılla zəruri yerlərə sərf etsə, mal-dövlətinə görə Allahdan qorxsa, qohumlarına əl tutsa və mal-dövlətində Allahın haqqını tanısa, Allah dərgahında ən yüksək dərəcədə olar. Bu şükür edən zənginin üstün olması barədə bir açıqlamadır. Səbir edən yoxsul isə səmimi qəlbdən zənginin etdiyi xeyirxah əməlləri edəcəyini niyyət etsə və bunu dilinə gətirsə zənginin qazandığı savaba bərabər savab qazanmış olar. Çünki onların hər ikisi xeyirli bir işi niyyət edir. Biri oru reallaşdırmağa imkanı olmasa da, digəri öz əməli ilə niyyətini həyata keçirir. Elmli yoxsul xeyirxahlığı niyyət edib dili ilə həyata keçirir və bu cəhətdən zənginin savabına bərabər savaba nail olur. Əsil savabda bərabər olmalarından keyfiyyət və biçimində bərabər olmalarına lüzum yoxdur. Sözsüz ki, niyyət və əmələ görə verilən savab yalnız dilə gətirilən niyyətə görə verilən savabdan üstündür. Kim həcc ziyarətinə getməyi niyyət edər, lakin getməyə maddi imkanı çatmazsa, bunun üçün savab qazansa belə, həcc ziyarətini saf niyyətlə bir başa həyata keçirənin savabı onun savabından üstündür. Bunun mənasını başa düşmək istəsən, Peyğəmbərin bu hədisi barəsində düşün. Belə ki, Peyğəmbər buyurmuşdur: «Kim sidq ürəklə Allahdan şəhid olmağı diləsə, yatağında ölmüş olsa belə, Allah-taala onu şəhidlərin zirvəsinə ucatdar»[779]. Şübhə yoxdur ki, Allah yolunda həqiqi mənada şəhid olan insanın qazandığı savabın keyfiyyəti və sifətləri şəhidlik zirvəsinə çatsa belə, yatağında ölən insanın niyyətinə görə qazandığı savabdan daha üstündür. Burada iki savab vardır. Biri əcr, digəri isə yaxınlıqdır. Əsil savabda bunların hər ikisi bərabər olsa da, icraçısı tərəfindən həyata keçirilən əməllər əlavə zəhmət ve xüsusi yaxınlıq tələb edir və bu da Allahın istədiyi şəxsə verdiyi bir fəzilətdir.

---

[778] əl-Buxari, 5729; Müslim, 815.
[779] Müslim, 1909.

Allahın elçisi: «"İki müsəlman bir-birinə qılınc çəksə, öldürən də öldürülən də cəhənnəmlikdir" - buyurdu. Səhabələr: "Ey Allahın elçisi! Öldürən məlumdur, Bəs öldürülənin günahı nədir?" - deyə soruşduqda Peyğəmbər: "Çünki o da yoldaşını öldürmək istəyirdi" - deyə cavab verdi».[780] Onların hər ikisi də Cəhənnəmə bərabər girəcəklər. Onların cəhənnəmdə eyni dərəcədə olmaları və eyni əzaba düçar olmalarına lüzum yoxdur. Allah elçisinin sözlərinin haqqını ver və onları öz yerinə qoy ki, onun nə demək istədiyi sənin üçün aydın olsun.

«Yoxsul mühacirlər Allah elçisinə şikayət edərək: "Ey Allahın elçisi! Mal-dövlət sahibləri savabları apardılar. Bizim kimi namaz qılır, bizim kimi oruc tuturlar. Onların artıq malları vardır ki, onunla həcc və ümrə ziyarətlərinə gedirlər, cihad edib sədəqə verirlər" - dedilər. Allahın elçisi isə onlara: "Sizə elə bir şey öyrədimmi ki, onunla sizi ötənlərə çatasınız və sizdən sonrakıları isə arxada qoyasınız və sizin etdiklərinizi edənlərdən başqa heç kəs sizdən əfzəl olmasın?" — soruşdu. Mühacirlər də: "Əlbəttə, ey Allahın elçisi, öyrət" - dedilər. Allahın elçisi onlara: "Hər namazın arxasınca Allaha təsbih edin, Ona həmdsəna edin və Onu təkbir edin" - dedi. Bir müddətdən sonra yoxsul mühacirlər yenidən Allah elçisinin hüzuruna gələrək: "Zəngin qardaşlarımız bizim etdiyimizi eşidib eynisini onlar da edirlər" - dedilər. Allahın elçisi də onlara: **"Bu, Allahın dilədiyi kimsəyə əta etdiyi lütfüdür"** (əl-Hədid, 21) - deyə cavab verdi».[781]

Bu hədis də şükür edən zənginlərin üstün olduqlarını izah edir. Əgər yoxsullar ancaq niyyətləri ilə savab miqdarında zənginlərə çatmış olsaydılar, Peyğəmbər onlara: «Onların etdiyi kimi etməyə niyyət edin ki, onların savabı qədər savaba nail olasınız» - deyərdi. Peyğəmbərin yoxsullara sədəqə verməkdə, kölə azad etməkdə, həcc və ümrə ziyarətlərini yerinə yetirməkdə əldən çıxardıqları savabları zikrlə əldə etməyi əmr etməsindən məlum olur ki, zənginlər xeyriyyəçilik işləri ilə yoxsullardan üstündür. Zənginlər yoxsulların zikr etdikləri kimi etdikləri zaman mallarını sərf etməklə üstünlükləri qaldı və yoxsullar zənginlərin onlar üzərindəki üstünlüyünün davam etməsindən Allah elçisinə: "Onlar oruc və namazda bizimlə bərabər olduqları kimi zikrdə də bizimlə bərabər oldular" - deyib şikayətlənərkən Allahın elçisi onlara bunun Allahın istədiyi kəsə verdiyi fəzilət olmasını xəbər verdi. Əgər yoxsulların niyyət və sözləri ilə zənginlərə savabda hər cəhətdən bərabər olmaları mümkün olsaydı, Allahın elçisi onlara bu imkanı göstərərdi.

---

[780] əI-Buxari, 31; Müslim, 2888.
[781] əl-Buxari, 843; Müslim, 595.

Yoxsullar zənginlərə xitabən belə deyir: «Bu hədis düzgün başa düşüldüyü zaman bizim üçün dəlil hesab olunur. Hədisin mənası belədir: zənginlər imanda, islamda, namazda, orucda yoxsullarla bərabər olub sonra isə xeyriyyəçilikdə onlardan üstün olsalar belə, təkbirdə, təsbihdə və təhlildə yoxsulların saf niyyətləri ilə və xeyriyyəçilikdə onlar kimi ola bilməsələr belə, zənginlərə çatmaq imkanları vardır. Hədisin başqa rəvayətlərində Peyğəmbər belə buyurur: "Əgər onu [sizə öyrətdiyimi] götürsəniz, sizdən öncəkiləri keçərsiniz, sizdən sonrakılar isə sizə çata bilməz". Bu da onu göstərir ki, yoxsulların dediklərini desələr belə, onlara çata bilməzlər.

Allah elçisinin: "Bu, Allahın dilədiyi kimsəyə əta etdiyi lütfüdür"- deməsinə gəldincə bu cümlənin mənası isə belədir: Allahın fəziləti təkcə yoxsullar üçün nəzərdə tutulmamışdır. Allah-taala onlara zikr etmələri ilə Öz fəzilətindən pay verdiyi kimi zənginlərə də yoxsulların etdiyi əməllərin eynisini etdikləri üçün Öz fəzilətindən pay verir. Siz zənginlər fəzilət sözünün mənasını xüsusiləşdirib onu öz yerində işlətmədiniz. Lakin bu sözün mənası ümumi və əhatəlidir. Allahın fəziləti yoxsulları da, zənginləri də əhatə edir. Onu aparıb təkcə özünüzə şamil etməyin. Bu hədisdə sizin bizdən üstün olmağınız haradadır?»

Zənginlər isə deyirlər ki, «Bu, Allahın fəzilətidir» - ifadəsi üç cür başa düşülə bilər. Birinci, zənginlərin xeyriyyəçiliklə yoxsulları arxada qoymasi kimi. İkinci, zikrin fəzilətində zənginlərin yoxsullarla bərabər olması və bu fəzilətin təkcə yoxsullara xas olmaması kimi. Üçüncü isə sizin Cənnətə zənginlərdən yarım gün əvvəl girməniz kimi. Üçüncü bu rəvayətdə qeyd olunmasa da, başqa yolla gələn digər rəvayətlərdə qeyd olunmuşdur.

Bəzzar öz "Müsnəd"ində Vəlid ibn Ömərdən, o da Məhəmməd ibn Zəbərxandan, o da Musa ibn Übeydədən, o da Abdullah ibn Dinardan, o da İbn Ömərdən belə deməsini rəvayət edir: «Yoxsul mühacirlər Allah elçisinə zənginlərin onlardan üstün olması barədə şikayət edərək: «"Ey Allahın elçisi! Qardaşlarımız da bizim kimi təsdiq edir, bizim kimi iman gətirir, bizim kimi oruc tutur və bizim kimi namaz qılırlar. Onların sədəqə verməyə, qohumlarına əl tutmağa və Allah yolunda sərf etməyə malları var. Biz kasıblar isə bunları edə bilmirik" - dedilər. Peyğəmbər onlara: "Sizə elə bir şey söyləyimmi ki, onun etdiyini zaman onların üstünlüklərinə çatasınız? Elə isə hər namazdan sonra on bir dəfə "Allahu əkbər", on bir dəfə "Əlhəmdulilləh", on bir dəfə də "Lə iləhə illallah" kəlməsini deyin ki, onların üstünlüklərinə yetişəsiniz" - dedi». Belə də etdilər. Zənginlər bunu eşitdikdə onlar da belə etməyə başladılar. Bir müddətdən sonra yoxsul mühacirlər yenidən Allah elçisinin hüzuruna gələrək: "Zəngin

qardaşlarımız bizim söylədiyimizi eşidib eynisini onlar da söyləyirlər" - dedilər. Allahın elçisi də onlara: "Bu Allahın istədiyi kəsə verdiyi bir fəzilətidir. Ey yoxsul camaat! Yoxsul müsəlmanların Cənnətə zəngin müsəlmanlardan yarım gün, yəni beş yüz il əvvəl girəcəkləri ilə sizi müjdələyimmi?" - deyə cavab verdi». Bu sözlərdən sonra Musa ibn Ubeydə **«Rəbbinin dərgahında bir gün sizin saydığınızın** [hesabladığınız vaxtın] **min ili kimidir!»** (əl-Həcc, 47) - ayəsini oxudu».[782]

Bu yoxsulların zənginlərin zikrdə onlarla bərabər olduğunu söylədikləri zaman Peyğəmbərin söylədiyi və onları müjdələyən bir kəlamdır. Buradan görünür ki, Peyğəmbər fəzilətin yoxsulların zənginlərdən öncə Cənnətə girməsi olduğuna aid edir. Əbu Kəbşin hədisində də deyildiyi kimi sözdə və niyyətdə onların xeyriyyəçiliyi ilə bərabər və onların yoxsulluq məziyyətinin olduqlarına görə Cənnətə əvvəl girmələri müjdəsi ilə xüsusiləşdirilmişlər.

Zənginlər deyirlər: «Bu hədisi əsl mənasından öz lehinizə çevirmək üçün çox çalışdınız. İnsafla baxsanız bu hədisin zənginlərin üstün olduğunu açıqlamasını görərsiz. Allah elçisinin: "Bu, Allahın dilədiyi kimsəyə əta etdiyi lütfüdür" - ifadəsi yoxsulların mal-dövlət sahiblərinin zikrdə onlarla bərabər savab aldıqları, onlar kimi namaz qılıb, oruc tutub iman gətirdikləri, xeyriyyəçiliyin üstünlüyünün qalması, bu işdə onlara çatacaq imkanlarının olmaması və Allah elçisinin onlara öyrətdiyi zikrdə də zənginlərin onları ötüb keçməsi barədə Peyğəmbərə şikayət etdiklərinə cavab olaraq deyilmişdir. Buradan da Peyğəmbərin şükür edən zənginlərin üstün olmasını demək istədiyi açıqlanır. Zənginlərin xeyriyyəçiliklə üstün olduğunu və bundan aciz olduqlarını bilən yoxsulların qəlbi sınınca Peyğəmbər onları Cənnətə yarım gün öncə girmələri ilə müjdələdi. Bu üstünlük isə yoxsulların zənginlikdən və xeyriyyəçilikdən üstünlük əldə edə bilmədiklərinin müqabilindədir. Lakin yoxsulların Cənnətə zənginlərdən əvvəl girməsi Cənnətdə zənginlərdən yüksək pillədə və dərəcədə olmaları demək deyil. Haqq-hesab üçün dayananların əksəriyyətinin Cənnətdə yeri və dərəcəsi Cənnətə haqq-hesabsız girən yetmiş minin dərəcəsindən və yerindən yüksəkdə olacaqdır. Allah-taala Quranın bir çox ayələrində malı xeyr adlandırmışdır. O bu barədə Öz kitabında buyurur: **«Sizin hər birinizi ölüm haqlayan zaman qoyub gedəcəyiniz maldan valideynlərinizə, yaxın qohumlarınıza verilməsi üçün ədalət üzrə** [malın üçdə birindən çox olmamaq şərtilə] **vəsiyyət etməyiniz zəruridir»** (əl-Bəqərə, 180). Digər bir ayədə isə belə buyurur: **«Həqiqətən, insan var-**

[782] **Zəifdir**: əl-Bəzzar, 3094; əl-Heysəmi, "Məcmuə əz-Zühd", 10/101

**dövlətə çox hərisdir!»** (əl-Adiyyat, 8). Allahın elçisi isə hədislərinin birində buyurur: «Sözsüz ki, xeyir ancaq xeyir gətirər». Digər bir rəvayətdə isə belə buyurur: «Xeyirin özü yox, Allaha üsyan xeyirə pislik gətirər».

Allah-taala malı insanların həyatda yaşaması üçün vermiş, onu qorumağı əmr etmiş, onu səfeh qadınlara, uşaqlara və digər bu qəbildən olan insanlara verilməsini qadağan etmişdir. Peyğəmbər malı bu sözləri ilə mədh etmişdir: «Saleh insanda halal mal necə də gözəldir».[783]

Səid ibn Museyyib isə belə deyir: «Halal mal yığmayan insanda xeyir olmaz. Çünki o yığdığı halal malın sayəsində daha insanlardan dilənməz, onunla qohumlarına əl tutar və Allahın haqqını verər».[784]

Əbu İshaq əs-Səbi belə deyir: «Sələf zənginliyi dinə yardım kimi qiymətləndirirdilər».[785]

Məhəmməd ibn əl-Munkədir belə deyir: «Təqvalı zənginə mal-dövlət necə də köməkdir».[786]

Sufyan əs-Səvri belə deyir: «Mal-dövlət hal-hazırkı dövrdə möminin silahıdır».[787]

Yusif ibn Səbat: «Dünya yaranandan bəri mal-dövlətin hal-hazırkı dövrümüzdəki faydası qədər faydası olmamışdı. Mal at kimidir. Kimisi üçün mükafat, kimisi üçün örtük, kimisi üçün də günahdır» - deyir.

Allah-taala malı bədənin qorunması üçün səbəb etmişdir. Bədəni qorumaq isə Allahı tanımağın, Ona iman gətirməyin, elçilərini təsdiq etməyin, Özünü sevməyin və Ona qayıdışın yeri olan qəlbin qorunması deməkdir. Mal-dövlət dünya və axirəti qurmaq üçün bir vasitədir. Mal-dövlət haram yolla qazanılıb haram yolla xərcləndiyi zaman, sahibini özünə qul etdiyi və onun qəlbinə hakim olduğu zaman, onu Allahdan və Axirətdən sapındırdığı, sahibi onun sayəsində pis məqsədlərə qurşandığı, yaxud tərifəlayiq məqsədlərdən uzaqlaşdırdığı zaman məzəmmət olunar. Məzzəmmət isə mal-dövlətə deyil, onun sahibinə aid olunar.

Peyğəmbər: «Dinar və dirhəmin qulu həlak olsun!»[788] — deyərək onların qullarını və alçaqlıqlarını məzəmmət etmişdir.

İmam Əhməd Safvandan, o da Yezid ibn Meysərdən belə

---

[783] **Səhihdir:** Əhməd, 4/197, 202; İbn Hibban, 3210, 3211; əl-Hakim, 2/2, 236; əl-Beyhəqi, "Şuabul-İman", 1190.
[784] İbn Əbi əd-Dünya, "İslah əl-mal", 55; Əbu Nəim, “Hilyətul-Övliya", 2/173.
[785] Əbu Nəim, "Hilyətul-Övliya", 4/340.
[786] İbn Əbi əd-Dünya, "İslah əl-mal", 58.
[787] İbn Əbi əd-Dünya, "İslah əl-mal"; Əbu Nəim, "Hilyətul-Övliya", 6/381.
[788] Yuxarıda verilmişdir.

rəvayət edir: «Qədimdə bir kişi var idi. Mal-dövlət yığdı, sonra üzünü ailəsinə tutaraq: "Bu gündən sonra xoş və firavan yaşayacayıq" - dedi. Bu zaman ölüm mələyi[789] gəlib yoxsul bir adam cildində qapını döydü. Ailə üzvləri qapını onun üzünə açdıqda mələk: "Mənə ev sahibi lazımdır"- dedi. Onlar: "Bizim ağamız sənin kimisinin ayağına necə gələr?!"- dedilər. Mələk bir az gözlədikdən sonra qapını yenidən döyərək: "Ona xəbər verin ki, mən ölüm mələyiyəm"- dedi. Ağa bunu eşitdikdə diksinərək qalxıb oturdu və: "Onunla mülayim danışın"- deyə əmr verdi. Ailə üzvləri: "Allah səni mübarək eləsin, ağamızdan başqasını istəməzsənmi?"- deyə soruşdular. Mələk: Xeyr - deyə cavab verib ağanın yanına keçdi. "Dur, vəsiyyət etmək istədiyini et. Çünki mən buranı tərk etmədən sənin canını alacağam" - deyə ağaya əmr etdi. Ağanın ailəsi ağlaşaraq çığırırdılar. Ağa: "Sandıqları açın, pul olan kisələrin ağzını açın"- deyə ailəsinə göstəriş verdi. Ailəsi bütün kisələrin ağzını açdıqdan sonra ağa üzünü mäl-dövlətinə tərəf tutub: "Lənət olsun sənə! Əcəlim çatana qədər sən mənə Rəbbimi unutdurdun. Sən məni axirət əməllərindən uzaqlaşdırdın"- onu lənətləyib söyməyə başladı. Bu zaman sərvəti dil açaraq dedi: "Məni söymə. Sən insanların gözündə alçaq olduğun halda səni mən yüksəltmədimmi?! Üzərində mənim nişanəm görünmədimi?! Bunun sayəsində ağaların, şahların məclislərinə gedib iştirak etmirdinmi?! Allahın saleh bəndələri isə gəlirdilər, lakin daxil ola bilmirdilər. Allahın saleh bəndələri qız istəyib, lakin evlənə bilmədikləri halda şahların, ağaların qızlarını istəyib onlarla evlənən sən deyildinmi?! Məni haram məqsədlər üçün xərcləyən sən deyildinmi?! Lakin mən sənə qarşı çıxmırdım. Sən məni Allah yolunda xərcləsəydin heç sənə qarşı çıxardımmı?! Məndən çox sən qınanmalısan. Ey Adəm övladları! Mən də siz də torpaqdan yaranmışıq. İnsanlardan kimisi günahla, kimisi də yaxşı əməllə dirilər"». Mal-dövlət belə dedi. Onun üçündə mal-dövləti haram yola sərf etməkdən həzər edin.[790]

Səhabələrdən gələn bir qudsi hədisdə Allah-taala belə buyurur: «Mallarınız Bizim yanımıza gəldi. Onlarla xoşbəxt olanlar səadətə qovuşdular, onlarla bədbəxt olanlar isə bədbəxt oldular».

Mal-dövlətin bir çox faydaları vardır. İbadətlərin yerinə yetirilməsi üçün başlıca amillərdəndir. Həcc ziyarətlərinin təşkili və cihad mala bağlıdır. Vacib və bəyənilən xərcləmələr onunla həyata keçirilir. Kölə azad etmə, vəqf, məscid və körpülərin inşaası, o cümlədən bir çox xeyriyyəçilik işləri onun sayəsində reallaşır. Xəlvətə çəkilib nafilə ibadətlərlə məşğul olmaqdan daha əfzəl olan ailə həyatı

---

[789] Ölüm mələyi bəzilərinin dilində işlənən Əzrayıl sözünün Quranda çəkilən düzgün adıdır.
[790] Əbu Nəim, "əl-Hilyə", 5/240-241.

malın vasitəsi ilə qurulur. Alicənablıq mala bağlıdır. Əliaçıqlıq və comərdlik sifəti onunla üzə çıxır. Şərəf-namus malla qorunur. Dost-aşnalar onunla qazanılır. Xeyriyyəçilər yüksək dərəcələrə və Allahın nemət verdiyi kəslərlə yoldaşlığa malın sayəsində çatdılar. Mal Cənnətin ən yüksəkliyinə qalxmaq, Cəhənnəmin isə ən aşağı təbəqəsinə düşmək üçün pilləkəndir. Səxavətli insanın səxavətini davam etdirən maldır.

Sələflərdən biri belə demişdir: «Comərdlik həqiqətdə, həqiqət də maldadır».

Sələflərdən bir qeyrisi isə belə dua edərdi: «Allahım! Məni yalnız zənginliyin islah etdiyi qullarından et!» Mal qulun Allahın qəzəbinə düçar olmasının səbəblərindən olduğu kimi Allahın qulundan razı qalmasının da səbəblərindəndir.

Əbu Hüreyrədən rəvayət[791] olunur ki, o, Peyğəmbərin belə deməsini eşitmişdir: «İsrail oğullarından biri albinos[792], biri keçəl və biri də kor olan üç kişi var idi. Allah-taala onları imtahana çəkmək istədi. Onların yanına bir mələk göndərdi. Mələk albinosun yanına gələrək: "Nə sənin üçün daha sevimlidir?" - deyə soruşdu. O da: "Gözəl rəng, gözəl dəri və bir də insanların məndən iyrənmələrinə səbəb olan albinizmdən xilas olmağım" - deyə cavab verdi. Mələk əlini [onun bədəninə] çəkən kimi iyrənc xəstəliyi yox oldu və bədəninə gözəl rəng gəldi. Sonra mələk: "Hansı mal sənin üçün daha sevimlidir?" - deyə soruşdu. O da: "Dəvə (və ya inək)[793]" - deyə cavab verdi, eləcə də ona on aylıq boğaz (qarnında balası olan) dəvə verildi. Mələk ona: "Allah sənə bunda bərəkət versin" - deyə xeyir-dua verdi. Sonra bu minvalla keçəlin yanına gəlib: "Nə sənin üçün daha sevimlidir?" - deyə soruşdu. O da: "Gözəl saç və insanların məndən iyrənmələrinə səbəb olan bu görünüşdən xilas olmağım" - deyə cavab verdi. Mələk əlini [onun başına] çəkən kimi eybəcər görünüşü yox oldu və başına gözəl saç gəldi. Sonra mələk: "Hansı mal sənin üçün daha sevimlidir?" - deyə soruşdu. O da: "İnək" - deyə cavab verdi və beləcə ona da boğaz inək verildi. Mələk ona da: "Allah sənə bunda bərəkət versin" - deyə xeyir-dua verərək çıxıb getdi. Sonra korun yanına gəlib: "Nəyi daha çox istərdin?" - deyə soruşdu. O da: "Allahın gözlərimi geri qaytarmasını və insanları görməyi" - deyə cavab verdi. Mələk əlini [onun gözlərinə] çəkən kimi Allah onun gözlərini qaytardı. Sonra mələk: "Hansı mal sənin üçün daha sevimlidir?" - deyə soruşdu. O: "Qoyun" - deyə cavab verdi və beləcə ona da bir

---

[791] əl-Buxari, 3464; Müslim, 2964. Əbu Hureyrənin rəvayət etdiyi uzun hədis.
[792] Albinizm (Orqanizmdə piqment azlığı və bunun nəticəsində dəri və saçların həddən arlıq ağlığı) xəstəliyinə mübtəla olan adam.
[793] Ravi burada dəvənin və ya inəyin olması baradə şübhə edir.

doğan qoyun verildi. Onlarla dəvə və inəkləri balalayıb artdı, bunun da qoyunu doğaraq çoxaldı və beləliklə, birinin bir vadiyə yerləşəcək qədər dəvə sürüsü, o birisinin bir vadi qədər naxın, digərinin isə bir vadi dolusu sürüsü oldu. Bir müddətdən sonra mələk albinosun xəstə vaxtındakı cildinə girərək onun yanına gəldi və: "Mən miskin bir insanam. Yolda qalmışam [səfər üçün lazım olan qida və ya minik vasitələrim qurtarıb]. Bu gün gedəcəyim yerə yalnız öncə Allahın, sonra da sənin köməyinlə gedə bilərəm. Səni and verirəm sənə gözəl rəng, gözəl dəri və mal verənə! Yoluma davam etmək üçün [minik vasitəsi olaraq] mənə bir dəvə ver" – deyə ondan kömək istədi. Kişi: "Malımda haqqı olanlar çoxdur" - deyərək mələyə kömək etməkdən imtina etdi. Mələk ona: "Sanki mən səni tanıyıram. Sən insanların səndən iyrəndiyi kasıb albinos deyildinmi, bütün bunları sənə Allah vermədimi?!" - dedi. O isə: "Xeyr, bunlar mənə ata-babalarımdan miras qalıb" - deyərək [öz keçmişini] inkar etdi. Onda mələk: "Əgər yalan deyirsənsə, Allah səni əvvəlki vəziyyətinə qaytarsın" deyə dua edib getdi. Sonra keçəlin keçəl vaxtındakı cildinə girərək onun yanına gəlib albinosdan yardım istədiyi kimi ondan da yardım istədi. Lakin keçəl də ona albinos kimi kömək etməkdən imtina etdi. Mələk ona da: "Əgər yalan deyirsənsə, Allah səni əvvəlki vəziyyətinə qaytarsın" - deyə dua edib getdi. Bu minvalla kor olan adamın cildində onun yanına gəlib əvvəlkilərə dediyi kimi ona da: "Mən miskin bir insanam, yolçuyam, yolda qalmışam. Bu gün gedəcəyim yerə yalnız öncə Allahın, sonra da sənin köməyinlə gedə bilərəm. Səni and verirəm sənə gözlərini qaytarana! Yoluma davam etmək üçün mənə bir qoyun ver" - deyib yardım istədi. Kişi: "Mən bir kor kişi idim. Allah-taala mənim gözlərimi özümə qaytardı. İstədiyini götür, istədiyin də qoy qalsın. And olsun Allaha ki, bu gün hər şeydən uca və böyük olan Allah üçün götürdüyün heç bir şeydə sənə mane olmayacağam" - dedi. Mələk ona: "Malını saxla. Siz imtahana çəkildiniz. Allah-taala səndən razı oldu, iki dostuna isə qəzəbləndi" - dedi».

Cihad əməllərin ən yüksəyidir, gah canla aparılar, gah da malla. Malla aparılan cihad çox vaxt daha əziyyətli və daha faydalı olur. Bəs Əli Osmandan daha əvvəl islamı qəbul etdiyi və daha çox cihadda iştirak etdiyi halda, nə ilə Osman ondan üstün oldu?!

Zübeyr və Əbdürrəhman ibn Auf çoxlu mal-dövləl sayəsində bütün səhabələrdən üstün oldular və onların suffə əhlindən daha çox dinə xidmət etdilər. Allahın elçisi malı boş yerə israf etməyi qadağan etmiş[794] və bildirmişdir ki, insanın öz varislərini zəngin halda buraxması, yoxsul buraxmasından daha xeyirlidir[795]. Həmçinin, xəbər

[794] Müslim, 1715.
[795] əl-Buxari, 2743, 5354; Müslim. 1628.

vermişdir ki, mal sahibi hər dəfə Allah rizası üçün bir şey xərclədikcə bununla onun dərəcəsi və mərtəbəsi artır.

Allahın elçisi həmişə yoxsulluqdan Allaha sığınar və onu küfrlə əlaqələndirərək belə dua edərdi: «Allahım! Küfrdən və yoxsulluqdan Sənə pənah aparıram».[796]

Xeyir iki növdür. Birincisi, küfrlə təzad təşkil edən axirət xeyri, ikincisi isə yoxsulluqla təzad təşkil edən dünya xeyridir. Yoxsulluq dünya əzabının, küfr isə axirət əzabının başlıca səbəbidir. Allah-taala zəkatın verilməsini zənginlər üçün, alınmasını isə yoxsullar üçün bir vəzifə etdi. Hər iki əlin arasını şəriət və qədər nöqteyi-nəzərdən ayırmış, verən əl alan əldən daha üstün etmişdir. Allah-taala zəkatı mal-dövlətin çirki etmişdir. Buna görə də Allah-taala onu məxluqatın ən xeyirli insanı Məhəmmədə və onun ailəsinə onları bu çirkdən qorumaq, hörmətini və şərəfini qaldırmaq üçün haram buyurmuşdur. Biz Allah elçisinin əvvəl yoxsul, sonradan isə Allahın onu zəngin etdiyini inkar etmirik. Allah-taala bir çox fəthlər nəsib etmiş və ona var-dövlət bəxş etmişdir. Peyğəmbər də ailəsinin bir illik ərzağına qənaət edər və heç bir kəsin verə bilmədiyi şəkildə paylar verərdi. Payı da yoxsulluqdan qorxmayan bir insan kimi verərdi və vəfat edərkən özündən sonra Fədəki, ən-Nədiri və Allahın ona xas etdiyi malları qoyub getmişdir. Bu barədə Allah Qurani-Kərimdə belə buyurur: **«Allah Öz Peyğəmbərinə** [fəth olunmuş] **məmləkətlərin əhalisindən** [dinc yolla] **verdiyi qənimət Allaha, Peyğəmbərə,** [Muhəmməd əleyhissəlama yaxın olan] **qohum-əqrabaya, yetimlərə, yoxsullara və** [pulu qurtarıb yolda qalan] **müsafirə** [yolçulara] **məxsusdur...»** (əl-Həşr, 7). Allah Peyğəmbəri sədəqə ayrılacaq bir yoxsulluqdan qorumuş və onu Allahın malını haqsızlıq və təcavüzlə əldə etmiş düşmənlərindən nizənin kölgəsi, qılıncın sapı ilə əldə edilən ən şərəfli, ən halal və ən əfzəl malı verməklə yoxsulluqdan uzaq etmişdir. Allah-taala malı ibadətə kömək üçün yaratmışdır. Lakin Allahın malı kafirlərin əlinə haqsızlıq və təcavüz nəticəsində keçmişdir. Mal-dövlət Allahın dostlarına və ibadət əhlinin əlinə keçdiyi zaman isə onu malın yaranma məqsədinə görə sərf edirlər. Lakin Allah elçisinin zənginliyi və mülkü dünya aşiqlərinin zənginliyinin və mülkünün cinsindən deyildir. Çünki onlar mal-dövlətlə zəngin olmuşlar, Peyğəmbər isə mal-dövlətdən uzaq olmaqla zəngin olmuşdur. Bu isə ən ali zənginlikdir. Dünya aşiqləri mal-dövlətlərini istədikləri yerə sərf edərlər, Peyğəmbər öz əmlakını yalnız ağasının əmri ilə sərf edən bir qul kimi sərf edər.

---

[796] **Səhihdir:** ən-Nəsai, '"Əməl əl-Yaum vəl-Leylə", 22, 572; İbn Sünni, "Əməl əl-Yaum vəl-Leylə", 67; Əhməd, 5/42; əl-Hakim, 1/35, 252-253.

Fəqihlər arasında feyin[797] Peyğəmbərin mülkü olub olmaması barədə iki rəvayətdə fikir ayrılığı vardır. Bu iki rəvayət Əhməddən rəvayət olunur. Rəvayətlərdən çıxarış budur ki, fey mülkiyyətin başqa forması olub Peyğəmbərin mülkiyyətinə məxsusdur və o, bunu ancaq əmrlə sərf edir. Peyğəmbər öz hədisində bu barədə belə buyurur: «Allaha and olsun ki, heç kəsə vermərəm və heç kəsdən saxlamaram. Çünki mən bölücəyim şeyi mənə əmr olunan yerə qoyuram».[798] Bu onun Allaha olan köləliyinin ən mükəmməl dərəcəsidir. Bu nöqteyi-nəzərdən də onun özündən sonra varisi olmamışdır. Çünki o hər cəhətdən uca və böyük Allahın xalis qulu idi və qulun da malı yox idi ki, onun varisi də olsun. Allah-taala onu zənginin ən yüksək növü ilə yoxsulluğun ən şərəfli növü arasında birləşdirdi, onun üçün kamillik mərtəbələrini mükəmməl etdi. Ona görə də nə şükür edən zənginlər, nə də səbir edən yoxsullar bu məsələdə biri digərindən daha haqlı hesab oluna bilməz.

Peyğəmbər yoxsulluğunda məxluqatın ən səbirlisi və ən çox şükür edəni olduğu kimi zənginlikdə də belə idi. Allah-taala onu zəngin və yoxsullar üçün bir təqlid ediləsi nümunə etmişdir. Hansı zəngin yer üzünün xəzinələrinin açarları və Səfa dağının qızıla döndərilməsi təklif olunduğu zəngindən daha varlı ola bilər.[799] Peyğəmbərə hökmdar-peyğəmbərlə qul-peyğəmbər olmaq seçimi verilmiş, o da qul-peyğəmbər olmağı seçmişdir.[800] Bununla yanaşı Ərəb yarımadasının və Yəmənin malları onun hüzuruna gətirilmiş, onların hamısını paylamış, bir çöp belə olsun özünə götürməmişdir. Hətta Peyğəmbər müsəlmanların öhdəsindəkiləri və borclarını öz boynuna götürərək: «Kim özündən sonra mal qoyub gedərsə, onun varislərinindir. Kim də özündən sonra öhdəliyə ehtiyacı olan birini buraxarsa, o mənə aiddir və mənim boynumdadır» - demişdir.[801] Allah-taala onun hörmətini qaldıraraq sədəqənin halal olduğu yoxsullardan etmədiyi kimi, miras qalan mal vasitəsilə zəngin olan zənginlərdən də etməmiş, əksinə, onu başqa yolla zəngin etmiş, qəlbini bütün zənginliyi ilə genişləndirmiş və var-dövləti başının üstündən tökmüşdür. O da xəsislik etməkdən son dərəcə xeyriyyəçilik edərək ən böyük paylar və hədiyyələr vermişdir. Özünə

[797] Fey - kafirlərdən heç bir döyüş olmadan alınan əmlak.

[798] əl-Buxari, 3117. Əbu Hureyrənin rəvayəti.

[799] **səhihdir:** Əhməd, 1/242, 245: əl-Hakim, 4/240. əl-Hakim sahihdir demiş, əz-Zəhəbi də razılaşmışdır.

[800] **Səhihdir:** Əhməd, 2/231; əl-Bəzzar, 2462; Əbu Yəla, 6105; İbn Hibban. 6365. Deyirəm: Sənədləri iki şeyxin (əl-Buxari va Müslim) şərtlərinə görə səhihdir.

[801] **Səhihdir:** Əbu Davud, 899, 2900; İbn Macə, 2738; Əhməd, 4/131, 133; ət-Tayalisi, 1150; İbn Hibban, 1225; əd-Daraqutni, 4/85-86; əl-Beyhəqi, 6/215; əl-Hakim, 4/344.

isə nə bir mülk, nə də bir torpaq sahəsi götürmüş, özündən sonra miras olaraq nə bir qoyun, nə bir dəvə, nə bir kölə, nə bir kəniz, nə bir dinar, nə də bir dirhəm buraxmışdır.

Şükür edən zəngin Allahın elçisinin halını yalnız onun etdiyi kimi etdikdə dəlil olaraq gotürə bilər. Həmçinin səbir edən yoxsulun da Peyğəmbərin halını dəlil götürməsi üçün onun kimi səbir etməsi və məcburiyyət qarşısında qaldığı üçün yox, istəyi ilə tərkidünya olması lazımdır. Allahın elçisi yoxsulluq və zənginlik mərtəbələrinin haqqını lazımınca ödəmişdir. Həmçinin Allah-taala yoxsullara onun sayəsində zənginlik bəxş etmiş və ümməti onun sayəsində zənginlik tapmışdır. İnsanların ən zəngini onun sayəsində zəngin olanıdır.

Uleyyu bin Əbi Rəbah əl-Ləxmi demişdir: «Məsləmə ibn əl-Ənsari Misirdə olarkən mən də onunla birlikdə idim. Abdullah ibn Amr ibn əl-As onun yanında əyləşmişdi. Məsləmə Əbu Talibin şerlərindən bir beyti misal gətirərək: "Əbu Talib bu gün bizim içində üzdüyümüz Allahın verdiyi naz-neməti və şöhrəti görsəydi, qardaşı oğlunun cənab olub xeyir gətirdiyni bilərdi" - dedi. Abdullah ibn Amr dedi: "Elə həmin gündə də Peyğəmbər cənab idi və xeyir gətirmişdi". Məsləmə: "Məgər Allah-taala: **«Məgər O səni yetim ikən tapıb sığınacaq vermədimi?! Sənin şaşqın** [yaxud: uşaq vaxtı Məkkə vadisində azmış] **vəziyyətdə tapıb yol göstərmədimi?! Səni yoxsul ikən tapıb dövlətli etmədimi?!»** (əd-Duha, 6-8) - deyə buyurmadımı?!" - dedi. Abdullah ibn Amr: "Onun yetim olmasına gəlincə, o atadan və anadan yetim qalmışdır. Yoxsul olmasına gəldikdə, ərəblərin əlində olan malı az idi. Ərəblərin hamısı kasıb idi. Allah-taala Peyğəmbərə və islamı qəbul edib dəstə-dəstə Allahın dininə daxil olan ərəblərə fəthlər bəxş etdi. Sonra Allah Peyğəmbərin dünya malına sarılmadan canını almışdır. Peyğəmbər insanları dünyadan və dünya malının fitnəsindən xəbərdar etmişdir. **«Həqiqətən, Rəbbin sənə** [qiyamət günü ən uca şəfaət məqamı, Cənnətdə tükənməz nemətlər] **bəxş edəcək və sən** [Ondan] **razı qalacaqsan!»** (əd-Duha, 5) - ayəsinin mənasına gəlincə, dünya Allah elçisini razı sala bilməz və o da dünyanı bütünlüklə ümmətinin olmasına razı olmayıb onları bundan çəkindirmişdir. Dünya malı ona ərz olunduğu zaman onu qəbul etməkdən imtina etmişdir. Allah-taalanın Peyğəmbərə savab verməsi, ona və onun ümmətinə Sasani hökmdarı Xosrovun və Sezarın əmlakını nəsib etməsi, insanların islama daxil olması və dinin yayılması, bir sözlə bütün bunlar Allahın Peyğəmbərinə olan sevgi və razılığından doğur"».[802]

Sufyan əs-Souri əl-Əvzaidən, o da İsmayıl ibn Abdullah ibn

[802] əl-Beyhəqi, "Dəlail ən-Nubuvvə", 7/62; əs-Suyuti, "əd-Dərul-Mənsur", 8/544.

Abbasdan Peyğəmbərin belə deməsini rəvayət etmişdir: «Məndən sonra fəth olunacaq küfr məmləkətləri mənə göstərildi və bu məni çox sevindirdi. Sonra bu ayələr nazil oldu: **«And olsun səhərə; And olsun sakitləşməkdə olan** [və ya: getdikcə zülməti artan] **gecəyə ki,** [Sənə bir neçə gün vəhy nazil etməməklə] **Rəbbin səni** [ya Peyğəmbər!] **nə tərk etdi, nə də sənə acığı tutdu. Şübhəsiz ki, axirət sənin üçün dünyadan daha xeyirlidir! Həqiqətən, Rəbbin sənə** [qiyamət günü ən uca şəfaət məqamı, Cənnətdə tükənməz nemətlər] **bəxş edəcək və sən** [Ondan] r**azı qalacaqsan!»** (əd-Duha, 1-5). Allah-taala mənə torpağı müşk olan və mirvaridən min qəsr verdi və hər bir qəsrdə ona layiq olan şeylər var idi».[803]

Şükür edən zənginlərin üstün olduğunu iddia edənlər deyirlər: «Siz dünyada zahidlikdən və dünya malından aza qane olmaqdan danışdınız. Zahidlik zənginliyə zidd deyildir. Əksinə, zəngin zahid, yoxsul zahiddən daha kamildir. Çünki zəngin güclü bir halda, yoxsul isə aciz olaraq tərkidünyalığa qapılır. Buna görə də aralarında uzun bir məsafə qədər fərq vardır. Allahın elçisi zənginlik halında belə məxluqatın ən zahidi idi. Həmçinin İbrahim Xəlilullah çoxlu var-dövlətə sahib olduğu halda, dünyada insanların ən zahidi idi».

Tirmizi Əbu Zərdən Peyğəmbərin belə deməsini rəvayət etmişdir: «Bu dünyada zahid olmaq halalın haram edilməsi və onun itirilməsi demək deyil. Dünyada zahid olmaq əlində olanların Allahın əlində olanlardan daha etibarlı olmaması və bir müsibətə düçar olduğun zaman onun savabı üçün müsibətin qalmasını istəməndir».[804]

İmam Əhməddən üstündə min dinarı olan bir insanın zahid olması haqda soruşulduqda: «Bəli, zahiddir, bir şərtlə ki, pulu artıqda sevinməməli, azaldıqda isə kədərlənməməlidir» - deyə cavab vermişdir.

Sələflərdən biri demişdir: «Zahid odur ki, halal mal şükrünü, haram mal isə səbrini azaltmasın.»

Bu ən yaxşı hədlərdəndir. Səbir və şükrlə vəsf olunmayan insana zahid adı layiq deyildir. Halal mal verildikdə şükrü ona üstün gələn, haram mal ərz olunduqda isə səbri ona üstün gələn insan həqiqi mənada əsil zahiddir. Halal malın şükrünə üstün gəldiyi, haram malın isə səbrinə üstün gəldiyi insanın şükrü və səbri məğlub olmuş olur və o zahid deyildir.

Şeyxülislam İbn Teymiyyənin belə deməsini eşitdim: «Zahidlik sənə fayda verməyən şeyləri tərk etməndir. Möminlik sənə zərər

---

[803] əl-Beyhəqi, "Dəlail ən-Nubuvvə", 7/61.
[804] **Çox zəifdir:** ət-Tirmizi, 2340; İbn Macə, 4100; əl-Beyhəqi, "Şuabul-İman", 10775

verən şeyləri tərk etməndir. Zahidlik dünyadan əlləri deyil, qəlbi boşaltmaqdır. Onun əksi xəsislik və hərislikdir. Zahidlik üç növdür. Birincisi, haramı tərk etmək. İkincisi, şübhə və bəyənilməyən şeyləri tərk etmək. Üçüncüsü isə artıq malı tərk etməkdir. Birinci növü tərk etmək fərzdir, ikinci növü tərk etmək fəzilətdir. Üçüncü növü tərk etmək isə şübhə dərəcəsinə görə onların ikisinin arasındadır. Şübhəli olması güclü olarsa, birinci növün daşıdığı hökmü daşıyar. Əks halda isə üçüncünün hökmü qalır. Çox vaxt üçüncünün vacib olması Allah və axirət naminə çalışanlar və tərkidünyalığa qapılanlar üçün labüd olur. Belə olan halda ehtiyacdan artıq mal onlara zərərdir. Çünki dünyanı istəmək axirəti istəməyə zərər verər. Qulun iradə məqamının sağlam olması üçün tələbinin iradəsinin və məqsədinin birləşməsi lazımdır. Çünki istəyənlə istənilən bir-birindən ayrıla bilməz. İstənilənin birliyinə gəlincə, insanın istəyinin, iradəsinin Allahdan qeyrisinə və Ona yaxınlaşdıran vasitələrə bağlılığı olmamalıdır. Yalnız Allaha xas iradənin şəhvət amillərini və pis yollara sapdıran nəfsin istəklərini kökündən qurutmaq, iradənin qəlbin hər tərəfinə yerləşib orada Allahla yanaşı qeyrisinə tərəf cəlb edən amillərə yer verməməsi və bu iradənin yalnız Allah üçün qalması lazımdır. Belə ki, zahid insan vaxtını boşa sərf etməmək və qəlbini məqsədinə həsr etməsi üçün qəlbinin mütiliyinə zərər verə biləcək tamah maddələrindən boşaltmalıdır. Çünki böyük günahların, fəsadın, günahkarlığın əsas özəyi tamahkarlıqdır. Zahidlik onların hamısını məhv edir, qəlbi onlardan boşaldıb özü ora hakim olur. O, əzaları Allaha ibadətə sövq edir, Allah ilə qul arasındakı uzaqlığı qaldırır, qulu Rəbbinə doğru çəkir, əgər Allaha yaxınlıq istəyi qulda zəifləmişsə, bunu qüvvətləndirir, qula Allahı tanımağın və Onu sevməyin şirinliyini daddırır. Zahid bədən və qəlb baxımından insanların ən rahatıdır. Əgər zahidin tərkidünyalığı Allahı və axirəti istəməsində onun üçün bir güc vasitəsi olarsa, yəni qəlbini Allah üçün boşaldıb Ona yaxınlaşmağa həris olsa, vaxtını boş yerə sərf etməkdə xəsislik göstərsə, Allah ondan razı qalar və onu sevər. Zahid də öz növbəsində insanların ən xoşbəxti, firavanı və xoş iradəlisi olar. Məlumdur ki, dünyanı istəmək qəlbi param-parça edər, qəm-qüssəni, kədəri artırar. Belə ki, o, gözlənilən şiddətli əzaba aparan hazırki əzabdır və qulun istədiyi bir çox nemətlərin əlindən çıxmasına səbəb olur».

İmam Əhməd Heysəm ibn Cəmildən, o da İbn Meysərdən, o da Tavusdan Allah elçisinin belə deməsini rəvayət edir: «Dünyada zahid olmaq qəlbi və bədəni rahatlaşdırar. Dünyaya istək isə qəmi və

kədəri artırar».[805]

Qəm-qüssə, kədər, üzüntü iki səbəbdən yaranır. Birincisi, dünyanı sevmək və ona həris olmaqdan, digəri isə xeyirxah əməlləri və ibadəti azaltmaqdan.

Abdullah ibn Əhməd Bəyan ibn Həkəmdən, o da Məhəmməd ibn Hatəmdən, o da Bəşər ibn əl-Harisdən, o da Əbu Bəkr ibn Əyyaşdan, o da Leysdən, o da Həkəmdən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Əgər bəndə (ona vacib olan) əməldə qüsura yol verərsə, uca və böyük Allah onu üzüntü ilə imtahana çəkər»[806]

Dünyanı istəmək görünən böyük günahların özəyi olduğu kimi qəzəblənmək, həsəd, təkəbbürlük, öyünmə kimi qəlbə xas olan günahların da özəyi sayılır. Bu da sadaladığımız mənfi keyfiyyətlərin əldə olmasından deyil, qəlbə dolmasından irəli gəlir. Qəlbin bu keyfiyyətlərlə əhatə olunması şükür etməklə təzad təşkil edir. Şükrün əsası qəlbin bu keyfiyyətlərdən boşaldılmasıdır. Var-dövlətin çoxalması ömrün və şan-şöhrətin uzanması kimidir. Sizin bu dünyada xeyirliniz uzunömürlünüz və əməlisalehinizdir. Beləliklə, kimin malı artar, bununla xeyirxahlığı da artarsa, onda əhsən belə insana, belə var-dövlətə, belə şan-şöhrətə! Var-dövlət və şan-şöhrət insanın ya dərəcələrini qaldırar, ya da alçaldar.

Yoxsulluğun və dünya malından aza qane olmanın yolu səbirlə birlikdə salamat yoldur. Zənginliyin yolu isə çox vaxt həlak yoludur. Əgər zəngin var-dövlətinə görə Allahdan qorxarsa, qohumlarına əl tutarsa, malında Allahın haqqını unutmazsa, təkcə zəkat verməklə kifayətlənməyib acları doydurarsa, çılpağı geydirərsə, üzüntülü insana, ehtiyacı olana yardım edərsə, onun yolu faydalı, qənimətli və yoxsuluğun salamat yolunun üstündə olar. Yoxsul etmək istədiklərindən xəstəliyinə görə məhrum olunmuş xəstə kimidir. Əgər o bu məhrumiyyətə gözəl şəkildə səbir edərsə, buna görə savab qazanar. Zənginə gəldikdə, onun var-dövlət yığmaqda, qazanmaqda və sərf etməkdə təhlükəsi böyükdür. Əgər sağlam yolla qazanıb düzgün yerə xərcləsə, bu ona fayda verər. Yoxsul insanlardan təcrid olmuş insan kimidir. Xeyriyyəçiliklə məşğul olan zəngin isə ianəçiyə, müəllimə və mücahidə bənzər. Peyğəmbər Allahın bəxş etdiyi müdrikliklə hökm verən və onu öyrədən insanın yaxınıdır. Bu da üçüncüsü olmayan iki qibtə olunan keyfiyyətdən biridir. Cahillər insanlardan təcrid olub xəlvətə çəkilən və yalnız özünə faydası toxunulan insana xeyriyyəçiliklə məşğul olan və başqalarını öyrədən zəngindən çox qibtə edirlər. Bunların hansının əfzəl olduğu

[805] **Zəifdir:** Əhməd. "əz-Zühd", səh. 16; İbn Əbi əd-Dünya, "Zəmmud-Dünya", 131; əl-Beyhəqi, "Şuabul-İman", 10536.
[806] **Çox zəifdir:** Əhməd, "əz-Zühd", səh. 16.

soruşularsa, yəni sədəqə verən, xeyriyyəçiliklə məşğul olan zəngini seçənmi, yoxsa dünya malından aza qane olan, axirətə hazırlıq üçün qəlbi titrəyən, fitnələrdən uzaq, bəlalardan salamat olan yoxsulu seçənmi, yoxsa bunların heç birini seçməyib Allahın onun üçün seçdiyini seçənmi?

Bu mövzu sələfi-salehin mübahisə obyektidir. Onlardan Əbdürrəhman ibn Auf və digərləri kimi zəngin səhabələr cihad və xeyriyyəçilik üçün malı seçmişlər. Qeys ibn Səd isə belə dua edərdi: «Allahım! Məni yalnız zənginliyin islah etdiyi qullarından et!» Əbu Zər və onun kimi bir qrup səhabələr isə yoxsulluğa və dünya malından azına qane olmağa üslünlük vermişlər. Çünki onlar dünyanın bəlalarına və pisliklərinə baxıb var-dövlətlə fitnəyə düşməkdən qorxmuşlar. Zənginliyə üstünlük verən səhabələr isə xeyriyyəçiliyin mənfəətinə, dünya və axirət savablarına baxıb belə seçim etmişlər. Üçüncü dəstə isə heç birisini seçməmiş, əksinə onlar Allahın onlar üçün seçdiyini seçmişlər. Dünyada Allahın dininə xidmət etmək və Ona ibadət etmək üçün dünyada uzun ömür yaşamaq da belədir. Bir qrup insan bu məqsədlə uzun ömürlü olmağı istəmiş, ikinci dəstə Allaha qovuşmaq və bu dünyadan canlarını qurtarmaq üçün ölümü istəmiş, üçüncü dəstə isə bunların heç birini arzulamayıb Allahın onlar üçün seçdiyini seçmişdir. Çünki onların bu seçimi onların öz iradəsi altında olmayıb Allahın iradəsi altındadır. Bu, Əbu Bəkər əs-Siddiqin halıdır. O, ölüm yatağında olarkən ətrafındakılar: «Sənin üçün həkim çağıraqmı?» - deyə soruşduqda: «O artıq məni gördü» - deyə cavab verdi. Yanındakılar: «O sənə nə dedi?» - soruşdular. O: «O mənə dedi ki, mən istədiyimi edirəm» - deyə cavab verdi.

Birinci hal, yəni dünyada Allahın dininə xidmət etmək üçün uzunömürlü olmaq istəyənlərin halı Musanın halına bənzəyir. Belə ki, ölüm mələyi onun canını almağa gəldikdə, Musa ona bir şillə vurub gözünü tökdü. Bu onun dünyaya məhəbbətindən və dünyada qalmaq istəyindən irəli gəlmirdi. Əksinə, o bununla Rəbbinin əmrlərini həyata keçirmək, onun dinini qurmaq və düşmənlərinə qarşı cihad aparmaq istəyirdi. Ölüm mələyinə dedi: «Sən də Allahın əmrini daşıyan bir qulusan, mən də. Mən Rəbbimin əmrlərini icra edirəm və Onun dinini qururam» - dedi. Musaya uzun ömür ərz olunduğu və bundan sonra da yenə öləcəyini bildiyi zaman Allahın onun üçün seçdiyini seçdi.

Peyğəmbərimiz Məhəmmədə gəlincə, Rəbbi ona elçi göndərib dünya və axirət seçimini etməsi üçün ixtiyar verdi. O Allahı insanların ən yaxşı tanıyanı idi. Uca və ulu Allahın Ona qovuşmasını istədiyini və onun üçün bunu seçdiyini bilincə, Allaha qovuşmağı seçdi. Əgər

Peyğəmbər Rəbbinin onun dünyada qalıb əmrlərini yerinə yetirməsini və dinini qurmasını istədiyini bilsəydi, Onun istəyi xaricində heç nəyi seçməzdi. Onun ixtiyarı uca və böyük Rəbbinin ixtiyarı idi. Rəbbi ona hökmdar-peyğəmbərlə qul-peyğəmbər olması arasında seçim hüququ verdiyi zaman Rəbinin onun qul-peyğəmbər olmasını seçdiyini bilib Onun seçdiyini seçdi. Allah elçisinin bütün hallarda seçimi Allahın seçiminə tabe idi. Buna gorə də o, Hüdeybiyyə günü bir çox əziyyətlərə dözdü. Onun bu məqamında hər cəhətdən sabitqədəm olan Əbu Bəkr əs-Siddiq olmuşdur. Peyğəmbər heç vaxt Allahın onun və səhabələri üçün seçmiş olduğu haldan başqasını seçməyib və Onun seçmiş olduğunu seçərək razı qalıb. Budur Allaha bəndəlik etməyin ən yüksək forması[807]. Allah-taala Peyğəmbərin şükür etməsindən razı qalıb onun qarşılığında Fəth surəsinin əvvəlində onu müjdələmişdir. Səhabələri də onu təbrik edərək: «Sən necə də bəxtiyarsan, ey Allahın elçisi!» - demişdir. Çünki ən layiqli təbrikə və ən layiqli müjdəyə haqqı olan Allahın elçisidir.

Məlum olduğu kimi Allah-taala bütün fəzilət keyfiyyətlərinin ən əlasını elçisinə halal etmiş və onu bu keyfiyyətlərin ən yüksəyinə aid etmişdir. Buna görə də ümmətindən olan hər bir firqə özlərində olan bu keyfiyyətlərlə digər firqələrdən üstün olduqlarına dair Peyğəmbərin halını dəlil gətirmişlər. Hər bir firqə bu yolla özünün üstün olması barədə dəlil gətirə bilər. Qazilər və mücahidlər dəlil gətirərək özlərinin bütün icmalardan üstün olduqlarını iddia edirlər. Həmçinin alimlər də əvvəlkilər kimi özlərinin üstün olması barədə dəlillər gətirirlər.

Zahidlər və dünyadan geri qalanlar özlərinin üstün olmaları barədə dəlillər gətirirlərsə, dinə xidmət etmək və onun əmrlərini həyata keçirmək üçün dünyaya, rəhbərliyə və siyasətə girişənlər də özlərinin üstün olmaları barədə dəlillər gətirirlər. Səbir edən yoxsul dəlil gətirdiyi kimi şükür edən zəngin də dəlil gətirir. İbadət əhli nafilə ibadətlərin üstün olduğunu dəlil gətirdikləri kimi elm əhli də elmin fəzilətli olması barədə dəlillər gətirirlər. Təvazökar ağıl-kamal sahibləri özlərinin üstün olması barədə dəlil gətirdiyi kimi batil əhlini məğlub edən güc-qüdrət sahibləri də özlərinin əfzəl olması barədə dəlil gətirirlər. Vüqarlı, hörmətli, ciddi insanlar üstün olmaları barədə dəlil gətirdikləri kimi gözəl əxlaqlı, yalanın bulaşmadığı zarafatlar edən, ailəsi və dostları ilə gözəl davranan insanlar da üstünlükləri haqda dəlil gətirirlər. Hər yerdə haqqı açıq-aşkar söyləyənlər üstün olmaları barədə dəlil gətirdikləri kimi sözü yerində deyən, insanların xoşuna gəlmədikləri şeyi üzə deməkdən çəkinən həyalı insanlar da

807 əl-Buxari, 3407; Müslim, 2372.

üstünlükləri barədə dəlil gətirirlər. Radikal mövqeli dindarlar özlərinin üstün olmaları barədə dəlil gətirdikləri kimi şəriətdən kənara çıxmamaq şərti ilə dini asanlaşdıranlar da üstün olmaları barədə dəlil gətirirlər. Diqqət və qayğısını dinin və qəlbinin islah edilməsinə sərf edənlərin dəlil gətirdikləri kimi canını, yaşayışını və dünyasını qoruyub saxlayanlar da Peyğəmbərin həm dünyasını, həm də dinini yaşaması üçün göndərildiyini dəlil gətirirlər. Qəlblərini səbəblərə bağlamayıb onlara meyl etməyənlər dəlil gətirdikləri kimi, qəlblərini səbəblərə bağlayıb onları yerbəyer edən və onların haqqını verənlər də dəlil gətirirlər. Ac olub buna səbir edənlər dəlil gətirdikləri kimi, tox olub ona şükür edənlər də dəlil gətirirlər. Bağışlama yolunu tutanlar dəlil gətirdikləri kimi, intiqam məqamlarında intiqam alanlar da dəlil gətirirlər. Allah üçün verib Allaha dost olanlar dəlil gətirdikləri kimi, Allah üçün saxlayıb Allaha üçün düşmən olanlar da dəlil gətirirlər. Sabaha bir şey saxlamayanlar dəlil gətirdikləri kimi, ailəsinin bir illik ərzağını saxlayanlar da dəlil gətirirlər. Arpa çörəyi və sirkə kimi quru qidalarla dolananlar dəlil gətirdikləri kimi, qızardılmış, şirin, meyvə, qarpız və s. ləziz yeməklərlə qidalananlar da dəlil gətirirlər. Orucu davam edənlər də, orucu kəsənlər də «Allahın elçisi bizə: "Deyəsən orucunu kəsmir" - deyənəcən oruc tutar, "Deyəsən heç oruc tutmur" - deyənəcən isə oruc tutmazdı» - hədisini gətirirlər. Qadınları sevməyənlər dəlil gətirdikləri kimi, dünyada ən gözəl nemətin olduğu qadınları sevənlər də dəlil gətirirlər. Qadınlara qarşı mülayim davranıb qanadını onların ayağı altına açanlar dəlil gətirdikləri kimi, onları tərbiyə edib boşayanlar da, yataqlarını onların yatağından ayıranlar və boşanmaq mövzusunda onlara seçim verənlər də dəlil gətirirlər. Məişət səbəblərini birbaşa tərk edənlər dəlil gətirdikləri kimi, məişət məsələlərini tərk etməyib kirayə verən, icarəyə götürən, satan, alan, avans istəyən, borc verən və borc götürən də dəlil gətirir. Qadınların aybaşı və oruclu olan vaxtı onlardan tamamilə uzaqlaşanlar dəlil gətirdikləri kimi, aybaşı zamanı qadınlarla cinsi əlaqədə olmayıb onlarla yaxınlıq edən oruclu ola-ola arvadını öpənlər də dəlil gətirirlər. Mümkün olan qədər cinayətkarları bağışlayanlar dəlil gətirdikləri kimi, Allahın cəza qanunlarını (hədlərini) onlara tətbiq edib oğrunun əlini kəsən, zinakarı daş-qalaq edən və şərab içəni şallaqlayanlar da dəlil gətirirlər. Zahiri sübutlara əsaslanaraq hökm verənlər dəlil gətirdikləri kimi, açıq-aşkar sübutlara əsaslanıb ədalətli hökm çıxaranlar, bir günahdan ötrü həbs edib cəzalandıranlar da dəlil gətirirlər.

Peyğəmbər Allahın peyğəmbəri Süleymandan xəbər verərək bildirir ki, o, qadının uşağın rəfiqəsinə aid olmasını etiraf etməsinə

baxmayaraq açıq dəlillə uşağın onun özünə verilməsi hökmünü verir. Açıq dəlillə yalan olması üzə çıxan etirafa uyğun hökm verməmişdir.[808]

Əbu Əbdürrəhman[809] hədisdən çıxarış olaraq iki hökmü qeyd edir. Onlardan biri hakimin həqiqəti üzə çıxarması üçün etməyəcəyi bir şey haqda "edəcəyəm" - deməsi caiz olmasıdır. İkincisi isə əleyhinə hökm edilənin etirafının əksinə olaraq hakim həqiqətin onun etirafına uyğun olmadığını bildiyi zaman onun lehinə qərar verməsinin caiz olması. Səhabələr də istər Peyğəmbərin sağlığında, istərsə də ondan sonra bu cür sübutlarla əməl edərdilər. Əli Hatibin məktubunu gəzdirən qadına: «Ya məktubu çıxaracaqsan, ya da paltarını soyundurub özüm axtaracağam» - demişdi.[810] Ömər zina cəza qanunu hamilə qalmağa görə tətbiq etmiş, ağzından şərab iyi gələnə isə şərab cəza qanunu tətbiq edilməsi hökmünü vermişdir.

Allah-taala Quranda Yusifdan bəhs edərkən onun köynəyinin arxasının cırılmasına əsasən şahid Yusifin günahsız olması barədə hökm çıxarmışdır.

Peyğəmbər İbn Əbi Huqeyqə Huyey ibn Əxtabın xəzinəsinin harada olduğunu soruşduqda xəzinənin xərclənib qurtardığını soylədi. Peyğəmbər müddətin az, malın çox olduğunu fikirləşdikdə[811] bu iki faktla malın xərclənilmədiyini düşünüb onu xəzinənin harada olmasını etiraf edənədək sıxışdırdı.

Peyğəmbər bir nəfərin qatil olduğunu təsdiqləyən dəlillərə əsasən öldürülənin adamlarına həmin adamın qatil olmasını and içib ondan qisas almalarına icazə vermişdir.

Allahın qanunları kişi öz arvadının zina etməsini iddia etdiyi və arvadının bu iddianı rədd etməsi təqdirdə kişinin iddiasının həqiqət olmasını göstərən açıq sübut olarsa, qadının daş-qalaq olmasına icazə verir.

Allah elçisinin şəriəti düşünənlər üçün bu cür açıq sübutlarla doludur. Açıq dəlillərlə hökm vermək şəriətin özündəndir. Allah elçisinin gətirdikləri ədalətsiz və zalım hakimlərin əleyhinə dəlil

---

[808] əl-Buxari, 3427; Müslim. 1720. Əbu Hureyrənin rəvayətinə görə Peyğəmbər demişdir: "Vaxtı ilə iki qadın uşaqları yanlarında olduğu halda canavar birinin uşağını aparır. Biri digərinə "canavar sənin uşağını apardı" deyərək mühahisə edirlər. Davud peyğəmbərin hüzurunda mühakimə olunduqda, o uşağın böyük qadına aid olduğunu hökm edərkən qadınlar Süleyman peyğəmbərə xəbər verirlər. O: "Bıçaq verin bölüb ikinizə də verim"- dedikdə, kiçik qadın: "Xeyir! Dur, mərhəmət et, uşaq onundur"- demişdir. Bundan sonra Süleyman peyğəmbər uşağın kiçik qadına aid olduğunu hökm etmişdir".

[809] Bu ən-Nəsaidir, Allah ona rəhmət eləsin!

[810] əl-Buxari, 4274.

[811] **Səhihdir:** İbn Hibban, 5199; əl-Beyhəqi, 9/137.

olduğu kimi ədalətli qazilərin və rəhbərlərin də lehinə bir dəlildir. Yardım diləmək üçün üz tutulan yeganə varlıq Allah-taaladır.

Bu fəsil haqda nəticə etibarı ilə onu deyə bilərik ki, səbir edən yoxsullar heç də şükür edən zənginlərdən Peyğəmbərə daha yaxın deyillər.

Peyğəmbərə insanların ən yaxını olan onun sünnətini ən yaxşı bilib ona riayət edənlərdir.

Müvəffəqiyyət Allahdandır.

# İYİRMİ BEŞİNCİ BÖLMƏ

## Səbrə zidd olan və onu pozan amillər

Səbir dili Allahdan qeyrisinə şikayətdən, qəlbi qəzəblənməkdən, əzaları, üz-gözü və paltarı cırmaqdan qoruyursa, səbir etməmək bütün bunların əksinə səbəb olur. Bunlardan biri də bəndənin Allahdan məxluqa şikayət etməsidir. Belə ki, əgər bəndə Rəbbindən özü kimi bir məxluqa şikayət etmiş olsa, ona rəhm edəndən etməyənə şikayət etmiş olur. Şikayətin Allaha edilməsi isə səbrə zidd deyildir. Bu Yaqubun **«Gözəl səbir etmək»** (Yusif, 18, 83) - deməklə Allaha şikayətində də öz təsdiqini tapmışdır. Bəndənin məxluqa ondan yol göstərməsini, yaxud ona yardım etməsini, yaxud da zərurəti aradan qaldırmaqda ona kömək etməsini istəmək məqsədilə öz vəziyyətini danışması da səbri pozmur. Xəstənin öz dərdindən həkimə şikayət etməsində, haqsızlıqla üzləşənin ona yardım edə biləcək birinə halını danışmasında, bəlaya mübtəla olan bir kəsin onu bu bəladan qurtarmaqda vasitəçi olmasına ümid bəsləyən şəxsə öz müsibətini danışmasında heç bir qəbahət yoxdur. Peyğəmbər bir xəstənin yanına getdiyi zaman ondan halını soruşar və: «Özünü necə hiss edirsən?»[812] - deyərdi. Peyğəmbərin bu sualı onun halını öyrənmək məqsədi güdürdü.

Bəs inilti və sızıltı səbri pozurmu? Bu barədə İmam Əhməddən iki rəvayət nəql olunur. Onların ən səhihinə görə bu məkruhdur. Tavusdan da rəvayət olunur ki, o xəstə olarkən inildəməyi bəyənməzdi.

Mücahid isə belə deyir: «Xəstələndiyi zaman iniltisi də daxil olmaqla hər bir şey Adəm övladının boynuna yazılır».

İmam Əhmədin oğlu Abdullah belə deyir: «Atam ölüm xəstəliyində mənə: "Abdullah ibn İdrisin kitabını yanıma gətir" - dedi. Yanına gətirdikdə: "İndi də Leys İbn Əbi Süleymin hədislərini gətir" - dedi. O: "Oxu Leysin hədislərini. Mən Təlhaya Tavusun xəstələndiyi zaman inildəməyi məkruh saydığını söylədim. Ölənə qədər ondan inilti eşidilmədi" - dedi. Mən də atamın bu xəstəliyində vəfat edənəcən inildəməsini eşitmədim».

İkinci rəvayətə görə inilti nə məkruhdur, nə də səbri pozur.

---

[812] **Səhihdir**: ət-Tirmizi, 983; İbn Macə, 4261.

Bəkr ibn Məhəmməd atasından rəvayət edir ki, Əhməddən: «Çəkdiyi ağrıdan şikayətlənən xəstə barədə Allah elçisindən bir şey bilirsənmi?» - deyə soruşuldu. O da belə cavab verdi: «Bəli, Aişənin hədisini. Bir dəfə Aişənin başı bərk ağrıyırdı. O: "Of başım!" - deyərkən Peyğəmbər onu sakitləşdirməyə başladı»[813].

Mərvəzi belə deyir: «Əbu Abdullah xəstə olarkən yanına gəldim. Halını soruşdum. Göz yaşları axıtdı və gecə çəkdiyi ağrılardan danışdı».

Səhih isə budur ki, inilti iki cür olur. Birincisi, şikayət xarakteri daşıyan iniltidir ki, məkruhdur. İkincisi isə məkruh olmayıb istirahət və ağrıkəsici xarakteri daşıyan iniltidir. Ən düzünü bilən isə təbii ki, Allahdır.

Bir əsərdə rəvayət olunur ki, əgər xəstə "əlhəmdulilləh" deyib sonra öz halından danışarsa, bu şikayət hesab olunmur.

Şəqiq əl-Bəlxi belə deyir: «Müsibətə düçar olunan Allahdan qeyrisinə şikayət edərsə, qəlbində heç vaxt Allaha etdiyi ibadətin ləzzətini duya bilməz».

Şikayət iki növdür. Birincisi dillə olan şikayətdir. İkincisi, hal-vəziyyətlə olan şikayətdir. İkincisi bəlkə də birincisindən daha böyükdür. Buna görə də Peyğəmbər Allahın nemət bəxş etdiyi kəsə Onun nemətini göstərməsini əmr elmişdir. Halı yaxşı ola-ola Rəbbindən şikayətlənən kəs Allah yanında məxluqatın ən mənfurudur.

İmam Əhməd Abdullah ibn Yeziddən, o da Kəhməsdən, o da Abdullah ibn Şəqiqdən belə deməsini rəvayət etmişdir: Kəab Əhbər: «Gözəl əməllərdən biri: "Subhətul-hədis", pis əməllərdən biri də "ət-Təhzif"dir. Abdullahdan "Subhətul-hədis"in nə olduğunu soruşdular. O da: "Söhbət əsnasında Subhanallah və bihəmdih deməkdir" - deyə cavab verdi. "ət-Təhzif"in nə olduğunu soruşduqda isə: "Hal-vəziyyəti yaxşı olduğu halda soruşarkən pis olduğunu söyləməkdir" - deyə izah etdi».

Səbrə zidd olan əməllərdən biri də başa bir müsibət gəldiyi zaman üz-gözü, əlləri cırmaq, saç yolmaq, vay-şivən qaldırmaqdır. Bunun üçün də Peyğəmbər müsibət zamanı fəryad edəndən, üz-gözünü cırandan və paltarını yırtandan uzaq olmuşdur. Lakin ağlamaq və kədərlənmək səbrə zidd deyildir. Allah-taala Yaqub haqqında danışarkən belə buyurur: **«Dərd-qəmdən** [həmişə ağlamaqdan Yəqubun] **gözlərinə ağ gəldi. O,** [bütün dərdini] **içində çəkirdi** [oğlanlarına bildirmirdi]**»** (Yusif, 84). Qətadə bu ayə haqda deyir: «Yaqub hüzn və kədəri boğur və xeyirdən başqa bir söz

813 əl-Buxari, 5666.

söyləmirdi».

Həmmad ibn Sələmə Əli ibn Zeyddən, o da Yusif ibn Mehrandan, o da İbn Abbasdan Peyğəmbərin belə deməsini rəvayət edir: «Gözdən və qəlbdən gələn [kədər] Allahdan və onun mərhəmətindəndir. Əldən və dildən gələn [kədər] isə şeytandandır».[814]

Həşim Əbdürrəhman ibn Yəhyadan, o da Həssan İbn Əbi Cəbələdən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Kim [başına gələn bir müsibəti] yaysa, səbir etmiş olmaz».[815]

Xalid ibn Osman demişdir: «Oğlum ölərkən Səid ibn Cubeyr məni başı örtülmüş vəziyyətdə görüb: "Başını aç, çünki bu acizlikdəndir" - dedi».

Bəkr ibn Abdullah əl-Muzəni demişdir: «Deyilənə görə müsibətdən sonra evdə oturmaq acizlikdəndir».

Ubeyd ibn Umeyr demişdir: «Səbirsizlik və kədər gözün yaş tökməsi, qəlbin üzülməsi deyil, səbirsizlik və kədər pis söz və pis zəndir».

Qasım ibn Məhəmməddən səbirsizlik və kədərin nə olduğu haqda soruşuldu, o: «Səbirsizlik və kədər pis söz və pis zəndir» - deyə cavab verdi.

Bəsrə qazilərindən birinin oğlu ölmüşdü. Yas mərasiminə toplaşan alim və fəqihlər öz aralarında insanın səbirli və səbirsiz olmasının necə müəyyən olması barədə fikir mübadiləsi aparırdılar. Belə qərara gəldilər ki, əgər insan həmişə etdiyi bir şeyi tərk edərsə, səbirsizlik etmiş olar.

Həsən ibn Abdüləziz əl-Huri demişdir: «Mənim gözəl bir oğlum öldü. Anasına: "Allahdan qorx, savabını Allahdan um və səbir et!" - dedim. O isə: "Müsibətimin [savabı] onu səbirsizlik etməklə pozmağımdan daha böyükdür" - deyə cavab verdi».

Abdullah ibn Mubarək demişdir: «Yezid ibn Yezid namaz qılarkən yanına bir kişi gəldi. Yezidin oğlu can verirdi. Kişi: "Oğlun can verir, sən də namaz qılırsan?!" - dedi. Yezid isə: "Əgər insan həmişə etdiyi bir əməli (müsibət) gəlincə bir gün belə tərk etsə, bu onun əməlində qüsurun olmasını göstərir" - deyə cavab verdi».

Sabit belə demişdir: «Abdullah ibn Mutarrafın başına bir müsibət gəlmişdi. Onu gözəl paltarda və gözəl təravətli ətir vurmuş olduğunu gördüm. "Bu nə məsələdir?" - deyə soruşdum. O: "Ey Əbu Məhəmməd! Nə deyirsən, şeytana tabe olum, yoxsa ona başıma müsibətin gəldiyinimi göstərim? Ey Əbu Məhəmməd! And olsun Allaha ki, əgər bütün dünya mənim olsa, sonra Allah-taala onu

[814] **Sənədi zəifdir**: "Kənzul-Əməl", 15/616/42451.
[815] **Sənədi** mu'dəldir.

məndən alıb qiyamət günü onun əvəzinə bir udum su versəydi, bu bir udum su mənim üçün daha dəyərli olardı" - deyə cavab verdi».

Səbri pozan amillərdən biri də müsibəti yaymaq və onun haqqında danışmaqdır. Müsibətin gizlədilməsi isə səbrin başıdır. Həsən ibn Sabah "Müsnəd"ində Xələf ibn Təmimdən, o da Zafir ibn Süleymandan, o da Abdüləziz İbn Əbi Rəvaddan, o da Nafindən, o da İbn Ömərdən Allah elçisinin belə deməsini rəvayət etmişdir: «Müsibətləri, xəstəlikləri və sədəqəni gizlətmək yaxşılıqdandır».[816]

Digər bir rəvayətdə isə Peyğəmbər: «Kim [başına gələn bir müsibəti] yaysa, səbir etmiş olmaz»[817] - buyurmuşdur. Həsən əl-Bəsridən başqa yolla rəvayət olunan bir mərfu hədisdə isə belə buyurur: «Müsibətləri gizlətmək yaxşılıqdandır. Kim [başına gələn bir müsibəti] yaysa, səbir etmiş olmaz».

Əta ibn Rəbahın bir gözünə su yığılmış, iyirmi il ailəsi bundan bixəbər olmuşdur. Lakin bir gün oğlu atasının gözləri önünə gəldikdə qocanın gözlərinin kor olduğunu bilmişdir.

Bir kişi Davud ət-Tai yatağında xəstə yatarkən onun yanına gəldi. Onun titrədiyini görüb: «Hər şey Allah üçündür və hər şey Ona qayıdacaqdır» - dedi. Davud ona: «Bəsdir! Bunu heç kəsə bildirmirsən. Bundan əvvəl də dörd ay xəstə yatmışdım və heç kəs bilməmişdi» - dedi.

Muğirə demişdir: «Əhnəf əmisinə diş ağrısından şikayətləndi və bunu bir neçə dəfə təkrar söylədi. Əmisi ona: "Mənə təkrar-təkrar bunu söyləmə! Gözümün biri qırx ildir ki, kordur, hələ indiyədək ondan heç kəsə şikayətlənməmişəm" - dedi».

Səbrə zidd olan əməllərdən biri də müsibət baş verdiyi zaman həyəcan və qorxu keçirmək haqq-ədalət gəldiyi zaman isə onun qarşısını almaqdır: Bu barədə Allah-taala belə buyurur: **«Həqiqətən, insan** [sərvətə] **çox həris** [tamahkar və kəmhövsələ] **yaradılmışdır! Ona bir pislik üz verdikdə fəryad qoparar. Ona bir xeyir nəsib olduqda isə xəsis olar»** (əl-Məaric, 19-21).

Bir hədisdə belə deyilir: «Qulda olan ən pis keyfiyyət ifrat xəsislik və ifrat qorxaqlıqdır».[818]

Xəsislik və qorxaqlıq qulda olan ən mənfi keyfiyyətlərdir. Əlalxüsus da insan xəsisliyindən zövq alırsa və qorxudan qəlbi yerindən titrəyirsə, onda nə comərdlikdən, nə şücaətdən əsar-əlamət olmaz, nə malı, nə də bədəninin ona bir faydası olar. Nə qovulmaz, nə

---

816 **Zəifdir:** əl-Beyhəqi, "Şuabul-İman", 10047; Abdurrəzzaq, "Təfsir", 1/2/327-328; İbn Cərir, "Təfsir", 13/32.

817 **Sənədi** zəifdir.

818 **Səhihdir:** Əbu Davud, 2511; Əhməd, 2/302, 320; İbn Əbi Şeybə, 9/98; İbn Hibban, 3250; Əbu Nəim, 9/50; əI-Beyhəqi, 9/50; əl-Albani, "əs-Səhih", 560.

də qaçmaz. Əksinə xəsislik, qorxaqlıq və tamahkarlıq onu yatırar, kiçildər, alçaldar və rəzil edər. Əgər qorxaqlığın nə olduğu bilmək istəyirsənsə, bil ki, o, insanı aclıq yaxaladığı zaman onu hamıya yayar və dilənməyə tələsər, harasısa ağrıdığı zaman tez şikayət edərək hamıya xəstə olduğunu bildirər, əgər bir məğlubiyyətə uğrarsa, dərhal itaət göstərər, əgər qarnı ac olarsa, böyrü üstə yıxılıb şikayətini hamıya bildirər, gözünə qida mənbəyi dəydikdə uçaraq özünü ora salar, onu əldə edib ruhunun yerinə qoyar. Nə dözümü olar nə bir üstünlüyü. Bütün bunlar nəfsin kiçikliyindən, rəzalətindən, bədənə soxulmasından, onun gizlətməsindən və alçaltmasından irəli gəlir. Yardım diləmək üçün üz tutulan yeganə varlıq Allah-taaladır.

# İYİRMİ ALTINCI BÖLMƏ

## Səbir və Şükrün Allahın sifətlərinə daxil olması və Allahın özünü əş-Şəkur və əs-Səbur adı ilə adlandırması

Əgər səbir və şükrün bundan başqa fəziləti olmasaydı, bu da ona bəs edərdi.

Ən arif və böyük insanlar Allahı bütün nöqsanlardan tənzih edərək səbri mübaliğə formasında Ona aid etmişlər.

Əməş Səid ibn Cubeyrdən, o da Əbu Əbdürrəhman Səlmidən, o da Əbu Musadan Peyğəmbərin belə deməsini rəvayət edir: «Heç kəs eşitdiyi bir əziyyətə [söyüşə və ya təhqirə] uca və böyük Allah qədər səbir edə bilməz. Lakin [insanlar] Allahın övladı olmasını iddia edirlər, Allah isə onlara şəfa verir, ruzi bəxş edir».[819] Allahın gözəl adları arasında mübaliğə formasında olan əs-Sabur **الصبور** adı vardır. əs-Səbur adı sabir **الصابر** və sabbar **الصبّار** formalarından məna baxımından daha geniş və daha əhatəlidir. Allah-taalanın səbri məxluqatın səbrindən fərqlidir və bir çox baxımdan ona bənzəmir. Məsələn, tam bir qüdrət baxımından Allahın səbri məxluqatın səbrinə oxşamaz. Allah-taala kömək etməkdən qorxmaz. Qul isə qorxuya və yardıma tələsir. Allah-taalanın səbrinə heç bir vəchlə ağrı, hüzn, naqislik daxil ola bilməz. Dünyada əs-Sabur adının əlamətinin görünməsi əl-Həlim **الحليم** adının görünməsi kimi əyani şəkildə müşahidə olunur. Səbirlə həlimlik arasında fərq ondan ibarətdir ki, səbir həlimliyin həm bəhrəsi və onun yaranma səbəbidir. Qulun səbri onun həlimliyinə bağlıdır. Allah-taalanın sifətlərindəki həlimlik isə səbirdən daha əhatəli və genişdir. Bunun üçün də Allahın əl-Həlim adı bir neçə yerdə qeyd olunur. O, geniş və əhatəli olduğu üçün Allah-taala onu əl-Alim **العليم** adı ilə yanaşı qeyd edir. Belə ki, Allah buyurur: **«...Allah** [hər şeyi] **biləndir, həlimdir!»** (əl-Əhzab, 51); **«...Allah** [hər şeyi] **biləndir, həlimdir!»** (ən-Nisa, 12).

Bir əsərdə qeyd olunur ki, ərşi daşıyan mələklər dörddür. Onlardan ikisi «Subhanəkə Allahummə va bihəmdikə, ləkəl-həmd alə hulmikə badə ilmikə» - deyə Allahı zikr edir, digər ikisi isə: «Subhanəkə Allahummə va bihəmdikə, ləkəl-həmd alə afvikə badə qudratikə» - deyə zikr edirlər.

---

[819] əl-Buxari, 7378; Müslim, 2804.

Məxluq bilməməsinə görə həlimdir və acizliyinə görə əfv edir. Allah-taala isə mükəmməl elmi ilə həlimdir və qüdrətinin tamamı ilə əfv edir. Bir-biri ilə yanaşı olanların ən gözəli elmlə həlimlik, cəzalandıraraq iqtidarında ola-ola əfv etməkdir. Bu səbəbdən də Allah-taala kədərli vəziyyətdə edilən duada əzəmətlə yanaşı həlimliklə vəsf edilmişdir. Allah-taalanın həlim olması Onun zatının tərkib hissəsindəndir. Allah-taalanın səbri qullarının küfrü, şükrü və Onu söyməsinə və günahlarının növlərinə bağlıdır. Bütün bunlar Allahı narahat və cəzanı tezləşdirməsinə sövq etməz. Əksinə, qulunun bu hərəkətlərinə səbir edər, ona möhlət verər, onu islah etmək istər, ona qarşı mülayim və həlim davranar və məxluqa bəhanə üçün yer buraxmaz. Bütün bunlara baxmayaraq qul ona verilən möhlətdən, Allahın ona qarşı mülayim və həlim davranışından yararlanmaz, Rəbbinə qayıtmaz və sonda Rəbbi ona yaxşılıq və nemət, bəla və intiqam qapılarından deyil, ən son üzrlərdən, nəsihətdən və hər bir qapıdan Özünə sarı çağırışdan sonra hər şeyə qadir olan güclüyə layiq bir tərzdə quluna müdaxilə edir. Bütün bunlar Allahın həlimlik sifətinin səbəblərindəndir və bu sifət Onun əbədi zatı sifətidir.

Əgər səbrin bağlılığı hikmətdən doğaraq mövcud olan və kəsilən digər fellər kimi bağlılığı kəsilirsə, onda bu barədə fikirləş! Çünki bu çox incə bir fərqdir ki, mahir insanlar belə onun ondabirinə belə rast gəlməmişlər. De, görək bu kimin ağlına gəlib, kim ona diqqət yetirib?! Bu ad onların əksəriyyəti üçün anlaşılmaz olaraq qalır. Onlar Quranda bunun gəlmədiyini deyir, ona əhəmiyyət verməyib sonra qulun səbri və bu səbrin növləri haqqında danışırlar. Əgər onlar bu adın haqqını vermiş olsaydılar, Allahın əl-Alim, əl-Qadir, əs-Səmi, əl-Basir, əl-Heyy və digər gözəl adlarına haqqı çatdığı kimi bu ada da məxluqatından daha çox haqqı çatdığını bilərdilər. Allah-taalanın səbri ilə onların səbri arasındakı fərq Allahın həyatı ilə onların həyatı, Allahın elmi ilə onların elmi, Allahın eşitməsi ilə onların eşitməsi arasındakı fərq kimidir. Onun digər sifətləri də belədir. Əgər bunu ən arif insan bilsəydi, onda: «Bəli, heç kəs eşitdiyi bir əziyyətə [söyüşə və ya təhqirə] Allah qədər səbir edə bilməz» - deyərdi.

Bəsirət əhli Allahın rəhmətinin, elminin, əfvinin, gizlətməsinin səbri kimi olmasını bilirlər. Çünki Allahın elmi, qüdrəti, izzəti və əzəməti qarşısında şahların, hökmdarların, günahkarların Allahın kamalına, adlarına, sifətlərinə hörmətsizlik etdikləri, Allaha övlad aid etmək kimi ən çirkin şeyləri bulaşdırdıqları, Allahın ayələrini və peyğəmbərlərini təkzib etdikləri, peyğəmbərləri söyüb təhqir etdikləri, əziyyətlər verdikləri, Onun övliyalarını yandırdıqları, öldürdükləri və alçaltdıqları halda səbirdə heç kəsin ona çata bilmədiyi əs-Səbur onlara səbir edib dözdü. Əgər Allahın səbri və

həlimliyinin nə olduğunu bilmək istəsən, bil ki, onlar arasında heç bir fərq yoxdur və aşağıdakı ayələr barəsində düşün! Belə ki, Allah-taala buyurur: **«Həqiqətən, Allah göyləri və yeri zaval tapmasınlar** [öz mehvərindən çıxmasınlar] **deyə, tutub saxlayır. Əgər öz mehvərindən çıxsalar, Ondan başqa onları heç kəs tutub saxlaya bilməz. Doğrudan da,** [Allah] **həlimdir, bağışlayandır!** [Bəndələrinə cəza verməkdə tələsməz, tövbə edənləri əfv edər]» (əl-Fatir, 41); **«**[Müşriklər:] **"Rəhman özünə övlad götürmüşdür!» - dedilər. Siz, doğrudan da, olduqca pis bir şey etdiniz** [çox böyük-böyük danışdınız]**! Buna görə az qaldı ki, göylər parçalansın, yer yarılsın və dağlar yerindən qopub uçsun! -** [Müşriklərin] **Rəhmana övlad isnad etdiklərinə görə!»** (Məryəm, 88-91); **«**[Kafirlər Peyğəmbərə və islam dininə qarşı bacardıqları qədər] **hiylə qurdular. Onların hiyləsi Allah dərgahında məlumdur** [və buna görə də cəzalarını da alacaqlar]**. Onların hiyləsi ilə dağlar** [islam dini, onun hökmləri] **yerindən oynayan deyildir!** [Və ya onların hiyləsi dağları yerindən oynatsa belə, yenə də Allahın dini qarşısında acizdir!]**»** (İbrahim, 46).

Allah-taala həlimliyinin və bağışlamasının göylərin və yerin yox olmasına mane olduqlarını bildirmişdir. Həlimlik, göyləri və yeri saxlamaq elə Onun səbridir. Allah-taala həlimliyi ilə düşmənlərə tez cəza verməyə səbir edir. Yuxarıdakı ayələrdə göylərin və yerin qulların etdikləri pisliklərə görə yox olmaq üçün Allahdan izn istədiklərinə və Allahın onları Öz həlimliyi və bağışlaması ilə saxladığına işarə edilmişdir. Bu da Allah-taalanın insanların pisliklərinə qarşı onları cəzalandırmağı saxlaması və Onun səbrinin həqiqətidir. Yerlə göylərin saxlanılması Onun həlimlik sifətindən irəli gəlir. Onları saxlamaq isə səbirdir və bu da cəzalandırmanın saxlanılmasıdır. Cəza verməni saxlamaqla onu saxlamanın yarandığı varlıq arasında fərq vardır. Bu haqda düşün.

İmam Əhmədin "Müsnəd"ində mərfu isnadla rəvayət olunan bir hədisdə belə deyilir: «Elə bir gün olmaz ki, dəniz Adəm övladlarını batırmaq üçün Rəbbindən izn istəməsin».[820]

Bu dənizin təbiətinin tələbindən irəli gəlir. Çünki su kürəsi təbiətinə görə torpaq kürəsindən daha yüksəkdədir. Lakin Allah-taala onu Öz qüdrəti, həlimliyi və səbri ilə tutub saxlayır. Dağların yıxılması, göylərin çatlaması da belədir. Allah-taala onları da Öz səbri və həlimliyi ilə saxlayır. Çünki Allahın əzəməti, böyüklüyü, alicənablığı qarşısında kafirlərin, müşriklərin, günahkarların etdikləri pisliklər dağların uçmasını və göylərin çatlamasını tələb edir. Lakin

[820] **Zəifdir**: Əhməd, 1/43; İshaq bin Rahuyə, "əl-Mətlub əl-Aliyə", 2/176, Əhməd Şakir, "Şərh əl-Müsnəd", 1/286; əl-Albani, "Daif əl-Cami'i əs-Sağir", 4935.

Allah-taala bütün bunların müqabilində sevəcəyi, razı qalacağı və əməlli-başlı sevinəcəyi səbəblər yaratmışdır. Bu səbəblər dünyanın yox olmasına və dağılmasına səbəb olan amillərlə qarşılaşaraq onları dəf edir. Bu metod Allahın rəhmətinin qəzəbini dəf etməsinin və rəhmətinin qəzəbini keçməsinin nişanələrindəndir. Allahın rəhməti qəzəbinə qalib gəldiyi kimi rəhmət əlaməti də qəzəb əlamətinə qalib gəlir. Buna görə də Peyğəmbər Allahın qəzəb sifətindən razılıq (riza) sifətinə, cəzasından isə əfvinə sığınmışdır. Sonra bunları Allahın zatında birləşdirərək: «Sənin qəzəbindən rizana, cəzandan əfvinə və Səndən Sənə sığınıram»[821] - deyə dua etmişdir. Çünki Allaha sığınılan şeylər Onun istəyi, yaratması, izni və hökmü ilə meydana gəlir. Sığınılan səbəblərin baş verməsinə icazə verən də Allahdır. Səbəb də səbəb olan da Allahdandır. Canları və bədənləri hərəkətə gətirən, onlara təsir qüvvəsi verən, onları yaradan, hazırlayan, inkişaf etdirən, onları istədiyi şeyə hakim edən, onlarla onların qüvvəsinin və təsirinin arasına girən Allahdır.

Allah elçisinin «Allahım! Səndən Sənə sığınıram» - ifadəsi haqda düşün! Bu ifadənin altında Allahın birliyi, Ondan qeyrisinə yönəlməmək, yalnız Allaha təvəkkül etmək, təkcə Ondan yardım istəmək, yalnız Allahdan qorxmaq və Ona ümid etmək, zərəri dəf, xeyiri cəlb etmək, zərərin toxunması da Allahın istəyilə, dəf edilməsi də Onun istəyilə olmasına, Allahdan Allaha sığınmaq, bəla və əmin-amanlığı yaradanın da Allah olmasına inam dayanır. Əgər məxluqatın asilikləri, küfrü, şirki və haqsızlıqları Allahı qəzəbləndirirsə, mələklərinin və mömin bəndələrinin Onu təsbih etmələri, yalnız Ona həmd-səna oxumaları və Ona itaət etmələri Onu razı salır. Bunun üçün də Allahın qəzəbindən rizasına sığınılır.

Abdullah ibn Məsud demişdir: «Rəbbınızdə gecə-gündüz yoxdur. Göylərin və yerin nuru Onun sifətinin nurundandır. Sizin bir gününüzün müddəti Allah yanında on iki saatdır. Dünən etdiyiniz əməllər günün əvvəlində Allaha ərz olunur. Onlara üç saat baxır, bu əməllərdən bəyənmədikləri Onu qəzəbləndirər. Onun qəzəbləndiyini ilk bilənlər isə ərşi daşıyan mələklər olar. Çünki Allah qəzəbləndiyi zaman onlar ərşin üzərlərində ağırlaşdığını hiss edirlər. Bu zaman ərşi daşıyan və digər mələklər Cəbrayılın boruya üfürməsinədək Allahı zikr edirlər. Elə ki Cəbrayıl boruya üfürür, onun səsini eşitməyən qalmır. Onlar Rəhmanı üç saat zikr edirlər, nəhayət Rəhman mərhəmətlə dolar və bu altı saat davam edər. Sonra bətnlər Onun hüzuruna gətirilər. Onlara da üç saat baxar. Belə ki, Allah-taala buyurur: **«Bətnlərdə** [anaların bətnində] **sizə istədiyi surəti verən**

[821] Müslim, 486. Aişənin rəvayət etdiyi hədis.

**Odur!»** (Ali-İmran, 6); **«Göylərin və yerin hökmü Allahın əlindədir. O, istədiyini yaradır, istədiyinə ancaq qız, istədiyinə də ancaq oğlan verir. Yaxud hər ikisindən - həm oğlan, həm də qız verir, istədiyini də sonsuz** [övladsız] **edir»** (əş-Şura, 49-50). Doqquz saat beləcə davam edər. Sonra ruzilər gətirilər. Ona da Allah-taala üç saat baxar. Yenə də Allah buyurmuşdur: **«Allah istədiyi bəndənin ruzisini bol da edər, azaldar da»** (ər-Rəd, 26); **«O hər gün** [hər an] **bir işdədir** [birini öldürər, birini dirildər; acizə kömək, zalıma zülm edər; birinin duasını qəbul edər; birinə mərhəmət əta edib digərinə cəza verər]**»** (ər-Rəhman, 29). Buyurun, bu sizin işiniz, bu da Rəbbinizin işi»[822]. Bunu Əbulqasim ət-Tabarani «əs-Sünnə»də, Osman ibn Səid Darimi, Şeyxülislam əl-Ənsari, İbn Mündə, İbn Xüzeymə və başqaları da rəvayət etmişlər.

Allah-taala əl-Ənam surəsində düşmənlərini, onların küfrlərini, elçilərini təkzib etmələrini xəbər verdikdən sonra sevimlisi İbrahimi, ona göylərin və yerin səltənətini göstərdiyini, İbrahimin Allahın dinini və birliyini yaymaq uğrunda qövmü ilə mübarizə aparmasını, sonra İbrahimin zürriyyətindən olan peyğəmbərləri, onları doğru yola yönəltdiyni, onlara kitab, müdriklik və peyğəmbərlik verdiyini qeyd edir və belə buyurur: **«Onlar Bizim kitab, hökm və peyğəmbərlik verdiyimiz kimsələrdir. Əgər** [indi] **bunlar** [Qüreyş müşrikləri və başqa kafirlər] **bu dəlilləri dansalar, Biz onlara həmin dəlilləri inkar etməyən bir tayfanı müvəkkil edərik** [onların yerinə dəlillərimizi inkar etməyəcək bir zümrə gətirərik]**»** (əl-Ənam, 89).

Allah-taala yer üzündə Onu və tövhidini inkar edən, peyğəmbərlərini təkzib edən kafirlərlə yanaşı onların inkar etdiklərinə iman gətirən, onların təkzib etdiklərini təsdiq edən və onların zay etdiklərini qoruyub saxlayan qullar da yaratdığını xəbər vermişdir. Buna görə də yuxarı aləmlə (göylərlə) aşağı aləm (yer) bir-birindən tutub dayanırlar. Əks halda əgər haqq Allahın düşmənlərinin istəyinə tabe olsaydı, göylərlə yer və onlar arasında olanlar fəsada uğrayar və bu aləm məhv olardı. Buna görə də Allah-taala aləmi məhv edən səbəblərdən onu saxlayan səbəbləri yer üzündən qaldırmışdır. Aləmi saxlayan səbəblər isə Allahın kəlamı, Onun evi, dini və həyatlarını onun hökmlərinə uyğun tənzimləyənlərdir. Aləmin məhvini tələb edən həmin səbəblərin qarşısında dayana biləcək və onlara əngəl olacaq səbəblər olmazsa, dünya məhvə uğrayar.

Əl-Həlim adı vəsflərə, əs-Sabur adı isə fellərə daxil olduğu üçün

[822] **Zəifdir:** ət-Tabərani, "əl-Kəbir", 8886; əd-Daraqutni, 91: Əbu Nəim, "əI-Hilyə", 1/137.

həlimlik səbrin əsasıdır. Quranda əl-Həlim adı əs-Sabur adının əvəzinə işlənərək onu özünə əhatə edir. Ən doğrusunu bilən isə təbii ki, Allah-taaladır.

Allah-taalanın Özünü əş-Şəkur **الشكور** və əş-Şakir **الشاكر** adlandırmasına gəlincə, bu Əbu Hüreyrədən rəvayət olunan hədisdə[823] və Quranda qeyd olunur. Belə ki, Allah-taala buyurur: **«Allah şükrə qiymət verəndir,** [hər şeyi] **biləndir!»** (ən-Nisa, 147), digər bir ayədə isə belə deyilir: **«Allah qədirbiləndir, həlimdir!»** (ət-Təğabun, 17), **«**[Onlara belə deyiləcəkdir:] **"Bu sizin** [dünyada etdiyiniz yaxşı əməllərə görə] **mükafatınızdır. Zəhmətiniz** [Allah yanında] **məqbuldur** [təqdirəlayiqdir]**!"»** (əl-İnsan, 22). Allah-taala bu ayədə iki məsələni birləşdirərək qullarının zəhmətini təqdirəlayiq hesab etmiş və buna görə onları mükafatlandırmışdır. Qul Allaha olan ibadət və itaətini daha da təkmilləşdirdiyinə görə Allah-taala ona təşəkkür edir, Ona tövbə etdikdə günahlarını bağışlayır. Allah quluna yaxşı əməlinə görə təşəkkür edir, pis əməllərinə görə isə onu bağışlayır. Çünki O, bağışlayan və qədirbiləndir.

İyirminci fəsildə bəndənin şükrünün həqiqəti, onun səbəbləri artıq qeyd olunmuşdur. Allahın şükrünə gəlincə, Onun səbrinin sonsuzluğu kimi şükrü də sonsuzdur. Buna görə də O, əş-Şəkur sifətinə bütün şükür edənlərdən daha layiqdir və həqiqi şəkurdur (təşəkkür edəndir). Allah-taala quluna Ona şükür etdiyi üçün verər və onu müvəffəq edər. Allah-taala qulunun az əməlini də qiymətləndirir və bu dəyərləndirməni az hesab etmir, qulunun etdiyi bir yaxşılığın əvəzində on qat artığını verir. Allah-taalanın sözdə bir quluna şükür etməsi onu mələkləri və böyük mələklərin toplumu arasında tərifləməsi, qulları arasında isə ona öz hərəkəti ilə tərifini bildirməsidir. Qul Onun rizası üçün bir şeyi tərk edərsə, Allah ondan da əfzəlini ona verər. Əgər onun üçün sərf edərsə, Allah ona qat-qat artığını qaytarar. Qulu hər hansı bir şeyi tərk etməsinə və Allah üçün çalışmasına müvəffəq edən Allahdır. Süleyman Peyğəmbər onu Allahın ibadətindən yayındırdıqlarına qəzəblənərək və bu halın bir daha təkrar olunmaması üçün ilxını qurban kəsdi. Allah-taala isə ona atların əvəzinə külək verdi. Ondan sonra Süleyman istədiyi yerə küləklə gedərdi.

Səhabələr Allah yolunda yurdlarını tərk edib oradan çıxdıqlarının əvəzinə Allah onlara dünya mülkünü və fəthlər verdi.

Yusif əs-Siddiq zindanın darısqallığına dözdüyü üçün Allah-taala onu yer üzünə də yerləşdirdi. Belə ki, Yusif istədiyi yerdə qala bilərdi.

---

[823] **Zəifdir**: "Səhih əl-əzkar və Daifə", 302/80.

Şəhidlər Allah yolunda canlarını qurban verdikləri üçün, hətta düşmənlər bədənlərini dəlik-deşik etdikləri üçün Allah onlara təşəkkür etdi və canlarının əvəzində ruhlarını yaşıl quşların boğazına yerləşdirdi. Qiyamət gününə kimi ruhları həmin quşların boğazında Cənnətin çaylarını gəzərək onun meyvələrindən yeyəcəklər. Qiyamət günü isə onların ruhları bədənlərinə ən gözəl şəkildə qaytarılacaqdır.

Elçiləri Onun yolunda bütün cəhdlərini sərf edib düşmənləri tərəfindən haqsızlığa və təhqirə qaldıqları üçün bunun müqabilində həm Özü, həm də mələkləri onlara salavat gətirmiş, göylərdə və məxluqatı arasında onları təriфləmiş və onların qəlbinə sırf axirət dünyasının zikrini yerləşdirmişdir.

Allah düşməninin Allah dərgahında məxluqatın ən mənfuru olmasına baxmayaraq, əgər bu dünyada etdiyi yaxşı bir əməli varsa, Allahın onun əvəzini ya bu dünyada verməsi, ya da saxlayıb qiyamət günündə əzabını yüngülləşdirməsi Onun şükründəndir. Həmçinin susuzluqdan torpağı yeyən itə su verdiyinə görə zinakar qadını[824], müsəlmanların yolundan tikanlı budağı götürüb qırağa qoyan[825] başqa birisini bağışlaması Allahın şükrünün əlamətidir. Qul özünə etdiyi yaxşılığa görə Allah-taala ona təşəkkür edir. Qul isə ona yaxşılıq edənə şükür edir. Bunu daha da qabarıq şəkildə desək, Allah qulun özünə etdiyi yaxşılığa görə ona mükafat verir və az əməlinin əvəzini qat-qat çoxaldır. Beləliklə, Allah-taala Özü yaxşılıq edib Özü də şükür edir. Belə olan halda əş-Şəkur adına Allahdan daha çox kimin haqqı çata bilər?! Elə isə bu ayə haqqında düşün! **«Əgər siz şükür etsəniz və iman gətirsəniz, Allah sizə nə üçün əzab versin ki, Allah şükrə qiymət verəndir,** [hər şeyi] **biləndir!»** (ən-Nisa, 147). Bu xitabdan məlum olur ki, Allah-taalanın təşəkkürü qullarının zəhmətini heç etməyə razı ola bilmədiyi kimi, günahsız bəndələrinə də əzab verməyə razı ola bilməz. əş-Şəkur adı ilə vəsf olunan Allah yaxşılıq edənin əməlini itirməz, günahsız olana isə boş yerə əzab verməz. Bu "Allah qulunun boynuna gücü çatmadığı işi tapşırır, sonra da ona buna görə əzab verir" - deyənlərə açıq rəddir. Allah-taala bu yalan zəndən və ədalətsiz haqq-hesabdan tamamilə uzaq və ucadır. Allahın şükrü şükür edən mömimə əzab verməməyi və onun əməlini heç etməməyi tələb edir. O, kamalına, zənginliyinə və həmdinə zidd olan eyb və nöqsanlardan uzaq olduğu kimi bunun əksindən də tam uzaqdır.

Zərrə boyda edilən bir yaxşılığa görə qulunu cəhənnəmdən çıxarmaq və bu kiçik bir miqdarı puç etməmək Allah-taalanın şükründəndir.

---

[824] əl-Buxari, 3467; Müslim, 2245.
[825] əl-Buxari, 2472; Müslim, 1914.

Qullarından birinin insanlar arasındakı dərəcəsini onu razı salacaq qədər qaldırılması, ona təşəkkür etməsi, onu anması, onu mələklərinə və mömin qullarına xəbər verməsi Allahın təşəkkküründəndir. Buna misal olaraq Allah-taala Firon ailəsindən olan mömin təşəkkürünü onu bu məqama qaldıraraq, tərifləmiş və qulları arasında adını anmışdır. Qulları arasından Sahibu-Yasini haqqa dəvət etməsinə görə insanlar arasında dərəcəsini qaldırması Allahın təşəkkkürünə misaldır. Allahın şükrü və məğfirəti arasında yalnız həlaka layiq olan həlak olar. Çünki O, bağışlayan və qədirbiləndir. Çoxlu günahları bağışlar, az əməllərin isə mükafatını artıqlaması ilə verər.

Əş-Şəkur sifətilə vəsf olunan Allah-taala həqiqi qədirbilən olduğu üçün insanlar arasında ən çox sevdiyi qul da şükür sifətilə vəsf olunanıdır. İnsanlar arasında Allahın ən çox nifrət etdiyi qul isə naşükür olanıdır. Allahın digər gözəl adları da belədir. Onlarla vəsf olunan Allah dərgahında ən sevimli qul, əksi ilə səciyyələnənlər isə ən mənfur qul hesab olunur. Buna görə də nankor, zalım, avam, qəddar, xəsis, qorxaq, alçaldıcı və rəzil insanlar Allah dərgahında mənfur insanlar sayılırlar. Allah-taala gözəldir və gözəlliyi sevir. Biləndir, alimləri sevər. Mərhəmətlidir, mərhəmətli olanları sevər. Yaxşılıq edəndir, yaxşılıq edənləri sevər. Qədirbiləndir, şükür edənləri sevər. Səbirlidir, səbir edənləri sevər. Comərddir, əliaçıqları sevər. Günahları gizlədəndir, eybləri gizlədənləri sevər. Hər şeyə qadirdir, acizliyi qınayır. Güclü mömin zəif mömindən Allah üçün daha sevimlidir. Bağışlayandır, bağışlamağı sevir. Təkdir, təki sevir. Allahın sevdiyi hər bir şey Onun ad və sifətlərinin əlamətlərindəndir. Nifrət bəslədiyi hər bir şey isə ad və sifətlərinə zidd olanlardır.

## SON SÖZ

Ey Allah və axirət yolçusu! Artıq qarşında bir məqsəd vardır. Əl-qolunu çirmələ, məqsədinə çat. Çünki bu məqsədə nail olmaq imkanı hələ tükənməmişdir. Bu səfərini Allahın mərhəməti ilə nəfsinin eyblərini, əməllərini və əməllərindəki qüsurları görmək arasında reallaşdır. Allahın nemətlərinə tamaşa etmək necə də davamlıdır. Arif bir insanın əməllərinə baxıb: «Bu məni yanar əzabdan xilas edəcək» - deməsi onun üçün günahdır. Bunda yalnız Allahın əfvinə və bağışlamasına ümid edilməlidir. Hər kəs Ona möhtacdır. Hər bir bəndə: «Mənə bəxş etdiyin nemətinlə Sənə qayıdıram. Məni bağışla! Mən günahkar və miskinəm, Sən isə mərhəmətli və bağışlayansan» - deməlidir.

Bütün əməllərini tərəzinin bir gözünə Allahın sənə bəxş etdiyi ən kiçik bir neməti isə tərəzinin digər gözünə qoysan, əməllərini puç edən amillərdən salamat olsan belə, Allahın neməti olan tərəf ağır gələcəkdir. Sən isə o nemətlərin sənə verildiyi andan onlara görə şükür etməyin qarşılığında girovsan. O nemətlərə görə Allahın haqqını layiqincə verdinmi? O nemətlər sənin istifadənndədir. Ümid kəndirindən yapış, tövbə və əməl qapısından daxil ol! Çünki O, bağışlayan və qədirbiləndir.

Allah bəndəyə qurtuluş yolu göstərmiş, onun üzünə bu yolun qapılarını açmış, səadətin necə əldə edilməsi yollarını bildirmiş və ona bunun səbəblərini vermişdir. Eyni zamanda Allah bəndəsini günahların müsibətindən çəkindirmiş, ona özünü və başqasını bu günahların bədbəxtliyinə və əzabına şahid tutmuş və: «İtaət etsən, fəzilətimlə sənin mükafatını verərəm. Yox əgər asi olsan, hökmümlə səni bağışlaram» - demişdir. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Allah qulunu xəstəliklərdən qorumuş, acizlikdən və tənbəllikdən Ona sığınmasını əmr etmiş, ona az əməlinin qarşılığında belə mükafat verəcəyini və çoxlu günahlarını bağışlayacağını vəd etmişdir. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Allah-taala quluna şükür edəcəyi neməti bəxş edir, sonra quluna Allah üçün deyil, özü üçün yaxşılıq etdiyinə görə təşəkkür edir. Allah quluna ona verdiyi neməti özünə sərf edəcəyi təqdirdə ona ən yaxşı mükafat verəcəyini, onu Özünə yaxınlaşdıracağını, Ona tövbə etdiyi halda günahlarını bağışlayacağını və qiyamət günü qarşısında

onun pis əməllərini ifşa etməyəcəyini vəd etmişdir. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Allahın əfvi yanılaraq günah edənləri də əhatə etmişdir. Allah Onun alicənablığına bağlanaraq yaxşılıq edənlərin ümidlərini əsla kəsməz. Tövbə edənlərin və dua edənlərin duaları yeddi qat göyü deşib keçər və Allah onların duasını eşidər. Allahın əfvi, bağışlaması və ruzisi bütün məxluqatı əhatə edir. Yer üzərində elə bir canlı tapılmaz ki, Allah-taala onun ruzisini Özü verməsin və onların yaşadığı və saxlanıldığı yeri bilməsin. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Allah bəndələrinə onların diləməsindən öncə əlavə nemətlər verir. Dua edənlərə və ümid edənlərə istədiklərinin və ümid etdiklərinin qat-qat artığını verir. Ona tövbə edənin günahları dənizin köpükləri, daş, torpaq və qum dənəciklərinin sayı qədər olsa belə, yenə də onu bağışlar. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Allah qullarına qarşı ananın öz övladından da mərhəmətlidir. Allah qulun tövbə etməsinə bir kimsənin susuz bir səhrada azuqəsi üzərində olan dəvəsini itirdikdən sonra yenidən onu taparkən sevindiyindən də çox sevinir. Allah bütün qullarının gördüyü az əməlinin müqabilində onları qat-qat artıq savabla mükafatlandırır. Kim ona zərrə qədər xeyirlə yaxınlaşarsa, Allah ondan razı qalıb onu tərifləi. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Qullarına ad və sifətlərini tanıtdırdı, onlara Öz həlimliyini və nemətlərini sevdirdi, günahları onlara nemət verilməsinin qarşısını almaz. Tövbə edənin və gözəl itaət göstərənin günahlarını Allaha qovuşacağı gün bağışlayacağını Allah-taala vəd etmişdir. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Səadət bütünlükdə Allaha itaətdədir. Bütün gəlir Onunla yaxşı davranmaqdadır. Bütün bəlalar, fitnələr, imtahanlar Allaha asi və müxalif olmaqdadır. Qul üçün Allaha şükür və tövbə etməkdən faydalı bir şey yoxdur. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Məxluqata nemətini axıdıb Özünə mərhəməti vacib bildi. Yazdığı Lövhü-məhfuzda rəhmətinin qəzəbinə üstün gəldiyinə[826] zəmanət verdi. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Allah-taala itaət olunar və Ona itaət edənlərə qat-qat artıq mükafat verər. Ona itaət etməyin özü də Allahın müvəffəqiyyəti və sayəsilədir. Qul asi olur, Allah isə ona qarşı həlim davranır. Qulun asi olması özünə qarşı haqsızlığından və avamlığındandır. Pis əməl

[826] əl-Buxari, 3164; Müslim, 2751.

sahibi Ona tövbə edir, Allah da onun tövbəsini qəbul edir və o sanki heç o pisliyi etməmiş kimi olur. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Bir yaxşılığın əvəzində Allah on qat mükafat verir, yaxud da saysız-hesabsız dərəcədə onu qat-qat artırır. Bir pisliyə bir günah yazır və bu günahın aqibəti isə Allahın əfvi və bağışlaması olur. Tövbə qapısı Allahın dərgahında göyləri və yeri yaratdığı gündən qiyamətə kimi açıqdır. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Allahın səxavət və mərhəmət qapısı ümidlərin toplandığı, günahların isə atıldığı yerdir. Allahın pay, bəxşiş səması yağmaqdan kəsilməz. Əksinə, leysan kimi yağar. Onun xəzinəsi doludur və gecə-gündüz xərclənsə də, tükənməz. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Allahın nəsihətlərini yalnız səbir edənlər qəbul edər, onun bəxşişlərini yalnız şükür edənlər qazanar, əzabı isə yalnız Ona üsyan edənlər qazanacaq. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir.

Ey asi! Allahın sənin canını birdən almasından çəkin! Çünki Allah qısqancdır. Allah sənə nemətini uzadarkən Ona asilik etməkdən çəkin! Allah sənə qarşı laqeyd deyildir. Lakin O səbirlidir.

Ey tövbəkar! Sən isə Allahın bağışlanma və mərhəməti ilə müjdələnirsən. Çünki O, bağışlayan və qədirbiləndir. Kim Allahın təşəkkür edən olduğunu bilərsə, Onunla çeşidli ünsiyyətlərdə olar. Kim də Allahın məğfirətinin geniş olduğunu bilsə, məğfirətinin quyruğundan yapışar. Kim Allahın rəhmətinin qəzəbinə qalib gəldiyini bilərsə, rəhmətindən ümidini kəsməz. Həqiqətən, Rəbbimiz bağışlayan və qədirbiləndir. Kim Allahın sifətlərinin birinə bağlanarsa, həmin sifət onun əlindən tutub Allahın hüzuruna aparar. Kim Allahın gözəl ad və sifətləri ilə Ona sarı getsə, mütləq Ona qovuşar. Kim Allahı sevsə, Onun ad və sifətlərini də sevmiş olar. Çünki ad və sifətlər Allah üçün ən sevimli şeylərdir. Qəlblər Allahı tanımaq və sevməklə döyünməkdədir, əzaların kamilliyi itaətlə Allaha yaxınlaşmaqda və Ona xidmət etməkdədir, dil Allahı zikr etməkdə, Ona həmd-səna oxumaqda və vəsfləri ilə Onu mədh etməkdədir. Allaha şükür edənlər, Onun nemətinə nail olanlardır. Allahı zikr edənlər Onun dərəcələrinə nail olanlardır. Allaha itaət və ibadət edənlər Onun hörmətinə nail olanlardır. Allah Ona asi olanların rəhmətinə olan ümidlərini kəsməz. Əgər tövbə etsələr, Allah onların həbibi [sevimlisi], etməsələr də təbibi [həkimi] olub onları günahlardan və eyblərdən təmizləmək üçün çeşidli bəla və müsibətlərlə imtahana çəkər. Çünki Allah bağışlayan və qədirbiləndir.

Bolluca həmd olsun aləmlərin Rəbbi olan Allaha! Rəbbimizin

sevib və razı qaldığı, Onun rizasına və böyüklüyünə layiq, yer-göy dolusu qədər Ona həmd-səna edirik. Ey Rəbbimiz! Sənə istədiyin qədər və Sənə edilən bildiyimiz və bilmədiyimiz həmdlərin sayı qədər, verdiyin bildiyimiz və bilmədiyimiz nemətlərin sayı qədər həmd edirik. Ey Rəbbimiz! Sənə həmd edənlərin, Sənin zikrindən qafil olanların, qələminin yazdıqlarının, kitabının saydıqlarının sayı qədər və elminin əhatəsi genişliyində həmd edirik.

**Sonda peyğəmbərimiz və cənabımız Məhəmmədə onun ailəsinə, bütün səhabələrinə və digər peyğəmbərlərə Allahın salamı və xeyir-duası olsun, onların yolunu qiyamətə qədər layiqincə davam etdirənlərdən isə Allah razı olsun deyirəm!**

## Bəzi hədis terminlərinin izahlı lüğəti

**Ceyyid** - səhih və ya ona yaxın dərəcədə olan hədisdir.

**Zəif** - həm raviyə, həm də hədisə aid ola bilər. Nəql etdiyi hədisə etimad olunmayan, etibarsız raviyə deyilir. Həmçinin həsən hədisdən aşağı səviyyədə yerləşən, və ya özündə həsən hədisin vəsfini cəmləşdirməyən, hər hansı şərtlərdən biri olmayan hədisə də deyilir.

**Hafiz** - əzbərlədiyini və ya yazdıqlarını qoruyan, dəqiq olan.

**Hədis** - Peyğəmbərə istinad edilən kəlmə, hərəkət, təsdiq etmə, sifətdir (fitri və ya əxlaqi dəyərlər).

**Həsən** - İbn Həcərin tərifinə görə isnadının əvvəlindən axırına qədər dəqiqliyi az olan insaflı ravinin aramsız, sapdırmadan ("şazz" olmadan) və qüsursuz ("illə"siz) olaraq özü kimisindən xəbər verdiyi hədisdir.

**Həsən li-qeyrihi** - dərəcə etibarı ilə həsən hədisdən aşağı olub, istilahi mənası bir çox yollarla (isnadlarla) rəvayət olunan zəif hədisdir ki, zəifliyinin səbəbi ravinin yalançı və ya fasiq olması deyildir.

**Həsən-səhih** - İbn Həcərin tərifinə görə əgər hədisin iki və daha çox sənədi varsa, bu ifadə: "Bu hədis bir sənədlə həsən, digər sənədlə səhihdir"- mənasını verir. Əgər hədisin bir sənədi varsa, bu ifadə: "Bir qrup alimin rəyinə görə həsən, digər qrupun rəyinə görə səhihdir"- mənasını verir.

**İllə** - hədisin mötəbər olmasında naqislik əmələ gətirən gizlin, anlaşılmaz səbəbdir. İki şərtlə "illə" hesab olunur:

- anlaşılmaz və gizlin olması;
- hədisin mötəbər olmasında naqislik əmələ gətirməsi.

**İsnad** - istilahda iki məna verir:

- hədisi istinad edərək rəvayət edənə aid etmək;
- hədisin mətninə gətirib çıxaran ravilərin silsiləsi. Bu mənada isnad sənədin sinonimidir.

**Qərib** - tək bir ravinin fərdi olaraq öz rəvayətini xəbər verməsi qərib hədis adlanır.

**Məqbul** - istilahi mənada bu o ravidir ki, az sayda hədis rəvayət etmiş, rəvayət etdiyi hədisin qəbul olunmamasına dair heç bir amil sübuta yetirilməmiş və həmin hədis də başqa hədislə gücləndirilmişdir.

**Mərfu** - istilahi mənada Peyğəmbərə istinad edilən kəlmə, ya hərəkət, ya təsdiq etmə, ya da sifət (fitri və ya əxlaqi dəyərlər) mərfu hədis adlanır.

**Mətn** - sənədə gətirən kəlmədir.

**Mətruk** - bir kimsənin rəvayət etdiyi hədisin tərk olunmasında bütün alimlər həmfikir olarlarsa, onun rəvayət etdiyi hədis tərk olunur.

**Məvquf** - səhabəyə istinad edilən kəlmə, ya hərəkət, ya da təsdiq etmə "məvquf" hədis adlanır.

**Məvsul** - "mərfu" və ya "məvquf" qrupuna aid, sənədində bağlılıq olan isnaddır.

**Mu'dəl** - isnadından iki və ya daha çox ravinin adlarının ardıcıl buraxıldığı hədisdir.

**Müəlləq** - isnadının əvvəlindən bir və ya daha çox ravinin adları ardıcıl olaraq buraxıldığı hədisdir.

**Müdəllis** - yalançı, fırıldaqçı, kələkbaz və s. mənalarını verib üç növdür:

a) "tədlisu əl-isnad" - ravinin rastlaşdığı kimsədən (başqa ravidən) eşitmədiyi rəvayəti elə bir formada rəvayət etməsidir ki, həm eşitməsi, həm də eşitməməsi ehtimal olunur;

b) "tədlisu ət-təsviyə" - "müdəllis" ravinin özündən əvvəlkindən eşitdim deməklə hədis rəvayət etməsidir ki, o, isnadın tərkibində olan, bir-biri ilə rastlaşmış iki "siqa" ravinin arasında (hədisi birindən eşidib digərinə çatdırmaqda vasitə) olan "daif" ravinin adını vurğulamır və onlardan birincisi ("daif" ravinin hədis eşitdiyi kəs) "müdəllis" də deyildir.

v) "tədlisu əş-şuyux" - bir ravinin digərindən eşitdiyi hədisi həmin ravi hədisi rəvayət edən şəxsin tanınmaması üçün onu məşhur olmadığı adı ilə, kunyası ilə və s. qeyd edərək rəvayət etməsidir.

**Mühəddis** - hədisləri rəvayət edib onları araşdıran, hədis elmi ilə məşğul olan şəxsdir.

**Münqəti** - isnadının hər hansı bir yerində bağlılıq olmayan sənəddir. "Mürsəl", "müəlləq", "mu'dəl" kimi isnadlar "münqəti" adlana bilər.

**Münkər** - etibarsız ravinin etibarlı raviyə müxalif olaraq rəvayət etdiyi hədisdir.

**Mürsəl** - isnadının sonundan, təbiundan sonra gələn (Peyğəmbərlə təbiun arasında olan) ravi buraxılmışdır.

**Müsəlsəl** - tərkibində olan ravilər eyni xassədə (dedikləri sözlərin və ya özlərinin eyni xüsusiyyətə malik olması) və ya eyni vəziyyətdə (dedikləri sözün və ya hərəkətlərinin eyni olması), və ya rəvayətin özü (rəvayətin eyni üsulla ravilər arasında bir-birinə

ötürülməsi) eyni formada olan sənəddir.

**Müsnəd** - bir neçə mənası var:

- hər bir səhabənin rəvayətlərini ayrı-ayrılıqda özündə cəmləşdirən kitab;
- sənəd baxımından bağlılıq olan hədis;
- hədisin mətninə gətirən ravilər silsiləsi.

**Mütəvatir** - bir çox ravi tərəfindən rəvayət olunub, səhihliyində heç bir şübhə olmayan, hamılıqla qəbul olunan hədis.

**Sənəd** - istilahi mənada hədisin mətninə gətirib çıxaran ravilərin silsiləsidir. Buna həm də isnad deyilir.

**Siqa** - istilahi mənada öz işlərində ədalətli və dəqiq olan ravi siqa adlandırılır.

**Səhih** - isnadın əvvəlindən axırına qədər dəqiq olan insaflı ravinin aramsız, sapdırmadan ("şazz"sız) və qüsursuz ("illə"siz) olaraq özü kimisindən xəbər verdiyi hədisdir.

**Səhih li-ğeyrihi** - özünün mislində və ya özündən də qüvvətli başqa yolla rəvayət olunmuş həsən hədisdir.

**Şazz** - rəvayəti məqbul (səhih, həsən) sayılan ravinin özündən də nüfuzlu raviyə müxalif olaraq rəvayət etdiyi hədisdir.

**Vahin** - inanılmış olduğu qeyd olunmayan və onda olan nöqsanla etibarsız sayılan ravi.